VİDADİ BABANLI

# BULANLIQ DÜNYA

*(roman)*

“Şərq-Qərb”
Bakı – 2011

# BİRİNCİ HİSSƏ

## 1.

Başdan papaq qaçıran sərt küləkli bir payız günündə Əfsun Zamanlı şəhərin mərkəzi kitabxanasına yollandı. Nadir nüsxə olan, başqa kitabxanalarda tapılmayan çox köhnə bir dərslik sorağına düşmüşdü. Ona buranı salıx vermişdilər.

Əfsun İqtisad İnstitutunda təhsil alırdı. "Maliyyə-kredit" fakültəsinin üçüncü kurs tələbəsi idi. Əla qiymətlərlə oxuyurdu. Bütün müəllim heyətinin rəğbətini qazanmışdı. Yalnız birindən savayı. Bu, əsas fənn müəllimi qocaman, adlı-sanlı professordu. Öz həmkarlarından son dərəcə tələbkarlığı və güzəştsizliyi ilə seçilirdi. Düzgünlükdə ad çıxartmışdı. Xahişə, minnətə baxmırdı. Heç institut rəhbərliyini də eşitmirdi. Di gəl ki, çalışqan, elmə həvəsli tələbələr gözünün işığıydı. Onları haqsızlıqdan, müəllim qərəzlərindən doğma balası kimi qoruyurdu. Hətta lazım gəlsə, maddi köməklik də göstərirdi. Bu xasiyyətlərinə, tündməzaclığına görə, professor Cəmil İmanlını həmkarları arasında sevməyənlər, badalaq gəlməyə hazırlar az deyildi.

Professor Cəmil İmanlının tələbə Əfsunla öcəşməsi, onu bəyənməməsi isə bambaşqa cəhətdən qaynaqlanırdı. Digər müəllimlərdən fərqli olaraq, bu tələbənin iç üzünü aydın görürdü. Sözünü onun üzünə açıq deyirdi: "Sən lovğasan, özündən çox razısan. Sırtıqlıqla, özünü gözə soxmaqla hər işini nizamlayırsan. Elmə həvəs, biliyə maraq sənin içindən gəlmir, yüksək qiymətləri əzbərçiliklə, zəhlə tökməklə alırsan. Uzun çəkməyəcək, elm səni usandıracaq. Tamam ayrı bir yolun yolçusu olacaqsan".

Əfsun da höcətə düşmüşdü. Arxasını yerə vurdurmaq istəmirdi. "Tərs" professorun dərsinə bir az da səylə çalışır, özü haqqında mənfi rəyi heçə endirməyə xüsusi cəhd göstərirdi. Bu cəhd həm də kurs yoldaşları qarşısında vüqarını sındırmamaq əzmi idi.

Ancaq höcətin axırı gəlib "kurs işi"ndə çiləkənə ilişmişdi. Professor onu divara qısnamışdı. Ən ağır mövzunu Əfsunun boynuna yükləmişdi. İşin də içindən əlavə əngəl çıxmışdı. İstifadə üçün gərəkli kitab, elmi vəsait yağlı kökəyə dönüb göyə çəkilmişdi. Əfsunu çətin vəziyyətlərə salmışdı. Hara əl atırdı, əli boşda qalırdı. Günləri səmərəsiz keçir, "kurs işi"nin vaxtı yaxınlaşırdı. Təyin edilmiş müddətə işi yazıb başa çatdırmasa, professorun hüzurunda dili gödək olacaq, tələbə yoldaşlarının etimadını itirəcəkdi...

O, Mərkəzi kitabxananın oxu salonuna ayaq basan kimi, gözü taxta arakəsmə küncündə əyləşib, önündəki bir yığın kitabı qeydə alan cavan, olduqca göyçək bir qadına sataşdı. Otuz, bəlkə də otuz iki yaşlı bu qadına elə ilk baxışdan quşu qondu. Axtardığı "yağlı kökə" kitabın məhz bu qadının köməyi ilə tapılacağına qəlbində çox qəribə inam yarandı. Göyçək qadına izafi ehtiramla yaxınlaşdı. Qılığa girməkdə, istənilən adamla az zaman ərzində xoş münasibət qurmaqda səriştəsi yaxşı idi. Xüsusən də qadınlarla dil tapmaq onun üçün bir içimlik su idi.

Arakəsmənin tininə dirsəklənib, şirin dilini işə saldı:

– Acizanə üzr istəyirəm, xanım, icazə verin, bir dəqiqəliyə vaxtınızı alım.

Qadın məşğuliyyətindən ayrılmadı. Ona müraciət edənə başını qaldırıb, heç gözucu da baxmadı. Rəsmiyyətlə:

– Buyurun, eşidirəm, – dedi.

Əfsun sinəsini qabağa verdi. Asta səsini xeylicə ucaldıb, ona lazım kitabın adını və müəllifini söylədi.

Göyçək qadın işindən yenə də ayrılmadan başını buladı, kitabın yoxluğunu işarətlə bildirdi.

Əfsun yalvarışlı təkidlə:

– Ümidim, bütün gümanım bircə sizədi, xanım, – dedi. – Əliboş qaytarmayın məni. Sizə zəhmət də olsa, axtarın o kitabı, vacibdən-vacib lazımdı... Çox xahiş eləyirəm.

Qadın soyuq dilləndi:

– O kitabın adını birinci dəfədi eşidirəm, çətin ki, bizdə olsun.

Əfsun təkidini ciddiləşdirdi:

– Var o kitab sizin fondda. Yəqin bilirəm, var.

Qadın işini saxladı. Qəddini dikəldib, inadkar oxucuya heyrətlə, eyni zamanda da narazılıqla baxdı:

– Bu yəqinlik nədəndi sizdə? – soruşdu.

Əfsunun həniri batdı. Qadının sualı yox, gözəlliyi onun dilini-ağzını bağlamışdı. Al yanaq, yığcam ağız-burun, incə yatımlı-ətli dodaqlar, qüdrətdən çəkilmiş dümqara, qövsşəkilli qaşlar, badamı gözlər, hər kim olsa, karıxdırar; ağlını başından alardı. Əfsun umsuq-umsuq kəkələdi:

– On... ondandı ki, siz çox xeyirxah qadına oxşayırsınız. O xeyirxahlıq sizin alnınıza yazılıb. Arzulardım ki, həmən xeyirxahlıqdan mənə də Allah payı düşsün.

Qadın nə üçünsə titrəşən kirpiklərini bir ara qovuşdurub, geniş açdı:

– Qəribə oğlansınız, – dedi. – Yox yerdən adamın boynuna minnət qoyursunuz.

Əfsun qadına heyranlıqdan tam ayılmamışdı. Durna boğazı kimi uzanaraq boyun, meydan tək geniş, mərmər hamarlığında bəmbəyaz sinə və nazik, ipək qoftanı xeylicə qabartmış yumruca məmələr diqqətini maqnit cazibəsi ilə çəkmişdi. Handan-hana:

– Əsla minnət qoymuram, – pıçıldadı. – İnamımı, qənaətimi deyirəm. Çöhrəsi gözəl olanın daxili də gözəl olur. Dərdimin yeganə çarəsi sizdədi.

Qadının işıqlı çöhrəsi kölgələndi. Gözləri çəplənib yana süzüldü. Əfsun fağırladı:

– Dönə-dönə üzr istəyirəm. Sözlərim, deyəsən, şit səsləndi. Hiss eləyirəm, xətrinizə dəydi. Pis mənaya yozmayın, həyəcanlıyam. Bir tərs professorun çənginə ilişmişəm. O kitabı tapıb oxumasam, ordan müəyyən qeydlər götürməsəm, vayımı verəcək.

Qadının üzündən əsəb kölgəsi azacıq silindi:

– O professor belə çətin adamdı? – soruşdu.

– Çətindən də çətindi! – Əfsun işinin düzəlməsi xatirinə professoru lap əzazil qələmə verdi: – Qiymət yazmaqda Hacı Qaranın sağ əlini kəsib, qoynuna qoyub. Ondan müsbət qiymət alınca, adamı o dünyaya aparıb qaytarır.

Qadın incə-incə qımışdı:

– Belə şikayətləri çox eşidirik. Tələbələr öz tənbəlliklərini, pis oxumaqlarının təqsirini müəllimlərinin üstünə yıxmağa çalışırlar.

Əfsun, yeri gəlmişkən, öyünməkdən özünü saxlamadı:

– Mən o əfəl tələbələrdən deyiləm, yaxşı oxuyuram. Əlaçıyam!

– Həə?! – Qadın inamsızlığını səsini uzatmaqla bildirdi.

– Bu ölsün! – Əfsun üzünə yüngül şillə çəkdi. – Nə üçün inanmırsınız? Gop eləmirəm, düzünü deyirəm. Lap birinci kursdan "beş"lə oxuyuram. Heç bir dənə də "dörd"üm, nə də "üç"üm yoxdur. Bütün müəllimlər başıma and içirlər. Təkcə bu professordu mənimlə gözyağı yeyən. Hey sınağa çəkir, qənşərimə kötük dığırlayır. Nə olar, qoy bildiyini eləsin. Mən də mənəm. Heç bir müəllim, professor, dosent qarşısında gözükölgəli qalmamışam. İnşallah, bu sınaqdan da alnıaçıq çıxaram. Əlbəttə ki, sizin köməyinizlə.

Qadının qaşları dartılıb, qırışsız alnının ortasına qalxdı. Bu, oğlanın müştəbehliyindən ikrahlıq ifadəsi idi. Üzünü yana çevirdi. Qulaqlarındakı bahalı sırğalar astaca tərpənərək çənəsinin altını ildır-ildır şölələndirdi.

Əfsun sırğaların çənəaltı şöləsini maraqla izləyə-izləyə səsini sızıldatdı:

– O bir olan Allaha, əzizlərinizin şirindən-şirin canına, ölənlərinizin urfuna and verirəm, məni məyus eləməyin. Sorağını alıb gəlmişəm, o kitab var sizin fondda. Kitabxananıza üzv olanlar deyirlər bunu. Bir neçələri oxuyublar onu.

Qadın yalvarışlara etinasız qala bilmədi. Könülsüz-könülsüz ayağa durdu:

– Yaxşı, gözləyin. Gedirəm axtarmağa.

– Çox-çox minnətdaram... Gedən ayaqlarınıza daş dəyməsin!

Qadının bədən quruluşu da olduqca cazibədar idi. Qılçaları düz, ətli, qəməti uca, beli isə incə. Yalançılar sözü, iynənin deşiyindən keçərdi. Elə bilərdin, ilahinin xüsusi qəlibində hazırlanıb.

Əfsunun ağzı açıla qaldı. Qadın nazlı-nazlı çönüb xırda qədəmlərlə ipçin kitab tərəcələrinin arası ilə uzaqlaşanda, Əfsun məftun, qırpımsız nəzərlərlə onu gözdən itirincə müşayiət etdi. Gənc bədən ustufca ləngərləndikcə, əynindəki darısqal, mixəyi don altından bel-buxunu oyur-oyur oynadı. Hayıl-mayıl Əfsun yanğılı, sinədolusu ah çəkdi. Bunun dalınca da beynində dəlisov bir fikir şimşəyi çaxdı: "Əcəb candərmanı canandı! Görəsən, hansı bəx-

təvərin arvadıdı?.. Kaş o xoşbəxt Allah bəndəsinin yerində bircə gecəliyə mən olaydım...”

Ahı təkrarlandı. O biri dirsəyini də arakəsmə taxtasına dirədi, sağ əlini üzünə söykəyib, qadının qayıtmasını həsrətlə gözləyə-gözləyə, qəti qərara gəldi: “Gərək girişim bu xanıma. Keçməli şey deyil. Bəlkə bəxtim gətirdi, toruma ilişdi. Axı, niyə də ilişməsin? O, qənirsiz gözəldirsə, mən də heç pis oğlan deyiləm. Sifətcən bir az qarayamsa, başqa cəhətlərdən ciddi bir eybim, yar-yaraşıq qüsurum yoxdur. Hamı mənə suyuşirin oğlan deyir. Xalq arasında məsəl də var: “Qara kişmiş daha dadlı olur”. Bir də ki, gözəllərin çoxunun əri qarabuğdayı kişilərdi. Həyatda beləlırini az görməmişəm. Hə, gərək mütləq sınayım bəxtimi. Necə deyərlər, tutar qatıq, tutmaz ayran. Məndən nə gedir? Bəd ayaqda üzr istəyərəm, günahımdan keçilər”.

Qadın gec qayıtdı. Aralıdan Əfsunu muştuluqladı:

– Bəxtiniz varmış, kitab tapıldı!

Əfsun məmnun-məmnun təzim etdi:

– Oy, lap sevindirdiniz məni. Çox sağ olun! Yüz yaşayın! Hər diləyinizə yetin!

Qadın əvvəlki yerinə keçib sakitcə əyləşdi. Sənəd istədi. Əfsun tələbə vəsiqəsini irəli uzatdı. Qadın rəsmiyyətlə:

– Pasportunuz lazımdı, – dedi.

Əfsun inciklik büruzə verdi:

– Mənə inanmırsınız?

Qadın sərt danışdı:

– Qanun belə tələb edir!

Əfsun küskünlədi. Sanki qadınla çoxdan tanış idi, ona ərki çatırdı.

– Qəribə zəmanədə yaşayırıq. İnsanların bir-birinə inamı, etibarı qalmayıb...

Qadın təəccübləndi. Bu ərk, bu küskünlük tanımadığı oğlanda nədən idi? Ona nüfuzedici diqqət yetirdi.

Həmən anda Əfsunun da ovunu gözaltılamış qartal nəzərləri qadına zilləndi. Baxışlar çarpazlaşdı. Qadının sürməli kirpikləri qəribə şəkildə titrəşib, tezcə çəpərləndi. Göz giləl əri isvaha qapaqları altında narahat-narahat qımıldandı. Və özü də rahatsız oldu:

– Cəld olun, vaxtımı almayın!

Əfsun söz güləşdirmədi. Qaş düzəltmək istədiyi yerdə, vurub göz tökərdi. Qadın ondan pasportu alıb, kitabı arakəsmənin üstünə qoydu. Ciddi-ciddi tapşırdı:

– Kitabla səliqəli davranın, yeganə nüsxədir.

– Baş üstə! Göz bəbəyim kimi qoruyaram! – O, bunu qımışa-qımışa deyib, əsas məqsədə keçid düşündü. Lakin məqsədi baş tutmadı. Qadın tələm-tələsik yığışıb harasa getdi.

Əfsun bir xeyli məyus-məğmun dayandı. Sonra heysiz hərəkətlə kitabı qoltuğuna vurub, oxu salonuna adladı. Lap axır cərgədəki masaların birində, süst halda əyləşdi. Kitabı ləng-ləng açıb, oxumağa başladı. Gözləri sətirlər arasında gəzsə də beyninə heç nə girmədi, yalnız gənc qadın haqqında düşündü. Ovsunlu xəyal aynasında onun yerişi, duruşu, baxışı canlandı. Arada iki dəfə qalxıb qeydiyyat arakəsməsinə yönəldi. Qadınla yeni söhbətə fürsət güddü. Cəhdi alınmadı. Onun yerində ayrı, nisbətən yaşlı qadın gördü. Gözləri dağlandı. Bir sözlə, o gün nə kitabdan bəhrələnə bildi, nə də könül sevdasından yarıdı. Kitabı təhvil verəndə öyrəndi ki, gənc qadın iş növbəsini bitirib, evinə getmişdir...

## 2.

O, ertəsi gün də dərsdən sonra Mərkəzi Kitabxanaya gəldi. Gənc qadını öz yerində tapdı. Ürəyi toxtadı. Yaxınlaşıb şad-xürrəm salamlaşdı. Ordan-burdan söz salıb, arada mehribançılıq yaratmağa çalışdı. Cəhdi bir nəticə vermədi. Qadın özünü dünənkindən də rəsmi və ciddi apardı.

Əfsun bunu qəlbinə dərd yükü eləmədi. Məqsədinə çatmağın heç də asan olmayacağı ona qabaqcadan yəqin idi. Bunun üçün daha önəmli fəndlər, üsullar işlətmək lazım gələcəkdi. Qadınla istədiyi ünsiyyəti qura biləcəyi qeybdən beyninə yeridilmişdi; dəqiq qənaətə çevrilmişdi. Odur ki, ürəyini buz kimi saxladı: "Mısmırığını qoy nə qədər sallayır-sallasın; özünü ciddidən də ciddi aparsın, heç vecimə deyil, əvvəl-axır yumşaldıb muma-şama döndərəcəm. Hər cəfaya tab gətirəcəm. Nəyin hesabına olur-olsun (lap ölümüm bahasına) qovuşacam ona. Mütləq qovuşacam! Dün-

ya dağılsa da əl çəkməyəcəm. Həyatda beş gün yaşayıramsa, əsl insan kimi yaşamalıyam. Umsuq-umsuq baş girləməkdən, zövqü-səfadan məhrum yüz il yaşamaqdansa, elə o beşcə günün ləzzəti bəsimdi" – düşündü.

Daha ara-bərədə tüyünmədi. İradəsi möhkəm idi. Tədbirli tərpəndi. Gənc qadının kitabxanadan günün hansı vədəsi çıxdığını, hansı küçə ilə evə yollandığını, nəqliyyatdan istifadə edib-etmədiyini qıraqdan-qırağa dəqiqləşdirdi və əsas işini də unutmadı. Bəzi yelbeyin cavanlar kimi, bütün vaxtını eşq-məhəbbət qovğalarına qurban vermədi. Çətinliklə tapdırdığı kitabdan "Kurs işi" üçün vacib məlumatları, müddəaları, fikirləri ayrıca dəftərə yazıb götürdü. Necə deyərlər: həm ziyarətini elədi, həm də ticarətini.

Aradan dörd gün ötdü. İşlərini sahmana salmış Əfsun Zamanlı axşama yaxın gəlib, kitabxananın çıxış qapısının qaranlıq bir küncündə gizləndi. Qadının marığına durdu. Qadın içəridən tək çıxmadı. Başqa bir həmkarı ilə şirin söhbət edə-edə, deyib gülə-gülə Əfsunun böyründən səkiyə adladı. Əfsun yanıb-yaxıldı. Başqa qadını ürəyində söydü, yamanladı: "Bu köpək qızı lap qır-saqqızdı. Çənəsini boş qoyub hey söz üyüdür. Rədd olub aralanmayacaq ki, mən də beş-üç kəlmə kəsim; kefini soruşum, əhval tutum. Dərdimi ona balabanla anladım".

Lakin babal yumağa dəyməzmiş. Başqa qadın küçədə xudahafizləşib, əks istiqamət götürdü. Gendən-genə onları izləyən Əfsun fürsəti ötürmədi. Gözaltısını küçənin münasib yerində – gediş-gəliş seyrəkliyində xapa-xapdan yaxaladı:

– Axşamınız xeyir!

Qadın hürkdü, yana çəkildi.

Əfsun ədəbli davrandı:

– Bağışlayın, hərəkətim bir az kobud alındı. Sizi qorxutdum... Çox-çox üzr istəyirəm.

Gözləri geniş açılmış, bənizi qaçmış qadın onu çəp, narazı nəzərlə süzdü. Dillənməyib, addımlarını yeyinlətdi.

Əfsun dala qalmadı. Qadının sağ tərəfinə keçib, şaqraq və mehriban səslə:

– Ehtiyatlanmayın, – dedi. – Mən sizə zəhmət verib, çətin tapılan kitabı istəyən oğlanam... Diyəsən, tanımadınız.

Qadın addımlarını xeyli yavaşıtdı. Başını bekarca qanırıb baxdı, dodaqucu gülümsədi:

– Hə, indi tanıdım... İşləriniz necədi?

Əfsun sevindi. Qadının gülümsəməsi qamaşığını açdı:

– İşlərim əladı! Hər şey qaydasındadı.

– Professorla aranız düzəldimi?

– Hələ düzəlməyib. Çünki kurs işimi yazıb qurtarmamışam. Ancaq ümid eləyirəm ki, düzələcək. "Kurs işim" mütləq xoşuna gələcək. Yağlıca bir "sağ ol"unu qazanacağıma əminəm.

Qadın susdu. Dodaqlarındakı həlim təbəssüm söndü. Oğlanın öyüncəkliyindən yenə razı qalmamışdı.

Əfsun təlaşlandı. Söhbətin kəsilməyini istəmirdi. Dilinə güc verdi:

– "Kurs işi"min gələcək müvəffəqiyyətinin səbəbkarı ilk növbədə sizsiniz. Professordan alacağım "sağ ol"un böyük qismi sizin payınıza düşür. Əgər siz zəhmət çəkib o kitabı mənim üçün tapmasaydınız, təsəvvür eləyin, necə yazıq hallara qalacaqdım. Professorun açıq-açığına rişxənd hədəfinə çevriləcəkdim. O biri yandan da üçillik əlaçılıq əməyim hədər gedəcəkdi. Bu mənə həm maddi, həm də mənəvi zərbə olacaqdı. Durub-oturub sizə alqış eləyirəm. Tanrıdan uzun ömür, möhkəm cansağlığı diləyirəm. Təşəkkürüm bitib-tükənməzdir.

Qadın başını ehmal-ehmal tərpətdi:

– Təşəkkürə dəyməz, – dedi. – Kitabxanamıza üz tutub gələnlərə kömək etmək, qayğı göstərmək bizim xidməti borcumuzdu. Xüsusən də tələbələrə.

– Siz nə danışırsız?!.. Necə yəni təşəkkürə dəyməz?!.. – Əfsun coşdu, çağladı. – Təşəkkür sizin haqqınızdı. Ana südü təkin halalınızdı! Bunu bilməsəm, onda gərək mən heyvərənin-heyvərəsi olum, zırramalar, qanmazlar şahzadəsi adını daşıyım. İnsana əskiklik gətirən o biabırçı adı özümə yaraşdırmaram!

Qadın heç nə deməyib, yerişinin sürətini yenidən artırdı. Əfsun addımlarını onun addımları ilə qoşalaşdıraraq mətləbə keçdi:

– Sizə balaca bir hədiyyəm var. İcazə verin onu təqdim eləyim.

– Nə hədiyyə? – qadın əsəbi soruşdu.

– Fransız ətridi.

– Mənə heç bir hədiyyə gərək deyil, ehtiyacım yoxdur!

– Özgə mənaya yozmayın. Təmənnasız hədiyyədi. Mənə böyük yaxşılığınızın kiçik əvəzidi.

Qadının çiyinləri silkələndi. Göyçək sifəti turşudu:

– Dedim ki, mənim heç bir hədiyyəyə ehtiyacım yoxdur. Hər şey varımdı.

Əfsun üzə durdu:

– Hədiyyə ehtiyacın olub-olmamasına baxmır. Könül xoşluğu üçündür.

Qadın bir az da əsəbi danışdı:

– Mənim könül xoşluğuna da ehtiyacım yoxdur!

Əfsun küsəndi:

– Siz məni təhqir eləyirsiniz... Belə çıxır ki, adam yerinə qoymursunuz. Tələbə olanda nə olar? Qanacağıma nə gəlib?!

Qadın yumşalmadı. Yolunu dəyişib, daha da ciddiləşdi:

– Burdan belə dalımca gəlməyin. Məni tək qoyun! – dedi.

Əfsun sırtıq-sırtıq irişdi.

– Baş üstə, gəlmərəm. Ancaq bu şərtlə ki, hədiyyəmi götürəsiz. Ayrı cür mümkün deyil.

Qadın çarəsiz qaldı. Əfsun vaxt itirmədi. Qadının özü tərəfdəki əlini qəfil qamarladı. Barmaqlarını zorla aralayıb, hədiyyəsini onun ovcuna basdı. Və fürsətdən istifadə edib, pambıq kimi yumşaq ələ sığal çəkdi.

Qadın təlaş içində yan-yörəyə boylandı. Tələsik minnətdarlıq etdi:

– Payınız çox olsun!

Əfsun rahat nəfəs dərdi:

– Halal xoşunuz olsun!

Qadın tələm-tələsik uzaqlaşdı.

Əfsun sözünə əməl edib, ayaq saxladı. Qadının arxasınca heyran-heyran baxıb, özünə təsəlli verdi: “Məqsədimin başlanğıcı pis alınmadı. Hədiyyəmi işə keçirə bildim. Bunun özü də qələbədi. Böyük qələbəmi isə, inşallah, yaxın günlərdə bayram eləyərəm...”

**3.**

Aradan üç gün yenə ötdü. Əfsunun dərslərə başı bərk qarışdığından kitabxanaya yolu düşmədi. Belə darmacal gözə görünməyi

özü də istəmədi. Bu da bir fənd idi. "Eşq əməliyyatı" üçün beynində planlar cızırdı. Kitabxana həndəvərində gündüz veyillənmək ona əl vermirdi. Birbaşa həmləyə keçməyi, qadını mütləq ram etməyi qəti qərara almışdı. Bunun üçün əvvəlcədən uyğamlı yer də seçmişdi. Bura qadının evə getdiyi yolun yaxınlığında, iri ağacların əhatəsində get-gəldən aralı, xəlvət bir künc idi. Qadını birtəhər dilə tutub həmən küncə apara bilsə, qalan məsələlər çəm-xəmsiz düzələcəkdi.

O, bələdlədiyi yerə vaxtından yarım saat qabaq gəldi. Qadının bu gün evə haçan gedəcəyini dəqiq öyrənmişdi. Onun başını söz-gapla qatıb, nəzərdə tutduğu xəlvət küncə hardan, necə aparacağını bir daha ölçüb-biçdi. Hətta araya hansı söhbətləri salacağını, nələr deyəcəyini də zehnində nizama düzdü. Gözləri isə qadının gələcəyi yola zilləndi. Ürəyinin intizarlı döyüntüləri anbaan gücləndi.

Qadını uzaqdan-uzağa, nazlı yerişindən tanıdı. Qənşərinə getdi. Kələk qurub, özünü elə göstərdi ki, guya təsadüfən rastlaşırlar:

– Ohoo, nə gözəl, nə xoş təsadüf! Necə gözlənilməz qarşılaşma!.. Son dərəcə şad oldum bu qəfil görüşə. Kefiniz, əhvalınız? İşinizdə, evinizdə salamatlıqdımı?

O, bu bəlağətli sorğu-suallarla əl tutuşmağa cəhd göstərdi. Keçən dəfəki təmasdan xüsusi ləzzət duymuşdu. İndi o təması daha yaxşı təkrarlamaq, yumyumşaq əli ovucunda möhkəm tutub oxşamaq xəyalına düşdü. Qadın imkan yaratmadı.

Əfsun xantamah qalmağını vecə almadı. Təzə hay-küy başladı:

– Ürəyiniz çox düzdü, tərtəmizdi! Lap elə indicə, heç bir dəqiqə də olmaz, könlümdən möcüzə bir istək keçdi. Sizə rast gəlməyi arzuladım. Qurban olduğum Allah diləyimi eşitdi, qıymadı sizdən intizarlı qalım.

Qadın dinib-danışmadı. Sakit-sakit ayaqlarının ucuna baxdı. Ortaya sükut çökdü.

Əfsun darıxdı. Bu sükut işin xeyrinə deyildi. Məhrəm ünsiyyətə tələsdi:

– Bayaqdan bəri çaşbaşam, adınızı bilmirəm ki, səmimi söhbətə başlayım. Xahiş eləyirəm adınızı bağışlayın mənə.

Qadın istər-istəməz qımışdı:

– Adımı sizə bağışlayım, özüm adsız qalım?

Əfsun bu məzəli məzəmmətə əvvəlcə pıqqıltı ilə güldü. Sonra da uşaq kimi şitəndi:

– Elə yox ha, adınızı sadəcə, bilmək istəyirəm.

– Bu, belə vacibdi?

– Əlbəttə, vacibdi! Adınızı bilsəm, çox məmnun olaram.

– Buna ehtiyac duymuram.

– Siz duymasanız da mən duyuram. Həqiqi tanışlıq mənim üçün çox vacibdi.

Qadın ciddiyyətini pozmadı.

– Zənnimcə, salamlaşmaq kifayətdi, – dedi.

Əfsun israrla:

– Yox! – dedi, – kifayət deyil. Tanış – tanışının adını mütləq bilməlidir. Bu ümumi qaydadır. Gəlin qaydanı pozmayaq.

Qadın boynunu yana əyib, kirpik çaldı. Əfsun bunu işin xeyrinə yozdu. İsrarında möhkəmləndi:

– Nolar, acizanə rica eləyirəm. Daşı ətəyinizdən tökün. Qorxmayın, buna görə dünya dağılmaz!

Qadın çönüb, oğlana bekaraca nüfuz etdi. Sanki onun daxilindən xəbər tutmaq istəyirdi. Dodaqları gecdən-gec qımıldandı:

– Durnadı adım.

Əfsun şadlığından qıy çəkdi:

– Deməli, Durna xanım! Əladı!.. Özünüzə yaraşan addır. Afərin bizim valideynlərimizə. Uşaqlarına ad seçməkdə yanılmırlar. Sizə ən gözəlini seçib qoyublar.

Qadın utandı. Əfsunu pərt-pərt qınadı:

– Sakit danışın. Biz küçədəyik.

Əfsun hay-küyünü xırp kəsdi, peşmanladı:

– Keçin günahımdan, Durna xanım. Bir qələtdi elədim... Hədsiz sevinəndə hisslərimi cilovlamağı bacarmıram. Kəndçi balasıyam, neyləyim? Şəhər dəbinə hələ alışmamışam. Ədəb qaydalarını lazımınca öyrənməmişəm.

Durna xanım qınağını bir qədər həlimlətdi:

– Mühitə alışmaq lazımdı, – dedi. – Böyük bir institutda oxuyursunuz. Dediyinizə görə, həm də qabaqcıl tələbəsiniz. Qabaqcıllar elmlə bərabər, mədəniyyət daşıyıcıları olurlar.

Əfsun dərsini aldı. Özünü yığışdırdı. Ancaq dilini dinc saxlamadı:

– Adınız, könlümə yaman yatdı. Heç bilirsiz, yadıma nəyi saldı? Məşhur bir şeiri. Molla Pənah Vaqiflə Molla Vəli Vidadinin "Durnalar" deyişməsini. Orta məktəbdə əzbərləmişəm o deyişməni. Hərdən özüm üçün zümzümə eləyirəm.

*Bir zaman havada qanad saxlayın,*
*Sözüm vardır mənim sizə, durnalar!..*
*Qatarlaşıb nə diyardan gəlirsiz!*
*Bir xəbər versəniz bizə, durnalar!*

Durna xanım səmimi təqdirlə:

– Şirin ləfsiniz var, – dedi. – Sizdən yaxşı qiraətçi çıxar.

Əfsun təqdiri könlündən keçən hədəfə yönəltdi:

– Yaxşı qiraətçi ola biləcəyimi deyəmmərəm, amma sadiq dostluğu bacaracağıma əminəm... – O, birdən tövşüməyə başladı. Sinəsi tez-tez körükləndi. Qəribə tələsgənliklə "sən" ifadəsinə keçdi: – Mehribanım Durna xanım, sənə yüz faiz də yox, min faiz söz verirəm, nəyə desən and içirəm ki, dostluğumuz ölüncəyədək pozulmayacaq. Bu dostluq yolunda hər cür əziyyətə, ən dəhşətli əzablara hazıram. Sidqən inan mənə!

Durna xanım oğlanın and-qəsəminə ürəyində rişxəndlə güldü: "Bu nə çərənləyir?!.. Hansı dostluqdan danışır?.. O hara, mən hara?.. Adi xoş üz göstərmək, bəyəm, dostluqdurmu?!"

Əfsun bir anda çönüb, geri yanına nəzər fırlatdı. Qabaqcadan bələdlədiyi yerə çatmışdılar. Yaxınlıqda heç kəs yox idi. Durna xanımı qəfildən, dəli hövlü ilə qucaqladı. Boynuna sarılıb, üzündən marçamarç öpdü. Heyrətdən donmuş Durna xanım (oğlandan belə cəsarət gözləməmişdi) özünə gələnə qədər Əfsun öpüşlərinə ara vermədi. Qadının döşlərinə də əl atdı. Durna xanım təəccüb qamaşığından ayıldı. Bütün gücü ilə çırpındı. Müdafiə oluna-oluna, qəzəb boğmuş xırıltılı səslə çımxırdı:

– Bu nə ədəbsizlikdi?! Burax məni, zırrama!!

Əfsun çılğınlıqdan ağlını itirmişdi, söz eşidəcək halda deyildi. Durna xanımdan qopmadı. Onu xəlvət küncə çəkməyə çalışdı. Durna xanım qışqırdı:

– Aç qollarını, tərbiyəsiz! Qanacaqsız kənd ayısı!! Elə eləmə ki, milisioner çağırıb həbsə aldırım.

Başına, üzünə, gözünə dəyən şillə-şapalaqlar Əfsunun çılğınlığını tədricən yatırtdı. Qolları boşaldı. Durna xanım ikrahla ondan aralandı. Üst-başını səliqəyə sala-sala ədəbsizi söydü:

– İt balası!.. Heyvan oğlu!! Vəhşinin vəhşisi!!

Əfsun peşmanlamamışdı. Əlini şillələnmiş üzünə sürtüb, fağır-fağır irişdi:

– Off, əlin nə yaman ağırdı sənin. Şillələrin ağrısı hələ də kəsmir. Vay halına sənin qapazların altına düşənin!

– Səni kimi alçağa bu da azdı! – Durna xanımın gözlərindən nifrət yağdı. Düzümü pozulub pırpızlanmış saçlarını ovcunun içi ilə səliqəyə salıb, çiyin çantasından yaylıq götürdü, üzünü (Əfsunun öpdüyü yerləri) dönə-dönə silərək, yenidən əsib-coşdu, Əfsuna barmaq silkələdi: – Sən eşşək qədər qanmaz bir məxluqsan! Yad qadına zor işlətməyin, onun namusuna təcavüz cəhdinin cəzası başa düşürsən, nədi?!

– Başa düşürəm. – Əfsun irsizliklə qımışa-qımışa cavab verdi: – Ya ömürlük sürgündü, ya da ölümdü! – O, bunları deyib başını irəli uzatdı. – Boynum qıldan nazikdi sənin qarşında. İstəyirsən kəsdir, istəyirsən asdır onu. Amma yalvarıram, ayaqlarına döşənib, aciz-aciz minnət eləyirəm qovma, murazımı gözümdə qoyma. Rədd olunmaq, murazı gözündə qalmaq hər cəzadan ağırdı mənim üçün.

Durna xanım daha da şiddətlənən qeyzindən dodaqlarını bir-birinə bərk-bərk sıxdı. Acığını soyutmağa əlavə söz tapmadı. Burnu ilə çətin-çətin nəfəs alıb fınxırdı. Sanki içindəki ağrı-acını çıxartdı. Əfsun ona qəzəbin söndüyünü zənn etdi. Sərbəst etirafa başladı:

– Mən sənin vurğununam, Durna xanım. Aşikarca dəli-divanənəm. Bir könüldən min könülə vurulmuşam. İlk dəfədən, kitabxanada görəndən bəri gecəm-gündüzüm yoxdu. Gözlərimi yumanda da, açanda da, gözəl simanı qarşımda görürəm. Xəyalımdan bircə an da çıxmırsan. Hər dəqiqə səni düşünürəm. Ağlımı itirmişəm. İndiki kobud hərəkətimə, sən demiş, vəhşiliyimə də səbəb budu... Özüm-özümlə bacarmıram. Mümkünsə, keç təqsirimdən.

Durna xanımın nazik qaşlarının bir ucu yuxarı dikləndi. Ürəyində nəsə dedi. Səsi eşidilməsə də, dodaqlarının əsəbi tərpənişindən həyasız oğlanı bir daha yağlıca söydüyü bilindi və yönünü sərtliklə

çevirib, getdiyi istiqaməti dəyişdi. Yerimədi, qılçaları dolaşa-dolaşa yüyürdü. Sanki qorxulu bir düşməndən qaçırdı.

**4.**

Durna xanımın uşağı olmurdu. On iki il idi ərə köçmüşdü, özü sevib-seçdiyi, hər cəhətdən könlünə yatan bir gənclə – Bəhlulla ailə qurmuşdu. Çox mehriban, bir-birinə qədərsiz qayğı ilə yaşayır, çoxlarının qibtə etdiyi bəxtəvər ömür-gün sürürdülər. Di gəl ki, övladsızlıq dərdi ürəklərini gizli-gizli qovururdu. Yaxın qonşu evlərindən uşaq gülüşü, körpə ağla-sıtqası bağırlarının başına od salırdı. Bu həsrətə çarə düşünürdülər. Neçə-neçə təcrübəli, adlı-sanlı ginekoloqların, ara həkimlərinin müayinəsindən keçmişdilər. Qüsur Durna xanımda tapılmışdı. Uzunmüddətli müalicə qəbul etmişdi, zəhər kimi acı dərmanlar içib, pəhriz saxlamış, çox təamlara tamarzı qalmışdı, müsbət nəticə alınmamışdı.

Bəhlul onu başqa şəhərlərə, daha məşhur bilicilər yanına da aparmışdı. Ən nüfuzlu mütəxəssislərə – alimlərə göstərmişdi, ətək-ətək pul xərcləmişdi, yenə də məqsəd hasil olmamışdı.

Sonsuzluq mərəzi Durna xanıma, bir qadın kimi, daha ziyadə əzab verir, dərin qüssələrə salırdı. Tay-tuşları iki-üç uşaq sahibi idilər. Bəzilərinin oğlu, ya qızı orta məktəbin yuxarı siniflərində oxuyurdular. Durna xanım onlara həsəd aparır; dərdi günü-gündən dərinləşirdi.

Axır zamanlar, yəni üç-dörd ildən bəri vəziyyət lap ağırlaşmış, ailədaxili münasibətlər son dərəcə gərginləşmişdi. Yaxın qohum-əqrəbadan, sözgəzdirənlərdən qulağına çatan qaxınclardan, tənə-təhnizlərdən, ibnəli atmacalardan yazıq canı cəzanə gəlmişdi. Bilmirdi neyləsin, başına haranın külünü töksün ki, qanqaraldan, ürək yaralayan iynə-sancaqlı söz-gaplardan xilas olsun. Özgələr bir yana, baldızları (Bəhlulun üç bacısı vardı) qollarını çırmayıb, dava-dalaş meydanına girmişdilər. Ordan-burdan eşitdikləri qaxıncların, qəsdli dedi-qoduların üstünə öz tən-töhmətlərini də artırıb evə gətirir; analarının, xüsusən də qardaşlarının qulağına çatdırır, doğub-törəməz gəlini boşatdırmağa çalışırdılar.

Bəhlulun anası geniş ürəkli, böyük səbirli, xanım-xatın ağbirçək idi. Hər ağzıgöyçək sözünə məhəl qoymur, qınaqları qulaq-

ardına vurur, təmkinlə dözürdü. Allah insaf qapısını açıb, onları bu nisgildən qurtaracağı ümidi ilə yaşayırdı. Pirə, müqəddəs ocaqlara gedib nəzir-niyaz verirdi ki, arzusu tezləşsin, müstəcəb olsun. Qızlarına da hər dəfə sərt təpgi ilə acıqlanırdı:

– Öz sözünüzü danışın, gəlinlə işiniz olmasın! Əl çəkin ondan. Çox yaxşı gəlindi. Onu qağanız da ürəkdən sevir, mən özüm də. Uşağı olmur deyin binəvanı çöləmi ataq? İnsafınız hanı sizin?! Dözmək lazımdı. Belə getməz. Pərvərdiyar günlərin bir günü bizi də sevindirər, inşallah!

Ananın sözündən çıxa bilmədilər. Onun səbrinə gizlində dodaq büzsələr də, üzərdə höcətə getmədilər. Hirs içlərini güvə kimi yeyə-yeyə bir neçə il də gözlədilər. Xeyri olmadı. Bacılar sözü bir yerə qoyub, yenidən çırmandılar. Qardaşlarına gücləri çatmadı (Bəhlul onları eşitmirdi. Durna xanımın əleyhinə danışanı dərhal susdururdu), ananı möhkəm sıxma-boğmaya saldılar:

– Daha bəsdi, ana! Nə qədər dözmək, gözləmək olar?! Aradan gör, neçə il keçir. Bu vaxtacan doğmayan, bundan sonra heç doğmaz. Qağamız onu aparmadığı yer, göstərmədiyi həkim qoymadı. Var-yoxdan çıxdı. Oğlunu ağıla gətir, başa sal. Yarıyaşına çatır, saçlarına dən düşməyə başlayır. Sabahkı gününə, ahıllıq çağına övlad, qolundan tutan oğul-qız lazımdı. Haçanacan əzizləyəcək o qatır cinsli qadını?! Sən anasan, hər şeyə, hər kəsə ixtiyarın çatır. Məsələni ciddi və birdəfəlik qoy. Tələb elə boşasın üstü bəzək, altı təzək gözəlçəni. Ömür-günü hədər keçir. Bir azdan saçı-saqqalı tam ağaracaq, qocalıq belini bükəcək, təzədən evlənmək gec olacaq. Sözünü kəskin de, qurtar bizi el qaxıncından!

Ananın da səbir kasası dolmuşdu. Dözümü tükənmişdi. Qızlarının təkid və təzyiqinə axır ki, boyun əyməli oldu. Və bir gün ana oğlu ilə üz-üzə dayandı:

– Bura bax, a bala, nə vaxtacan sən mənə dərd yükləyib vərəmlədəcəksən? – soruşdu.

Bəhlul anasının üzünə mat-mat baxdı.

– Sən nə danışırsan, ana? Bu nə sözdü? Mən heç o qələti, o qəbahəti eləyərəmmi? Sənin başından bir tük əskik olmasını istəyərəmmi?

– Anasının başından bir tük əysik olmasını istəməyən oğul bəs niyə məsləhəti eşitmir?

– Hansı məsləhətini eşitməmişəm, ana? Sənin hər sözün mənin üçün qanundu.

– Elədisə, sözüm sənnən ötəri qanundusa, keç arvadıyın başınnan. Burax getsin dədəsi öyünə.

Bəhlul başını aşağı saldı. İncikliklə xəbər aldı:

– Nə üçün, ana? Hansı pis hərəkətinə, yanlış davranışına görə göndərim onu dədəsi evinə? Sənə nə hörmətsizliyi, qanacaqsızlığı eləyib? Kimə nə yamanlığı keçib.

Ana səsinin cod, zabitəli ahəngini dəyişdi. Həlim-həlim dedi:

– Mən babal yuyammaram. Gəlin, insafən, pis gəlin döyül, lap yaxşı gəlindi. Qanacaxlı, mərifətdidi. Heç kəsə də pisdiyi, yamannığı keçməyib. Hamıyla dinc, mehriban dolanıb. Mənim özümün bir doğma ana təkin qulluğumda lazımınca durub. Xətrini də qızlarımnan artıx istəmişəm. Həmişə tərəfini saxlamışam. Qoymamışam bir adam ona güldən ağır söz desin. Amba... – Ana səsini qısıb, köksünü ötürdü. Kövrək-kövrək davam etdi: – Züryəti yoxdu, uşağa qalmır. Mən nəvə laylası çalmax həsrətindəyəm. Havaxdacan murazım gözümdə qalacax?!

Bəhlul zarafata saldı:

– Nəvələrinə nə gəlib, ana? Maşallah, sayı-hesabı itib. Layla çalmaqdan əldən düşübsən. Hərdən özün də bezirsən, dallarınca deyinirsən. Dinclik, rahatlıq axtarırsan.

– Onnar qız nəvələrimdi. Mən oğul nəvəsi tamarzısındayam!

– Fərqi nədi, ana? Nəvə elə nəvədi.

– Fərqi çoxdu! – Ana burada təzədən sözünü göyərtdi. – Qabağıma kötük dığırrama. Onun fərğini sən bilməzsən, cavansan. Vaxt gələr, annayarsan. İndilikdə eşit nə deyirəm. Yaşın az döyül, bir azdan qırxı haxlıyacaxsan. Onacan özgəsiynən ayilə qurmalısan ki, böyütdüyün uşağın bar-bəhərini görəsən. Ömrünnən-gününnən yarıyasan.

Bəhlul qaşlarını sıxıb, yerə baxdı.

– Mən onu bacarmayacam, ana.

Ana nəvazişlə, sığallı sözlərlə oğlunu dilə tutdu:

– Qadan-bəlan mənə gəlsin, ay bala, canım sənə sadağa. Demirəm ha, dava-dalaşla, qalmağalla göndər dədəsi öhdəsinə. Sülhnən, dil-ağıznan yola sal. Vəziyyəti olduğu təkin danış.

Annaxlı gəlindi, özü hər şeyi başa düşəcək. Görəcək ki, belə yaşamağın məynası-filanı yoxdu, xoşluxnan çıxıb gedəcək. Bəlkəm də ayrı ərə köçüb daha xoşbəxt yaşıyacax. Təki elə olsun, paxılı döyülük. İstəyirik sənciyəzdən əl çəksin.

Bəhlulun içi göynədi. Anasına qəti bir cavab verə bilmədi. O, Durna xanımı hədsiz dərəcədə sevirdi. Övlad üzünə ömürlük həsrət qalacaqları yəqinləşəndən sonra bu nəhayətsiz sevgiyə rəhm də qatılmışdı, sədaqəti polad kimi möhkəmlənmişdi. Durnanın hərdən-hərdən xəlvətə çəkilib, göz yaşı axıtdığını, qüssələndiyini gördükcə, ona həqiqi mənada canı yanır, məhəbbətinin üstünə bir insani qayğı, hüsnü-rəğbət də artırdı. Odur ki, anasına kobud cavab verməli oldu:

– Yığışdırın bu gərəksiz söz-söhbəti, ana. Birdəfəlik yığışdırın! Mən Durnanı boşayan deyiləm. Onun özü mənə oğuldan da, qızdan da əzizdi. Həyatımı onsuz təsəvvür eləmirəm. Bilirəm ki, gəlininə qarşı belə sərt münasibət sənə qızlarından – mənim istəkli bacılarımdan gəlir. Onlara tapşır ki, burunlarını lazım olmayan yerə soxmasınlar. Bu mənim son sözümdür!

Belə inadlı, qətiyyətli cavabdan sonra hamı qınına çəkildi. Anası da, bacıları da Bəhluldan küsdü. Münasibətlər soyudu.

Ana-oğul, bacı-qardaş inciklikləri il yarım davam etdi. Nəhayətdə təkidin, təpginin lazımsızlığını başa düşdülər. İki qəlbi bir-birindən ayırmaq cəhdinin nahaq iş olduğunu anladılar. Allah yanında günaha batacaqlarından, tanrı qəzəbinə tuş gələcəklərindən qorxdular. Qalmağalların bir daş altına, bir daş da üstünə qoydular.

– Əh, nəyimizə gərəkdi, babal qazanaq, qan-qarğış yeyəsi olaq! Bizdən demək idi, onu da yetərincə dedik. İnnən beləsini özü bilər, gözəlçəsi bilər. Başı da onun, başmağı da!

İki qəlb isə mübaliğəsiz bir idi. Bəhlulla Durna lap yeniyetməlikdən ilahi tellərlə bir-birinə bağlanmışdılar. Eyni kənddə dünyaya göz açmış, eyni məktəbdə oxumuşdular. Valideynləri həm simsar, həm də qapı bir qonşu idilər. Uşaqlıqları, demək olar ki, bir yerdə keçmişdi. Məktəbə də eyni gündə, eyni ildə getmişdilər. Aralarında çox cüzi yaş fərqləri vardı. Bəhlul Durnadan üç-dörd ay böyük idi.

Hər ikisi orta məktəbi fərqlənmə attestatı ilə bitirdilər. Ali təhsil almağa da qoşa yollandılar. Azərbaycan Dövlət Universitetinin ayrı-ayrı fakültələrinə imtahansız qəbul olundular. Bəhlul geoloqluq, Durna kitabxanaçılıq ixtisasını seçdi. Şəhər mühitində, ali təhsil müddətində də bir-birinə həyan oldular. Çox vaxt yeməklərini də birlikdə yedilər. Hara getsələr (dərsə, axşamlar bulvar gəzintisinə, kinoya, teatra, konsertə) yataqxanadan mütləq qol-qola girib, çıxırdılar. Kənardan baxanlar elə bilirdilər onlar ya evli, ya da nişanlıdırlar. Halbuki, rəsmiyyətdə hələ heç nə yox idi. Heç adaxlanmamışdılar da.

Lakin valideynlər məsələdən agah idilər. Orta məktəbin yeddinci-səkkizinci siniflərindən bu iki gəncin ruhi aləmində, könül dünyasında baş verənləri sezmişdilər. Bu məhəbbət cücərtilərinə nə oğlan, nə qız simsarları tərəfdən narazılıq bildirilməmişdi. Əksinə, qonşuluqları şirinləşmişdi. Balalarının gələcək xoşbəxtliyinə ürəklərində xeyir-dua vermişdilər. Gənclər bir-birinə çox yaraşırdılar. Hər ikisi ağıl-kamallı, ədəb-ərkanlıydı. Valideynlərə bunlardan artıq daha nə lazımdı?!

Məhəttəlçilik yalnız gənclərin ali təhsili tamamlamaq sarıdandı. Nəhayət ki, bu da sona yetdi. Bəhlulla Durna universitet təhsilini müvəffəqiyyətlə başa vuran ilin payızında toy məclisi quruldu. Yaxın qohumlar, dostlar-tanışlar bir gün, bir gecə yaxşıca şənləndilər, sevgililəri şahidlik zəmanəti ilə qovuşdurdular.

Bəhlulla Durna iki il rayonda, valideyn himayəsində yaşadılar. Hərəsi öz ixtisası üzrə rayon mərkəzində işə düzəldi. Sonra bu həyat tərzi onları qane salmadı. Bakıya köçməyi, şəhər sakini olmağı qərara aldılar. Orada irəli getmək, inkişaf etmək imkanları geniş idi. Hər ikisi universiteti "Qırmızı diplom"la bitirmişdi. İşlə dərhal təmin olundular. Bəhlulun burada dayısı yüksək vəzifədə çalışırdı, əli hər yerə çatırdı, onun da müəyyən qədər köməyi dəydi. Bir müddət kirayədə qaldılar, sonra Bəhlulun iş yerindən üçotaqlı mənzil aldılar. (Əlbəttə, "dayı"nın yenə də binagüzarlığı ilə). Bəhlul çox işgüzar, üzüyola idi. Tapşırıqları, öhdəsinə düşən işi səylə, səbatla yerinə yetirirdi. Daim diqqətdə idi. Ona görə də ildən-ilə irəli getdi, vəzifəsi böyüdü. Yaşam tərzləri daha da yaxşılaşdı. Heç nədən korluq-darlıq çəkmədilər. Amma o mənhus məsələyə – sonsuzluq dərdinə çarə tapılmadı ki, tapılmadı...

Bəhlul Ağazadə təbiətən sakit, iradəli və bir qədər də soyuqqanlı adam idi. Evindən uşaq səsi gəlməməsi onu az narahat edirdi. Başını idarə, vəzifə iş-gücləri çox qatırdı, şəxsi həyatı barədə düşünməyə, demək olar ki, vaxtı qalmırdı. Səhər tezdən durub, ayaqüstü çay içib, üç-dörd loğma çörək yeyib, xidməti maşınına əyləşir, işə yollanır; gecədən xeyli keçmiş, yorğun-arğın evə qayıdırdı. Fərdi qayğılarını, könüllü olaraq, təşkilat-vəzifə başqarışdırmalarına qurban vermişdi. Nə uşaq yadına düşürdü, nə ailə dərd-səri.

Durna xanım öz qəm-qüssələri, nisgilləri ilə həmişə tək idi. Kitabxanada bir az ovunsa da, dərdini bir neçə saatlığa unutsa da evə dönüb, soyuq divarlar arasına düşən kimi, özünə qapılır, xəyallanır, xiffətlənirdi. Uşaqsızlıq canını sıxır, ürəyini oda tutub qovururdu. Bəhlul bir neçə dəfə gəlib onun hönkür-hönkür ağladığını görmüşdü. Səbəbini bilincə, zarafata başlamışdı. Möhkəm-möhkəm qucaqlayıb divana yıxmış, qoltuqlarının altını, yan-yançaqlarını qıdıqlayaraq, “üç telli”sini (lap çoxdan, ilk gənclikdə eşqlə aşıb-daşan çağlarından onu “üç telli durnam” çağırırdı. Məşhur bir xalq mahnısını zümzümə edirdi) güldürməmiş, kefini açıb şənləndirməmiş əl çəkmirdi. Axırda da inamlı öyüd-nəsihətlə:

– Könlünü heç bir zərrə də sıxma, mənim üç telli durnam, – deyirdi. – Möhkəm ol, nahaq yerə dərdlənmə, qəm-qüssəyə batma. Bu, bəndəlik iş deyil, ilahinin fərmanı belədi. Çox yəqin ki, bizi sınağa çəkir. Əhdimizə vəfamızı yoxlayır. Eşqimizə sadiqliyə inananda bizi bu nisgildən mütləq qurtaracaq, övlad payımızı verəcək. Odur ki, ümidini heç vaxt üzmə, yüzə dözən, yüz birə də dözməlidi. Biz gərək bir-birimizə sədaqətimizi Tanrımıza sübut eləyək!

Durna xanım Bəhlulun qılığından xoşhallanır, onun dediklərinə ümid bağlayır, taleyin hökmü ilə üzərdə barışır; ağla-sıtqasını dayandırırdı. Ancaq daxilən qan-yaş tökməkdə davam edirdi.

Bu minvalla nə az, nə çox on iki il keçdi. Dumanlı ümidlər, nikbin fərzlərlə ömür-gün sürdülər. Doğmaların təkidlərinə, yadların iftiralarına tab gətirib, vəfalarına dönük çıxmadılar. Bəhlulun heç bir təsir altına düşməməsi, hər cür təzyiqə sinə gərməsi Durna xanımın təsəllisini, ilğımlı xoşbəxtliyə inamını artırdı. Nisgilini ona xeyli dərəcədə unutdurdu. Belə davam etsəydi, bəlkə də ömürlərini

elə bu sayaq başa vuracaqdılar. Nə yazıq ki, "şeytan törəməsi" Əfsun Zamanlı şəppə-xeyir peyda oldu...

## 5.

Durna xanım özünə çox gec gəldi. Üzləşdiyi hadisə ona dəhşətli yuxu kimi göründü, yolu gedə-gedə haldan-hala düşdü. Gah təlaş hirsini, gah da hirs təlaşını üstələdi. Xəcalət ağır daşa dönüb boynundan sallandı. Bu vaxta qədər heç bir yad kişi onu qucaqlamaq, öpmək nədi, heç əlinə də toxuna bilməmişdi. Onun gözəlliyinə tamahı düşənləri, sino gedənləri ciddi qaş-qabağı, sərt görkəmi ilə yerlərində fas-farağat oturtmuşdu. İşdə də, küçədə də ona yaxınlaşmağa bir kəs cəsarət etməmişdi. İndi bu biabırçılıq nə sayaq törəmişdi? Necə olmuşdu ki, Bəhlulun ayağının tozu da saymadığı sarsaq bir oğlan, sərbəstlik qazanmışdı? Onu xapa-xapdan qucaqlayıb öpməyə, ora-burasına əl atmağa macal tapmışdı? O abırsız hərəkətlərə şərait nədən yaranmışdı? Kənd zırraması ilə o nə söhbət idi küçənin ortasında başlamışdı? Ağlını niyə oğurlatmışdı?.. Suallardan sual doğur, dolaşıq fikirlərdən beyni çatlayırdı.

Durna xanım evə, sərxoş adam vəziyyətində, qılçası-qılçasına dolaşa-dolaşa, çox heysiz çatdı. Həyadan üzünü örtmüşdü. Gözü ayaqlarının altını zorla seçirdi. Ona elə gəlirdi ki, öpüşlərin üzündə izi qalıb, qabağına çıxan tanış-bilişləri bunu sezəcəklər.

Çantasından açarı əlləri titrəyə-titrəyə çıxartdı. Qapını çətinliklə açdı. İçəridə də toxdaya bilmədi. Hirsi bala-bala sönmək əvəzinə bir az da gücləndi. Çiyin çantasını ümumi otaqdakı divanın bir küncünə tullayıb, o biri otağa adladı, Əfsunun hədiyyəsini trimo tumbasının üstünə, öz əşyalarının yanına qoymuşdu. Yaxşılığının mükafatı kimi qiymətləndirmişdi. Cumub onu götürdü. Pəncərəni açıb küçəyə fırlatdı. Asfalt döşəmədə çiliklənən şüşənin səsindən bir xeyli daxili rahatlıq duydu. Təskinliklə pıçıldadı: "Əclafın hədiyyəsi, bax, beləcə urvatsız edilməlidi! Ona mənim əşyalarım içində yer ola bilməz. Rədd olsun ətri də, özü də! Qadam ağzına".

İrsiz oğlanı daha acı, daha lənətli sözlərlə söymək, ürəyini tam boşaltmaq istədi. Qəribədir ki, istəyi alınmadı. Bayaq Əfsunun üzünə söylədiyi həqarətli, bir batman balla udulmayan kəlmələri indi

dilinə gətirə bilmədi. Ağır təhqirlər, ilik çapan söyüşlər qəhətə çəkildi. Nə üçün? Hansı səbəbdən? Baş açmadı. Buna qadınlıq isməti, həyasımı qadağa qoyurdu? Axı, söyüncə, qaxınca adətkər deyildi.

Yataq otağına keçdi. Paltarını dəyişmək istədi. Ona da hövsələsi çatmadı. Arxası üstə çarpayıya uzandı. Əllərini başaltı eləyib, xeyli tərpənmədi. Gözlərini tavana zillədi, xəyal aynasında zırrama oğlanın ədəbsiz hərəkətləri canlandı. Biabırçı əhvalatın baş verməsində təkcə zırramanı yox, özünü də günahlandırdı. Mədəni davranışı, yumşaq rəftarı ilə "vəhşini" şirnikdirdiyinə görə acı təəssüf ürəyinin başına göynərti saldı: "Öz gözümdə yekə tiri görmürəm, özgə gözündə kiçik tük axtarıram!.. Bir soruşan gərək, ay ağlı püf, yelbeyin, sadəlövh qadın, nə üçün alırdın onun düşük hədiyyəsini? Yaxşı tanımadığın əclafa niyə xoş üz göstərirdin, yalvarışına sıyılırdın? İndi çək cəzanı! Hələ üzüsulu qurtardın. Daha pis, daha biabırçı hadisə törəyə bilərdi. Onda neyləyərdin?!"

Qəzəbi kükrədi. Əllərini başının altından çıxardıb, yumruqlarını bərk-bərk düydü, dizlərinə çırpdı, heyfsindi: "Nahaq, çox nahaq yerə milis çağırıb o zırrama köpək oğlunu tutdurmadım. Qabaqkəsən xuliqan kimi dama basdırmadım... Ehh, budur mədəni davranışın, səmimiyyətin acı nəticəsi!.."

Vaysındı. Dönə-dönə, dərin-dərin köks ötürdü. Təsəllisini təmkində tapdı: "Heç eybi yoxdu, keçmiş ola. Bir də üzünə salıb mənə yaxınlaşar, qabağımı kəsər, verdirərəm vayını!.. Durnanı əfəl, üzüyola tanıyıb... Ay özün öləsən!.."

Elə bununla da toxtadı. Qalxıb paltarını dəyişdi. Mətbəxə keçdi. Qaz plitəsini alışdırıb, çay qaynatdı, xörək hazırladı. Bəhlulun işdən qayıtmasını böyük səbirsizliklə gözlədi. Ayrı vaxtlar heç bu qədər darıxmazdı. Gözü yolda, qulağı qapıda qalmazdı. Çay-çörək tədarükündən sonra sakitcə oturub Bəhlulun abunə yazıldığı qəzet-jurnalları vərəqləyər, xoşuna gələn yazıları oxuyar, bundan yorulanda da iç otağa gəlib, televizoru işıq xəttinə qoşar, maraqlı verilişləri izləyərdi. Ciddi sıxıntı keçirməzdi.

Bəhlul evə bir qayda olaraq, saat doqquzdan, onun yarısından tez gəlmirdi. İşdə ləngiməkləri çox olurdu. Bəzən bu ləngimələr saat on birə, on ikinin yarısına da çəkirdi. İki il idi Bakı şəhər partiya

komitəsinin ümumi şöbəsinə müdir təyin edilmişdi. İş başından aşırdı. Səliqə-sahmanlı xidmət üçün dəridən-qabıqdan çıxırdı. "Yaxşı işçi" imici qazanmışdı. Ara-bərədə söhbət gəzirdi ki, vəzifəsini bir pillə də artıracaqlar. Şad xəbəri eşidəndən bəri canını lap oda yaxırdı. Dəftərxanada hey eşələnirdi. O biri işçilər iş gününün axırında, əqrəb-əqrəb üstündə tələsik yığışıb, evlərinə gedirdilər. Heç bir dəqiqə də ayaq saxlamırdılar ki, ortaya qənbərqulu çıxar, əlavə tapşırıq verilər. Bəhlul isə birinci katibin (idarə başçısının) xidməti otağında işıq sönməyincə yerindən tərpənmirdi. Hətta azarlayanda – qış mövsümündə zökəm xəstəliyinə tutulanda da, yorğan-döşəkdə yatmağı, evə çaxılıb qalmağı xoşlamırdı. İşsiz darıxır, tıncıxırdı. Canı xırda-para sızıltılara, zoqqultulara dözə bilirdisə, sübh çağında yataqdan durub üzünü qırxır, yuyunur, təmiz köynək geyinib, ona uyğun qalstuk bağlayır; hər səliqə-sahmanı yerində idarəyə yollanırdı. Xəstəliyini bax, beləcə, ayaq üstə keçirirdi.

Təəccüb doğuracaq haldır ki, "üç telli"sinin qanı qaraldığı həmən mənhus axşam Bəhlul evə ertə gəldi. Durna xanımın heyrətini gözlərindən oxuyub, gəlişinin səbəbini qəribə sevinclə açıqladı:

– Əzizim, üç tellim, təəccüblənmə. Bilirsən ki, sabah böyük bayramdı. Ulu rəhbərimizin doğum günü münasibəti ilə bu axşam "Respublika sarayı"nda təntənəli konsert düzəldilib. Gəldim ki, konsertə səni də aparım. İki dəvətnamə almışam.

Durna xanım Bəhlulun sevincini bölüşmədi. Laqeyd:

– Mənsiz get. Həvəsim yoxdur, – dedi.

Bəhlul şən ovqatını dəyişmədi. Şirin qılıqla "üç telli"sinə üz vurdu:

– "Həvəsim yoxdu" demə, dərdiş. Bu konsert adi konsertlərdən, növbəti şənliklərdən deyil, yuxarıdan xüsusi tapşırıqla, seçmə adamlar üçün düzəldilib. Sənin çox bəyəndiyin, mahnılarını sevə-sevə dinlədiyin ən məşhur müğənnilər, xanəndələr iştirak edəcəklər. Artistlər gülməcələr, yamsılamalar söyləyəcəklər. Bir sözlə, belə konsertə getməmək olmaz. Günaha yazılar.

Durna xanım nazlı-nazlı zıqqıdı:

– Doğru sözümdü, Bəhlulum. Təkid eləmə. Heç nəyə meylim yoxdur.

Bəhlul "üç telli"sinə aralıdan diqqət yetirdi. Nə isə baş verdiyini sezdi. Ağlına başqa şey gəlmədi. Onun yenə uşaqsızlıq

sarıdan xiffətləndiyini düşündü. Həmişəki nəvazişini ikiqat artırdı. İrəli gəlib qolunu Durna xanımın boynuna doladı. Üzündən, buxağından öpdü. Həlim-həlim soruşdu:

– Söylə, nə olub sənə mənim üç tellim. Olmasın azar, nədi səni incidən?

Durna xanım ani səksəkə keçirdi: "Mən ehtiyatsızlıq eləyirəm, özümü pis aparıram. Belə olmaz. Ürəyinə xal salar. Rahatlığı pozular..." – düşünüb, tələsik bəhanə uydurdu:

– Fikir vermə, Bəhlulum, – dedi. – Özümü bir az üzgün hiss eləyirəm. Günortadan bəridi süstəm, yorğuntəhərəm.

Bəhlul şuxlandı:

– Süstlük bekara şeydi, o hamıda olur. Ciddi ağrı-acıdan Allahım qorusun səni. Heç vaxt ah-uf eləmiyəsən! – O, "üç telli"-sinin yanağından təkrar öpdü. Sevimli mahnısını oxudu:

*Qanad çalıb nə diyardan gəlirsən?*
*Haralısan, haralısan, haralı durnam?*
*Həsrətindən gözüm saralı, durnam!*
*Üç telli, dörd telli, beş telli durnam.*
*Gözəllər içində çox bəlli, durnam!!*

Bəzi misraları özündən artırdığı mahnını şirin zümzümə edə-edə Durna xanımın qoltuğunun altından yapışıb ayağa qaldırdı, zarafatını ciddiləşdirdi:

– Hə, əziz üç tellim, inad göstərmə. Konsert lap yerinə düşür. Gedərik, orda könlün açılar. Süstlük də, üzgünlük də sıfqarılıb canından çıxar... Di cəld ol. Konsertin başlanmasına az qalır, get, aç şifoneri. Toya, nişana geyindiyin qəşəng paltarlarının içindən seç, ən yaxşını, ən dəbdə olanını tax əyninə. Ora gələn xanımlar ultra bərbəzəkdə olurlar. İstəyirəm ki, heç kəsdən əskik görünməyəsən. Qoy özündən razı, ədası yerə-göyə sığmayan xanımlar sənə baxıb, gözlərinə su versinlər, həsəd aparsınlar.

Durna xanım hərəkətə gəlmədi. Tək qalıb, qarauğur hadisəni soyuqqanlıqla çözmək, səbəbini zehnində ətraflı araşdırmaq qərarında idi. Sakit tərzdə:

– Qurban olum, Bəhlulum, sən mənə bənd olma, – dedi, – tərpənməyə taqətim yoxdu. Könlünü açmaq, dincəlmək sənə daha çox

lazımdı. İşdə yorulursan, bütün günü idarə qayğıları qanını qaraldır. Mən konsertə evdə televizorla da baxa bilərəm. Bu, mənə rahat olar.

Bəhlul razılaşmadı. Adəti əksinə, inadını yeritdi:

– Heç elə şey yoxdu, üç telli! Hamı həyat yoldaşı ilə getdiyi yerə mən nə üçün özüm getməliyəm?! Ciddi bir səbəb olmaya-olmaya nəyə görə yalquzaq kimi tək görünməliyəm?.. Tay-tuşlarımdan, işçilərimdən, həmkarlarımdan ayıbdı, axı!.. Tez elə, hazırlaş. Sənsiz ora ayaq basan deyiləm. Birlikdə getməliyik, vəssalam!.. Musiqi dinləməyə bu gün həvəsim böyükdü. Sözümü yerə salsan, inciyərəm.

Durna xanım daha etiraz edə bilmədi. Bəhlulun könlünü sındırmamaqla bərabər, onun dediklərinə haqq da qazandırdı: "Konsertə adamlar arasında canlı baxmaq, televizorda seyr etməkdən qat-qat yaxşıdı. Evdə tək-tənha qalsam, qara fikirlər başıma dolub, əhvalımı bir az da pisləşdirəcək, canımı üzəcək. Getməyim sərfəlidi. Orda yaramazın iyrənc sifətini birdəfəlik unudaram, çoxdandı kütləvi yerlərə ayağım dəymir, yeniliklərdən xəbərsizəm. İctimai tədbirlərdə olmaq gözə də, könülə də nəsə təzə bir şey verir. Getmək lazımdı!.."

Gecdən-gec razılaşdı:

– Yaxşı, qoy sən deyən olsun! Amma gərək özün də paltarını dəyişəsən. Bu günlərdə aldığın kostyumla ayaqqabını geyinəsən.

– Əlbəttə, mütləq!.. – kefi durulmuş Bəhlul "üç telli"sinə məzə üçün göz vurdu. – Yoxsa bərbəzəkli tovuzquşu yanında qotur xoruza bənzəyərəm, bədxahlarım qəşş edincə gülərlər.

**6.**

Onlar bir azdan "Respublika sarayı"nda idilər. Adamlar bayram konsertinə gur gəlmişdilər. Geniş vestibüldə, artırmalarda, enli ağ mərmər pillələr axarında, astana və giriş-çıxışlarda qaynaşırdılar.

Şənliyə dəvət olunmuşlar zövqlə geyinmişdilər. Kişilər – qadınlar da, oğlanlar – qızlar da imkanları çatan qədər bəzənmişdilər.

Durna xanımın bir gözü rastlaşdığı qadınlarda, qız-gəlinlərdə qalmışdı. Onları qaşaltı, xəlvət-xəlvət süzürdü. Bəzilərinə qəlbən qibtə edir, xanım-xatın davranışlarını bəyənir; bəzilərinə də dodaq

büzür, şit geyimlərinə, özlərini yüngül aparmaqlarına acığı tuturdu.

Sarayın nəhəng salonunun həm sağdakı, həm soldakı giriş qapıları böyrünə vurulmuş qəşəng, zərli çərçivəli, adam boyundan hündür güzgü önündən keçəndə Durna xanım istər-istəməz ayaq saxladı. Qoluna girdiyi Bəhlulu da ehmallıqla çəkib əylədi. Hər şeyi incəliyi, dəqiqliyi ilə göstərən bu güzgüdən özünə bir neçə anlığa diqqət yetirdi. Eyni zamanda da yaxınlıqdakı qadınlara fikir verdi. Özü ilə onları hər cəhətdən müqayisə etdi: Geyim zövqündə, səliqədə, təbii yaraşıqda tutuşdurdu. Şəxsini hamıdan üstün gördü. Qəlbini xoş duyğular döyündürdü. Əhvalı duruldu. Əyilib Bəhlulun qulağına təşəkkürlə pıçıldadı:

– Sənə çox minnətdaram! Nə yaxşı ki, məcbur eləyib gətirdin məni. Burda gördüklərim könlümü açdı. Süstlüyüm, əzginliyim canımdan sıfqarılıb çıxdı.

Bəhlul zarafatyana öyündü:

– Hələ bu harasıdı, mənim can-ciyər üç tellim! İçəri keçib, salonun əzəmətini, möhtəşəmliyini seyr edəndə, say-seçmə müğənnilərə, dadlı-duzlu mahnılara qulaq asanda kefin lap durulacaq. Mənə “sağ ol”u “sağ ol” üstündən deyəcəksən. Bu da bəs eləməyəcək, camaat içində boynumu qucaqlayıb öpəcəksən məni.

Durna xanım şirin-şirin gülümsündü.

İçəri keçdilər. Genişliyi göz oxşayan, yaraşıqlı oturacaqları, ildır-işığı, keçidlərindəki bəzəkli ayaqaltıları nəzər sehrləyən salon yarıya qədər adamla dolmuşdu. Keçidlərdə, cərgələrarası döngələrdə dəstə bağlayıb söhbətə, lağlağıya ləngimiş tamaşaçılar da ilk xəbərdarlıq zəngindən sonra yerlərini tutmağa tələsdilər.

Çox çəkmədi sıralar tam doldu. Cərgələrarası gediş-gəlişlər seyrəldi. Durna xanımla Bəhlul da orta cərgələrin birindəki yerlərini tapıb rahatlandılar. Bəxtlərinə yaxşı sıra düşmüşdü. Buradan hər tərəf apaydın seçilirdi. Səhnə qənşərlərindəydi.

Durna xanım “Respublika sarayı”na birinci dəfəydi ayaq basırdı. Qıraqdan-qırağa, onun-bunun ağzından sarayın tərifini çox eşitmişdi. Ancaq eşitmək hara, öz gözünlə görmək hara? Sözün həqiqi mənasında hayıl-mayıl qalmışdı. Salonun heyrətamiz genişliyinə, tutumuna baxmaqdan doymurdu. Uca tavanından asılmış, ulduz-

ulduz bərq vurub gözqamaşdıran yes-yekə çilçırağına, cüt-cüt cərgələnmiş qönçə şəkilli divar lampalarına, ağır-ağır sallanmış zər qotazlı, mavi rəngli, dalğalı səhnə pərdəsinə tamamca heyran olmuşdu. Sehrlənmiş nəzərləri gah ona, gah buna sancılırdı. Hərdən-hərdən də başını qanırıb, çiyinləri üstündən çəpəki boylanırdı ki, görsün tanış-bilişlərdən, kitabxana işçilərindən bu konsertə dəvətlilər varmı. Birdən onu sanki elektrik cərəyanı vurdu, bədəni tir-tir əsdi. Keçid yolunun o biri tərəfindən, bir az aşağıdakı sıradan ona bir cüt göz zillənmişdi, həris baxışlar üzünü yandırdı. Qırpımsız, qəribə parıltılı bu gözlər ona tanış gəldi. Ancaq yəqinləşdirə bilmədi. Kirpiklərini qapayıb açdı. Başını sol çiyni üzərinə əydi. Adamlar arasından həmən səmtə oğrumluqla boylandı. Canından üşütmə keçdi. Bu üşütmə tezliklə içini buzlatdı. O irsiz, qırpımsız gözlər kimin olduğunu dəqiqləşdirmişdi: Zırramanın, kənd ayısının gözləri idi! Sifətini də aydın seçdi. Həyasız-həyasız irişirdi...

Durna xanımı hirs silkələdi. Acı sözlər dilinin ucunu göynətdi: "O, iblis törəməsi, qadam ağzına olmuş necə gəlib çıxıb bura?.. O hara, belə böyük şənlik hara? Uşaq-muşaq, sırtıq cavan yeridimi yüksək insanlar yığnağı?!" – düşünüb, Bəhlula sarı çöndü, astaca soruşdu:

– Bura tələbələr də dəvət olunublar?

Bəhlul fərəhlə cavab verdi:

– Hə, olunublar. Bu bayram hamının bayramıdı, ümumi şənlikdi. Hər sahədən adamlar çağırılıb. Əlbəttə ki, yalnız say-seçmələr. Onların arasında bəzi institutların öncül müəllimləri, tələbələri də var... nəyə görə soruşursan?

– Elə-belə. – Durna xanım ilk tanışlıqda zırrama oğlanın özünü öyməsini xatırladı. Dərhal da bugünkü yaramaz hərəkətləri gözləri önündən keçdi. Qəzəbdən içi bir daha çalxalandı. Ürəyində onu yeni hiddətlə hədələdi: "Ah, yaramaz oğlu, yaramaz!.. Bir də çıxarsan qabağıma, tüpürərəm o murdar cəmdəyinə. İt ölüsü kimi sürütdürərəm meyidini!.. Həyasızlığına bax, üzünə deyilən o cür pis, lənətli sözlərdən sonra da ölüb yerə girmir, məni marıtlayır... Əclaf!!"

Son xəbərdarlıq zəngi də çalındı. Ara-bərədə vurnuxan asayiş keşikçiləri də öz yerlərini tutdular. Salonun səs-küyü, uğultusu

kəsdi. Bir neçə dəqiqəlik sükut çökdü. Çilçıraqlar öləzidi. Səhnə işıqlandı, ağır, "tilsimli" pərdələr tərpəndi, musiqi sədalarının müşayiəti ilə ehmal-ehmal aralandı.

Konsert başlandı.

Durna xanım diqqətini cəmləyib, səhnəyə yönəltdi. Şən, şaqraq musiqi onu bayaqkı xoş ovqata qaytardı. Könül bulantıları, əsəb qıcıqları bala-bala keçib getdi. Bir-birini əvəz edən ustad müğənnilərin ovsunlu nəğmələri, könülaçan mahnıları hamı kimi onu da tezcə ağuşuna aldı; uzaq gənclik illərinə, ömrün ilk bahar çağlarına uçurdu. Təkrarolunmaz xoş duyğularla yaşadı. Lakin o xoşbəxt aləmdə çox qala bilmədi. İrsiz baxışların üz yandıran təması ondan əl çəkmədi. At milçəyi olub zəhləsini tökdü. Oturuş tərzini dönə-dönə dəyişsə də, əlləri ilə üzünü örtsə də, iyrənc təmasdan qoruna bilmədi. Nəhayətdə Bəhlulu dümsüklədi. Səhnəni yaxşı görə bilmədiyini bəhanə gətirib, yerini onunla dəyişməyə məcbur oldu:

– Burdan müğənniləri yaxşı seçmirəm. Qabağımdakılar maneçilik törədirlər. Qoy sənin yerinə keçim.

Bəhlul arxadakı tamaşaçılardan üzr istəyib, yerdəyişməni mümkün qədər sakit icra etdi:

– Buyur, sənə hara xoşdur, orda əyləş. Mənim üçün fərqi birdi. Müğənniləri görməsəm də olar, səslərini eşitməyim kifayətdi.

Durna xanım təzə yerdə də özünü rahat hiss etmədi. Pusqusunda möhkəm durmuş iti nəzərlər onu dinc qoymadı, hədəfini asanca tapdı. Acışmış Durna xanım bütün konsert müddətində hey tıncıxdı, Əfsunu ürəyində bəlkə də yüz dəfə söydü, yamanladı: "Ahh, zalım balası, gərək elə konsertdə də gəlib tuş olaydın mənə?! İşıqlı dünyada gəzməyi Tanrım sənə haram eləsin. Belə gözəl çal-çağırın ləzzətindən məhrum qoydun məni. İlahi heç nədə yarıtmasın səni!"

...O gecə Durna xanım dumanlı hisslər pəncəsində çırpındı. Bəhlulu izdivaclarının ilk çağlarında, ehtirasların qaynar anlarında olduğu kimi, yataqda bərk-bərk qucaqladı, qoynuna sığındı, şıltaqlandı. Bəhlul bu qaynarlığın səbəbini anlamadı. Onu adi qadın çılğınlığına yozdu...

**7.**

Əfsun Zamanlı bir həftə gözə görünmədi. Kitabxana tərəfə yön

çevirmədi. Nə küçə tinində pusquya durdu, nə də əvvəllərdəki kimi xapa-xapdan qarşıya çıxdı. Durna xanım sakitləşdi. Təhlükənin sovuşduğunu, "zırramanın" ağlı başına gəldiyini zənn etdi. Neçə gündən bəri beynini sarmış, zəhləsini tökmüş qara düşüncələr zehnindən silindi. Tam arxayınlıqla həmişəki yolu ilə işə gedib, işdən qayıtdı.

Amma aldanmışdı. Ürəyinin dərinliklərində anlaşılmaz bir xof gizlənmişdi. Elə ki evdə təklənirdi, yaxud kitabxanada hansısa tələbə ondan az tapılan kitab istəyirdi, Durna xanımın əhvalı heç nədən dəyişirdi, ovqatı pozulurdu. Zırrama oğlan arzu olunmadan yadına düşür, könlünü sirli-sirli çalxalayırdı. Və özünü hirsli-hirsli danlayırdı:

– Bu nə səfehlikdi eləyirəm?! O, haranın səmə itidi haqqında fikirləşirəm?! Rədd olsun, cəhənnəmə itilsin! Meşənin çaqqal-çuqqalı əsgik idi mənə! – deyib, üstünün tozunu tökürmüş kimi bərk-bərk silkələnsə də, mübhəm fikirlərdən birdəfəlik qurtara bilmirdi.

Əfsun Zamanlı isə qərarında israrlıydı. Durna xanımın qəlbinə yol tapıb, onunla heç olmasa, yarımca saatlığa bir yastığa baş qoymaq üçün ölüb-dirilirdi. Ehtiras qazanında cızır-cızır yanır, cızdağı çıxırdı. Ötəndəfəki görüşdə eşitdiyi söyüşlər, təhqirlər, tikanlı məzəmmətlər onu bir az da acığa, höcətə salmışdı. Durna xanımın saqqızını mütləq oğurlamağı qarşısına qəti məqsəd qoymuşdu: "Bu yolda ya öləcəm, ya da arzuma çatacam!" – deyə gecə-gündüz düşünür; təzə həmləyə uğurlu fürsət arayırdı.

İntizardan üzülmüş Əfsun bir axşamüstü dənizkənarı bulvarda gəzintiyə çıxdı. İki dəfə obaş-bubaşa gedib-gəldi. Məqsədi üçün burada da ağıllı bir plan çözə bilmədi. Dilxorçuluq onu tezcə yordu, topuqları sızıldadı. Bu genişlikdə, açıqlıqda da havası sanki çatışmadı. Önündəki dəniztəki köksü birdən qabardı. Nə oldu, nə baş verdisə həyəcanlandı. Qaibdən onu kim isə, harasa səslədi. O, filarmoniya bağının sərt yoxuşunu yeyin-yeyin, birnəfəsə dırmaşdı. Dikin başındakı "Poeziya evi"nin bərabərində ayaqları yerə yapışdı. Durna xanım qənşərindəydi, üz-üzə gəlmişdilər. Bu fürsət, çox güman ki, ilahidən idi.

Əfsun bir qədər karıxdı. Necə davranacağını təyin etməyə dar macalda çətinlik çəkdi. Sifəti daxili gərginlikdən gah pörtdü, gah da bozardı. Durna xanım da bu qəfil görüşdən özünü itirdi. Hirs-

dənmi, nifrətdənmi, ya bir başqa hissin gücündənmi bənizi dümağ ağardı. Əfsuna kinli, sarsıdıcı nəzər fırladıb, kəskin hərəkətlə yana çöndü, istiqamətini dəyişdi.

Əfsun özünə tez gəldi, qamaşığı bircə andaca açıldı. İrəli atılıb, qabağı ərklə, höcətlə kəsdi. Ədəb qaydasında "siz" ifadəsi ilə köhnə hay-küyünü təzələdi:

– Oy, nə yaxşı ki, rastlaşdıq!.. Heç gözləməzdim, qurban olduğum Allahım sizi bir də qarşıma çıxardacaq, mənim yatmış baxtımı oyadacaq. Neçə günüydü dünyam qara geymişdi. Yer yarılmışdı, altına girmişdim. Nə ölüydüm, nə diriydim. Quruca nəfəsim gedib-gəlirdi. Bir az da belə davam eləsəydi, həsrətiniz məni aşkarca vərəmlədərdi.

Durna xanım əlləri ilə qulaqlarını qapadı. Boğazını qəzəb boğduğundan danışa bilmədi.

Əfsun yüyürək dilini daha cəld yüyürtdü:

– Bilirəm, səhvimi başa düşürəm, ötən dəfə tərbiyəsiz davranmışam. Xuliqan hərəkətləri eləmişəm, qələt iş tutmuşam. Olduqca peşmanam. Sizdən sonra özüm-özümü o ki var danlamışam, sizdən də çox söymüşəm, yamanlamışam. Acizanə surətdə yalvarıram, bu dəfə keçin günahımdan. Söz verirəm, o qələti heç vaxt təkrarlamayacağam.

Durna xanım özünü topladı. Ayaqlarını yerə çırpıb təpindi:

– Çəkil yolumdan, zəhləm getmiş! Çərənləyib baş-beynimi aparma. Əl çək məndən!

Əfsun bicliklə səsini lap sızıldatdı:

– Mən xətəkar bir gənc, siz isə alicənab hakim, verin ədalətli cəzamı. Sizə eşqim, məhəbbətim, məftunluğum o dərəcədədi ki, ağlımı başımdan çıxardıb, özüm-özümlə bacarmıram... Bir daha, bir daha yalvarıram, dönə-dönə üzr istəyirəm. Məni dolayın başınıza, kobud qəbahətimi bağışlayın əbləh cavanlığıma.

Durna xanımın hiddəti üstünə hiddət artdı. Əfsunu sərtliklə yana itələdi, son dərəcə qeyzlə çımxırdı:

– Dedim, əl çək məndən!.. Sonrası pis olacaq!!

Əfsun hırıldayıb, qollarını yana açdı. Yolun ortasında dirək kimi dayandı.

– Çox rica edirəm axıracan dinləyin məni. Bilirəm ki, siz ərli

qadınsınız. Və əriniz də məlumatıma görə, vəzifəli, səlahiyyətli adamdı. İstəsə, məni yerlə yeksan elətdirər. İnstitutumdan qovdurar. Hər cürə pisliyi asanca bacarar. Amma mən heç nədən qorxmuram. Sizə olan böyük, tükənməz məhəbbətim uğrunda bütün məhrumiyyətlərə, ən ağır cəzalara dözməyə hazıram. Öz xoşumla ölümə də gedərəm. Yar intizarı çəkib, dərd-azarla yaşamaqdansa, yer altına köçmək min dəfə şərəflidi!

O, sinədolusu ah çəkib, qollarını yanına saldı. Boynunu yetimsayağı burub, qəmgin-qəmgin əlavə etdi:

– Mənim sizə deyəcəklərim, ərz eləyəcəklərim bunlar idi. Neçə gündü bu sözlər ürəyimi deşirdi. Canımı üzürdü. Çox şükür ki, imkan oldu, onları sizə çatdırdım. Ürəyimdə qalıb irin bağlamadı. İnnən belə qərar da, hökm də sizindi... burasını da bilin ki, cavan, dünyadan hələ heç bir ləzzət almamış oğlanın vərəmləyib nakam ölməsinə günahkar siz olacaqsınız. Böyük babala batacaqsınız. Di sağ olun! Sizi yoldan saxlayıb başağrısı verdiyim üçün məni üzürlü sayın.

Əfsun xeyli kənara çəkildi, yolu boşaltdı. Başını köksünə sallayıb, fağır-fağır kirimişlədi. Bəlağətli sözlər özünü də təsirləndirmişdi.

Durna xanım kirimişlədi. Oğlanın sonda dediyi cümlələrə biganə qalmağı bacarmadı. Zəhləsi getmişin ədəbli, tərbiyəli davranışı, yazıqhal görkəmi hirsini əməllicə yatırtmışdı. Daha onu kinlə, hədsiz nifrətlə süzmürdü. Sallaq qaşları altından həlim-həlim baxırdı. Bu qeyri-adi həlimləşməni Əfsun aydın sezdi. Özünü bir qədər də mədəni apardı. Belini əyib dalı-dalı gedərək:

– Sağ və salamat qalın! Ürəyimi kitab kimi açıb söylədiklərimi səmimi etiraf sayın, – dedi.

## 8.

Məhəbbət – yaranışdan sirri açılmamış bir möcüzədi. O ürəyə necə daxil olur, orada özünə nə sayaq yuva qurur, bundan heç kəs, heç vaxt duyuq düşmür. Huşyarlıqdan ayılanda, könlünün qaynar,

eyni zamanda da dumanlı duyğularla dolub-daşdığını hiss edir.

Durna xanımın ayaqları sanki çidarlanmışdı. Sərbəst addım ata bilmirdi. Gedir-gedir əylənir, barmaqlarını alnında gəzdirir, nəsə düşünür və təzədən yoluna davam edirdi. Nə idi səbəb? Anlamırdı.

Evə gəldi. Çiyin çantasının qayışını barmaqlarının ucları ilə fikirli-fikirli sürçüdüb aşağı saldı. Həmişəki yerinə – yataq otağındakı tumbanın içinə aparıb qoymağa zoru çatmadı. Sallandıra-sallandıra yelləyib divanın küncünə tulladı. Güllü ipək qoftasının üstündən geyindiyi təptəzə pencəyini də eyni heysizliklə soyunub çantanın böyrünə atdı. Divana yorğun-arğın çökdü. Əfsunun yazıqlamış səsi qulaqlarından hələ də getməmişdi, hey təkrarlanırdı. Ovucları ilə qulaqlarını qapadı ki, zəhləsini tökmüş səs kəsilsin. Fərq eləmədi. Buna əlavə olaraq oğlanın boynuburuq duruşu, məlul-məhzun baxışları gözü önündə canlandı. Bədənindən zəlzələ gücündə lərzə keçdi. Hətta bu lərzədən qorxdu da. Olan-qalan qüvvəsini toplayıb, ayağa qalxdı. Özünü tez-tələsik hamam otağına saldı. Üzünü, boyun-boğazını su ilə, şap-şupla yudu, içindəki anlaşılmaz hərarəti söndürməyə çalışdı.

Cəhdi müsbət nəticə vermədi. Qurulanıb yataq otağına yönəldi. Çarpayıya üzüqoylu uzandı. Qulaqlarındakı səs handan-hana səngidi. Aramsız ürək döyüntüləri də bala-bala sakitləşdi. Lakin nə faydası? Sanki yağışdan çıxıb, yağmura düşdü. Qəlbini daim narahat edən sonsuzluq mərəzi – övladsızlıq dərdi içinə yeni göynərti saldı. Dərindən-dərin ah çəkdi. Allaha – ulu yaradana asılandı. Onu bu çarəsiz bəlada inildətdiyinə görə lənətlədi, qarğış elədi. Dərhal da peşmanladı. Əlini ağzına basıb, tövbəyə başladı:

– Dilim-ağzım qurusun, bu nə qələtdi, nə gic-gicilikdi mən eləyirəm?! Nə sarsaq, nə ağılsız sözlərdi dilimə gətirirəm?! Tanrı üzünə ağ olmaq bağışlanmaz günahdı... – Durna xanım fövqəl bir hövl ilə yırğalandı. Duruxdu, nagahan təsəlli tapdı: – Hər şərin arxasında bir xeyir gizlənir, deyirlər. Başıma gələn bu hadisə, ola bilsin, mənim alın yazımdı, tale qismətimdi. Adi təsadüf, qarauğur hadisə yox, tanrı-peyğəmbər əmridi. Nifrət bəslədiyim, görəndə gözümün ikisi də ağrıdığı zırramanı bəlkə də qəsdən qarşıma çıxardıb ki, sonsuzluq bəlasından qurtarım. Bədxahlar töhmətindən, baldızlar qaxıncından xilas olum. Başqa qadınlar kimi

oğul-qız dünyaya gətirim, bəxtəvər həyat sürüm...

Ağlına qəfil gəlmiş bu təskinlədici fikir onu qıcıqlı hisslərdən ayırdı. Qəlbində ümid qığılcımı alışdırdı:

– Qurban olduğum Allah rəhimlidi, ədalətlidi. Gümanım, inşallah, aldatmaz məni. Düşündüyümü həqiqətə çevirər. Hər şey onun əlindədi. Yoxu var eləyəndi!

Əsəb gərginliyi tədricən azaldı. Ağlına gələni soyuqqanlıqla götür-qoya başladı. Yadına həkimlərin qənaəti düşdü. Təsəllisi heçə endi. Dizlərini qucaqlayıb uzun fikrə getdi. Asan təslim olmaq istəməyən ümidi tərəddüd maneələrini höcətlə üstələdi: "Əh, nə olsun ki, həkimlər sonsuzluq günahını məndə görürlər. Onların yanlış, kökündən səhv diaqnozları bəyəm azdırmı?.. Çox vaxt birinin dediyini o birilər yalana çıxardır, ayrı təyinat verirlər. Mən özümə inanıram. Mütləq ana olacam. Lap yəqin olacam!.. Heç kəsin sözünə yox, tanrı məsləhətinə, ilahinin əmrinə qulaq asmaq lazımdı. Mənə urcah elədiyi oğlanı rədd etməyib, gələcək xoşbəxtliyimi yalnız onda görməliyəm. Arzuma onunla çatmalıyam!.."

Durna xanım xeyli rahatlandı, nəfəsi genişləndi. Ancaq bu rahatlığın ömrü çox gödək oldu. Könlü yenidən çalxalandı. Ərli qadının – bu məqama qədər heç bir kişiyə gözlərinin ucu ilə də baxmamış, heç nəyə sıyılmamış, abır-həya ilə davranmış bir zənənin birdən-birə əqidəsini dəyişməsi, cəmiyyət içində qınaqlı həyat tərzi seçməyə meyillənməsi, əlbəttə, son dərəcə müşkül idi. Hələ üstəgəl, ərini də sevməsi, ona uşaqlıqdan könül telləri ilə bağlılığı da vardı. Bu möhkəm, illərlə bərkimiş telləri necə qırıb ataydı?.. Əri ilə nəyinsə xətrinə, ürəksiz ailə qurmuş olsaydı, belə hərəkəti hardasa başa düşülərdi. Ona bəraət qazandıranlar tapılardı. Di gəl ki...

Durna xanımın özü də öz qərarından vahimələndi, ikrah etdi: "Mən gicəm, axmağam. Olan-qalan ağlımı da itirmişəm!.. Bəs Bəhlul?! Xəyanətim onu sarsıtmazmı? Ürəyini yaralamazmı? Taytuşları arasında, ictimaiyyət içində nüfuzdan düşməzmi?.. Axı, diqqətli bir ər kimi, nəcib insan kimi narazılığım yoxdu ondan. Məni həmişə uşaq təki əzizləyir, nazımı çəkir. Evləndiyimiz bu neçə ildə dilindən bir acı söz eşitməmişəm. Ailədə hamı məndən

üz döndərəndə, bacıları məni təkidlə evdən qovdurmaq istəyəndə, doğub-törəməz adı ilə təhqir eləyəndə tərəfimi saxladı. Məni heç kimin ayağına vermədi. Doğmaca anasını da mənə görə özündən küsdürdü, haçandı gəlib qapımızı açmır... Canımdan əziz saydığım Bəhluluma budurmu vəfam?!.. Yox, bir də yox! Ona vəfasızlığı bacarmaram, bu pis yolu qətiyyən seçmərəm!.. Çəkil qara fikirlər, çəkil başımdan!!"

Gərginlikdən Durna xanımın gicgahları bir neçə dəfə sancdı. Alnında və boynunun ardında küt ağrılar peyda oldu. Heç nə ilə ovuna bilmədi. Bir məxrəcdə cəmlənməyən qarışıq düşüncələr dincliyi ona qəhət elədi. Gah sancılanmış kimi çarbayıda çapaladı, o üz-bu üzə çevrildi, gah durub otaqda gicələk-gicələk gəzindi, gah da mətbəxə keçib, baş qatmaq üçün qab-qacaqla əlləşdi, zəhləkar fikirlərdən aralanmağa məşğuliyyət axtardı. Nə faydası?!

Adətən, ertəsi günün xörəyini axşamdan hazırlayıb, soyuducuya qoyurdu ki, işdən qayıdanda tələm-tələsik bişir-düşür hayına qalmasın. Xörək alaçiy, dadı-duzu kəm olmasın, iştahlı yeyilsin. İndi boyat xörəyi soyuducudan götürüb qaz plitəsində qızdırmağa, azacıq qaynatmağa hövsələsi çatmadı. Əli heç nəyə yatmadı. Dəqiqələri, saatları mürgülü adam vəziyyətində arxaya ötürdü.

Bəhlul, vərdişi üzrə, evə yenə də axşamdan çox keçmiş döndü. Ərini, bir qayda olaraq, gülərüz, şadman qarşılayan, qabağına yeriyən Durna xanım yerindən qımıldanmadı. Heç başını qaldırıb Bəhlulun üzünə də baxmadı. Bəhlul buna ciddi məna vermədi. Halsızlıq, yorğunluq əlamətinə yozdu. Salamlaşıb iç otağa adladı. Paltarlarını dəyişdi. Hamamxanada yaxşı-yaxşı yuyundu. Oradan mətbəxə gəldi. "Üç telli"sini əziyyətə salmadı. "Sən dincəl, özüm öz qulluğumu eləyəcəm" – deyib soyuducudan xörəyi götürdü. Qaz pilitəsinin üstünə qoydu. Xörək qızınca çörək doğradı. Necə lazımdı, səliqə-sahmanlı süfrə açdı. (Birinci dəfə deyildi. Qadın işlərinə hərdən-hərdən həvəslə qarışırdı. Durna xanım nasazlayanda, yaxud işi başından aşanda belinə önlük bağlayıb kartof-soğan doğrayır, ət çapır, qazanı hər qaydası ilə ocağa asırdı. Hətta əksər kişilərin şəninə sığışdırmadığı çirkli qab-qacaqları yuyub yaxalamağa, silməyə də ərinmirdi. Qədərsiz sev-

diyi zövcəsinə bacardığı köməyi heç nədə əsirgəmirdi. O, bir balaca kefsizləyəndə, başı-dişi ağrıyanda pərvanə olub, dövrəsində fırlanırdı.)

Bəhlul, ümumiyyətlə, həlim xasiyyət insan idi. Təkcə evdə "üç telli"sinin yanında deyil, idarədə də xoşqılıq davranırdı. Tabeliyindəki işçilərin heç birinin xətrinə dəymirdi, hamı ilə mehriban rəftar edir, arada şirin münasibət yaratmağı rəsmiyyətçilikdən üstün tuturdu. Böyüyün də, kiçiyin də taqsırını sakitliklə bildirir, buraxılmış nöqsanı düzəltməyə özü də ürəklə girişirdi.

O, yeməyini alaqarın yeyib, böyük divanın bir küncündə hələ də büzüşərək oturmuş "üç telli"sinin yanına qayıtdı. Böyründə rahat əyləşdi. Qolunu onun boynuna dolayıb, üzünü-üzünə söykədi, mehriban dindirdi:

– Bayaq aclıq əhədimi kəsmişdi. Bağırsaqlarım doğranırdı. Söhbətə heyim çatmırdı. İndi agah elə mənə görüm, nə olub?

– Heç nə, – Durna xanım həvəssiz dilləndi. – Narahat olma.

– Gizlətmə. Dərdini mənə açıq söylə. Neçə gündü gözümə birtəhər görünürsən. Bəlkə Allah eləməmiş, ağrıyan bir yerin var, həkimə getmək lazımdı?

– Səhhətim normaldı, nigarançılığa dəyməz.

– Sirr saxlama. Hiss eləyirəm nəyisə gizlədirsən məndən.

Durna xanım ərinin üzünə səksəkəli baxdı. Bəhanə uydurdu:

– İşdə bir az qanım qaralıb...

– Kim qaraldıb qanını? – Bəhlul yarı doğru, yarızarafatla hədəfi hədələdi: – Mənim üç tellimin qanını qaraldanın pişiyini ağaca dırmaşdıraram, miyoldaya-miyoldaya qalar elə orda!

Bu şən, şux sözlər Durna xanımın dodaqlarını bekaraca qaçırtdı. Bəhlul zarafatını gerçəklətdi:

– Doğrudan nə məsələdi? Xətrinə kim dəyib?

Durna xanım yalan danışmağa məcbur oldu:

– Bir qarayaxa tələbə var. Gəlib kitab fondumuzda olmayan dərslik tələb eləyir. Ha deyirsən ki, elə dərslik yoxdu bizdə, başa düşmür. Dava-qalmaqal salır, şikayətə gedəcəyini bildirir. Bizi iş yarıtmamaqda günahlandırır. Bu gün canımı lap boğazıma yığdı. Abrını ətəyinə büküb qovdum kitabxanadan... Hirsimdən hələ də özümə gələmmirəm.

Bəhlul rahat nəfəs dərdi.

– Mən elə zənn elədim kitabxananın direktoru, ya başqa bir işçi acılayıb səni. Tələbəni bağışlamaq olar. Özümüz də o həyatı keçmişik. Yəqin ki, hansısa professor, ya dosent binəvanı dirəyib divara. O da gəlib acığını sizdən çıxıb. Mümkündü belə-belə şeylər. Keçib gedər. Təki azar-bezar bizdən uzaq gəzsin. Sən kefsizləyəndə, əhvalın pozulanda dünya gözümdə bir heçə dönür. İstəmirəm sənin başından bircə tük də əskilsin... Hə, üç tellim, yadından çıxart o yazıq tələbənin höcət inadkarlığını, zəhməti qəbul elə dur, keç mətbəxə. Təzə çay dəmlə, sən dəmləyən çayın ləzzəti bir ayrı cürədi. İşdə içdiyim çaylar onun tamını vermir.

Nəvazişli sözlər Durna xanımın könlünü açdı. Mənhus fikirləri beynindən qovub, özünü xəyalən bir daha danladı: "Mən doğrudan da ağlımı çaşmışam. Səfehləmişəm. Gör, kimi kimə tay tutmaq istəyirəm?! O, heç mənim Bəhlulumun kəsinti dırnağına da dəyməz! Qoy rədd olsun, itilsin gözümdən. Başımı xarab eləməsin!!"

Canına çökmüş ağırlıq bir neçə andaca tamam sıfqarıldı. Əlavə xahiş-minnətsiz ayağa durdu. Həmişəki şux yerişlə mətbəxə getdi. Çaydanı təzə su ilə doldurub, əlharayı qaynatdı. Ədva ilə çay dəmlədi. İki büllur stəkana süzüb gətirdi. Televizorla qabaq-qənşər divara söykədilmiş kresloların arasındakı balaca masanın üstünə qoydu. Yanına mürəbbə və çərəz düzdü. Bu müddət ərzində bekaraca mürgüləmiş Bəhlulu ehmallıqla oyadıb, çay süfrəsinə dəvət etdi:

– Bəsdi mürgülədin. Gəl, kresloda əyləş, çayı televizora baxa-baxa içək.

Bəhlul məzələndi. Sağ əlini əsgər sayağı qaldırıb gicgahı bərabərində saxladı.

– Baş üstə, qəməndir! Çay qonaqlığına mən hazır!

Onlar gülüşə-gülüşə kreslolara əyləşdilər. Buğlanan çayları kiçik qurtumlarla içə-içə, televiziya verilişini dinməzcə seyr etdilər. Axırda veriliş barədə mülahizələr yürütdülər. Sonra da söz-sözü çəkdi, yaxın-uzaq keçmişin yaddaqalan maraqlı əhvalatlarından söhbət açdılar. Könül bulantıları unuduldu...

* * *

Bəhlul yorğan-döşək arasına girən kimi, dərin yuxuya daldı.

Arxasını Durna xanıma çevirib, asta-asta mışıldadı. Gecənin hüşyar sakitliyində tənha qalmış Durna xanımı qara fikirlər yenidən çulğadı. İradəsindən asılı olmadan Əfsunu bir də xatırladı. "Zırrama oğlan" bu anlarda ona, çox qəribə də olsa, yaxşı tərəflərdən görünməyə başladı: olduğundan bir xeyli qəşəngləşdi. Qaynar gözləri qəlbinə qayibanə od saldı. (Əslində həmən od onun qəlbinə sonuncu görüşdən düşmüşdü. Etiraf etmək, buna inanmaq istəmirdi.)

Durna xanım yorğan altında birdən-birə hövülləndi. Dikəlib, balınca dirsəkləndi. Bəhlulun rahat yatışına acığı tutdu. Köksünü ötürüb küskün-küskün deyindi:

– Buna bax! Elə yatır, deyərsən, bir ayın yuxusuzdu... Böyründə arvadını vecinə almır, qeydinə qalmır... – Hündürdən ah çəkdi. Əlini zərblə balınca çırpıb səsini ucaltdı: – Sonsuzluğumun səbəbini nahaq ayrı şeydə axtarırlar. Ən başlıca səbəbi bax, budu... sönük ehtirasdı!

Durna xanım bir də ah çəkdi. İlk dəfə idi bu halı keçirirdi. Bəhlulun işdən yorğun gəlib, dərin yuxuya getməsi, arvadına yataqda nəvaziş göstərməməsi bəyəm azmı olurdu? Son illər belə vəziyyət tez-tez təkrarlanırdı. Durna xanım onu heç vaxt qınamırdı. Bunun umu-küsüsünü etmirdi. Əksinə, ona canı yanırdı. Çox yorulduğuna acıyırdı. Ancaq indi Bəhlulun daş yatışına darıldı. Qadınlıq hisslərini Əfsunun hərarətli öpüşləri coşdurmuşdu. Üzüstə uzandı, qərarını pıçıltı ilə qətiləşdirdi:

– Mən öz xoşbəxtliyimi düşünməliyəm. Sonsuzluq dərdimin çarəsinə çalışmalıyam. Kimlərinsə qınağından, dedi-qodusundan nahaq yerə qorxuram. Qoy nə deyirlər-desinlər, nə cürə yozurlar-yozsunlar, vecimə almamalıyam. İt hürər, karvan keçər. "Zırrama" saydığım oğlanı mənə Tanrım yetirib. İnanıram buna. Lap yüz faiz inanıram! Belə olmasaydı, həmən oğlanı dönə-dönə qarşıma çıxartmazdı, qəlbimi sirli-sirli döyündürməzdi...

Durna xanım burda yenidən fınxırdı. Sanki canından tərəddüd ilişgənlərini, əhd-peyman maneələrini dartıb içindən çıxartdı. Özünü yüngülləşdirdi:

– Yox, qismətdən geri durmaq, ar-namusa sığınmaq axmaqlıqdı. Bəhlul qoy özündən küssün. Vəfasızlıqda, etibarsızlıqda qınamasın məni. Su meymunun boğazına çıxanda doğmaca bala-

sını ayağının altına qoyur, deyirlər.

Durna xanım, nəhayət, sakitləşdi. Balıncını hər iki tərəfdən bərk-bərk qucaqlayıb, səhəri elə bu vəziyyətdə açdı.

## 9.

Əfsun Zamanlı iyirmi iki yaşına təzəcə girməsinə baxmayaraq, "aşiq-məşuqluq"da əməllicə təcrübəsi vardı. Hələ ilk gəncliyindən, lap yeniyetməlik çağından qadınla yaxınlıq şirinliyini dadmışdı. Orta məktəbin doqquzuncu sinfində oxuyarkən, süpürgəçi gəlinlə intim əlaqə qurmağı bacarmışdı. Şirin dili, qılığı, zarafatları ilə onu yoldan çıxartmışdı. Əri oğurluq üstündə həbsxanaya düşmüş bu gəlinlə gizlin kef çəkmişdi. Məsələnin üstü açılanda, gəlinin qohumları son dərəcə qəzəblənmişdilər. Bu namus ləkəsini qanla yumaq istəmişdilər. Əfsunu güdmüşdülər. Harda əllərinə keçsə, öldürəcəkləri ilə hədələmişdilər. Əfsunun valideynləri həlli sülh yolu ilə çətin olan qalmaqalı yat-küt eləmək üçün rayon hərbi komissarına vasitəçi salıb, Əfsunu vaxtından qabaq əsgərliyə göndərtmişdilər ki, iki-üç il gözdən uzaq olsun, kin-küdurət unudulsun. Lakin Əfsun o uzaq, qərib-qürbət yerdə, ciddi nizam-intizam şəraitində də dinc durmamışdı. Komandirinin həddi-bulux qızının saqqızını oğurlayıb, qələt işi təkrarlamışdı. Həbsə salınmışdı. Hərbi tribunalın həbs cəzasını alhaalda, təsadüfi xoşbəxtlik üz vermişdi. Sən demə, günüqara qız başqa bir əsgərlə də yaxın münasibətdə imiş. Həmən ərəfədə ona qoşulub qaçmışdı. Əfsunun canı cəzadan qurtarmışdı…

Budur, indi də yeni eşq, yeni könül sevdası!

Əlbəttə, təzə sevda əvvəlkilərdən çox fərqlənirdi. İlk gənclik macəralarında məqsəd bir idi: şəhvət tələbatını ödəmək! Bu dəfə isə məsələ bir qədər başqa cürəydi. Ondan Əfsunun özü də doğru-düzgün baş açmırdı. Bu həqiqi eşqdimi? Bəlalı məhəbbətdimi? Hisslər aydın deyildi. Az-çox bəlli olan bircə şey vardı ki, Durna xanım üçün əldən gedirdi. Hər dəfə görəndə ağzının suyunu yığıb-yığışdıra bilmirdi. Elə ki, Durna xanımın ətli əndamı, incə beli, dolğun qılçaları gözünə sataşırdı, ağlı başından çıxırdı. O şux gərdənə sarılmaq, incə beli qucmaq üçün ölüb-dirilirdi. Özü demiş-

kən, bunun uğrunda ən ağır cəzaya da qail idi.

Qarşıdakı görüşə ötəndəfəki kimi qəsdən ara verdi. Həsrətin, intizarın amansız sıxıntılarına birtəhər dözdü. Gecələr yuxusunu ərşə çəkib, gündüzlər onu gicələk qoysa da iradəsi zoruna tab gətirdi. Lap son rastlaşmadakı yalvar-yaxarlarının təsirini sınamaq istəyirdi. Xüsusi yanğı və yazıqlıqla deyilmiş sözlər az, ya çox dərəcədə müsbət rol oynamalı, qadın ürəyini çalxalamalı idi. Buna ümidi çox idi. Ona görə də yeni rastlaşmanı səbirlə gecikdirirdi. Əgər işi nəhsə düşüb, istədiyi alınmasaydı, özünü oda-közə vurub, baş sındırıb ayrı kələklər fikirləşəcəkdi.

Dörd gün, dörd gecəni zülüm-zillətlə keçirdi. Bundan belə dözmək gözünə durdu. Hicranın hər anı, hər dəqiqəsi onun üçün aya, ilə döndü. Bəxtini bir də sınamağa, məqsədə çatmağa qərar verdi. İşi elə bu axşamdan o yana qoymadı. Durna xanımın kitabxanadan çıxmaq vaxtı yaxınlaşanda gedib, köhnəki yerdə – get-gəli az döngədə dayanıb gözlərinin kökünü saralda-saralda yar gəlişini gözlədi.

İncəvara, Durna xanım yaxın yolunu uzaqdan salmadı, iz itirmədi. Aralarında on-on beş addım qalanda, Əfsun quş kimi qanadlandı. Özünü Durna xanıma qaranəfəs yetirdi. Ürəyindən onu qucaqlamaq keçdi. Ancaq məcburiyyət qarşısında toxtadı. Tələskənlikdən gözü qorxmuşdu. Durna xanımı yenə cırnadacağından ehtiyatlanıb ədəb-ərkanlı davranmağa çalışdı.

– Salam-əleyküm, Durna xanım. Hər vaxtınız xeyir!

– Əleyküm-salam.

Salamının xoş ovqatla alınması Əfsunu cəsarətləndirdi. Görüşmək üçün əlini şəstlə irəli uzatdı. Durna xanım əli havada boş qoymadı.

Əfsun pambıq kimi yumşaraq, ağappaq əli ovcunun içində hiss edincə, həbsi-hal oldu. Nazikcə barmaqları özünün baş barmağı ilə ustufca sığallaya-sığallaya qabaqcadan beynində hazırlayıb, çinədanına yığdığı ən xoşagəlim sözləri ipə-sapa düzdü:

– Oy, nə səmimi görkəm! Nə nurlu, nə mehriban baxış! Bu şirin təbəssüm canıma sarı yağ kimi yayıldı. Ölü bir bədənə dirilik eleksiri verdi. Təşəkkür! Min dəfə, milyon dəfə təşəkkür!

O, ara verdi. Ovcundakı yumşaraq əlin hərarəti ürəyinə təpər gətirdi. Lap coşdu:

– Allahıma çox-çox minnətdaram. Azacıq da olsa, sizi rəhmə

gətirib. Könlünüzə insaf toxumu səpib, gözləriniz gülümsəyir. Əgər məni əvvəllərdəki təkin mısmırıqlı qarşılasaydınız, inanın, gedib özümə qəsd etməkdən savayı çarəm qalmayacaqdı. Nə yaxşı ki, pərvərdiyar məni o qarauğurluqdan qurtardı. Yoxsa, siz, vallah-billah, böyük qan-qarğış yeyəsi olacaqdınız.

Durna xanım əlini Əfsunun qaynar ovcundan ehmallıqla çıxartdı. Xoş təbəssümlə:

– Başa düşmürəm, nə üçün? Mənim günahım nədi? – soruşdu.

Əfsun lotuyana qımışdı.

– Günahınız çoxdu, ziyadadı!

– Məsələn, – Durna xanım yarıciddi xəbər aldı: – Hansılardı?

– Birinci günahınız odur ki, ananız sizi qənirsiz gözəl doğub. İkinci günahınız ondan ibarətdir ki, mənim qarşıma çıxıbsız. Leylisiz Məcnun eləyibsiz. Üçüncüsü də budur ki, rahatlığımı əlimdən alıbsınız. Nə gecəm gecədi, nə gündüzüm gündüzdü... Bəsdi, ya yenə sadalayım?

– Bəsdi. – Durna xanım bir anlığa duruxub nazlı-nazlı əlavə etdi: – Mən özüm sizin qarşınıza çıxmamışam... Siz gəlib tapıbsız məni.

Əfsun "ovun" tora düşdüyünü tam yəqinləyib, arxayınlaşdı. Durna xanımın əlini ərklə yenidən ovcu içinə aldı, aramla tumarladı. Durna xanım etiraz bildirmədi. Əfsun bu məşğuliyyətindən əlahiddə həzz duya-duya rahatlıqla "sən" ifadəsinə keçdi:

– Hə, hə, düz buyurursan, – dedi. – Yüz faiz haqlısan. Səni mən arayıb-axtarıb tapmışam. Daha doğrusu, mən yox, bəxtim axtarıb tapıb səni. Alın yazısıdı bu. Belə alın yazısından, tale qismətindən hədsiz məmnunam. Mələməmiş quzu kəsərəm ona!

Durna xanım pıqqıltı ilə güldü:

– Mələməmiş quzu?!

– Bəli, mələməmiş, yəni südəmər quzu! – Əfsun da şən-şən irişib-qımışdı. – Bizim tərəfin adamları qoyunçuluqla məşğul olduqları üçün belə ifadə işlədirlər. Mələməmiş quzunun əti, əmlik ətindən də dadlıdır. Onu yalnız ən ali niyyət üçün kəsirlər.

Durna xanım gözlərini süzdürüb, susdu.

Əfsun daha da sərbəstləşdi. Boş əlini qaldırıb Durna xanımın çiyninə qoydu, səsinin bəlağətini artırdı:

– Bilirsən, Durna xanım, sözün doğrusu, mən bu dəqiqələrdə özümü dünyanın ən xoşbəxt, ən bəxtəvər adamı sayıram. Məni tə-

kin yolux, aciz bir oğlanı (ürəyində dilindəkinin əksini fikirləşdi, özünü çox cəsur oğlan adlandırdı), gətirib sənin simanda dünya gözəlinə, huri-mələyə urcah eləmiş bəxtə necə minnətdar olmayasan?! Hər iki gözüm üstündədi onun mübarək yeri!

Durna xanım qılıqcıl sözlərə tam yumşalmışdı. Ağzından tabesiz söz qaçırtdı:

– Bu neçə gündə hardaydınız? Heç yerdə görünmürdünüz... Fikirləşdim, yəqin xəstələnibsiz.

Əfsun bu sorğudan qürur duydu. Sual ona qadın qəlbinin gizlin nigarançılığından xəbər verdi. Qəddini iftixarla dikəltdi: “Aha, deməli, belə... hər şey aydındı. İntizarımı çəkib, yolumu gözləyib. Çox gözəl! Mənə də elə bunu bilmək lazım idi. Daha istəyimə nail olmağa yüz faizli şansım var. Məqsədə çatmaq məqamıdı”, – deyə düşünsə də, hansı bir hiss isə onu tələsməyə qoymadı. Hər ehtimala qarşı, biclik işlətdi. Səsini boğazında sızıldada-sızıldada:

– Eh, xəstələnsəydim nə vardı, – dedi. – Bu neçə gündə çəkdiyim sənə həsrət əzablarının yanında o, toya getməli olardı. Bir də, axı, mən yazıq, mən başıbəlalı sən rəhmsizin gözünə nə cürə görünəydim? Sənə yaxınlaşmaq olurdu ki?! İtin abrını verirdin. Dəymişim dura-dura, kalım tökülürdü. Nə yaxşı ki, bu zülümlərin uzun sürmədi. İnsafı arada gördün. Ağrısını alım o insaf-mürvətli ürəyin!

Durna xanımın üst dodağından zərif bir çimilti keçdi. Bu nəyin ifadəsi idi? Əfsun anlamadı. Bəlkə də onu heç sezmədi. Çünki içindəki ehtiras yanğısı son həddə çatmışdı, güclü vulkan kimi püskürmüşdü. Ədəb qaydalarını bundan o yana gözləməyi heç cürə bacarmadı. Durna xanımın çiynini sığallayan əli tələsik aşağı sürüşdü, yumru məmə üstündə əyləndi.

Durna xanım səksəkə ilə dala çəkildi:

– Oy, neynəyirsən?.. Başladın yenə?!

Əfsun Durna xanımdan möhkəm yapışıb, özünə sıxdı. Tövşüyə-tövşüyə yalvardı:

– And verirəm əzizləriyin canına, ölənləriyin müqəddəs urfuna, mane olma. Yazığın gəlsin mənə, ölürəm dərdindən... Bir misqal səbrim qalmayıb.

Durna xanım təlaş keçirdi. Həyəcandan çox həyadan pörtdü.

Utana-utana ətrafa boylandı. Yaxınlıqda adam yox idi. Vəziyyəti kənardan seyr etmirdilər. Nisbətən toxtadı, ağlı çaşqın oğlanı xahişlə sakitləşdirməyə çalışdı:

– Amanın bir günüdü, məni biabır eləmə. Bura küçədi, gələn-gedən var. Bizə nə deyərlər?

– Qoy, nə deyirlər, desinlər. Qaradan o yana rəng yoxdur!

– Özünü, xahiş eləyirəm, ələ al. Adam sevdiyi qadınla belə ləyaqətsiz rəftar eləməz.

– Fərmanını ver: ölüm, ya qalım!

Durna xanımın mehriban səsi sərtləşdi:

– Aramızın dəyməsini istəmirsənsə, mənim reputasiyamı qorumalısan. Mən küçə qadını deyiləm!..

– Mən də küçə xuliqanı deyiləm. – Əfsun Durna xanımı özünə yapışdırdı. – Eşq dəli-divanəsiyəm!

– Belə eləsən, bir də görüşməyəcəyik. Bu qəti sözümdü!

– Onda öldür məni. Qanım sənə halaldı!

Durna xanım titrədi. Nəfəsi tıxaclana-tıxaclana pıçıldadı:

– Yalvarıram, əlini dinc qoy... Odur, bizə sarı adam gəlir. Tanışlardan olar... Sözə baxmasan, sənin barəndə fikrim dəyişəcək.

Əfsun işarə olunan səmtə baxmadı. Nəyinə gərəkdi? Onsuz da onu ağıl idarə etmirdi. Çılğın ehtiras burulğanındaydı. Durna xanımı var gücü ilə qaranlığa dartdı.

– Rəhmini əskik eləmə mənə. Çox yox, cəmi beşcə dəqiqəliyə bəri gəl. Heç nə eləməyəcəm... Doyunca öpəcəm səni. Yoxsa hövlüm başıma vurar, aşkarca dəli olaram.

Durna xanım qarmağa ilişmiş balıq vəziyyətində idi. Sözə baxmaqdan savayı çarə tapmadı...

## 10.

O axşam Əfsun böyük qəhrəmanlıq göstərmiş adam ovqatında idi. Dodaqlarından fəxarət təbəssümü, gözlərindən sevinc parıltısı silinib getmirdi. Nə zarafatdı, Durna xanım kimi şəhərin ən gözəl qadınlarından birini ələ keçirmişdi. Öyünməyə, sevinməyə, əlbətdə dəyərdi!

Görüş yerini gec tərk etdi. İti addımlarla uzaqlaşan Durna xa-

nımı məmnun nəzərlərlə yola salıb: "Bax belə! Bundan sonra açanda ovucumda, yumanda yumruğumda olacaq. Daha canını qurtara bilməz məndən. Bu günlük bəsimdi. Əsas məqsədə gələn dəfə çataram. Muma-şama döndərmişəm...", – düşündü.

O, şadlığından aşıb daşa-daşa küçənin aydınlığına çıxdı. Get-gəli tam seyrəlmiş bu küçədə aşağı-yuxarı veyl-veyl gəzindi. Fıştırıq çaldı. Qol qaldırıb oynadı da. Bilmədi özünü başqa nə ilə ovundursun.

Birdən xırp dayandı. Anladı ki, veyllənməkdən heç nə hasil olmayacaq. Yaxşısı budur, gedib hünərini kiməsə danışsın, bolluca öyünsün, sərənəsini yatırtsın. Yadına sadəlövh otaq yoldaşı Fərid düşdü. Durna xanımdan zorla aldığı ilk öpüşlərin xoş təəssüratını ona söyləmişdi, ağzını sulandırmışdı. Hazırkı qələbəsi Fəridi lap mat qoyacaqdı. Ona heyrətdən gözləri bərələ-bərələ tamaşa edib, həsəd aparacaqdı...

Yataqxananın kasıbtəhər otağında üç nəfər qalırdılar. Yoldaşlarından biri dərslər təzə başlayan ərəfədə bərk azarlayıb, xəstəxanada üç həftədən artıq yatmışdı. Lazımi müalicə olunub, ayağa duranda valideynləri institut rəhbərlərinin razılığı ilə onu kəndə aparmışdılar ki, öz nəzarətləri altında qədərincə ətə-qana gəlsin, tam sağalsın, sonra qayıdıb dərslərinə davam eləsin.

Əfsun otaqda hegemon idi. Fəridin başında tərs dəyirman işlədirdi. Özü heç nəyə əl vurmur, zəhmət çəkmir, fağırı uşaq yerinə də buyurub-çağırırdı. Otağı sildirib-süpürtdürür, yatacaqları yığışdırtdırır, çirkli qab-qacağı yudurtdurur, hərdən dükan-bazara da yüyürtdürürdü. Bircə sözlə, üzüyola Fəridi özünə nökər-naib halına salmışdı. Təpinmək, göz ağardıb qorxutmaqla yox, qılıgına girmək, dilə tutmaqla saqqızını asanca oğurlayırdı...

Otağa şahanə qədəmlərlə daxil oldu. Küncdəki kiçik yazı masası arxasında dərsinə hazırlaşan Fərid başını dərhal dikəltdi. Əfsunu altdan-yuxarı, hədsiz maraqla marıtladı. Onun ədalı davranışından, irişib-qımışmasından nəsə şən əhvalat eşidəcəyini yəqinlədi. (Görüşə gedəcəyini Əfsun ona əvvəlcədən bildirmişdi.)

Əfsun ağayanalıqla altına səndəl çəkdi. Fəridlə qabaq-qənşər əyləşib, əlini sinəsinə sürtə-sürtə məzə qurdu:

– Həə, əzizim Fərid, sənə nədən danışım, bu axşamkı əla

sərgüzəştimdən...

Fərid hövsələsiz dilləndi:

– Danış, danış!.. Bir ətraflı söylə görüm, budəfəki görüş necə alındı?

Əfsun dodaqlarını yaladı, ağzını marçıldatdı.

– Yerin məlum, bir dünyalıq ləzzət dadmışam. Elə bilirəm, göyün yeddinci qatındayam.

Fərid qulaqlarını şeşlədib, boynunu Əfsuna doğru əydi. İştahla soruşdu:

– Ötən səfər cananından öpüş almışdın, bu səfər neylədin?

Əfsun məğrur-məğrur:

– Mümkün şeyləri elədim, – dedi. – Quzu yatımlı dodaqlarını ağzıma salıb doyunca əmdim. İncə belinə, şümşad gərdəninə sarıldım. Qəşəng məmələri ilə oynadım.

– Az da olsa, etiraz bildirmədi?

– Əvvəlcə hə, bildirdi. Sonra quzuya döndü.

Fərid dodaqlarını dili ilə yaladı.

– Çox maraqlıdı... xəsislik eləmə, ətraflı nağılla.

– Olmaz! – Əfsun birdən-birə üzünü bozartdı. – Sirdir bu. Açıb-ağartmaq qadağadı, icazə verilmir.

– Kim icazə vermir?

– El adəti!.. Kişilik qeyrəti!

– Qorxma, heç kəsə deməræm.

– Üz vurma!

Fərid incidi. Küskünlüklə dala çəkilib, burnunda mızıldandı:

– Yaxın yoldaşıq... Amma etibar eləmirsən mənə.

Əfsun yekəxanalandı:

– Sən hələ uşaqsan. Elə şeyləri bilmək tezdi sənə. Vaxtı çatanda özün öyrənəcəksən.

Fərid cırnadı:

– Uşaq niyə oluram? Aramızda cəmi iki yaş fərq var.

Əfsun bir müddət dinmədi. Səndəldən durub, çarpayısına yanaşdı. Geyinəcəkli halda ona sərildi. Qılçını qılçının üstünə aşırıb, bir də yekəxanalandı:

– Əslində, belə şeylər üstüörtülü qalmalıdı. İncimə. Kişi gərək dostluq elədiyi qadının da vəziyyətini düşünsün. Adını hallandırıb, aləmə car çəkməsin. O qadınların bir çoxunun ərləri, uşaqları var. Nə olsun ki, hansı cəhətinə görəsə ərinə vəfasız çıxır. Belə

vəfasızlığın, hər halda, səbəbləri olur. Mənim cananımın da mənə meyli, heç şübhəsiz ki, səbəbsiz deyil. Özündən soruşmamışam, amma bəzi hərəkətlərindən duyuram bunu... Bir sözlə, özünü kişi sayan hər kəs dilini dişləri arxasında saxlamalıdı. Ağzıbütöv kişiləri qadınlar yüksək qiymətləndirirlər. Mən bəzi əhvalatları sənə ona görə danışdım ki, görürəm, çox maraqlanırsan. Həm də inanıram ki, dediklərim ikimizin arasında qalacaq.

– Ona zərrəcə şübhən olmasın! – Fərid qətiyyətlə and içdi: – Atam canı, özümün ölmüşümə, sözü mənə dedin, ya gedib kar qayaya söylədin, fərqi birdir... Xasiyyətimi bilə-bilə nahaq ehtiyatlanırsan mənnən. Heç gözləməzdim.

Əfsun ağzını göyə tutub, ucadan qəhqəhə çəkdi:

– Ha, ha, haaa!! Ehtiyatlanmıram, ey, sadəcə, incəliyə varmaq istəmirəm. Bir də, axı, öpüş-görüşü gərək özün eləyəsən ki, dadını duyasan.

Fərid kiridi. “Bacarıqsızlıq”dan utanıb, qulaqlarının ucuna qədər qıpqırmızı qızardı. Əfsuna qibtə ilə:

– Sənə paxıllığım tutur, çox zirəksən, – dedi.

Əfsun ləzzətlə gərnəşdi. Özü də özündən razı qaldı.

– Elədi, düz sözə zaval yoxdu. Zirəklik, heç kəsin bacarmadığını bacarmaq Allahımın mənə mükafatıdı. Tanrı vergisidi. Dilim-dilçəyim olmasa, günüm göy əsgiyə düyülər. İndiki zamanda bicliklə, kələklə gərək özünə yol açasan, fəndgir olasan. Əks halda, yazıq hala düşəcəksən. Ömrün boyu hər şeyə tamarzı qalacaqsan.

Fərid köks ötürdü:

– O səriştə hər adamda olmur.

– Bu da doğrudu. Mən qızıl açaram, hər qapını açaram! O bacarığı Allah hamıya vermir.

– Kələklərindən mənə də öyrət, nolar, yoldaş döyülükmü?

– Yanımdasan də, fərasatın varsa, öyrən. Əl-qolunu kim tutur?

– Ehh... - Fərid mağmınladı. – Sağ əlin başıma!

Əfsun burda yenə ürəkdən güldü. Və köhnə, paslı dəmir çarpayısını bərk cırıldada-cırıldada Fəridə sarı çevrildi. Sol gözünü qıyıb, rişxəndlə:

– Sənə yazığım gəlir, – dedi. – Hiss eləyirəm, əlin qız əlinə heç toxunmayıb. Yaman yanğılı-yanğılı danışırsan.

Fəridin üzünün xəcalət qızartısı gözlərinin ağına da çiləndi.

– Yox, toxunmayıb... Qızlardan həmişə utanmışam... yaxınlaşa bilməmişəm.

– Ay ya-zıq! – Əfsun açıq lağ elədi. – Sən lap əfəlin-əfəlisən ki?!..

Fərid pərt-pərt susdu.

Əfsun yalan-doğru ümid verdi:

– Yaxşı də, çarəm nədi? Əzvay bir otaq yoldaşımsan. Gərək bəzi məsələlərdə səni işə-başa salım. Yoxsa, bu dünyaya əfəl gəlibsən, əfəl də gedərsən.

Fəridin şadlıqdan irilənmiş bəbəkləri parıldadı.

– Çox xahiş eliyirəm. Bəlkə sənin cananıyın yaxşı rəfiqəsi var...

Əfsun kirpiklərini xıppıldatdı, nə isə fikirləşib, alakönül razılaşdı:

– Özünü yaxşı aparsan, düzələr bu iş.

Fərid nisyəni nağdılamağa tələsdi:

– Nəyi nəzərdə tutursan?.. Özümü nədə pis aparıram?

Əfsun amanıqırıq sualı cavabsız qoydu. Çarpayıdan yorğun-yorğun düşüb, paltarlarını soyundu. Yorğanı üstünə örtüb, əmr etdi:

– Söylətmə məni. Dur, lampanı öləzit! İşıqda yatammıram.

– Yorğanı çək başına, gözünə işıq düşməsin.

– Söz güləşdirmə!

– Bağışla, işim çoxdu.

– İşin sabaha qalsa, dünya dağılmaz.

– Sabaha saxlayammaram. Kollekvuma konspekt tuturam.

Bir dəqiqəlik pauza yarandı.

Əfsun gözlənilmədən qılığa başladı:

– Ə, Fəri, qulaq as! Sabahda, biri gündə cananımı bəlkə bura gətirdim... Bəlkə deyirəm, ona görə ki, hələ razılığını almamışam. Bu barədə bir kəlmə danışmamışıq. Birdən ağlıma gəldi. Çox nazlı-qəmzəli xanımdı. Göylə gedənlərdəndi. Bilmirəm bizi endirib bu kasıb yataqxanamıza ayaq basarmı?

– Gətirə bilsən, əla olardı. Öz gözlərimlə görərdim onu. Neçə gündü hey tərifləyirsən. Baxardım, o tərifə layiqdimi.

– Gözlə ha, görəndə hayıl-mayıl olub, seliyini saxlayammazsan.

– Arxayın ol! – Fərid zarafatla göz-qaş oynatdı. – Gəlsəydi, mənim də işimə bir əncam çəkərdi. Diləyimi ona öz dilimlə yetirərdim. Səndən ağlım bir şey kəsmir. Közü yalnız öz qabağına çəkirsən.

Əfsun yatağından dik atıldı. Əsəbi-əsəbi çığırdı:

– Qələtini elə, əə!.. Sarsaxlama!!

Fərid tezcə mısdı. Cınqırı zorla çıxdı.

– Mən nə dedim, axı?!

Əfsun hirsini söndürüb, yastığa dirsəkləndi. Cır səsini qaydasına saldı:

– Orasını fikirləşmirsən ki, belə xahiş onun xətrinə dəyər. Elə bilər, onu küçə qadınlarından sayırsan. Mənim tilovuma ilişdiyinə baxma, ciddi qadındı. Bizi məhəbbətdi bir-birimizə bağlayan.

– Qayım-qədim olsun məhəbbətiniz! Mənə də sevgili tapsa, savaba batardı.

Əfsun daha höcətləşmədi. Sonrakı işlərinin xatirinə Fəridə güzəştə getdi:

– Söz verirəm, vaxtı çatan kimi o işi özüm düzüb-qoşacam... Hə, indi qalx, işığı söndür, rahat yatım.

Fərid dəftər-kitabını örtdü. Onsuz da fikri dağılmışdı. Bu söhbətlərdən sonra çətin ki, diqqətini dərs üzərində cəmləşdirə bilərdi.

## 11.

Bəhlul Ağazadə erkən durmağa, günəşi üfüqdə qarşılamağa adət etmişdi. Çiskinli, yağış-yağmurlu havalarda da həmən vaxtda oyanırdı. Ona xəbərdarlıq zəngi-filan gərək deyildi. Nə qədər gec yatmış, yuxusuz qalmış olsa da vərdişinə sadiq idi. Dəqiqəsinə, saniyəsinə söz yoxdu, saat yeddi tamamda yuxudan oyanırdı. "Üç telli"sinin sübh uyqusuna haram qatmadan, ehmalca qalxıb çarpayıdan düşür, yorğan-döşəyinin səliqəsini özü düzəldir, tualetlə işini qurtarıb, yaxşı-yaxşı yuyunur, oradan mətbəxə keçirdi. Əvvəllərdə təsvir etdiyimiz qaydada özünə yüngülvari qəlyanaltı hazırlayır, yeməyini yeyib, üstündən bir stəkan çay içir və pəncələri üstündə, asta-asta yataq otağına qayıdırdı. İş paltarlarını soyunduğu yerdən götürüb, tələsmədən geyinir; əyilib "üç telli"sinin yana-

ğından, yaxud saçlarından öpür, idarəsinə yollanırdı. (Bu öpüşdən Durna xanım əksər hallarda heç xəbər də tutmurdu.) Bəhlul Ağazadə həmişə (qanunlaşmış halda) rəhbərlik etdiyi şöbənin bütün işçilərindən tez gəlirdi. Onun evdən haçan getdiyi, çöl qapısını arxasınca nə cür bağladığı da Durna xanıma gizli qalırdı.

Bəhlulun gedişindən Durna xanım bu səhər də xəbər tutmamışdı. Öpüşünü də əsla hiss etməmişdi. (Əfsunun hərarətli öpüşləri müqabilində bu nə öpüşdü ki?!) Xumarlı gözlərini hərləyib, ön divardakı iri, kəfgirli saatda əylədi. Doqquzun yarısı idi. Kitabxanaya yollanmağına hələ xeyli vardı. Həmişə ona işləmiş evdən çıxırdı. Arxayınlıqla qollarını yana açdı. İdman eləyirmiş kimi, iki-üç dəfə havaya qaldırıb-saldı. Belini qanırıb quluncunu qırdı. Sonra kirpiklərini ovuşdurdu. Tənbəl-tənbəl dikəlib, yastığa dirsəkləndi, qalxmaq istədi. Gövdəsinin ağırlığına dirsəkləri tab gətirmədi. Təzədən arxası üstə sərildi. Gözləri xəyallandı. Ötən axşamkı intim görüşü xatırladı. Bekaraca aralanmış isvaha dodaqlarına xəfif təbəssüm qondu. Bu təbəssüm yavaş-yavaş bütün çöhrəsinə yayıldı. Əfsunun adını əvvəlki dəfələrdən fərqli olaraq, həsrət yanğısı ilə dilinə gətirdi, ehtirasla pıçıldadı: “Ah, Əfsun, sən necə şirinsən!? Öpüşlərin, nəvazişlərin necə də dadlıdı, ləzzətlidi!?” Bunun dalınca da çönüb, Bəhlulun yatağına ötəri nəzər yetirdi. Bir daha özünə haqq qazandırmağa çalışdı: “Mən, ağılsız, özümü nahaqdanca qəmqüssəyə batırmışdım. Başıma gələn işin xəcalətini çəkirdim. Nədi, axı, günahım!? Fahişəlikmi, şortuluqmu eləyirəm?! Qurban olduğum Allaha əyandı ki, bütün qadınlar kimi, övlad arzusundayam. İstəyirəm körpə nazı ilə oynayım, gecələr yuxusuz qalım, əziyyətini çəkim. Bu müqəddəs analıq qayğılarından mən nə üçün məhrum olmalıyam, nə üçün?!”

Durna xanım yaralı quş halında çırpındı. Səsini üsyankarlıqla ucaltdı:

– Mən sapsağlam qadınam. Həkimlər məndəki qadınlıq gücünü, analıq qabiliyyətini görə bilmirlər. Onu duymağa qadir deyillər! Neçə-neçə qadın tanıyıram ərlərindən ayrılıb, başqası ilə ailə qurublar, üstündən heç bir il keçməmiş də uşaq doğublar. Allahımın köməkliyi ilə mən də Əfsundan umduğumu qazanaram, uşağım doğular. Şəkkə lənət!!

Və bu inamın, özünə güvənmənin güclü təsiri ilə də təpərləndi. Sevincək geyindi. Böyük güzgü qabağında saçlarına daraq çəkdi, qaşlarını, kirpiklərini tumarladı. Ovuclarının içi ilə hər iki üzünü, alnını sığalladı. Ağır-arxayın tərpəndi. Evlə işlədiyi kitabxananın arası iyirmi-otuz dəqiqəlik piyada yolu idi. Geciksə də eyib etməzdi. Oxucular kitabxanaya günün ikinci yarısında axışırdılar. Kitab tələb edənlərin böyük əksəriyyəti tələbələr olduğundan, gərginlik günortadan sonra yaranırdı.

Astagəl yuyundu, darandı. Ayna qabağında təkrar dayandı. Qaşlarının pırpızlarını yatırtdı. Burnunun yan-yancaqlarına, gözlərinin alt və üstünə sığal çəkdi. Pudralandı, ətirləndi. Gedib şifoneri açıb, asılqanlardan cərgə-cərgə asılmış dəb-dəb paltarlarından könlünə ən çox yatanını, diqqət çəkənini seçdi. Əfsunla öndəki görüşə xüsusi həvəslə bəzənib-düzəndi. Toya, nişana, teatra hərdənbir gedəndə heç belə cəhd göstərməzdi. Elə bilərdin, cavanca qızdı.

Görüş anlarını dərin intizarla gözlədi. İş vaxtı bitər-bitməz, tələm-tələsik yığışdı. Ona təəccüblə baxan iş yoldaşları ilə dilucu xudahafizləşib, yeri-yüyürlə kitabxananı arxada qoydu.

Əfsun dünənki yerdə yarım saatdan artıq idi nigarançılıq içində dəqiqələri sayırdı. İndiki görüşdən umacağı çox idi. Bu dəfə heç nədən çəkinməməyə, son məqsədinə mütləq çatmağa hazırlaşmışdı. O, Durna xanımın pişvazına odlu ürəklə yüyürdü.

– Salamlar olsun, mənim xoş avazlı, şux camallı Durnama!.. Axşamın xeyir!.. Nə var, nə yox, necəsən? – deyib, hal-əhval soruşa-soruşa onu küçənin ortasındaca qucaqladı. Hər iki yanağından möhkəm öpüş aldı.

Durna xanım ona mane olmadı. Çünki özü də Əfsun ovqatında idi. Çılğın hisslər onun da beynini dumanlandırmışdı. Hətta dili də tutulmuşdu.

Əfsun cavab gözləmədi. Buna ehtiyacı yox idi. Qolunu Durna xanımın gərdənindən götürüb, boynuna doladı. Hay-küyünə davam etdi:

– Səni bilmirəm, mən yamanca sənsizləmişdim, əziz Durnam! Bircə gecənin ayrılığı mənə min gecənin hicran zillətinə bərabər

olmuşdu. Demək olar ki, heç yatmamışam. Hey səni düşünmüşəm... Ah, nə ağırmış yar həsrəti!

Durna xanım ona qıyqacı baxdı. Göz gilələri sağa-sola tərpəşdi.

– Doğrudan bu qədər darıxmışdın?

– Əlbəttə, doğrudan!.. Niyə inanmırsan?

– Ona görə ki... yuxusuz qalmışa oxşamırsan.

– Nədən bilirsən?

– Yuxusuz qalan gözlər başqa cür olur... Kirpiklərindən mürgü sallanır. Sənin gözlərin isə çox rahat yatmış adam gözləridi.

Əfsun bir neçə anlığa tutuldu. Yalanına tezcə bəraət tapdı:

– Mənim gözlərimin belə görünməsinin səbəbi başqadı. O səni görəndə dərhal dirçəlir, sevincindən bərq vurur.

Durna xanımın sifətində qəribə əhval dəyişikliyi duyuldu. Sanki ona birdən-birə sayıqlıq fəhmi gəldi. Oğlanın özündən çox cavan olduğunun fərqinə yalnız indi vardı. Dərin məyusluğa qapıldı. Utana-utana soruşdu:

– Sənin neçə yaşın var, Əfsun?

Əfsun peşmançılığı hiss etsə də səbəbini anlamağa çalışmadı, məğrur cavab verdi:

– İyirmi ikini tamamlayıram, – dedi. – Necə bəyəm? Nə üçün soruşursan?

– Heç... – Durna xanım dalğınladı. Astarıq köks ötürdü. – Yaş fərqimiz böyükdü.

Əfsun arsızlıqla əlini-əlinə vurub, şaqqanaq çəkdi.

– Gör bir nəyin dərdini ürəyinə salırsan? O yaş fərqi boş şeydi. Sən mənim gözümdə on beş yaşında qızdan da gəncsən.

Durna xanım bir xeyli susdu, başını buladı.

– İndi belə deyirsən.

– Həmişə belə deyəcəm!

– Yox, bu ciddi məsələdi.

– Mən isə onu çox qeyri-ciddi, mənasız sayıram. Məhəbbət olan yerdə qalan şeylər əhəmiyyətsizdi. Bir şair bu barədə gözəl deyib:

*Hələ alovlusa, odlusa ürək*
*Könül sevdasının nə dəxli yaşa?!*

Durna xanımın məyusluğu ötüb-keçmədi. Əfsun araya zarafat qatdı:

– Qətiyyən narahat olma, əzizim. Qocalan vaxtımızda səni atıb, özgəsinə meyil salmaram. Hələ orasını da bilmək olmaz, kim tez qocalacaq.

Durna xanıma bu zarafat da təsir etmədi. Qaşqabağı açılmadı. Əfsun hay-küyünü təzələdi:

– Mənim canım-ciyərim, könül şahım Durna xanım! Sənin xəbərin yoxdur ki, bu sevgimizdən mən necə böyük fərəh duyuram. O həssas, o gözəl ürəyində özümə yuva qurmağımdan, heç bilirsən, nə qədər xoşhalam? Bu mənim üçün ağıla, xəyala gəlməz bir xoşbaxtlıqdı. Sənə olan ülvi, alovlu məhəbbətimi heç bir səbəb söndürməyə qadir deyil. Nəyə deyirsən and içim ki, bu belədir. Ona zərrəcə şübhən olmasın.

Durna xanımın əhvalı bala-bala duruldu. And-qəsəmlər könlünü xeyli açdı: "Əh, sonra hər nə olar, qoy olsun. Əsas budur ki, niyyətim baş tutsun. Hamıya sübut eləyim ki, mən qatır cinsindən deyiləm, uşaq doğmağa qabiliyyətim çatır. İndidən gələcəyin olacaqlarına yas saxlamaq ağılsızlıqdı. Taleyimə nə yazılıbsa, onu da görəcəyəm", – düşündü. Gözləri gülümsündü.

Əfsun sevindi:

– Allaha min şükür! Nəhayət ki, lənətə gəlmiş qara bulud üzündən çəkildi, siman yenidən gözəlləşdi. Sənə gülmək çox yaraşır. Qoy Allahım səni həmişə güldürsün. Və o gülüşdən mənə də bir yetim payı düşsün!

Durna xanım qəlbən:

– Etiraz eləmirəm, – dedi.

– Səxavətindən çox razıyam! – Əfsun tələskənliklə çönüb dala-qabağa nəzər saldı. Ətrafda sakitlik idi. Durna xanımı səkidən qırağa çəkdi. – Bəri gəl! Səndən ötrü təkcə mən yox, dünənki görüş yerimiz də darıxıb.

Durna xanım ayaqlarını yerə bərk dirədi. Sifətini bozartdı:

– Bu nə təklifdi eləyirsən?

– Gözəl təklifdi! – Əfsun uşaq şitəngliyi ilə hırıldadı. – Dünən axşam altına sığındığımız o ağac yenə bizi gözləyir. Müqəddəs ağacdı. Sevişənlərin pənah yeridi. Səndən sonra səcdə eləmişəm ona. Qucaqlayıb sənin iyini ondan almışam. Gedək onun xəlvət qoynuna.

Durna xanım hiddətləndi:
– Sən məni nə hesab eləyirsən?! Haqqın yoxdu alçaltmağa!
– Alçaltmıram... təklif eləyirəm.
– Ağaclar altında, qaranlıq künc-bucaqlarda pozğunlar görüşürlər.
– Həəə, başa düşdüm... – Əfsun boynunu yazıq-yazıq bükdü, əllərini yana açdı. – Neyləyim, dərdiş. Tələbəçiliyin üzü qara olsun, məni sənin yanında üzüqara qoyur. Kahkaşanələr içinə, cah-calallı bir yerə aparmağa gücüm çatmır. Sənə sadağa eləməyə bir quruca canımdı, bir də o ağac altı.
Durna xanım yerə baxdı. Sükut çökdü. Əfsun çənəsinin altını qaşıya-qaşıya başqa təklif irəli sürdü:
– Razılaşsaydın... bizim... yataqxanaya gedərdik.
– Yataqxanaya?!.. – Durna xanım istehza ilə qıyılmış gözlərini Əfsunun üzünə sancaq kimi sancdı.
– Bəli, yataqxanaya.
– Elə bircə o qalmışdı!.. Camaatı özümə güldürməyim əsgik idi!
– Vallah, can-ciyər, bizim yataqxana hər cəhətdən sərfəlidi. Çox səliqə-sahmanlıdı.
– Bəs adamlar?
– Adamlardan heç bir xətər yoxdur. Bizim yataqxanada sərbəstlikdi. Hardan gəlibsən, hara gedirsən soruşulmur.
– Axı...
– Düz deyirəm, qorxu-hürküsüzdü.
– Tutalım ki, elədi... Düşünməzlərmi bu qadın kimdi, bura nəyə gəlib?
– Düşünməzlər. – Əfsun inamla söz verdi. – Çox maraqlansalar, deyərəm dayım qızısan. Tələbə qohumlarından yataqxanamıza gəlib-gedənlər çoxdur... Hə, nə deyirsən, gedirikmi?
Durna xanımın qaşları çatıldı. Fikrə getdi.
Əfsun dəqiq cavab istədi:
– Dillən. Hə, ya yox?
Durna xanım çiynini çəkdi.
Əfsun təklifini ciddiləşdirdi:
– Soğan olsun, nağd olsun!.. İki sözdən birini seç.
Durna xanım dilini sürüdü:

– Çətin məsələdi...

– Heç bir çətinliyi yoxdur. Babalı mənim boynuma!

Durna xanım gərgin-gərgin susdu.

Əfsun qərarı söz kəsənliklə elan elədi:

– Deməli, danışdıq! Sabah elə bu zaman gəlirəm dalınca. Vəssalam, şüttamam!

**12.**

Əfsun Zamanlı imkanlı ailənin oğlu idi. Atası ucqar bir rayonun varlı sovxozunda baş mühasib işləyirdi. Kənddə hamıdan yaxşı dolanırdılar. Sovxozun direktoru da, heç sözsüz ki, baş mühasibin əlinə baxırdı. Yumurtadan yun qırxan bu mühasib haqq-hesabı elə fırladır, gəlir-çıxarını elə düzüb-qoşurdu ki, çoxluca "çirkli pullar" qazanırdı. O pulları direktorla dədə malı kimi bölüşür, özünə əlavə saxlanc da saxlayırdı. Pul sarıdan oğlunun da korluğu-filanı olmurdu. Geyimdə, dolanışıqda institut tələbələrinin çoxundan, bəlkə də hamısından fərqlənirdi. Bu səbəbdən də cibinin ağzı həmişə açıq idi. Kefindən, yeyib-içməyindən qalmırdı. Curlarını – institutun sayılıb-seçilən, nəzər-diqqətdə olan tələbələrini, işi keçən ara-bərə adamlarını həftədə, on gündə bir başına yığıb, qonaqlıqlar verirdi. Yataqxana böyükləri ilə də yaxın münasibətdə idi. Xırda-para kənd sovqatlarından onlara da pay ayırır, xətirlərini xoş eləyirdi. Durna xanımı arxayın salmağının da məğzində məhz bu ərk dururdu.

O, canan görüşündən umsuq ayrılsa da yataqxanaya şən və şux gəldi. Fəridlə şərti şumda kəsdi:

– Bax, ha! Özünü tərbiyəli apar. Cananımın razılığını almışam. Sabah axşam qonağımdı. Gözə görünüb, ağzıyın seliyini axıtma. Biz otağa gəlməzdən yarım saat əvvəldən əkil burdan. İki-üç saatlığa gedib parkda-zadda gəzin... Bir sözlə, gözə görünmə. Cananıma demişəm ki, otaq yoldaşlarım rayona gediblər, otaqda təkəm.

Fəridin gözləri işım-işım işıldadı.

– Mən, axı, onu görmək istəyirəm.

– Nə üçün?

– Onun üçün ki, bilim həqiqətən də gözəldi, ya sən hap-gopla öyürsən.

– Ona ancaq aralıdan, yataqxanaya giriş qapısı həndəvərindən

baxmağa icazə verirəm. Yaxından baxsan, ağzıyın tamah seliyini saxlayammazsan, biabır olarıq.

– Narahat olma, özümü toxtaq saxlamağı bacararam.

Əfsun ona gözünü ağartdı:

– Çürütmə sözü! Qanacaq yaxşı şeydi!

Fərid həsdəmədi.

– Qanacaq yaxşı şeydisə, vədə əməl də heç pis şey deyil.

– Nə vədə?!

– Mənə verdiyin vədi nə tez unutdun?

– Unutmamışam. – Əfsun candərdi onu arxayın saldı. – Söz dəyirmandakıdı.

Aydın oldu?

– Hə, oldu.

Əfsun ertəsi gün dərsə getmədi. Otaqda tək qalıb görüşə bəzi hazırlıq tədbiri gördü. Dükan-bazardan alınası, süfrəyə çıxarılası şeylərin siyahısını tutdu. Qonağını boş əllə, tədarüksüz qarşılamağı şəninə sığışdırmadı. Bunu qanacaqsızlıq, cananına hörmətsizlik hesab elədi. Axı, "qonaq" içəri ayaq basan kimi qamarlamaq, aparıb çarpayıya yıxmaq yaxşı deyildi. Amanıqırıqlıq qadına mənfi təsir bağışlayardı. Evdə bişib, qonşudan gəlməsə də baxdığı kinolardan, seyr etdiyi tamaşalardan yadında qalmışdı ki, centlmen sayağı davranmalı, hər işi ədəbli, mədəni görməlidi. Özü haqqında müsbət təsəvvür yaratmalıdı. Görüş bununla bitmirdi, davamları da olacaqdı.

Siyahısını cibinə basdı, yaxınlıqdakı ərzaq mağazininə bəri başdan yollandı ki, dar macalda ora-bura tüyünməsin. Yüyür-yıxılla, qaçaqaçla özünü yormasın.

Babat süfrə üçün üç cürə kolbasa, holland pendiri, balıq kürüsü, yağ və təzə təndir çörəyi aldı. İçkini də unutmadı. Qadınların şampan çaxırı sevdiklərini bilirdi. Hər ehtimala qarşı, "şampan"la bərabər başqa çaxır və iki şüşə də mineral su götürdü. Gətirib otaqdakı kiçik soyuducuda yerləşdirdi. (Bu soyuducunu da dərs ilinin əvvəlində özü almışdı. Otaq yoldaşlarını xərcə salmamışdı.) Sonra da yataqxana xidmətçilərini çağırıb, hərəsinə bir az xərclik verib, otağı lazımınca süpürtdürüb, pəncərə şüşələrini sildirdi. Bunlarla da kifayətlənmədi, çarpayısının döşəkağını, yor-

ğan və balınc üzlərini, ədyalını əlavə pulla təzələtdirdi. Otaq qabaqkı görkəmini xeyli dəyişdi, göz oxşadı.

O, hər hazırlığı imkanı daxilində səviyyəli görsə də ürəyi tıqqıltılı idi. Bərk nigarançılıq keçirirdi: görüş necə alınacaqdı? Allah eləməsin ki, ortaya bir hoqqa çıxsın.

* * *

Sevgililər gələn vaxt yataqxananın həyəti tünlük idi. Tələbələrin institutdan çoxdan qayıtmasına, axşam toranlığı çökməsinə baxmayaraq, sözlü-gaplı, canı odlu oğlanlar dəstələrə bölünüb orda-burda nəyinsə mübahisəsini edir; ucadan danışır, gülüşür zarafatlaşırdılar. Onların əksəri Əfsunun kurs yoldaşları, kef-damaq curları idi. “Cananını otağına gətirəcəyinin” vaxtını öyüncək Əfsun onlara da bildirmişdi. Aşiq-məşuqun təşrifini gözləyirdilər. Maraq böyük idi.

Taksi alaqapıda görünəndə, söz-söhbətlər kəsildi, dördgözlə maşının içinə boylanışdılar.

Əfsun maşını həyətə sürdürdü. Marağa duranlar aralanıb, geniş yol açdılar. Əfsun, qədim şahlar qaydası, sağ və sol yandakı oğlanları məğrur-məğrur salamlayıb taksini giriş qapısının düz qənşərində, bir addımlığında əylətdi. Sürücüsü ilə ilə hesablaşıb, cəld yerə düşdü. Maşının üstündən baxışan, həsəd çəkən yoldaşlarına həm qürrə, həm də bicərtək göz vurdu. Qaşlarını oynadıb, anlatdı ki: “Baxın, gözünüzə su verin!” Və maşının içinə əyildi, Durna xanımı tələsdirdi:

– Çatmışıq, əzizim. Ver əlini, düşməyə kömək eləyim.

Durna xanım həyadan qıpqırmızı qızarıb, maşının küncünə qısılmışdı. Onu hər tərəfdən marıtlamış baxışlardan gizlənmişdi. Əfsunun irəli uzanmış əlini hirslə dala itələdi:

– Düşmürəm!

Əfsun qılıqla üz vurdu:

– Utanma, dərdiş. Başqa adamlar yoxdu burda. Hamısı özümün yoldaşlarımdı. Eləcənə maraqlanırlar səninlə.

Durna xanım əlləri ilə üzünü örtdü. Barmaqları arasından sərt-sərt deyindi:

– Sən məni aldadıb hara gətiribsən?! Bunlar gözləri ilə adam yeyirlər...

Əfsun şit-şit irişdi.

– Bəri gəl!.. Qələt eləyir onlar.

Durna xanım bir az da küncə çəkildi:

– Sən yalançısan... Tanıdım səni! Gülünc vəziyyətlərə qoydun məni... Heyif zəndimə!

Əfsun boğaz çəkdi:

– Vallah, mən yalançı deyiləm... Nahaq yerə utanırsan.

Durna xanım söz eşitmədi. Küncə möhkəm sıxıldı. Burda qoca taksi sürücüsü də Əfsuna qəhmər çıxdı (haqqı artıqlaması ilə ödənilmişdi):

– Eşşəyə minmək bir ayıb, düşməmək iki ayıbdı, xanım. Daha naz-qəmzə yeri deyil. Xahiş eləyirəm, ləngitməyin məni. Sifarişçilərim var.

Sürücünün kinayəli sözləri Durna xanımı daha artıq utandırdı. Əlacı kəsildi. Ət tökə-tökə maşından düşmək məcburiyyətində qaldı.

Əfsun bir az da qürrələndi. Umsuq nəzərlərini Durna xanımdan ayırmayan sütül gənclərə, xüsusən də öz tay-tuşlarına yanıq vermək qəsdi ilə "cananının" qoluna izafi qürrə ilə girdi. Qapıya doğru şahanə yeridi.

Xəcalətdən başı köksünə əyilmiş Durna xanım necə addım atdığını bilmədi. Əfsunun böyrüncə kölgə kimi süründü. Ayaqları tez-tez bir-birinə dolaşdı. Üzündə hiss etdiyi həris baxışların təsirindən karıxıb, qapı astanasında büdrədi. Əfsun onu yıxılmaqdan zorla saxladı. Bundan daha da xəcalətlənmiş Durna xanım lap pörtdü, pıçıltı ilə öz-özünü danladı:

– Mən gicəm, yelbeyinəm, ağlımı büsbütün itirmişəm!.. Niyə gəlirdim bura?!. Nə itim azmışdı mənim burda?!. Ahh, kül başıma!.. Haqq olur mənə!.. Bu axmaqlığımı ömrüm boyu özümə bağışlamayacam!!

Əfsun onu şən-şən ovundurdu:

– Özünü əbəs yerə taqsırlandırma, mənim könül şahım!.. Biz ürəklərimizin əmri, onun xeyirxah hökmü ilə davranırıq. Ürək verən hökmü günaha yazmağa heç kəsin ixtiyarı yoxdur. Çünki ürəyi ulu Tanrı idarə edir. Hissləri, duyğuları coşduran da, yandırıb kü-

lə döndərən də ilahinin məsləhətidi. Bu məsləhətin əksinə getmək Allaha asi olmaq deməkdi. Toxtaqlı ol!

İlk mərtəbəni cınqırsız qalxdılar. Buradan pilləkən artırmasının qurtaracağındakı xudmani otağa buruldular. Əfsun qapını öz açarı ilə açdı. (Otaq sakinlərinin hərəsi özü üçün açar düzəltdirmişdi.) İçəri keçdilər.

Durna xanım güclə boğduğu qəhərini bundan belə saxlamağı bacarmadı, uşaq təki hönkürdü. Arxasını qapıya dirəyib, yumruğunu alnına, sinəsinə çırpa-çırpa Əfsunu qarğadı:

– Səndə bir misqal insaf yoxdur. Vicdansızcasına alçaltdın məni. Mənliyimi ucuz ayaqaltı kimi tapdaladın. Səni, görüm, qəhr olasan, yer altına köçəsən! Hü-hü-hü!

Əfsun qarğışı vecə almadı. Soyuqqanlı, hövsələli davrandı. Əsas məqsədi üçün də tələsmədi. Ov tələdə idi, hara qaçacaqdı? Həqiqi sevgili canıyananlığı göstərdi, “can-can” deyib Durna xanımın gah saçlarını, gah çiyinlərini tumarladı; əlini öpdü. Arada bir az pəltəkləmiş dilini yeni cəhdlə yüyürtdü:

– Səni başa düşürəm, əzizim. Sən belə riskə alışmayıbsan. Bu cür davranış tərzi sənə yaddı. Çünki sən əxlaqlı qadınsan. Saf ürəkli, abırlı, ismətlisən. Elə bu saflıqdan, abır-ismətdəndi ki, hər adi şeyə böyük məna verirsən. Onu pisliyə yozursan. Əslində isə, sən heç də pis iş tutmursan. Bütün sevişənlərin Allah izni ilə gördükləri bir işi təbii halda görürsən. Nə özünü qına, nə də məni. Biz bir-birimizi dəlicəsinə sevirik. Dəli sevginin də ölçü-biçisiz hərəkətləri qüsur sayılmır. Heç nəyi ürəyinə dərd eləmə. Bu sevdanın axırı çox yaxşı olacaq. Bizi arzuladığımız xoşbaxtlığa çatdıracaq.

Durna xanım, elə bil, könülləndi. Ağla-sıtqası yavaş-yavaş dayandı. Barmaqlarının ucları ilə nəmli kirpiklərini qurulaya-qurulaya:

– Xahiş eləyirəm, acizanə yalvarıram, məni tez apar burdan, – dedi. – Yoxsa ürəyim partlayacaq.

– Quzu kəsərəm o ürəyə. Qoymaram partlasın! – Əfsun növbəti hay-küyü ilə qucaqlayıb Durna xanımı balaca masaya yaxın apardı. Altına səndəl çəkdi. Çiynindən yüngülcə aşağı basdı. – Əyləş, beş-on dəqiqə nəfəsini dər. Sonra, baş üstə, gedərik burdan. Sənin narahatlığın mənim narahatlığımdı.

– Yox, tez gedək!

– Gedəcəyik. Bir azacıq dözməyin məsləhətdi.

Durna xanım gözqapaqlarını ağır-ağır sallayıb susdu. Əfsun əl-ayağa düşdü. Süfrə açmaq hayına qaldı, soyuducudan ərzaq tədarüklərini gətirib balaca masanın üstünə düzdü. Şampanı partıltı ilə açıb, stəkanları daşdırdı. Durna xanım heç nəyə əl vurmadı. Yola salınmasını bir daha təkidlə xahiş etdi.

Əfsun höcətini yeritmədi. Yeyib-içməyə vaxt itirməyə özünün də ciddi meyli yox idi. Şəhvət ehtirası amanını qırmağa başlamışdı. Cəld hərəkətlə səndəlini yana itələdi, əyilib Durna xanımın başını sinəsinə sıxdı. Üzünü, çənəsinin altını, boyun-boğazını, bəmbəyaz sinəsini qızğın öpüşlərə qərq etdi.

Durna xanım artıq özündə deyildi. Müqavimət göstərə bilmədi. Xumar tutmuş gözləri süzgünləmişdi…

**13.**

Fərid uzağa getməmişdi, qapı dalında pusqudaydı. Açar yerindən içərini izləyirdi. Nə qədər cəhd etsə də heç nə görmürdü. Əvvəlcə ağla-sıtqa, sonra da şirin ah-uflar eşitdi...

“Sevişmə” bitib, sevgililər geyinməyə başlayanda o, dala, dəhlizin qaranlıq tərəfinə çəkildi. Əfsunla Durna xanımın ayaq səsləri alt mərtəbədə eşidilən kimi, yüyürüb otağa təpildi. Əl vurulmamış yeməklər arxasında rahat əyləşdi. Aşiq-məşuqluq məsələsində ona “gün ağlamamış” Əfsunun acığına kəmərinin altını mükəmməlcə bərkitdi. Sonra da stəkanlarda içilməmiş şampanlara yiyələndi. Birini öz sağlığına dübarə başına çəkdi. “Oxxək!” – dedi. İkinci stəkanı qamarlayanda Əfsun qapı ağzından ona sərt-sərt sataşdı:

– Ə, Fərid Cəbiyev, nə bərk daraşıbsan özgə malına?!

Fərid halını pozmadı.

– Özgə malı niyə olur?.. Öz otaq yoldaşımın malıdı!

Əfsun üzünü bozartdı:

– Ə, həyasızlığına salma! Abırın olsun. Süfrədən geri dur, qoy mənə də bir şey qalsın. Acından ölürəm.

Fərid şampanla dolu stəkanı qaytarıb yerinə qoydu. Zarafatla ondan əvəz çıxdı:

– Acından ölməzsən. O cürə qəşəng bir xanımla kefə baxanın aclıq gərək yadına düşməsin.

Əfsun masa arxasına adladı. Ağzına bir loğma çörək, bir tikə də kolbasa alıb, yeyin çeynəyə-çeynəyə dedi:

– Ə, bu işin o işə dəxli yoxdu. Sən öl, ürəyim sıyrılır, səhər yediyimin üstündəyəm.

Fərid rişxəndlə qımışdı.

– O boyda enerji sərf eləyibsən, əlbət ki, ürəyin, sıyrılar.

Əfsun çeynədiklərini udub, ordunu yenidən doldurdu. Dodaqları çətin-çətin tərpəndi:

– Düzcə deyirsən, balam. Zalım qızı çox hərarətlidi.

– Sənə paxıllığım tutur... Bir də haçan gətirəcəksən onu bura?

– Dəqiq bilmirəm.

– Gəlsə, tək gəlməsin. Mənə də bir gün ağlasın.

– Ə, lal ol! Cındır mitilini tezcə sərmə ortaya!

– Neynim bəs? Qeydimə qalmırsan, yoldaşlıq təəssübüzad çəkmirsən...

Bir dəqiqə susdular. Əfsun ordunu kolbasa və çöreklə təkrar doldurub, həlim-həlim soruşdu:

– Hələ de görüm, cananım necə candı, tərifə layiqdirmi?

– Əla candı!

Əfsun kifayətlənmədi. Düzəliş verdi:

– Əla olmağı öz yerində, dünyada tək gözəldi!.. Qapıya toplaşıb bizə tamaşa eləyən yoldaşlarımız dalımızca nə dedilər?

– Nə deyəcəklər, həsəd apardılar. Ağızlarının suyu axdı.

– Qoy gözlərinə su versinlər! – Əfsun sinəsini məğrurluqla qabardıb, gərnəşdi. – Onların heç biri mənə tay ola bilməz. Tanrım məni tək yaradıb!

– İgidsən! – Fərid baş barmağını həsədlə dik qaldırdı.

– Ürəkdən deyirsən, bunu?

– Hə, ürəkdən. Yaman kələkbazsan.

– Ha, ha, ha!.. – Əfsun məmnunluqla güldü. – Onda gəl, kələkbazlığımı şərəfləndirək, içək mənim sağlığıma. Doldur öz stəkanını.

Fərid stəkanını şampanla doldurdu. Badələri havada toqquşdurub, iştahla içdilər. Fərid maraqlandı:

– Cananın doğrudanmı sevir səni?

– Doğrudan! – Əfsun birdən kefsizləşdi. Səsi həzinlədi. – Amma indi incik getdi. Ayrılanda möhkəm söydü məni, qarğışladı.

– Nəyə görə?

– Deyir, hamıya göstərdin məni, rüsvay elədin.

– Düz deyir də. Gərək elə hamıya car çəkəydin? Səndə öyüncəklik bir azardı.

– Eh, nə isə... Küsüb-barışmağın da öz ləzzəti var. Düzələn işdi... – Əfsun stəkanlara şampanı növbəti dəfə özü süzdü. – Gəl bu badələrimizi içək mənim gözəllər gözəli cananımın sağlığına! Həm də arzu eləyək ki, sənə də tezliklə bir canan qismət olsun. Belə süfrə arxasında qoşalaşıb oturaq.

– Allah ağzından eşitsin! – Fərid həsrət təşnəsi ilə qıy çəkdi. – Uzaq yolunu yaxından salsın o gün!

Əfsun gülə-gülə əlavə etdi:

– O günə quzu kəsək!

Və qol-qola girib, bunderşaf içdilər.

## 14.

Barışıqlıq Əfsunun düşündüyü kimi, asan olmadı. “Sevişmə” iki həftə ara verdi. Durna xanımın acığı soyumurdu. Başından şəhvət dumanı seyrəldikcə, yataqxanaya getməyinin xəcalətini daha artıq çəkir, böyük peşmançılıq keçirirdi.

Əfsun isə ilk intim yaxınlıqdan bir az da şirnikmişdi. Durna xanımı ağuşunda hər gün görmək həvəsindəydi. Bunun üçün yeni-yeni kələklər, bicliklər işlədir; ancaq heç nə alınmırdı. Durna xanımı cin atından düşürməyə heç nə təsir etmirdi.

Qarayaxa Əfsun çox götür-qoydan sonra başqa fənd düşündü. Bir axşam Durna xanımı gizlincə evə qədər güddü. Arxasınca kirimiş-kirimiş gəlib, həyətdə xapa-xapdan qənşərinə çıxdı. "Öldü var, döndü yoxdu", deyib, yalvar-yaxarını təzələdi. Yaxşı bilirdi ki, Durna xanım abrına sığınıb, burada ciddi çəm-xəm eləməyəcək. Qonum-qonşulardan utanacaq.

Belə də oldu. Durna xanım cınqır çıxartmadı. Həyadan, abır-ismətdən savayı intizar onu da sakit qoymurdu. Oğlana bütün qəlbi, varlığı ilə bağlandığını aydın duyurdu. Bir də ki, yanlış addım onsuz da atılmışdı. Çəm-xəmlərin bundan sonra faydası nə idi?

Oğlanı mehriban dindirdi:

– Necə gəlib tapıbsan buranı? Ünvanı kimdən öyrənibsən?

Əfsun qürrələndi:

– Heç kimdən. Ürəyimin diktəsindən!

Durna xanım bekaraca qımışdı.

– Qəribədir, ürək ünvanı da diktə edirmiş!

Əfsun küskünlüklə:

– Qəribə o deyil, – dedi. – Ən qəribəsi budu ki, adi bir səhv hərəkət ucbatından mənə bu qədər əzab verirsən. Yarım aydır dindirib-danışdırmırsan. Ürəyimi üzürsən. Belə daşqəlblilik olmaz, axı!

Durna xanım yüngülcə başını buladı.

– Sən o səhvinlə məni çox alçaltdın. Bunu annamırsansa, min təəssüf.

Əfsun höcətdən çəkindi. Umu-küsünü təzələyəcəyindən qorxub, şirindən-şirin qılığa keçdi:

– Bağışla məni, dərdiş. İşin orasını qanmamışam, incəliyə varmamışam. Yenə kəndçiliyimə salmışam... Bu dəfə də keç taqsırımdan. Yalvarıram, əfv elə məni.

Durna xanım özünə ayaq yeri qoydu:

– Yəqin bilsəm ki, bu səhv hərəkət sonuncudu, bir daha təkrarlanmayacaq, mənə çətin də olsa, əfv eləyərəm.

– Ona arxayın ol! – Əfsun ilan dili çıxartdı. – Qəti söz verirəm: sonuncudu!

– Yaxşı, bağışladım... – Durna xanım xudahafizləşmək üçün ona əlini uzatdı. – Di, qayıt geri. Burda çox dayanmaq olmaz. Qonşular görərlər bizi.

Əfsun əli möhkəm tutub buraxmadı.

– Öp məni, gedim. Yoxsa ürəkdən bağışlandığıma inana bilmərəm.

Durna xanım yan-yörəyə hürkmüş nəzər salıb, Əfsunu öpdü və tələsik aralanmağa çalışdı. Əfsun onu təkidlə saxladı.

– Bir dəqiqə səbir elə. Bəs, axı, görüş təyin eləmədik... Harda və haçan?

Durna xanım duruxdu.

– O barədə fikirləşərik.

– Yox, fikirləşmək qeyri-müəyyənlikdi. Mənə konkret bir söz de.

Durna xanım susdu.

Əfsun irişə-irişə təklif irəli sürdü:

– Bəlkə yaxın bir rəfiqənizgildə görüşək?.. – O çönüb, altdan-yuxarı binaya göz gəzdirdi. – Yaxud elə öz evinizdəcə... Şərait varsa.

Durna xanımın sifəti tutqunladı. Əfsuna çəp-çəp baxdı. Əfsun təklifini ciddi tərzdə əsaslandırdı:

– Acığın tutmasın, can-ciyər. Sənin xeyrin üçün deyirəm. Mən axtarıb, şəhərin kənar bir yerində görüşlərimiz üçün uyğamlı mənzil kirayə götürə bilərəm. Amma sən abırlı, ismətli qadınsan. Oralarda tanıyan olar səni, söz-söhbət yaranar.

Durna xanım dinmədi. "Hə", "yox" söyləmədi. Əlini Əfsunun ovcundan inciksiz çıxardıb, pillələrə doğru yönəldi.

Əfsun həzin səslə arxadan ona eşitdirdi:

– Xahiş eləyirəm, təklifim barədə soyuqqanlı düşün. Cavabını səbirsizliklə gözləyirəm. Ləngiyən hər an ömrümdən bir il gödəldir!

Durna xanım pillələri aramla, fikirli-fikirli qalxdı. Evdə də çox düşünüb-daşındı, təklif ağlına batdı. Öz evi həm yad gözlərdən uzaqdı, həm də təhlükəsizdi. Bəhlulun heç nədən şübhələnməyəcəyinə də tam arxayın idi. O, səhər tezdən evdən çıxır, gecəyarısı qayıdırdı. Nədən xəbər tuturdu ki, bundan da xəbəri olsun.

Vaxtı uzatmadı. Ertəsi gün işdən icazə alıb, tezcə evə gəldi. Qonaqlığa bənzər xörəklər hazırladı. Bişir-düşür işləri sona yetəndə İqtisad İnstitutuna yollandı, Əfsunu soraqlayıb tapdı. Salam-kəlamsız bildirdi:

– Gəlmişəm səni aparıb, ərimlə tanış eləyim.

Əfsun səksəkələndi.

– Nə üçün? – soruşdu. – Məqsəd nədi?

Durna xanım ciddiyyətlə:

– Sərbəstliyimiz üçün, – dedi.

Əfsun tərəddüdlə gicgahını qaşıdı.

– Axı bu bir az mürəkkəb məsələdi. Mən sənin ərinə rəqib sayılıram. Düşmən hesab olunuruq.

– Çarəsi var onun... – Durna xanım xəfifcə gülümsündü. – Rəqiblik qohumluqla əvəzlənəcək… Sən bu gündən etibarən olursan

mənim dayım oğlu. Ərimə səni bu cürə təqdim edəcəm.

– İnanacaq?

– Yüz faiz!

– Yalanın üstü açılsa, necə?

– Açılmayacaq!

– Yəqin?

– Lap yəqin! – Durna xanım zəmanət verdi: – Mənə inanır. İndiyəcən ona yalan danışmamışam. Özünün də ürəyi təmizdi. Şəkdən-şübhədən uzaq adamdı... Mənim ögey bir dayım var. Uzaq dağ kəndində yaşayır. Atamgilə gəliş-gedişi çox seyrəkdi. İllərcə üzünü görmürük. Deyəcəm, onun oğlusan... Bundan sonra bizdə rahat görüşəcəyik.

– Əla!..

– Bəs mənim adım nə olacaq?

– Elə öz adın.

– Soruşmaz ki, mən hardan gəlib tapmışam səni?

– Soruşar, cavabını verərəm.

– Əhsən!.. Oldu, bibiqızı. Afərin tədbirinə. Ancaq mən heç sənin ərinin adını da bilmirəm.

– Adı Bəhluldu. Sən ona şirinliklə "Bəhlul əmi" de, xoşuna gələcək.

– Ha... ha... haa!.. – Əfsun ürəkdən qəhqəhə çəkdi: – Bəyənilsin!..

– O, başını qürurla dik tutub, addımlarını Durna xanımın addımları ilə qoşalaşdırdı. – Yarın sözü yerə düşüncə, əfəl igidin boynu sınsın!

**15.**

Durna xanımgilin mənzili üçotaqlı idi. Təmirdən təzə çıxmışdı. İçəri ayaq qoyan kimi, Əfsun hayıl-mayıl oldu. Evin gözəl sahmanı, müasir avadanlığı, bəzək-düzəyi "qonağın" gözlərini qamaşdırdı. Hayana baxdı, heyranlığı bir az da artdı. Üstü ipək örtüklü, hündür söykənəcəkli divanın, yellənən kresloların, rahat oturacaqlı stulların səliqəsini pozmağa heyfi gəldi.

Əfsun ilk dəfə idi belə cah-calallı, hər cəhətli rahat yaşam tərzi görürdü. Paxıllığı tutdu: "Bəxtəvərlər şah kimi yaşayırlar! Biz yetimçələr də elə bilirik normal ömür-gün sürürük. Sən demə,

həyatın dibində sürünürmüşük...” – O nə üçünsə yırğalandı və tez-cə təsəlli tapdı: “Eybi yoxdu, çalışıb gələcəkdə bu xoş güzəranı mən də qazanaram. Mütləq qazanaram!.. Budur, belə bir evin şahzadəsini özümə ram eləyə bilmişəmsə, kölgəmi izləyən əl quzusuna döndərmişəmsə, deməli, ayrı şeyləri də Allahımın köməkliyi ilə əldə edəcəyəm. Hər arzuma çatacağam...”

O, xoş gələcək şövqü ilə Durna xanıma yan aldı. Onu ağuşunda görməyə tələsdi. Durna xanım ciddi davrandı:

– Səbrin olsun. Bunun məqamı var.

Əfsun inciklik büruzə verdi. Durna xanım gülümsündü. Əfsunu öpüb, divanda əyləşdirdi. Qapı küncündə, yaraşıqlı tumba üstündəki telefon aparatına əl atdı. Dəstəyi qaldırıb, nömrələri aram-aram yığaraq, bir gözü Əfsunda, əri ilə şux danışdı:

– Salam, Bəhlulum! Neyləyirsən? Nahara gəlmirsənmi? Yox, bufetə-zada getmə, yaxşı xörək hazırlamışam... Hə, işdən icazə almışam. Əziz bir qonağımız da var... Kimliyini gələndə biləcəksən. Lap yaxınca qohumumuzdu. Yubanma.

Dəstəyi yerinə qoydu. Qanrılıb Əfsuna müəmmalı göz vurdu:

– On-on beş dəqiqəyə gəlir. Çalış, özünü doğmaca qohum təkin apar. Şirin söhbətə başla. Bunu yaxşı bacarırsan.

– Baş üstə, “bibiqızı”. Bir dil töküm ki, aləm tamaşasına yığılsın!

Durna xanım televizoru xəttə qoşdu, pultu Əfsuna verdi. Özü mətbəxə yönəldi:

– Sən hələlik televiziya verilişinə bax, mən də süfrə açmaqla məşğul olum.

* * *

Bəhlul özünü gözlənildiyindən tez yetirdi. “Qonağı” astanadan çox səmimi salamladı:

– Xoş gəlib, qonağımız, səfa gətirib! – dedi. İrəli gedib, Əfsunla qoşa əllə görüşdü. Sonra Durna xanıma sarı çöndü: – Telefonda demədin kimdi əziz qonağımız, barı indi tanış elə bizi.

Durna xanım aralıdan ötkəm-ötkəm dilləndi:

– Qonağımız mənim çox yaxın qohumumdu, Bəhlulum. Doğmaca dayım oğludu, sənin yəqin ki, yadında qalmış olar, toyumuza uzaqdan bir dayım gəlmişdi. Çoxlu sağlıqlar söylədi, yoru-

lunca oynadı. Başımıza da şabaş yağdırdı. Bax, bu suyuşirin oğlan o dayımın oğludu.

– Çox gözəl! Bəs adı nədir dayımız oğlunun?

Əfsun söhbətə qoşuldu:

– Adım Əfsundu, Bəhlul əmi.

– Ooo!.. – Bəhlul qəlbən şadlandı. – Əfsun nadir adlarımızdandı. Mənası da dərindi: ovsunlamaq deməkdi. Arzum budur ki, həyatın özünü ovsunlaya biləsən, yaxşı gələcək qazanasan!

Əfsun fürsət ikən, sözü-sözə calaşdırdı:

– Möhtərəm, Bəhlul əmi, – dedi, – bizim evdə sizdən tez-tez söhbət düşür. Dədəm sizinlə, Durna bibiqızı ilə fəxr eləyir. Sevinir ki, siz yüksək vəzifədə çalışırsınız. Böyük hörmət sahibisiniz. Öz ağlınız, bacarığınızla irəli gedibsiniz. İnanır ki, daha da yüksələcəksiniz, Respublikamızda ən məşhur adamlardan olacaqsınız. Mənə də məsləhət görür ki, həyatın nəbzini tutmağı sizdən öyrənim. Hər dəfə kəndə gedəndə ilk sorğusu sizi axtarmağım olur. Elə ki, hələ axtarıb tapmamışam, tanış olmamışam, deyirəm, narazı qalır. Üzümü danlayır. Axır ki, çox soraqlaşandan, bir neçə kitabxanaya baş çəkəndən sonra bibiqızının izinə düşə bildim…

O, nəfəsini dərib, Durna xanımla xəlvəti baxışdı. Him-cimlə: “Necədi? Yalanım xoşuna gəldimi?” – soruşdu. Durna xanım gülə-yən gözlərini yumub-açmaqla sualı təqdir etdi. Və özü də tezcə yalan uydurdu:

– Səhər-səhər kitabxanada mənə dedilər ki, oxu zalında səni bir oğlan görmək istəyir. Gedib aralıdan baxdım. Tanış gəlmədi. Hardan tanıya bilərdim? Üzünü heç vaxt görməmişdim. Özü yaxınlaşdı mənə. Tanışlıq verdi. Dayımdan məktub da gətirmişdi. Oxudum, çox təsirləndim. Hədsiz kövrək yazılmış məktubdu. Heyif ki, unudub kitabxanada qoymuşam. Bir gün gətirərəm, sən də oxuyarsan. Yalvar-yaxarla oğluna göz-qulaq olmağımızı xahiş eləyir…

Bəhlul bütün deyilənləri tərtəmiz həqiqət saydı. Axı, “üç telli”si onu ikidən-birdən aldatmamışdı. Bundan əlavə də, neçə gündən bəri qaşqabağı açılmayan, qəm-qayğı ilə yatıb-duran “üç telli”sinin şadyanalığı könlünü açmışdı. Əfsunla dərindən maraqlandı:

– Çoxdanmı şəhərdəsən?.. Oxuyursan, ya işləyirsən?

Durna xanım Əfsunu qabaqladı:

– Tələbədi. İqtisad İnstitutunun üçüncü kursunda oxuyur. Dediyinə görə, əlaçıdı.

Bəhlul “qonağı” bəyəndi:

– Varam belə tələbəçiliyə! Gərək yaxşı oxuyasan ki, bəhrəsini də görəsən. Mən də, bibiqızın da universiteti əla qiymətlərlə bitirmişik, zəhmətimiz də itməyib. Həyatda az-çox nə qazanmışıqsa, hamısı onun səbəbinədi… Hə, nə isə, görüşümüzdən, tanışlığımızdan çox məmnunam. Necə deyərlər, su girdi qaba, oldu içməli. Tez-tez gəl bizə, utanıb-çəkinmə. Mən evdə oldum-olmadım, qapımız üzünə açıqdı. Ortaya bir problem-zad çıxsa, gizlətmə bizdən, bacardığımız himayəyə həmişə hazırıq.

Durna xanım Əfsunla yenə xəlvəti baxışıb, minnətdarlıqla gülümsədi.

– Çox sağ ol, Bəhlulum. Mənim dayım oğluna bu qayğın üçün hədsiz şadam.

Bəhlul sidq-ürəklə:

– Ayrı cür də ola bilməz, mənim əziz üç tellim, – dedi. – Sənin dayın oğlu, ya mənim dayım oğlu, nə fərqi var?

Əfsun da razılığını ləngitmədi:

– Sizi Allah qorusun, Bəhlul əmi! – deyib əlini döşünə qoydu, baş əydi. – Siz çox böyük ürəkli, olduqca yüksək mənəviyyatlı şəxsiyyətsiniz. Valideynlərimdən barənizdə eşitdiklərimin bu gün özüm canlı şahidi oldum. İnsanlıq keyfiyyətlərinizə vuruldum. Nə yaxşı ki, cəmiyyətimizdə nümunə götürüləsi sizin kimi adı böyük hərflərlə yazılacaq adamlar mövcuddur. Biz gənclər sizlərdən çox şey öyrənməliyik. Yüz yaşayın!

Bəhlul “qonağın” qanacağını bəyəndi. Süfrəyə göz gəzdirib, "üç telli"sini məzəli-məzəli qınadı:

– Qonaqlığın pis deyil. Amma süfrədə mühüm bir şey çatışmır.

Durna xanım nəyə eyham vurulduğunu anlamadı. Süfrəyə təəccüblə nəzər saldı.

– Nə çatışmır, Bəhlulum? Nəyi unutmuşam?

– Narahat olma. O sənlik deyil. – Bəhlul uşaq çəldliyi ilə ayağa qalxıb, mətbəxə yönəldi. Oradakı kolleksiya dolabından seçib, əla növ çaxır və üç piyalə gətirdi. Çaxır şüşəsinin tıxacını aça-aça söhbəti şirinləşdirdi:

– Bu çaxırı mənə Moldaviyada hədiyyə vermişdilər. Mühüm bir dövlət tədbirindən qayıdarkən, suvenir kimi bağışlamışdılar. Nadir şərablardandı. Hörmətli qonaq üçün saxlamışdım. Səndən əziz, səndən möhtərəm qonağım olacağına inanmıram. Gəl, birlikdə baxaq bunun dadına.

Əfsun yekəxanalandı:

– Dədəm də çox bəyənir bu çaxırı. Bayramlarda, şadlıq günlərində hardansa alıb gətirir, onun dadına baxmağa mənə də icazə verir. Evimizdə qonaq olmayanda dədə-bala otururuq qabaq-qabağa. Ancaq üç istəkandan artıq içməyi yasaq eləyir. “İçkini gərək qədərində, ləzzətini duya-duya içəsən, ağlını azdırıb, zayıllamayasan” – deyir.

– Düz deyir! – Bəhlul ehtiramla təsdiqlədi. – Hər hansı spirtli içkinin həddi var. O iştah açmaq, əhval durultmaq üçündür. Həddini aşmaq həm cana ziyandı, həm də ictimai fikri çaşdırır. Adam haqqında mənfi rəy yaradır.

– Dədəm də bunu tövsiyə eləyir. Tez-tez təkrarlayır ki, içgi də it kimi bir şeydi, dostluğuna inanıb, ağacı əlindən yerə qoymamalısan.

– Haqlıdı! İçki ilə dostlaşanların qazancı sonralar peşmançılıq olur!.. – Bəhlul piyalələri bir-bir, gülümsəyə-gülümsəyə doldurdu. – Bəh, bəh! Bəhməz kimi süzülür, yaxşı məhsul olması rəngindən də bilinir. Moldavanlarla gürcülər çaxır ustalarıdırlar, zay məhsula onlarda az-az rast gəlinir.

Durna xanım tamahlandı. Əlini qılıqcıl tərzdə ərinin çiyninə sürtdü.

– Çox təriflədiniz, olarmı onun dadına mən də baxım? – soruşdu.

Bəhlul nəvazişlə razılaşdı:

– Əlbəttə, olar, üç tellim! Odur, sənə də süzmüşəm. Götür badəni bizə yoldaşlıq elə. Dayı oğlunun gəlişinin şərəfinə birlikdə içək.

– İçək, Bəhlulum, içək!

Bəhlul yerində şadyana qurcalanıb, piyaləsini əlinə götürdü, şəstlə dik tutdu:

– Əziz dayı oğlu Əfsun! Bu badələri içirik sənin gələcək uğurlarının sağlığına. Həyatda böyük xoşbəxtlik arzulayırıq. Və bir da-

ha deyirik: bizə çox xoş gəlib, səfa gətiribsən. Gələn ayaqların var olsun, həmişə gəl!

Durna xanım qədərsiz şadlıqla əlavə etdi:

– Gözümüz üstə yerin var, dayıoğlu. Gəlişin mübarək!

Piyalələri ustufca toqquşdurub, zərif cingilti müşayiəti ilə qurtum-qurtum içdilər. Sonda Bəhlul bəh-bəhlə dodaqlarını marçıldatdı:

– Doğrudan əla şərabdı. Lap can dərmanıdı! – dedi və Əfsuna üz tutdu: – Necədi? Sən nə fikirdəsən?

– Fikrim müsbətdi, – Əfsun içki məsələsində təcrübəli adam ədası ilə rəy söylədi. – Tamı da, ətri də gözəldi!

Durna xanım da təriflədi:

– Çaxır yox, doşab dadıyır. Turşuluğu heç yoxdur.

Bəhlul süfrədən qalxa-qalxa təəssüfləndi:

– Heyif ki, onun ləzzətini axıra qədər dada bilməyəcəm. İşə qayıtmalıyam. Axşama çox mühüm tədbir var. Ona hazırlıq mənə həvalə olunub. Gedirəm, ancaq ürəyim sizin yanınızda qalır.

Durna xanımın sevincdən gözləri gülə-gülə ərini arxayın saldı:

– Sən işində ol, Bəhlulum. Dayım oğluma görə üzünü böyüklərinizə danlatma. Çox sağ ol ki, macal tapıb gələ bildin. Mənim əziz qohumuma ehtiram göstərdin. Səndən qədərsiz razıyam. Elə dayıoğlu da razıdı.

Əfsun Durna xanımın eyhamını başa düşdü. Ayağa durub, təzim etdi:

– Təşəkkür üçün söz tapmıram, Bəhlul əmi. Dünyalarca minnətdaram!

Bəhlul "üç telli"sinə şirin təbəssümlə baxdı. Əfsunun əlini sıxıb, son dərəcə səmimi xudahafizləşdi:

– Bir də tapşıraram, ayağını çəkmə bizdən. Boş vaxtlarında təşrif buyur. "Üç telli" də, mən də yolunu gözləyəcəyik.

– Baş üstə, Bəhlul əmi. Sizin tapşırığınız, hər sözünüz mənim üçün bu gündən sonra qanundu. Ona riayət müqəddəs borcumdu.

Durna xanım ərini çöl qapısına qədər ötürdü. Qayıdıb, Əfsunu muştuluqladı:

– Bax, bu oldu əsil arxayınçılıq, həqiqi sərbəstlik!

Əfsun qollarını geniş-geniş açıb, qıy çəkdi:

– Uç, durnam, uç gəl ağuşuma!

Qucaqlaşdılar. Yemək-içməyi ikilikdə davam etdirməyə həvəsləri söndü...

**16.**

İki aydan çox Əfsun Durna xanımgilə yol ağartdı.

Əvvəlcə üç gündən bir görüşdülər. Sonra görüş vaxtını gödəltdilər, günaşırıya keçirdilər.

Bəhlul, sanki, fil qulağında yatmışdı. Evində baş verən hadisələri sezmirdi. "Üç telli"sinin ondan soyuduğunu, laqeydləşdiyini hiss etsə də ciddi əhəmiyyət vermirdi. Pis mənaya yozmurdu. Hərdən onun sifətini çox solğun, gözlərinin altını qaralmış görürdü, buna da məhəl qoymurdu, xəstəlik təzahürü sayırdı.

Bir axşam evə, adəti xilafına, ertə gəldi. Canında dözümsüz üşütmə vardı, ya hardasa özünü soyuğa vermişdi, ya da ki, şəhərdə gəzən zökəmə yoluxmuşdu. (Burası ona qaranlıq idi.) Yorğan-döşək arasına girib qızınmağa, "üç telli"sinin dava-dərmanları ilə şəppə-xeyir azarı qabaqlamağa tələsmişdi. (Durna xanımın türkəçarə müalicələrinin şəfasını az dadmamışdı.)

"Üç telli"silə evə girəcəkdən salamlaşdı. Canının ağrımasına baxmayaraq, şirinliklə "axşamın xeyir!" – dedi. Durna xanım salamı alakönül aldı:

– Xeyir olsun, nə əcəb bu gün tez gəlibsən?

Bəhlul sualdakı etinasızlığı duysa da, istiqanlılıqla:

– Üstünə sağlıq, azarlamışam. Özümü pis hiss eləyirəm, – dedi.

– Hımm... – Durna xanım mızıldadı. – Zökəmə yoluxdurubsan özünü...

– Hə, oxşayır ona. Hər yerim sızıldayır.

Durna xanım susdu. Bəhlul təəccübləndi. Başqa vaxtlar "üç telli"si dərhal qayğıya qalardı, canıyananlıq göstərərdi. İndi...

Üstünü vurmadı. Dəhlizdə ayaqqabılarını çətin-çətin çıxartdı. Çəkələklərini zıqqıya-zıqqıya ayaqlarına taxdı, içəri keçdi. Gözü yığışdırılmamış süfrədəki bulaşıqlı qablara, çəngəl-bıçaqlara sataşdı.

– Dayı oğluna qonaqlığın, deyəsən, babat olub... Həyətdə qabağımdan getdi. Başını qaldırıb, heç salam da vermədi.

– Yəqin görməyib.

Bəhlul heysizliklə divana əyləşdi. Qanrılıb açıq qapıdan yataq otağına boylandı. ("Üç telli"nin səsi buradan gəlirdi.) Səliqəsizlik orada da nəzərinə çarpdı.

– Yatacaq niyə o haldadı?.. Səhər yığışdırılmayıb, nədi?

Cavab gəlmədi.

Bəhlul rahatsızladı. Ürəyinə nəsə dammışdı. "Üç telli"sinin laqeyd rəftarı, şübhəli davranışı da nədənsə xəbər verirdi. Ancaq Bəhlul qara fikrə inanmaq istəmədi. Ağlına gələni başından qovmağa çalışdı. Xəyanətin mümkünlüyünü təsəvvürə gətirmək belə istəmədi.

Divandan ağır-ağır qalxdı. Yataq otağına yeridi. Oynaqlarındakı sızıltılar, canındakı üşüntülər amanını qırırdı, yorğana bürünüb qızınmaq, bacarsa, bir-iki saat yuxu almaq istəyirdi. Lakin bu adi muraz nəsibi olmadı. "Üç telli"sində gördüyü sir-sifət ürəyini dağladı. Durna xanımın gözqapaqlarının altı çökəlib qapqara qaralmışdı. Çənəsinin və boyun-boğazının bir neçə yerində ehtiraslı öpüş izləri – göyərtilər vardı. Bunlar məlum məsələnin dəqiq təzahürləri idi.

Bəhlul dəhşətə gəldi. Bir neçə anlıq gərginlikdən, ruhi sarsıntıdan başı gicəlləndi, çarpayıya yanpörtü çökdü. "Bəlkə məni qara basır, canımdakı mərəzin yüksək hərarətindəndi?" – düşündü. Kirpiklərini taqətsiz-taqətsiz ovuşdurub, aralıda qurdalanan, özünü məşğul göstərən "üç telli"sinə zəndlə diqqət yetirdi. (Durna xanım da həmən anlarda çaşqın vəziyyətdə idi.) Çətin-çətin:

– Sir-sifətin niyə o gündədi? – soruşdu.

– Nə gündədi? – Durna xanım ləng dilləndi.

Bəhlul nəfəsini dərin-dərin dərdi.

– Get, güzgüdən özünə tamaşa elə... Biabırçı görkəmindən utan, yerə gir!

Əsəbi mükalimə hələlik sakit tərzdə, yalnız içi göynədərək gedirdi. Kükrəyəcəyi, bütün sərhədləri aşacağı mütləq idi. Durna xanım fürsətdən istifadə etdi. Kip-kirimiş "vanna otağı"na getdi. Üzünə iki-üç ovuc su çırpıb, sifətini nisbətən qaydaya salıb, toxtaqlıqla dala qayıtdı. Başını köksünə əyib, Bəhlulla üz-üzə dayandı. Yerə baxa-baxa, günahkar səslə:

– Səninlə söhbətim var, – dedi. – İndi eləyək, ya sən yatıb, bir az özünə gələndən sonraya saxlayaq?

Sifəti boğulub qaralmış, qaşları sıx-sıx çatılıb gözlərinin üstünə qeyzlə sallanmış Bəhlul qıcanmış dişləri arasından soruşdu:

– Nə söhbətdi o?

– Ciddi söhbətdi.

– Ciddi söhbət?!.. – Bəhlul "üç telli"sini qəlbinin bütün nifrəti ilə süzdü. – Buyur görək!

Durna xanım əllərini qoynuna qoyub, həzinliklə:

– Mən... daha sənin "üç telli"n deyiləm, – pıçıldadı.

Bəhlul qəzəbli nəzərlərini yana çəkdi.

– Necə başa düşüm bunu?

Durna xanım duruxdu. Burnunda mızıldadı:

– Sənə... vəfasızam.

– Hımm... Vəfasız?!.. – Bəhlul güclü fısıltı ilə başını yırğalayıb, öz-özünə deyindi: – Necə də həyasız etiraf!..

Durna xanım sallaq kirpiklərini hey qırpa-qırpa, kiçik fasilələrlə mızıltısına davam etdi:

– Bunu sənə çoxdan demək istəyirdim... fürsət tapmırdım... İndi... hər şey özünə aydındı.

Bəhlul, havasızlıqdan ağzını geniş açıb ləhlidi. Yazıq-yazıq inildədi. Və birdən yaralı şir kimi nərildədi:

– Ahh, yaramaz, arsız, namussuz qadın!!.. Bu şərəfsiz, bu biabırçı sözləri gör necə asan dilinə gətirirsən?!.. Dilin qurusun sənin!!

Durna xanım başını köksündən aralamadı. Dinib-danışmadı. Kirpiklərini sakit-sakit çəpərləyib əl dırnaqları ilə oynamağa başladı.

Bəhlul yanıb-yaxıldı. Tüstüsü təpəsindən çıxdı:

– Ax, ax, axx!.. Gör kimə bel bağlamışam? Kimə, kimə?! Dağıl, belə dünya, dağıl!! – O, qurcuxdu, qovşuruldu. Və səsi gəldiyincə bağırdı: – Tfu sənə fahişə! Kürsəyə gedən qancıx!!

Durna xanım astaca etiraz etdi:

– Mən fahişə deyiləm.

– Bəs kimsən?!.. – Bəhlul bir az da kükrədi. Sifəti tamam qırcaşdı. – Evə oynaş gətirən, ərinə xəyanət edən əxlaqsız qadın,

səncə, necə adlanmalıdı?!

– Mən onu... sevirəm.

Bəhlulun son həddə qədər bərəlmiş gözləri az qaldı hədəqədən çıxsın. “Tfu!.. Tfu!” – deyib, bu dəfə doğrudan tüpürdü. Və hirsin gücü xəstəlik süstlüyünü bir qırpımda üstələdi. Özünü tarazlayıb ayağa sıçramağı ilə “üç telli”sinin üzünə şillə çəkməyi eyni anda baş verdi.

Durna xanım cınqırını çıxartmadı. Durduğu yerdən tərpənmədi. Üzünün şillə dəyən tərəfini barmaqlarının ucu ilə sığallaya-sığallaya susdu.

Bəhlulun taqəti bununla tükəndi. Canının artmış ağrıları onu aşağı çökməyə, yatacaqda halsız oturmağa məcbur etdi. Bir də, axı, ömründə heç kəsə (xüsusən də “üç telli”sinə) əl qaldırmamış adamın bundan artıq hərəkətə nə gücü, nə həvəsi qalardı? Nəfəsi tutula-tutula söylənməkdən savayı heç nə bacarmadı:

– Sən bunda tülüngülüyə, hiylə-kələyə bax!! Oynaşını yaxın qohumu –dayı oğlusu adı ilə mənə sırıyıb, gör, necə əməllərdən çıxır?!.. Neyləyəsən beləsinə, nə cəza verəsən?!..

Durna xanım boynunu büküb lal dayandı.

Bəhlul yorğan-döşəyini yastığı ilə birlikdə yığışdırıb qoltuğuna vurdu. Qəzəbinin yekununu acı məyusluqla elan elədi:

– Bu murdarlıqdan sonra mən səninlə bir çarpayıda yata bilmirəm!.. Şortu qadınla eyni yastığa baş qoymaram!.. Heyif ömrümün səninlə keçən günlərinə, çox heyif!!

Durna xanım biganəliklə yönünü yana çevirdi.

Bəhlul kabinetinə köçdü. Buradakı divan-çarpayıda özünə çətinliklə yer hazırladı. Paltarlarını zarıya-zarıya soyunub, yorğanı başına çəkdi.

## 17.

Bütün gecəni o yatmadı. Hirs və yüksək qızdırma içində çapaladı. Yalnız səhərə yaxın nisbətən sakitləşib yuxuya getdi.

Gözlərini açanda otağındakı zəngli saat ötkəm-ötkəm səsləndi. Yastığa cummuş başını azacıq qanırıb boylandı. Saat on iki idi. Heyrətləndi. Bir neçə an harada olduğunu anşıra bilmədi. Ona elə gəldi ki, öz evində deyil, tamam başqa yerdədi. Heyrəti

dərinləşdi. Çaşqınlıq içində: "Bu nə olan məsələdi?.. Mən hardayam?" – düşündü.

Dikəlmək, ətrafa diqqətlə göz gəzdirmək istədi. Başını yastıqdan aralayan kimi gicgahları sancdı. Boynunun ardında, bədənində ağrılar, güclü sızıltılar peyda oldu. Sanki hər yerinə küt iynə-sancaqlar batırıldı.

Xeyli süst qalıb gözlədi. Ağrı və sızıltılar bir az səngiyəndə, zehni də yavaş-yavaş aydınlaşdı. Ancaq başını yastıqdan aralamağa qorxdu. Ehtiyatla qanırıb, gözlərini ustuf-ustuf hərlədi. Yox, bura hər səmtinə, hər əşyasına bələd olduğu yataq otağına oxşamırdı. "Üç telli"sinin yatağı da böyründə deyildi. Kirpiklərini üç-dörd dəfə ağır-ağır yumub açdı. Mənzərə dəyişmədi. Diqqətini cəmləyib ətrafa bir daha nəzər yetirdi. Bala-bala tanıdı. Bura onun evindəki iş otağı idi. Odur, küncdə yazı masası, ondan o yanda cərgəli kitab dolabları. (Kitab həvəskarı idi, kolleksiya yığmışdı.) Rəhmətlik atasının çoxdan böyüdülüb, ortadan asılmış şəkli və başqa tanış əşyalar…

Kabinetində gecələdiyini yəqinlədi. Təəccübü dərinləşdi: niyə belə? Nə üçün yataq otağında, özünün həmişəki yerində, çox sevdiyi iki nəfərlik rahat, yumşaq çarpayıda yatmayıb, gəlib rahatsız divan-çarpayıda gecələyib?..

Süstlüyü tam keçməmiş zehnindən kütlük dumanı çəkildi. Axşamkı dəhşətli hadisə yaddaşında tədriclə bərpa olundu. Canının ağrıları, sızıltıları yeni güclə təkrarlandı. Bunun təsirindəndimi, ya arzuolunmaz hadisəni xatırlamasından idimi, ünü ərşə çıxdı, uzun-uzadı ofuldandı, zarıdı, inildədi. Ötüb-keçməyən, davamlı ağrı və zoqqultular bütün damarlarını gəzdi. Və mürgülü hissləri tezliklə oyandı. "Üç telli"sinin xəyanəti ciyərini dağım-dağım dağladı. Ah-ofu otağı bürüdü. Nifrətini ilk növbədə Əfsuna – dələduz oğlana ünvanladı: "Ax, lotu köpək oğlu!.. Şeytan sifət oğraş!.. Hardan gəlib tapdın bizi?!.. Şirincə aşımıza zəhər qatdın... Bizə gələn ayaqların sınaydı!!"

Sonra da bu nifrinlər "üç telli"sinə yönəldi: "Ah, mürvətsiz qadın! Bəs nə oldu etibarın, mənə sidqin, vəfan?!.. Xar elədin məni, belimi sındırdın... Bu rüsvayçılığa necə dözəcəm? Dost-düşmən içinə nə üz ilə çıxacam?.. Kaş, bundansa əcəl alaydı səni

əlimdən. O dərdə birtəhər dözərdim. Amma bu rəzilliyə dözmək mümkünsüzdü. Ölümdən beş-betərdi!.. "

Yanğı-yanğıya qarışdı, dili-dodağı quruyub, qaysaq bağladı. Bir udumluq suya amansız ehtiyac duydu. Yan-yörəyə yazıq-yazıq boylandı. "Üç telli"si insanlıq mərhəmətini ondan əsirgəməmişdi. Səhər işə gedəndə divan-çarpayı böyrünə gətirib balaca masa söykəmişdi. Üstünə çayla dolu termos, stəkan-nəlbəki və mürəbbə düzmüşdü. Əlavə olaraq, bir şüşə mineral su da qoymuşdu. Evdə olan lazımlı dərmanları əlyetərdə yerləşdirmişdi. Hətta, uzun şunurlu telefonu da ona yaxınlaşdırmışdı ki, iş adamları, dost-tanışları ilə əlaqə saxlaya bilsin.

Bu sayğıya Bəhlulun əvvəlcə bərk acığı tutdu, daha da cinləndi. Nə suya, nə çaya tamah göstərdi: "Andıra qalsın, zəqqutuna dönsün onun çayı da, suyu da! Daha heç nəyi gərək deyil mənə" – deyib inadla imtina etdi. Lakin əlacı kəsilib, yanğı amanını lap qıranda inadı yenildi. Əlini güc-bəla uzadıb butulkanı götürdü. (Qapağı açılıb, eləcənə üstünə qoyulmuşdu.) Stəkana süzməyə heyi çatmadı. Butulkanın ağızlığını dodaqlarına dayadı. Su dodaqlarının yanlarından çənəsinin altına axa-axa iki qurtum içdi. Qalığını qaytarıb yerinə qoydu. Fikrə getdi. Qarauğur hadisənin törəmə səbəbini özlüyündə çözməyə, aydınlaşdırmağa cəhd etdi. Cəhdi alınmadı. Yanğı əhədini bir də kəsdi. Düşünməyə, məsələni araşdırmağa imkan vermədi. Ölüm-zülüm dikəldi. Butulkadan su içmək mümkün deyildi. Stəkanı doldurdu, iri qurtumlarla içdi. Suya yanğısı söndü. Amma içinin dərd yanğısına bunun təsiri olmadı. Özünə gəldikcə, beyin süstlüyü tam ötüb-keçdikcə, sarsıntıları, ruhi əzabları artdı: "Anlamıram Durna bu namussuzluğa, rəzil hərəkətə nəyə görə susayıb? Nədi onu xəyanətə sürükləyən?.. Qadınlar, əksər hallarda, belə əxlaqsız yolu kişisinə könülsüz, hansısa məcburiyyət nəticəsində ərə gələndə seçirlər; gizli eşq axtarışına başlayırlar. Yaxud da şorgöz ərindən acıq çıxmaq, qisas almaq xəyalına düşürlər. Axı, Durnanın heç nədən əyər-əskiyi yoxdur. Nə yemək-içməkdən, nə geyimdən, nə də zər-zibadan, qızıl-brilyant şeylərindən kəm-kəsiri var. Hər arzusunu, hər ehtiyacını ödəmişəm. Mənə də könülsüz ərə gəlməyib. Körpəlikdən sevmişik

bir-birimizi. Bu vaxta qədər də özünü namuslu, əxlaqlı aparıb, ən səviyyəli, ən ağıllı qadın kimi tanınıb. Haqqında ara söz-gapı, şayiə danışılmayıb. Təmkininə, tərbiyəsinə qibtə edilib. Mən də ki ona həmişə sadiq olmuşam. Bir para vəzifəli, imkanlı kişilər kimi qıraqda məşuqə saxlamamışam. Kənar qadına gözümün ucu ilə baxmamışam. Bəs niyə belə?.. Bu dəhşətli iş, baş töhməti hərəkət nəyə görə törəyib?.. Əhdinə, vəfasına sidq ilə inandığım "üç telli" nə səbəbdən eşqimizi yerə vurub, adbatıran bu addımı atıb?.. Uyduğu o dələduz köpək oğlunun bir elə yaraşığı, gözəlliyi də yoxdur ki, deyəsən, gözləri qamaşıb. Off, off!.."

Bəhlulun ürəyi alovlandı. Tüstüsü yenə təpəsindən çıxdı. O biri yanğısı da təzədən gücləndi, boğazını qurutdu. Könlündən yaxşı dəmlənmiş çay keçdi. Həmən dəqiqə gözünə "termos", onun yanında da mürəbbə sataşdı. (Bayaqdan onları görməmişdi.) Çaya meyli son dərəcə çoxaldı. "Üç telli"sinə qəzəbini bu meyil, elə bil, öləzitdi. Olmazın çətinliklə bir də dikəldi. Termosu özünə yaxınlaşdırdı. Qapağını burub, tıxacını çıxartdı, çayın xoş ətri burnunu qıcıqlandırdı. Adi çay deyildi, içinə darçın və kəkotu qatılmışdı. (Bunlar soyuqdəymənin türkəçarə dərmanı idi.) Bəhlul, istər-istəməz riqqətləndi. İncimiş qəlbinin uzaq bir küncündən xoş duyğu keçdi: "üç telli"si ona tam biganə deyildi, canı yanırdı. Çayın belə xüsusi hazırlanmasından kövrək, hürkəcək təsəlli tapdı. Əhvalında nisbi durulma sezildi. Göyərmiş dodaqlarında qüssəli təbəssüm gəzdi: "Yox, "üç telli"nin mənə məhəbbəti tükənməyib. Lotu köpək oğluna, o haramzadaya uyması ötəri haldı. Tezliklə peşmanlayacaq, şəhərə, qohum-əqrəba arasına söz-söhbət yayılmamış ağlı başına gələcək, şərəfsiz hərəkətdən əl çəkəcək..."

Təsəllisi alışıb-yanan qəlbinə bir qədər toxtaqlıq da gətirdi. Neçə illərdən bəri ictimai işlərdə, məsul vəzifələrdə çalışması, hər cürə adamlarla təmasda olması ona hirsi cilovlamaq, heç nədə tələsik qərar çıxartmamaq vərdişi öyrətmişdi. "Hirs insanı yanlış yola aparır, xəta törədir. Cinli, qeyz-qəzəbin əsiri adam tutduğu hərəkətin sonradan xəcalətini çəkir... Qoy işdən qayıtsın. Sakit, ətraflı sorğu-sual edim. Ürəyinin içinə girim, görüm fitva hardandı, nədəndi. Ola bilsin, hadisənin məğzində mənə məlum

olmayan qəsd gizlənir. Kim isə məndən nəyinsə qisasını, şəxsi intiqamını alır. Nə olsun ki, heç kəsə pislik eləməmişəm, hamıya əlimdən gələn yaxşılığa çalışmışam. İctimaiyyətin nüfuzunu, hörmətini qazanmışam. Elə bunun da paxıllığını çəkənlər, gözügötürməyənlər az deyil. Üzərdə üzünə gülürlər, daldada badalaq gəlirlər. Hələ mənim irəli çəkilməyim, vəzifəmin böyüdülməsi söhbəti var. Mümkündür ki, bədxahlar eşidiblər bunu. Tələ qurublar ki, ləkələnim, yuxarı təşkilat rəhbərləri yanında gözdən düşüm, hörmətimi itirim. Qadını əxlaqsızlığa qurşanmış kişini kim sayar? Tərəfini hansı rəhbər işçi saxlayar?.. Hə, düz fikirləşirəm. Ağıl kəsəndi. Bu məsələnin kökündə hiylə var. O şeytansifət əclafı öyrətmə ilə qoşublar bu şər işə. "Üç telli"ni çox incə kələklə ələ keçiriblər. Ən iradəli, ən namuslu qadını da tələ qurub, şərrəyib, tora salmaq mümkündür. Belə əhvalatlar bizim xalq dastanlarında, rəvayətlərdə də söylənir. Demək, həyatda baş verir ki, dilə-ağıza düşüb, rəvayətə, dastana, əfsanəyə çevrilir. Yanmayan yerdən tüstü çıxmır!.."

Gərgin düşüncələr onu yorsa da təsəllisini qüvvətləndirdi. Qənaətində möhkəmləndi: "Hə, mütləq dözmək lazımdı. Gəlsin evə, qılığına girim, şirin dilə tutub, açıq söhbətə çəkim. İncə kələk kələfinin ucunu tapsam, çözələyib sonuna getmək asandı..."

O, bir az da toxtadı. Çaya iştahı artdı. Su içinə üşütmə salır, titrətdirdi. Çayda isə loğman təsiri, cana faydası hiss edilirdi. Ətri də xoşa gəlirdi. "Termos"a bu dəfə həvəslə əl uzatdı. Stəkanı yarıyadək doldurdu, yerə qoymadan qəndsiz-filansız hortdatdı. Tamından ləzzət duydu. "Üç telli"sini minnətdarlıqla andı: "Budur bax, onun mənə canıyananlığına əsaslı sübut! Qayğıma qalır, sağlamlığımı istəyir. Darçınlı çay azar-bezar dərmanıdı. Məndən tamam üz döndərmiş, məhəbbətimi könlündən silmiş olsaydı, heç bir qayğı göstərməzdi. Əksinə, ölməyimi istəyərdi. Dul qadının əxlaqsız sərbəstliyini mövcud cəmiyyət az qınayır; haradasa az-çox haqq da qazandıranlar olur..."

Burada hirs beynini bir də çalxaladı. Təpəsi təzədən tüstüləndi. Hündürdən alt dodağını çeynəyə-çeynəyə söyüb-söyləndi:

– Amma, nə olsun, arxamı yerə vurdu. Yaramaz bir gədəyə

uydu. Evimə gətirib mənim yatağımda onunla yatdı... Hələ utanmaz-utanmaz “onu sevirəm” də deyir. Ahh, lənətə gəlmişlər!!

Bəhlul bir də əsib-coşdu. Gah vulkan kimi püskürən, gah da ara verən namus-qeyrət qəzəbini bilmədi necə, nə sayaq soyutsun. Yumruğunu düyüb hara gəldi çırpdı. Hey çevrikdi, çapaladı. Handan-hana yenidən sakitləşdi. Qabaqkı təsəlli ilə özünü təkrar ovundurdu:

– “Üç telli” mütləq tora salınıb, uşaqcasına nəyə isə aldanıb. Heç ağlım kəsmir ki, arada ciddi eşq-məhəbbət olsun. Yoluq bir tələbəyə, yöndəmsizə vurulsun. Axı, onun sevilməli hansı qeyri-adi cəhəti var?.. Heççə nəyi!.. Məsələni yalnız və yalnız sülhlə dondurmalıyam. Hələ gec deyil. Biabırçılıq dilə-ağıza düşüb, ictimaiyyət içinə yayılmamış; paxıllar, bədxahlar qulağına gedib çatmamış qarşısını almalıyam. Dost-tanış, qohum-əqrəba yanında xar olmaq bir yana, bu rüsvayçılıqdan yuxarı təşkilatlar xəbər tutsalar, reputasiyam yerli-dibli korlanar. İrəli çəkilməməyim cəhənnəm, hazırkı vəzifəm də əlimdən alınar, hərtərəfli zərbə altında qalaram... Yox, buna qətiyyən yol vermək olmaz. İnsident tezliklə yat-küt edilməlidi. Adbatıran bu əhvalatı heç yaxın qonşular da sezməməlidi. Ona görə də hirsi, höcəti bir qırağa qoyub, kompromisə getməliyəm. Mənim üçün çox ağır, ziyadə çətin də olsa, bu üsulu seçməliyəm. Başqa çarəm qalmayıb.

Darçınlı çaydan isti-isti yenə içdi. Ağzını silib dala çəkildi. Ürəyi bulandı. Bir neçə dəfə öyüdü. Yaxşı ki, qusub üst-başını batırmadı.

Ürək bulantısı uzun sürmədi, bala-bala sakitləşdi. Ancaq halı təzədən pisləşməyə başladı. Ağrıları artdı. Canındakı xəstəlik hərarətinin yüksəldiyini aydın duydu. Belə davam etsə, vəziyyəti lap ağırlaşacaqdı, heç qımıldana da bilməyəcəkdi. Vaxtında tədbir görməli idi. "Üç telli"sinin yanına qoyduğu dərmanlara yaxın durmadı. Telefonu zor-güc götürüb sinəsi üstündə yerləşdirdi. İdarədəki köməkçisinə zəng çaldı. Xəstələndiyini, evə həkim çağırmağı və sürücüsünü xidmətinə göndərməyi tapşırdı.

Yarım saatdan sonra sürücü həkimlə gəldi. Həkim xəstəni müayinə etdi, ciddi soyuqladığını söylədi. İynə vurub, üç-dörd həb

dərmanı yazdı və "xəstəlik bülleteni" açıb getdi.

İynə xəstənin əhvalını yaxşılığa doğru xeyli dəyişdi...

**18.**

Durna xanım evə təxminən saat iki-üç radələrində qayıtdı. (Ərinin xəstələndiyinə görə bu gün işdən icazə almışdı.) Əynini tezcə dəyişib, Bəhlula baş çəkdi.

– Salam. Özünü necə hiss eləyirsən?

Bəhlul acı köks ötürdü. "Üç telli"sinin üzünə baxmadan, küskün cavab verdi:

– Bir az babatam.

Durna xanım irəli gəldi, əlini Bəhlulun alnına qoydu, hərarətini yoxladı.

– İstiliyin düşüb... Bəs yanına qoyduğum dərmanları niyə içməyibsən?

Bəhlulun sallanmış gözqapaqları narahatlıqla qımıldandı. Bu, inciklik ifadəsi idi: "Sən mənə öldürücü zəhər içirdibsən. O dərmanların nə xeyri? " – düşünsə də dilinə gətirmədi. İradəsi gücünə səbirli danışdı:

– Həkim çağırtdırdım... Gəlib iynə vurdu.

– Çox yaxşı. – Durna xanım təqdir etdi. – Elə mənim özüm də həkim çağıracaqdım. O səbəbdən icazə alıb işdən tez gəlmişəm... Allaha şükür, bir az dirçəlibsən. Dünən gecə hərarətin çox yüksək idi. Sayaqlayırdın. İki dəfə qızdırmasalıcı həb içirtmişəm.

Bəhlul ah çəkdi, sinəsi xışıldadı. Gileyini məcburən yenə ürəyində söylədi: "Bu məni avam, səfeh yerinə qoyur, nədi? Elə davranır, guya arada heç nə olmayıb, heç bir qələt iş tutmayıb... Yoxsa, bu da bir hiylədi?!.."

– Dünən olmuşlar dəhşətdi... Altına stul çək. Sənə məsləhətim var.

– Bilirəm söhbət nədən gedəcək. Gəl, onu bir az sonraya saxlayaq. Sən dünəndən dilinə heç nə vurmayıbsan. Mən də möhkəm acmışam. Tox qarnına danışarıq.

Bəhlulu hirs odu qovurdu: "Zalım qızının heç nə vecinə deyil. Nə eləyəsən, necə çəkindirəsən onu pis yoldan?.. Məni başa düşmək, vəziyyəti anlamaq istəyəcəkmi?.."

Məqsədi xatirinə alakönül razılaşdı:

– Olsun! Mən iştahsızam... Yemək istəmirəm. Öz qeydinə qal.

Durna xanım sakitcə dönüb mətbəxə getdi, çox çəkmədi su şırıltısı, qab-qacaq dınqıltısı eşidildi. Bəhlul dəruni iztirab keçirdi, ürəyinin içi cızıldadı: “Eh, gidi dünya! Səndə necə qəribə hallar mövcudmuş!?.. İnsanlarının üzü nə qədər dönükmüş, sifətləri nə yaman dəyişkənmiş?!.. Bu gedişlə axırın nə olacaq sənin?!” – düşündü.

Yarım saat ötdü. Durna xanım mətbəxdən səsləndi:

– İştah diş altındadı. Sıyıq xörək gətirim, bir azca ye. Yoxsa, dirçəlməzsən.

Bəhlul bu adi qayğıdan duyğulandı. Amma tezcə də köntöy ismarış göndərdi:

– Mənə lazım deyil heç nə. Hörmətin artıq olsun!

Durna xanım yeməyini tələsmədən yedi. Ərinin yanına sakit görkəmlə ayaq basdı. Altına stul çəkib, Bəhlula təmkinlə üz tutdu:

– Mən söhbətə hazıram...

Bəhlul təkcə bir anlığa “üç telli”sinə nəzər fırlatdı. Alın qırışları sıxlaşıb şiş kimi qabardı. Burunu uzunu baxa-baxa, bacardıqca həlim dilləndi:

– Heç bilmirəm hardan və necə başlayım... Sənin biabırçı hərəkətlərin ağlasığmazdır. Mən, elə bil, pis yuxu görmüşəm...

Durna xanım kiridi. Tez-tez kirpik çalıb söhbətin sonunu gözlədi.

Bəhlul udqundu, öskürdü. Qaysaqlı dodaqlarını dili ilə yaşlayıb, tövşüyə-tövşüyə davam etdi:

– Durna, sən adi qadınlardan deyilsən, yetərincə savadlı, ali təhsillisən. Sənin ağlını çaşdıran nədi? Küçə qadınına xas olan hərəkətlərin səbəbi mənə qaranlıqdı.

Durna xanım astadan, qıcıqsız təkzib verdi:

– Mən ağlımı çaşmamışam. Həyatın diktəsinə qulaq asmışam.

– Mənim beynim eyham anlamaq halında deyil. Açıq danış!

– Baş üstə, lap açıq danışacam... Amma istərdim ki, söhbətimiz qalmaqalsız olsun.

– Mən də qalmaqal istəmirəm. Əlavə biabırçılıq törəyər. El içində bizi tamam xar eləyər.

Durna xanım özünü ovundurmaq üçünmü, ya nəyə görəsə, saçlarından bir çəngə ayırıb, uclarını şəhadət barmağına dolaya-dolaya, həzin pıçıltı ilə:

– Sənin ruhi vəziyyətini başa düşürəm, – dedi, – indi məndən

eşidəcəyin sözlər ürəyinə toxunacaq, sənə çox ağır təsir bağışlayacaq...

– Onsuz da mənə olan olub, iliyim çapılıb, de gəlsin!

– Məni nahaq qınayırsan... Sənin düşündüyün kimi, əxlaqsız hərəkət eləmirəm. İş ayrı cürədi.

– Yəni nə cürədi?!.. – Bəhlul acı-acı gülümsündü, – o ayrı cürəlik nədən ibarətdi?

– Mən o oğlanı həqiqətən sevirəm.

– Yaşın bu vədəsində təzə eşq?!.. – Bəhlul bərk fısıldadı. – Axı, sən ailəli qadınsan. Məhəbbət ömürdə bir dəfə olur. Bizim sevgimizin tarixçəsi, az qala özümüzlə yaşıddı.

Durna xanım saçlarını buraxıb, uzun dırnaqları ilə qurdalandı.

– İncimə, – dedi, – o, uşaqlıq sevgisi imiş...

– Həəə?!..

– Hə! – Durna xanım Bəhlulun gözlərinin içinə davamlı baxdı. – Aldatmaq istəmirəm səni, o oğlanı bir gün görməyəndə dünya başıma fırlanır. Yaşamaq həvəsim tükənir.

Bəhlulu sanki ilan çaldı. Ağrıyan ürəyinin ofultusu otaqla bir oldu.

– Gör, nələr eşidirəm, ay Allah?!.. Bu nə dəhşətdi?!.. Niyə qulaqlarımı kar eləmirsən ki, o həyasız, o vicdansız sözləri eşitməyim!.. Of, of, oofff!! – O, yumruğunu havaya qaldırdı. Heç nəyə gücü çatmayıb, heysizliklə yanına saldı. Taleyinə aciz-aciz küsəndi: – Vəfasına, əhd-peymanına bütün qəlbimlə inandığım, canını öz canımdan artıq əzizlədiyim qadın, bir fikir ver, necə lənətli kəlmələr dilə gətirir!.. Yeni eşqdən, məhəbbətdən dəm vurur... Nə böyük xəcalət, nə böyük rəzalət?!.. Heç gör utanıb-qızarırmı?!

Durna xanım, doğrudan da utanıb-qızarmamışdı. Bəhlulun fəryadlarına bircə tükü də tərpənmirdi.

Bəhlul gəldiyi qərarını xatırladı. Səbrini basıb, bir neçə anlığa səsini içinə saldı. Özünə güc toplayıb "üç telli"sini yumşaq məzəmmətə başladı:

– Çıxart bu gülünc sevdanı başından, Durna! – dedi. – Təkcə özünü yox, mənim halımı da düşün. Bu abırsızlıq davam eləsə, baş qaldırıb, camaat arasına çıxa bilməyəcəm, rişxənd və məsxərə hədəfi olacam. Elə sənin özünü də söyəcəklər, yüz cürə şayiə yay-

acaqlar, ələ salacaqlar. Yaxşı-yaxşı fikirləş.

– Fikirləşmişəm. – Durna xanım ayağa durdu. Pəncərə qənşərinə gəlib, sürahiyə dirsəkləndi. İsrarla əlavə etdi: – Bunları mən günlərlə, həftələrlə düşünmüşəm.

Bəhlulun göz çuxurlarında iki damla yaş büllur kimi işıldadı. Qəhərini çətin-çətin boğdu:

– Bir də düşün, Durna. Dərin-dərin düşün. Biz cəmiyyət içində yaşayırıq. Öz başına deyilik. Cəmdəyimizə tüpürərlər.

Durna xanım çiynini çəkdi, ağzını büzdü. Bu ifadələr "hər nə olur-olsun" – demək idi. Bəhlul sülhə ayrı yol aradı:

– Bəlkə özündən xəbərsiz tora düşübsən? Cəmiyyətimiz fırıldaqçılarla, insan taleyi ilə oynayanlarla doludur. Öz cılız mənafeləri üçün hər alçaqlığı eləyirlər. Ağlını başına yığ, qayıt bu yanlış, üz qaraldan yoldan. Özünə və mənə heyfin gəlsin. Səhvini, çətin də olsa, bağışlayıram.

Durna xanım başını etinasızlıqla buladı.

– Mümkün deyil! – pıçıldadı. Sonra səsini ucaltdı: – Belə yoldan qayıtmırlar. Ya qəhr olurlar, ya da xoşbəxt!

Bəhlul qırıq-qırıq nəfəs dərdi:

– Sən əlavə xoşbəxtlik istəyirsən?

– Bəli! – Durna xanım inadlı dilləndi. – Mən ana xoşbəxtliyi arzusundayam.

Bəhlulun bu ötkəm cavabdan matı-qutu lap qurudu. Səsi güclə çıxdı:

– Vurulduğun o əclaf gədə ilə yaş fərqinizi nəzərə al. O haramzada çox cavandı. Səni tezliklə atacaq.

– Atmaz! – Durna xanım tam arxayın bildirdi: – Əsl sevgidə yaş fərqi heç nədi.

Bəhlul sudan təzəcə çıxarılmış balıq kimi ağzını iki-üç dəfə geniş açıb-yumdu. Nəfəsi çatışmırdı. Heysiz-heysiz:

– Onu sonra biləcəksən, – dedi, – çox-çox peşman olacaqsan... Eşit məni!

Durna xanım başını dik tutdu.

– Qabağıma qara çəkmə! Mən hələ qocalmamışam. Evimdən uşaq səsi gəlməsinin həsrətindəyəm!

– Onu mən də istərdim…

– O sənlik deyil! – Durna xanım höcətləşdi: – Siz kişilər uşaqsızlığın qadın üçün necə böyük əzab olduğunu dərindən duymursunuz, təsəvvürünüzə gətirmirsiniz. Evdən səhər çıxırsınız, gecədən xeyli keçmiş qayıdırsınız. Nə xəbəriniz olur qadın evdə, dörd divar arasında tənha qalıb hansı hisslər keçirir.

– Həkimlər bunun günahını səndə tapdılar.

– Mən heç bir həkimə inanmıram. Yalnız özümə, bir də Allahıma inanıram!

Bəhlul astaca ofuldandı. Su götürüb içdi. Az qala yalvardı:

– Dediklərin adicə gümandı, Durna. Aldadıcı ilğım görüntüsüdü. And verirəm, anla səhvini. Ziyanın yarısından qayıtmaq da qazancdı. Sonrakı peşmançılıq faydasız olur.

Durna xanım alnını pəncərə şüşəsinə dirədi, bir neçə anlığa susub etinasız dedi:

– Dilə tutma məni. Uşaq deyiləm... neylədiyimi anlayıram.

Bəhlul yenə də səbirli davrandı.

– Bir de görüm, nəyin çatmır? Daş-qaş, zər-ziba, pal-paltarda, son dəbli geyimlərdə hansı qadından, kimin arvadından dala qalırsan? Hər tələbatını imkanımdan artıq ödəmişəm.

– Sənin insanlığından narazılığım yoxdur.

– Bəs onda nədi səbəb? Utanan üz qalmayıb səndə, açıq etiraf elə. O sırtıq gədə qızğındı məndən, çox ehtiraslıdı, hə?!

Durna xanım geri qanrıldı. Burnunun ucunu ovxalayıb höcətlə cavab verdi:

– Hə!

Bəhlulun sinəsi acışdı. Aramsız öskürəklə, xırıltı ilə qışqırdı:

– Rədd ol burdan! İtil gözümün qabağından! Sən ifritəsən! Sürük, görməyim səni!!

Durna xanım qürurlu addımlarla otağı tərk etdi. Bəhlulun şiddətlənən öskürəyi əlacsız ah-oflarına, iniltilərinə qarışdı...

* * *

Xəstəlik beş gün çəkdi. Yorğan-döşəyə çaxılıb qalmağı xoşlamayan Bəhlul ayağa durmadı. Ciddi həkim nəzarətində müalicə olundu. Durna xanım daha onun həndəvərinə hərlənmədi. Yalan-

dan da olsa, səhhəti ilə maraqlanmadı. Səhər, ya axşam, təsadüfən, tualet tərəfdə qarşılaşanda, üz-üzə gələndə başlarını aşağı salıb, kirimişcə yan ötdülər. Bir-birinə heç gözucu da baxmadılar. Elə bilərdin, köhnədən küsülü qonşulardı.

Bəhlulun qulluğunda etibarlı sürücüsü dururdu. Çay-çörəyi, lazımlı xörəyi hardasa bişirtdirib gətirir; hər tapşırığını canla-başla yerinə yetirirdi.

Lənətli məsələnin sülhlə, öyüd-nəsihətlə yat-küt olmayacağına, gedib kar qulaqlara da çatacağına Bəhlul, axır ki, inandı. Dava-dalaşın, döyüş-söyüşün də xeyri yox idi. Yalnız bir çıxış yolu vardı: abırı abırsızlardan qorumaq! Nikah rəsmən ləğv olunana, məhkəmənin qərarı ilə əmlak bölgüsü icraata verilənə qədər buradan baş götürüb getmək!.. Lakin hara getsin? Müvəqqəti olaraq kimə sığınsın?

Müşkül iş idi. Ona ürəkdən canıyananlar, sirr açmağa etibarlılar kənddə yaşayırdılar, əlçatmazdaydılar. Yaxında – əlyetərdəkilərdən (şəhərli simsarlardan) isə beli bərk deyildi. Dərdini onlara necə açıb deyəydi? Əgər desəydi, onu düzgün anlayardılarmı? Əlavə söz-gapa, dedi-qoduya şərait yaratmazdımı?

Bəhlul gərgin fikirlərə daldı. Hərtərəfli götür-qoylara, düşünüb-daşınmalara saatlar, günlər sərf etdi. Artıq dirçəlmişdi. Ağrı-acıları səngimişdi. Süstlük, halsızlıq amanını qırmırdı. Ağlına hardansa, necə oldusa, yerləşdi ki, mehmanxanalardan birinə üz tutsun. Hazırda Bakının ən yaxşı, ən müasir oteli sayılan "Abşeron"da sakit bir otağa köçmək qərarına gəldi. Bu mehmanxananın müdiri ilə isti münasibətdəydi. Böyük bayram şənliklərinə, mühüm siyasi-ictimai tədbirlərə kənarlardan hörmətli qonaqlar dəvət olunanda, təşrif buyuranları həmən oteldə yerləşdirmək üçün onun müdirinə tez-tez müraciət edirdi. Bir-birinə xüsusi ehtiram bəsləyirdilər. İndi onunla zəngləşib, özünə də üç-dörd günlüyə otaq ayırtdıra bilərdi. Bəhanəsi də bu olardı ki, kənddən qadın qohumları gəlib, onların yanında gecələmək istəmir, utanırlar.

Bəhanə inandırıcı idi. Heç kəsdə şübhə doğurmazdı. Oteldə qaldığı günlərdə də sürücüsünə əlaltından kirayəyə ev axtartdırardı. Gözdən uzaq, könüldən iraq yaşayardı. Qanı hər dəqiqə qaralmazdı.

Otel müdirinə telefon açdı. Müdir xahişə müsbət yanaşdı.

Bəhlul vacib paltarlarını, dəyişəcəklərini bir çamadana yığdı. "Üç telli"sinə xəbərdarlıqsız mehmanxanaya köçdü.

Durna xanım buna çox məmnun oldu. Maneə aradan götürülmüşdü. Oğlanına ləngimədən şad xəbər verdi. Elə həmən gün birdəfəlik yanına gətirdi. "Ev qaldı əyriyə; həm yeyə, həm səyriyə".

**19.**

Əfsunun əlinə göydən kökə düşmüşdü. Zarafatdı bəyəm?! Yatanda yuxusuna da girməyən, təsəvvürünə belə gəlməyən əla şəraitli bir evdə yaşamağa başlamışdı. Hələ yoluxca, qoturca tələbə ola-ola xoş günə çıxmışdı, şən güzəran keçirirdi. Durna xanımdan gördüyü şirin nəvazişləri, müstəsna qayğıları öz ata-anasından, can-ciyər doğmalarından heç vaxt görməmişdi. Əmlik quzu kimi bəslənirdi. Bu yaşınacan yemədiyi löyün-löyün xörəklər yeyir; vaxtaşırı şalvar-köynəyi ütülənir; pencəyinin və ayaqqabısının tozu təmizlənirdi. Bircə sözlə, hər nazı ilə oynanılırdı.

İnstitutda da xətir-hörməti əvvəlkindən xeyli artmışdı. Qabaqlarda yalnız çalışqanlığına, hazırcavablığına görə seçilirdisə, indi geyim-kecimi, görkəmi ilə də diqqəti çəkirdi. Əməllicə ətə-qana gəlmiş, irz-irəngi durulmuş, yaraşığa minmişdi. Kurs yoldaşları ona açıq-aydın həsədlə baxırdılar. Qızlar isə marığında durmuşdular.

Üçüncü kursu bitirib, dördüncü kursa keçəndə, "müftə gəlir oyunu"na qurşandı. Rüşvətxor, ələbaxım müəllimlərlə yaxınlaşdı, "gətir-götür" münasibəti qurdu. Qış və yay imtahanlarında, "kurs işi" yazma çətinliklərində zəif tələbələrə "himayəçi" oldu. Pulla məqbul qiymətlər yazdırdı. Dəllallıq səriştəsi ilə məşhurlaşdı. Ona müraciət edənlərin sayı get-gedə artdı. Asan qazanc gəlha-gəlinə şirnikdi. Semestr imtahanlarına pulla qiymət yazdırmaq daha ona bəs olmadı. İnstituta tələbə qəbul elətdirmək iştahına düşdü. Qəbul komissiyasının bəzi üzvlərinə yol tapdı. Qabaqca qohum-əqrəba, tanış-biliş uşaqlarını instituta götürtdü. (Əlbəttə, böyük məbləğdə xərci ilə.) Gəlirin çox hissəsini "zəhmət çəkənlərə" ötürdü, bir qədərini də özü cibiştanladı. Sonra da qeyrilərinin "dərdinə yandı". Və beləcə "nüfuz" qazandı. Dəllallıq dələduzluğa çevrildi. Yay aylarında, institutlara tələbə qəbulu ərəfəsində müştəriləri başından aşdı. Qazancının bir azını Durna

xanıma yemək-içmək xərcləri timsalında verdi. O biri qədərini də kəndə göndərdi. Qalanını isə "cibxərcliyi" elədi, eyş-işrətə, kef-damaqlara girişdi. Gecələr restoranlara, xəlvət əyləncə yerlərinə ayaq açdı, Durna xanımın yanına səhərə yaxın, halsız-heysiz qayıtdı.

Cibi pulla şişkin Əfsunun duruşu, tərpənişi də gündən-günə dəyişdi. Yerişi başqalaşdı. Başını təkəbbürlə dik tutub, qılçalarını yan basa-basa, dabanlarını yerə möhkəm vurubləngirlənə-ləngirlənə addımladı. Adamlara yuxarıdan aşağı baxdı. Əda ilə danışıb səsini boğazında qaynatdı.

Onun evə səhərə yaxın gəlməkləri, Durna xanıma az məhəl qoymaları sonralar çoxaldı. Arada dörd-beş gün, bəzən lap bir həftə itib-batdı. Durna xanıma yalan üstündən yalan satdı ki, dostları ilə ayrı şəhərə, mühüm ictimai tədbirə göndərilmişdi. İnstitut rəhbərliyinin təcili tapşırığı idi. Vaxt tapıb onu xəbərdar eləməyə imkanı olmadı.

Durna xanım uydurma bəhanələri yaxşı duyurdu. Onun haralarda, kimlərlə gün keçirdiyini aydınca anlayırdı. Əfsun daha onun tanıdığı odlu-alovlu oğlan deyildi. Ehtirasları sönükləmişdi. Bunu dava-qalmaqalla açıb-ağartmağa ehtiyatlanırdı. Aradan mot-motu çıxacağından qorxurdu. Şübhəsini umu-küsü ilə bildirirdi:

– Sən axır vaxtlar çox dəyişibsən, Əfsun, – deyirdi. – Soyuyubsan məndən. Buna nədi səbəb?.. Bəlkə ayrı sevdaya düşübsən?

Şübhənin ünvanı düzgün təyin edilmişdi. Əfsunun cibləri haram pullarla dolduqca, yeni eşq macəralarına həvəslənmişdi. Cavan-cavan məşuqələr tapmışdı. Durna xanımdan maddi və qeyri-asılılıqları azaldıqca, ona bir qadın kimi marağı da azalmışdı. Nə çox idi pula, yüngül həyat tərzinə meyilli gözəlçə qızlar, madmuazel xanımçalar. Gündə biri ilə görüş təyin edir, arı təki hər çiçəkdən şirə çəkirdi. Kim ona qoruq-qadağa qoya bilərdi? Keçəl halva yeyir, puluna minnət!

Bir də, axı, başqa cürə olması da mümkün deyildi. Bu eşqin ömrü uzun sürəmməzdi. Aralarındakı on iki illik yaş fərqinin fəsadı tez-gec özünü büruzə verəcəkdi. Bəhlul düz demişdi. Burası da vardı ki, bu sevda əvvəlindən məqsədli sevda idi: gənclik ehtirasını söndürmək, institutu bitirib, əli çörəyə çatana, bir iş sahibi olana qədər Durna xanımdan istifadə qəsdi güdmüşdü. Ustalıqla

qılığa girib fikir azdırırdı:

– Nahaq gümana düşmə, əzizim. Mən eşqimə sadiqəm. Ağlına qara-qura fikirlər gəlməsin. Sənin kəsinti dırnağını heç bir qıza, qadına dəyişmərəm. Ürəyini buz kimi saxla.

Durna xanım and-qəsəmə, əlbəttə, inanmırdı. Qadın məstliyindən ayılmışdı. Ağlı başına cəmlənmişdi. Əfsunun harda yalan, harda doğru danışdığını duya bilirdi. Söz güləşdirməkdən özünü saxlasa da, incikliyini hərdən sakitliklə büruzə verirdi:

– Mən nə karam, nə də kor! Hər şeydən agaham. Səni məndən oğurlayan var. Kef-damaqlardan gecənin yarısı gəlib, çarpayıya çul kimi döşənirsən. Mənə arxanı çevirib, şirin xorna çəkirsən. Bu kef-damaqların nə vaxtacan davam eləyəcək?

Əfsun lotuyana qəhqəhə çəkir, əlini-əlinə vurub uğunur, məzələnirdi:

– Başa düşürəm, əzizim. Bunun hamısı qısqanclıqdandı. Qısqanclıq isə böyük məhəbbətdən doğur. Mən qədərsiz dərəcədə sevinirəm. Deməli, sən məni həqiqətən sevirsən.

– Sevgimin həqiqiliyini indi bilirsən?

– İndi yox, ilk vaxtlardan duymuşam.

– Yalnız mənimlə nəfəs aldığını deyirdin.

– Bəli, deyirdim. Elə indi də deyirəm.

– Bu doğrudursa, dediklərinlə hərəkətlərinin uyğunsuzluğu nədəndi?

– Hansı uyğunsuzluq?

– Məni gecələr evdə tək qoyub, haralardasa kef çəkmələrin!

– Ona əhəmiyyət vermə, cavanlıq əlamətidir. Dost-tanışlara da vaxt ayırmaq lazımdı. Belə şeyləri bağışlamağı gərək bacarasan. Cavanlıq balıq kimi çox sürüşgəndi. Əldən çıxdımı, daha özünü tutdurmur.

– Bu öz sözündü, ya kimdənsə eşidibsən?

– Müdriklər kəlamıdı. Özüm nə yatmışam ki, nə yuxu görüm? Mənim həyatda gördüyüm də, görəcəklərim də yalnız sənsən. Yuxum da, reallığım da sənə bağlıdı.

Durna xanım söylənənlərin səmimiyyətinə inanmasa da məcbur olub susurdu. Dərdini içində çəkirdi. Deyingənlikdən nə qazanacaqdı?!..

Aylar ötdü, il dəyişdi, ovqatlar da dəyişdi. Ayrılığın çox da uza-

qda olmadığı dəqiqləşdi. Əfsun xeyli müddət əlaqəni tamam kəsmək üçün kiçicik bəhanə axtarışında idi. Durna xanım da ayrılığın labüdlüyünü artıq dərk edirdi. Əsas məqsədinin: – Əfsundan uşağa qalmaq niyyətinin baş tutmayacağı da müəyyənləşmişdi. Cavan, ehtiraslı oğlanla bir yastığa baş qoymasından, budur, il yarımdan çox keçirdi. Hamiləlikdən heç bir əsər-əlamət yox idi. Bununla belə, Əfsundan aralanmaq fikrini başından çibin qovan kimi qovurdu. Bu ona zərbə üstündən zərbə, ikiqat rüsvayçılıq olardı.

Amma neyləyəsən ki, yeni rüsvayçılıq qaçılmaz idi. Əfsun bir axşam həyasızcasına elan etdi:

– Bu gündən bizim eşq macəramızın nöqtəsi qoyulur! – dedi. – Darı biçildi, bildirçinlər uçub getdilər.

– Necəə?!.. – Durna xanımın üzünün urvası büsbütün silindi. – Nə darı, nə bildirçin?.. Bunlar nə deməkdi?

– “Bildirçinin bəyliyi darı sovuşanacandı” deməkdi.

– Adam dilində danış, başa düşüm!

– Başa düşülməyəsi heç nə yoxdur burda. Deyirəm ki, bizim bir yerdə yaşamağımız daha qurtardı. Vaxtı, müddəti bitdi!

Durna xanımın dili-dodağı əsdi.

– Zarafat eləyirsən mənnən?!

– Xeyr! – Əfsun qolunu yellətdi, ciddiyyətini artırdı: – Doğru sözümdü. Belə şeydə zarafat olmur. – O, hazır çamadanını götürüb qapıya sarı addımladı.

Durna xanım tam bir dəqiqə mat vəziyyətində qaldı. Sonra çaşqınlıq içində irəli atıldı. Arxadan Əfsunun köynəyindən yapışıb geri dartdı. Köynəyin ətəyi şalvar altından çıxdı.

– Bir dayan görüm!.. Hara gedirsən?

Əfsun köynəyini sərt hərəkətlə düzəldə-düzəldə acıqlandı:

– Hara getdiyimi, özüm bilərəm. Onun sənə dəxli yoxdur!

– Var dəxli! – Durna xanım qabağı kəsdi . – Belə asanlıqla gedəmməzsən!

– Gedərəm! – Əfsun bacardıqca soyuqqanlı danışdı. – Heç kim heç kəsi zorla saxlaya bilməz.

– Axı... – Durna xanımın titrək səsi boğuldu. Nəfəsi təngidi. Gözlərindən gildir-gildir yaş öz-özünə axdı. – Sən mənə ömürlük

sadiq qalacağına söz vermişdin...

Əfsun arsız-arsız güldü.

– Bəlkə də söz vermişdim... Bu mümkün haldı. Onda təcrübəsiz, romantik bir gənc idim. İrəlini-gerini dərindən fikirləşmirdim. Gözəl qadın qoynunda yatmağı hər şeydən üstün sanırdım. İndi həyatımın başqa mərhələsi başlayır. Hər nə olubsa, köhnədə qalıb. İnsan keçmişlə yox, gələcəklə yaşayır.

Durna xanım arxasını qapıya söykəyib, hər iki əli ilə başını tutdu. Hönkürtü ilə qıy çəkdi. Və birdən də dikəldi, şax dayandı. Göz yaşlarını silib, Əfsunun yaxasından iki əllə yapışdı:

– Olmaz!! Ölərəm, qoymaram gedəsən! Sənin ucbatından ailəmi dağıtmışam. Hər şeyimi sənə qurban vermişəm. Qaxınc, töhmət sahibi olmuşam. Yaxın qohum-əqrəbalarım da məndən üz döndəriblər... Buraxmaram! Öldür, meytimin üstündən keç!

Əfsun üzünü bozardıb, təpgi gəldi:

– Əlini çək yaxamdan! Məcbur eləmə zor işlədim.

Durna xanım ondan bir az bərk yapışdı.

– Yox, əl çəkməyəcəm. Nə bacarırsan elə!

– Gəl, xoşluqla ayrılaq. Sonrası pis olar!

Durna xanım gücü tükənmiş halda qollarını yanına asta-asta saldı. Bürüm-bürüm bürüşdü. Yazıq-yazıq zarıdı:

– Ahh, zalım oğlu!.. Sən necə yalançısanmış!?.. Necə ev yıxansanmış!?..

Əfsun Durna xanımın sönükləyib bomboz bozarmış bəbəklərinin içinə oğraşlıqla baxdı:

– Sən də aydan arı, sudan duru deyilsən. Məni evinizə özün gətirdin, ərini də özün aldatdın. Odur ki, əvəz-əvəzik. Nə sənin mənə borcun qalır, nə də mənim sənə. Əlvida!

Sonra o, qapı dibinə çökmüş yarıhuşsuz Durna xanımı qəddarlıqla qırağa itələdi. Qapını şaqqıltı ilə açıb gedə-gedə hırıldadı:

– Səninlə sürdüyüm o səfalı çağları mənə halal elə!

Durna xanımın dili söz tutmadı. Dizlərini qucaqlayıb, səssiz-səmirsiz ağladı. Çiyinləri hey titrədi, titrədi.

...Aradan heç bir həftə keçməmiş, Əfsun Zamanlının sorağı Dövlət Təhlükəsizlik İdarəsinin zirzəmisindən gəldi. İdarənin əməkdaşları onu güdürlərmiş. Təzə cinayət üstündə yaxalanmışdı.

Durna xanımı da dinc qoymadılar. Apar-gətirə salıb, izahatlar

aldılar. Gərgin dindirmələrin birində günü göy əsgiyə düyülmüş, qəm-qüssədən əriyib yarı canı qalmış Durna xanım özündən getdi. Oturduğu stuldan aşıb, böyrü üstə döşəməyə sərildi. Həkim çağırdılar, ürək çatışmazlığı diaqnozu ilə xəstəxanaya göndərildi...

**20.**

Bəhlul Ağazadə "üç telli"sinin xəstəxanaya düşməsindən tez xəbər tutdu. Nə qədər qəribə görünsə də, şərqli kişi xislətinə əks olsa da, Durna xanımı unuda bilmirdi. Özü dönsə də, ürəyi ondan dönmürdü. Hələ də güman edirdi ki, "üç telli"si çox məharətlə qurulmuş tora düşüb, amansız intiqam qurbanı olub. Ara uzandıqca, aylar, fəsillər arxada qaldıqca həsrət közünün üstü kül bağlamaq, öləzimək əvəzinə, qor altında korun-korun hey közərirdi. Bir haramzadanın ucbatından puç edilmiş səadətinə qəlbən təəssüflənirdi. Durna xanımın gözəl siması gözləri önündən heç cürə çəkilib getmirdi. Heç cürə!

Yaxın dost-tanışları Bəhlulu ərklə məzəmmətləyirdilər. Məsləhət görürdülər ki, vəfasız, xəyanətkar qadının məhəbbətini həmişəlik silsin könlündən. Onu xəyalına belə gətirməsin. Adamı dost-düşmən yanında xar eləyən, ictimaiyyət içində nüfuzdan salan qadına sonsuz nifrət də azdır. Ömrün çox illəri qabaqdadı. Özünə yaraşan, qədir bilən, halal süd əmmiş bir qadınla evlənsin. Həyatını boş, mənasız xiffətlərlə bada verməsin. Təklik, guşənişinlik acizlik əlamətidi. Ötən gün heç vaxt dala qayıtmır. Özünə yazığı gəlsin!

Doğmaları: xala-bibiləri, əmi-dayıları, xüsusən də bacıları onu yenidən sıxma-boğmaya salmışdılar. Bəhlulun xirtdəyindən tutub, lap divara qısnamışdılar:

– Nolub sənə?.. Cəsarətin niyə çatışmır? Doğub-törəməz bir şortudan, ad batıran o qatır cinsindən ötrü haçanacan qəm-qüssə çəkib, yalqız yaşayacaqsan?! Hanı sənin kişilik vüqarın, qeyrət damarın?! Bədxahları, bizi istəməyənləri niyə güldürürsən üstümüzə. Yeddi arxadan dolananlarını niyə ələ saldırırsan? Nə üçün kəbinini indiyəcən pozdurmayıbsan? Yoxsa bizi bir daha biabır eləmək, camaatı üzümüzə tüpürtdürmək, gedib o həyasız qəh-

bəylə, gic-gici gözəlçə ilə barışmaq istəyirsən? Cavab ver! Lal-kar durma qarşımızda!!

Bəhlul cavab vermirdi. Başını aşağı salıb, gözlərini ayaqlarının ucuna zilləyib, qızara-qızara, daşa-qayaya dönüb susurdu.

Son biabırçı hadisəyə qədər (Bəhlul o qarauğur əhvalatı gizlin saxlamağa çalışsa da, yer qulaqlıdı, gedib kəndə yayılmışdı) məsələyə ciddi qarışmayan, barışdırıcı mövqe tutan, gəlininin tərəfində duran həlim xasiyyətli ana da qeyzlənib "deyingənlər" cərgəsinə keçmişdi:

– Ay oğul, dərdin alım, başına dolanım, bıçaq gəlib daha sümüyə dirənib, əl çək o abırsızdan. Bu günlərəcən ürəyim yanırdı onun halına. İstəmirdim zürriyyətsizlik dərdi üstünə bir dərd də artsın, ona yazığım gəlirdi. Qıymırdım pis günlərə düşsün. İndi ki, o qadam ağzına olmuş, qancıxlığa başdıyıb, gedib özgəsiynən kürsəyə gəlir, qurtar canını baş töhmətinnən. Nikahını birkərəmlik pozdur. Biz də irahat nəfəs alaq, özün də gözükölgəlikdən qurtar. Elin tən-töhmətini, qaxıncını sən eşitmirsən, şəhərdəsən. Buranın yas yerlərində, şənnik məclislərində haqqında pis-pis sözlər söyləyirlər. Məsxərəyə qoyurlar, öz halal-hümmət evinnən küsüb getməyinə, kürsəyə gələnlərə şərait yaratdığına görə bol-bol söyürlər səni. Heç kəsin ağzını yummax olmur. Boşa o murdarı, bu qan qaraldan söz-goplar bəlkəm kəsilsin.

Bəhlul anası hüzurunda da dinib-danışmırdı. Eyni qaydada kiriyirdi. Ana öyüd-nəsihətinə həlim-həlim davam edirdi:

– Hə, ay bala, uzaqlaş o qızıxmışdan. Yaxşı oldu ki, araya nifaq özünnən düşdü, özgəsinə uydu. Qoy səssiz-küysüz itilib getsin. Danış hökumət adamlarıynan, nikahınızı pozsunlar. Gecikdirmə işi.

Bəhlul anasını ziyadə çox istəyirdi. Atasını erkən itirdiyindən (atası qırx beş yaşında, o, hələ orta məktəbin son siniflərində oxuyarkən, "mədə xərçəngi" xəstəliyindən dünyasını dəyişmişdi), onun ana məhəbbətinin üstünə ata məhəbbəti də artmışdı. Odur ki, heç bir vaxt, heç bir məsələdə anasının məsləhətindən çıxmır, bircə sözünü də qulaqardına vurmurdu. Ancaq "üç telli"si barədə zıqqıyırdı:

– Yaxşı, ana, nigaran qalma. Sənin dediyin kimi eləyəcəm.

Orada balaca bir əngəl var, o əngəl həll olunan kimi hər şey çəmini tapacaq, məsələyə son qoyulacaq.

Ana öyüdünü gələcək arzuları ilə tamamlayırdı:

– Sən hələ cavansan, oğul. İndi-indi kişiləşirsən. Bu il, Allah qoysa, otuz dörd yaşına keçəcəksən. Bir çoxları bu yaşda yenicə ailə qurur. Axtar, əsilli-nəsilli arvadı ya özün tap, ya da icazə ver, bacıların arayıb-axtarsınlar. Bəsdi, gözləməkdən gözümüzün kökü saraldı. Özünə rəhmin gəlmir, mənə gəlsin. Dərdini ürəyimə yük eləyib gora aparmayım.

Bəhlul vəd verirdi, intizarın lap yaxın zamanda bitəcəyinə boyun olurdu. Beləcə günü-günə satıb, məsələnin həllini uzadırdı. Şəhərin ucqarında kirayələdiyi birotaqlı, təmirsiz, miskin mənzildə tənha həyat sürməkdə davam edirdi.

Onun zıqqılığı, iradəsizliyi hamını yavaş-yavaş özündən uzaqlaşdırdı. Qohumlarından daha heç kim ona yaxın gəlmədi, dindiribdanışdırmadı, salam-kəlamı kəsdilər. Təsadüfən qabaq-qənşər gələndə, yolda-yolaxda rastlaşanda üzlərini çevirib, saymazyana ötdülər. Bacıları ultimatum göndərdilər ki, onunla ömürlük barışmayacaqlar. Bəhlul adında qardaşları yoxdur. Namussuz, qeyrətsiz adamı özlərinə qardaş saymırlar. Ondan imtina edirlər.

Xəstəhal ana da öz dilindən məktub yazdırdı ki, ad-sanını, hörmətini ləkələmiş bir ifritədən əl çəkməyən, düşmən qaxınclarını başa yağış təkin yağdıran oğul ona gərək deyil. Südünü halal eləmir. Öləndə üstünə gəlməsin; cənazəsini götürməsin!..

Bu ağır təpgilərə, həqarətli hədə-hərbələrə necə dözdüyünə Bəhlulun özü də mat idi. Nə sirr, nə hikmətdisə söz-söhbət artdıqca, dərinləşdikcə, daha təhqiramiz şəkil aldıqca, onun daxilindəki höcət də çoxalır, qüvvətlənirdi. Burası da son dərəcə heyrətli idi ki, hansı bir hiss, hansı bir fövqəl duyğu isə onu hey "üç telli"sinə doğru çəkirdi. Durna xanımın tezliklə peşmanlayacağını, bağışlanmağını istəyəcəyini ona diktə və təlqin edirdi. Budur, o qəribə daxili təlqin gerçəkləşmək üzrə idi.

Yeri gəlmişkən, bir gizlini də açıqlayaq: dələduz, kələkbaz oğlanın təhlükəsizlik idarəsi əməkdaşlarının caynağına keçməsində də Bəhlulun müəyyən cəhdi olmuşdu. O, eyni zamanda Durna xanımın qeydinə qalmışdı, məlum cinayət işinə qatılmamasına çalışmışdı. "Üç

telli"sinin dindirmə zamanı huşunu itirib, xəstəxanaya düşməsini də o idarədəki yaxın bir dostundan öyrənmişdi...

Bəhlul bütün çətinliklərə, qohum-əqrəba məzəmmətlərinə, ana və bacılarının yeni-yeni ismarışlarına bir elə məhəl qoymayıb, öz əhdinə sadiq qaldı. Xəstəxana rəhbərliyi ilə müntəzəm əlaqə yaratdı. "Üç telli"sinin səhhətindən hər gün xəbər tutdu. Çətin tapılan dərmanları səlahiyyətli tanışları vasitəsilə əldə etdi. Amma özü xəstəyə baş çəkməyə tələsmədi. Görüşü sonraya, xəstəlik sovuşana saxladı. Qorxdu ki, gözə görünməsi xəstədə mənfi emosiya törədər. Orasını da fikirləşdi ki, münasibəti sahmana salmaq, görüşdən əvvəl müəyyən hazırlıq işi aparmaq üçün vasitəçi lazımdır.

Bəhlul xeyli düşündü, yaxın adamları yadına saldı. "Üç telli"sinin bu şəhərdə mütəmadi, şirin münasibətdə olduğu yalnız Durna xanımın öz əmisi qızı Süsənbər idi. Bir-birinin evinə xəbərdarlıqsız, ərkyana gedib-gəlirdilər. Süsənbərin əri hərbçi idi. Zarafatcıl, şən, səmimi adam idi. Ailəvi yaxınlıq edirdilər. Bayramlarda, şənliklərdə həmişə bir yerdə olurdular. Yeni il gecəsini, Novruzu bir yerdə qarşılayırdılar. Qohumluqla dostluq qaynayıb-qarışmışdı. Bəhlul Süsənbəri "üç telli"sinin əmisi qızı kimi yox, özünün doğma bacısı qədər sevirdi. Süsənbər hədsiz mehriban, ziyadə qohumpərəst idi. Xoş ünsiyyət üçün əldən gedirdi. Di gəl ki, ...məlum qarauğur hadisədən bəri münasibətləri korlanmışdı. Bir-birilərini axtarmırdılar, tamam yadlaşmışdılar.

Bəhlul Süsənbərgilin həmişə əzbərində olan telefon nömrələrini ha çalışdı, yadına sala bilmədi. Köhnə cib dəftərçəsini vərəqlədi. Axtardığı tapıldı. Nömrələri sevincək yığdı. Azyaşlı uşaq cavab verdi. Pəltək dillə anasının xəstəxanaya – Durna xalasının yanına getdiyini söylədi.

Bəhlul bu xəbərdən məmnun oldu. Fikirləşdi ki, yaxşı fürsətdir, gedib elə orada – xəstəxanada Süsənbərin köməyindən istifadə eləyə bilər. Mehriban Süsənbər bu xeyirxah missiyanı rədd etməz, xasiyyətinə yaxşı bələddir.

İş otağında cəld yır-yığışa başladı. Xidməti maşınını çağırdı. Həyətə düşdü. Yaxınlıqdakı gül dükanında qəşəng çiçəklərdən böyük dəstə bağlatdı. ("Üç telli"si bu çiçəkləri çox sevirdi. Bəhlul

onu 8 Mart qadınlar günündə, novruz bayramında, təvəllüd şənliyində həmən çiçəklərlə təbrik edirdi.) Sonra da maşını bazara sürdürdü. Sürücüsünə bir səbət yaxşı mer-meyvə bazarlığı gördürdü və nigaran hisslərlə xəstəxanaya üz tutdu.

Xəstəxananın geniş, bağ-bağatlı həyətində, Allahdan olmuş kimi, Süsənbərlə qarşılaşdı. Buna çox sevindi. Düz qənşərinə yeridi. Ehtiramla salamlaşdı. Ancaq ətraflı hal-əhval soruşmağa çətinlik çəkdi.

Süsənbər onun keçirdiyi ruhi vəziyyəti yəqin ki, duydu. Şirin təbəssümlə özü dilləndi:

– Necəsiniz, Bəhlul qardaş!.. Nə var, nə yox?..

Tilsim sındı. Bəhlul yüngülcə qızararaq əl tutuşdu.

– Çox sağ olun, Süsənbər xanım, pis deyiləm. Yoldaşınız necədi?

– O da pis deyil. Tez-tez sizi xatırlayır.

Bəhlul səmimi minnətdarlığını bildirdi:

– Mən də onu tez-tez xatırlayıram. Şən, mehriban adamdı. Bayramlardakı hay-küylü görüşlərimiz yadımdan çıxmır.

Süsənbər narahat nəfəs dərdi:

– Eh, Allah baisin evini yıxsın. Araya pəl qatdı. İsti münasibətlərimizi soyutdu. Çox heyif!

Bəhlul başını köksünə salladı.

– Ona mən də təəssüflənirəm.

Söhbət bir neçə anlığa kəsildi. Süsənbər yenidən xoş ovqata qayıtdı:

– Sizi görməyimə şadam, Bəhlul qardaş. Yaxşı oldu ki, rastlaşdıq. Yoldaşım siz sarıdan nigaran idi. Keçən gecə yuxusunu qarışdırmışdı. Əhvalınızdan xəbər tutmaq istəyirdi. Ha axtardı, iş yerinizin telefonunu tapmadı. Bizim telefon kitabçamız it-bata düşüb. Evi ələk-vələk elədik, əlimizə keçmədi. Allah bilir, uşaqlar götürüb, hara atıblar. Heç ipə-sapa yatmırlar. Böyüdükcə, bir az da dəcəlləşirlər... İndi gedib muştuluqlayacam yoldaşımı. Rastlaşdığımızı, sizi gümrah gördüyümü çatdıracam ona. Buna çox sevinəcək.

– Xahiş eləyirəm, mənim salamımı da çatdırın.

– Mütləq çatdıracam. – Süsənbər duruxdu. Nə isə duymuş kimi ehtiyatla xəbər aldı. – Bəs nə əcəb yolunuz bura düşüb? Yaxınlarınızdan xəstə olanımı var?

– Bəli. – Bəhlul iki-üç dəfə udqundu. – Bir tanışıma baş çəkməyə gəlmişəm.

Süsənbər qayibən nəsə sezdi. Ürəyinə dammış xoş hissi dolayısı ilə dürüstləşdirməyə çalışdı:

– Baş çəkmək istədiyiniz hər kimdisə, Allah şəfa versin. Yastığı yüngül olsun!.. Əmi qızım da bu xəstəxanada yatır. Onun yanından qayıdıram.

Bəhlul iradəsindən asılı olmadan təlaşlandı:

– Vəziyyəti nə cürdü?

Süsənbər sorğunun riqqətindən ürəkləndi:

– Əvvəl çox pis idi. Reanimasiyada çox qaldı. İndi, Allaha şükür, babatdı. Palataya köçürüblər.

Bəhlul xahişini bildirmək istədi. Söz xirtdəyində ilişdi. Süsənbər cəsarətlə təklif etdi:

– Vaxtınız varsa, "üç telli"yə də baş çəksəniz heç pis olmazdı. Hərəkətlərindən çox peşmandı... həmişə sizi düşünür. Sizin böyük insanlığınızdan danışır. Göz yaşları qurumur...

Bəhlul doluxsundu. Süsənbər bundan bir az da cəsarətləndi:

– Bəhlul qardaş, siz alicənab insansınız. Nəcabətiniz hamıya bəllidi. Onu ürəkdən bağışlamasanız da gedib beş dəqiqəliyə baş çəksəniz savab iş görərdiniz. Ruhən ölüyə həyat bəxş etmiş olardınız.

Bəhlul öz hərəkətinin düzgünlüyünü yoxlayırmış kimi soruşdu:

– Belə şeyi siz mümkün sayırsınızmı?

Süsənbər qətiyyətlə:

– Nəinki mümkün, vacibdən vacib sayıram, – deyib, təkid etdi: – Mərhəmətinizi əsirgəməyin. O çox yazıq qadındı. Bütün günahı yalnız uşaq istəyinə görədi. Ayrı fikirlə sizə xəyanət eləməyib. Bunu yəqin bilirəm. Belə olmasaydı, hamı kimi, mən də ondan üz döndərərdim. Namussuzluq adi günah deyil. Babalarımız belə günahı qanla yuyublar.

Bəhlul fikirli-fikirli:

– Elədi, – dedi. – Qadın xəyanəti bizim milli adət-ənənəmizə ziddi, heç vaxt bağışlanılmır. Ən ağır cinayət hesab olunur. Onu bağışlayan kişi isə daha artıq lənətlənilir.

Süsənbər barışığa tədbir aradı:

– Amma bir şey də var, Bəhlul qardaş. Müdrik dədələrimiz

buyurublar ki, yüz dəfə imam üçün ağlayanda, bir dəfə də yezid üçün ağlamaq lazımdı. Biz gərək hardasa əmi qızımı da başa düşməyə çalışaq. Bayaq dediyimi təkrar deyirəm: o çirkin qəbahətin səbəbi uşaq sarıdandı.

Bəhlul daha heç nə gizlətmədi.

– Doğrusunu bilmək istəyirsinizsə, mən elə "üç telli"ni görməyə gəlmişəm.

Süsənbər eşitdiyinə çox xoşhal oldu:

– Oy, nə ali xeyirxahlıq!.. Nə gözəl insanlıq!!.. Bax, bu milyonda, bəlkə də milyardda bir kişinin böyüklüyüdü!

Bəhlul ürəyini tam açdı:

– Əslində, məni qayğılandıran, bura gətirən məsələnin başqa cəhətidi. Durnanın hamı tərəfindən lənətlənib, unudulması, tək qoyulmasıdı. Kimsəsizə, imdadsıza mərhəmət göstərmək Allah tövsiyəsidi... Orasını da danmıram ki, ona məhəbbətim də tam sönməyib. Bu neçə vaxtda nifrət eləməyə çalışdım, bacarmadım. Görünür, Durnaya lap uşaqlıqdan bağlanmağımdı bunun səbəbi... Ancaq bilmirəm "üç telli" məni düzgün anlayacaqmı.

– Anlayacaq! – Süsənbər qəti rəy söylədi. – Mənə yəqin inanın ki, qəbahətindən böyük xəcalət çəkir. Özünü hey qınayır. Başına-gözünə döyür. Aranıza girmiş o şeytansifət oğlanı söyməkdən, lənətləməkdən doymur. Tez-tez də məndən sizi soruşur.

Bəhlul tərəddüd keçirdi:

– Yanına tək getməkdən ehtiyatlanıram. Birdən faci hadisə törəyər.

Süsənbər inamlı zəmanət verdi:

– O sarıdan nigaran qalmayın. Xidmətində duran tibb bacısı məsuliyyətli qızdı. Hər şeyi nəzarətdə saxlayır, yanından uzaqlaşmır. Qonşu çarpayıda da qoca, xanım-xatın bir arvad yatır. Üz-gözündən nur yağır. Adı da Qumaşdı, özünə çox yaraşır. Söhbətcil, zarafatcıldı. Durnanı ağla-sıtqa eləməyə qoymur. O arvad yanında olmasaydı, əmim qızı bəlkə də dünyasını çoxdan dəyişərdi. İlk vaxtlar yaşamaq istəmədiyindən danışırdı. Ölümü xəcalətli adla ömür sürməkdən üstün tuturdu... Gedin, sevindirin "üç telli"nizi. Lazım gəlsə, Qumaş xala köməyinizə çatar, əmi qızını ağıla-başa salar.

Bəhlul üz vurdu:

– İnciməyin, Süsənbər xanım, sizə əlavə zəhmət də olsa, gəlin birlikdə gedək. Acizanə xahiş eləyirəm.

Süsənbər boyun qaçırdı:

– Bəhlul qardaş, siz heç nədən çəkinməyin, heç nə olmayacaq. Özünüz təkcənə qapını açıb içəri girsəniz yaxşıdı.

– Ehtiyat igidin yaraşığıdı, Süsənbər xanım. O cürə ağır ürək xəstəsinin gözünə xapa-xapdan görünməyim həyəcansız ötüşməz. Xahişimi, Allah xatirinə, yerə salmayın.

Süsənbər çarəsizliklə razılaşdı:

– Yaxşı, gedək! Ancaq bir şərtlə. Mən yanınızda çox qala bilməyəcəyəm. Uşaqları qonşu ümidinə qoyub gəlmişəm. Dəcəllər yola getmirlər. İtlə-pişik kimi boğuşurlar. Qorxuram bir xəta-zad eləsinlər. Sizi görüşdürüb aradan çıxacam.

– Mənə beş-on dəqiqəliyə həyan olsanız bəsimdi. Sonrası öz boynuma.

Pillələri yanaşı, dinməzcə qalxdılar. Hər ikisinin çöhrəsində məsum bir təbəssüm cilvələnirdi.

## 21.

Durna xanımın yatdığı müalicə otağı uzun və ensiz dəhlizin qurtaracağında, gündoğar tərəfdə yerləşirdi. İşıqlı, lakin darısqaldı. İki çarpayı bir-birinə çox yaxın qoyulmuşdu. Üstü dərmanlar, ərzaq şeyləri ilə dolu, bambalaca tumba çarpayıların arasına zorla pərçimləndirilmişdi. Bu çarpayıdan o çarpayıya əl asanlıqla çatardı.

Süsənbər otağın qapısını ustuf araladı. Eyni ustufluqla da Bəhlulun biləyindən tutub, içəri çəkdi. Pəncərə tərəfdəki çarpayıda arxası üstə uzanmış Qumaş arvad başını hənirtiyə qanırdı. Bir gözünü qıyıb maraqla boylandı. Süsənbəri görüb, tükü yarıyadək tökülmüş qaşlarını heyrətlə tərpətdi:

– Niyə qayıtdın, a bala? Yadınnan çıxan bir şeymi var? – soruşdu.

Süsənbər Qumaş arvadla himcimləşib, pıçıltı ilə:

– Yox, Qumaş xala, – dedi, – yadımdan heç nə çıxmayıb. Əmi qızıma sürprizlə qayıtmışam.

Qumaş arvad gərilmiş qaşlarını dartıb alnının ortasına qaldırdı. Bir xeyli kirpik çaldı. Sonra sağ əlinin iki barmağını qırışmış do-

daqlarında gəzdirə-gəzdirə:

– Hımm... Annadım, – deyib, o biri böyrü üstünə çevrildi.

Durna xanım qılçalarını qarnına yığıb, bir qolu ilə üzünü örtərək mürgüləmişdi. Süsənbər Bəhlulu aralıda (diqqətdən qıraqda) qoyub, özü əmisi qızına yanaşdı. Ehmalca çiyninə toxundu, şirin-şirin səslədi:

– Aazz, üç telli, oyan bax, görüşünə kim gəlib!

Durna xanım asta inilti ilə qolunu üzündən aşağı saldı. Çirişlənmiş kirpikləri bekaraca qımıldansa da aralanmadı. Süsənbər əmisi qızına daha da yaxın durdu. Çiyninə bir də toxunub, qulağına doğru əyildi. Çağırışını hündürdən təkrarladı:

– Azz, nə oldu sənə?.. Aç də gözlərini!

Durna xanım handan-hana bir gözünü yarıya qədər araladı:

– Sü...sənn?!.. Sənsən?

– Hə, mənəm, əmiqızı. Bu tezlikdə nə bərk yatıbsan?

– Nə bilim... – Durna xanım qılçının birini qarnından açdı. Hələ də mürgülü vəziyyətdə mızıldandı: – Bəs... sən... getməyibsən?

– Gedirdim, geri dönəsi oldum.

– Nə üçün?

– Özünə gəl, mürgünü dağıt, sənə şad xəbərim var.

Durna xanım sözəbaxım uşaq itaətkarlığı ilə kirpiklərini ovxalayıb, geniş araladı. Arxası üstə çöndü. Məyus dilləndi:

– Nə şad xəbər?.. Mənim şadlıq payım qurtarıb...

– Yox, qurtarmayıb! – Süsənbər şıtıq-şıtıq höcətləşdi. – Əvvəlcə de görüm, muştuluğuma nə boyun olursan. Gecə-gündüz arzuladığın, məndən hər dəfə soruşduğun adamı yanına gətirmiş olsam, mənə nə mağarıc verəcəksən?

Durna xanım gözlərini asta-asta sağa-sola hərlədi.

– Başa düşmürəm səni, Süsən... yanıma səndən savayı gələn kim ola bilər? Hamı mənə nifrət eləyir.

– Elə demə. Ürəyi səndən dönməyən bir gözəl insan var!

– Kimdi o?

– Sənin əzizlərdən əzizin Bəhlul qardaş!

Durna xanım dərindən ah çəkdi.

– Şitlik eləmə, Süsən. Zarafatlıq halım yoxdu mənim.

– Şitlik-zad eləmirəm, əmiqızı. Lap doğrusunu deyirəm.

– Ola bilməz!
– Olar, hələ o yana da keçər! – Süsənbər gülə-gülə kənara çəkilib, Bəhlulu işarətlə irəli çağırdı. Qapı küncünə daldalanmış Bəhlul qabağa yeridi. – Diqqətlə bax! Qarşında kimi görürsən?
Durna xanım baxdı. Heyrətdən dondu. Kirpiklərini sürətlə xıppıldatdı. Və birdən əlləri ilə üzünü qapayıb hayqırdı:
– Oyy, məni qara basır!.. Mən yuxu görürəm!!
Süsənbər onu nəvazişlə öpdü.
– Yox, əmiqızı, səni qara basmır, yuxu da görmürsən. Qarşındakı həqiqətən Bəhlul qardaşdı. Sənə baş çəkməyə, vəziyyətindən hali olmağa gəlib.
Durna xanımın sinirləri, elə bil, keyidi. Sus-pus qaldı. Nə dilləndi, nə tərpəndi. Öləzik baxışları Bəhlula zilləndi. Bu baxışlarda dərin təəccüb də vardı, xəcalət və inamsızlıq da.
Bəhlul kiçik addımlarla qənşərə yeridi. Tanınmaz dərəcədə arıqlamış, ovurdları çökəlib, gözləri batqınlaşmış "üç telli"sinin halına ürəyində acıya-acıya salam verdi, əlindən tutdu.
– Necəsən, üç telli?
Hədsiz mehribanlıqla süslənmiş sual Durna xanımın təəccüb qamaşığını açdı. Öləzik baxışlarında canlanma yarandı. Amma dinmədi. Dodaqlarının ucları titrəyə-titrəyə susdu. Yarım dəqiqə (bəlkə də daha az) sürən bu sükut sonda tüğyan elədi. Durna xanımın köksü tez-tez körükləndi. Soyuq parıltılı yaşlar göz çuxurunda silələndi. Xırdaca damlalar muncuq-muncuq olub, arıq və solğun yanaqları aşağı diyirləndi və səssiz ağlayış güclü hönkürtüyə çevrildi.
Qumaş arvad dik atıldı. Səsə tibb bacısı da o biri otaqdan yüyürüb özünü yetirdi. Hər ikisi eyni sualı bir anda verdi:
– Nə oldu ona?
Süsənbər əmisi qızını sakitləşdirə-sakitləşdirə:
– Heç nə olmayıb. Bir az həyəcanlandı... Keçib-gedər, – dedi.
Tibb bacısı kobud hərəkətlə Süsənbəri xəstədən araladı. Əl-ayağa düşüb ürək sakitləşdirici iynə hazırlaya-hazırlaya deyindi:
– Kanar durun, bircə!.. Siz məni işdən qovdurmaq, üzümü danlatmaq istəyirsiz! Kim sizə icazə verib, xəstəni narahat eləyəsiz?!
Süsənbər tibb bacısını yüngülcə qınadı:

– Acığın tutmasın, bacı. Biz onu bilərəkdən eləmədik... Heç istərikmi həyəcanlansın?!

Tibb bacısı üzünü bozartdı:

– Bilərəkdən, ya bilməyərəkdən, fərqi birdi! Ona bu vəziyyətdə adicə qıcıq da ziyandı. Reanimasiyadan təzəcə çıxıb. Kiçik bir stress onu komaya sala bilər.

Süsənbər peşmanlayıb üzr istədi. Tibb bacısı iynəni vurub, xəstənin nəbzini ölçüb, sərt nəzərlərini Bəhlula tuşladı:

– Çıxın otaqdan! Kənar şəxslərin palataya icazəsiz girməsi qadağandı.

Bəhlul pərt oldu. Qıpqırmızı qızarıb, geri döndü. Qucağındakı gül dəstəsini çarpayının ayaq tərəfinə qoyub, (mer-meyvə, ərzaq zənbilini sürücü gətirib, süpürgəçi qadın vasitəsilə içəri ötürmüşdü), sıxıla-sıxıla çölə çıxdı.

Qapı örtüləndə Qumaş arvad tibb bacısını yamanladı:

– A qızım, a günü ağ olmuş, kişini niyə pərt elədin? Olmazdımı yumşarax danışaydın?

Tibb bacısı hirslə fınxırdı:

– Bu xəstənin başına bir iş gəlsə, siz hamınız çəkilib gendə duracaqsınız. Günahkar məni sayacaqlar.

Süsənbər taqsırı öz üzərinə götürdü:

– Günah gedəndə yox, məndədi, – dedi. – Qaydanı mən pozdurmuşam.

Qumaş arvad təskinlik verdi:

– Şeytana lənət, bala! Xatadan sovuşdux... Durna qızım toxdadımı?

– Hə, toxdadı. Allaha şükür, irz-irəngi düzəlir.

– Çəkil qabağımnan, əhvalını özünnən soruşum.

– Baş üstə! – Süsənbər yana çəkildi.

Qumaş arvad əlini uzadıb, Durna xanımın çiynini ana mehri ilə sığalladı.

– Ürəyin sakitləşdimi, qızım? İrahat oldunmu?

Durna xanım kövrəkcə qımışıb, başının asta tərpənişi ilə sorğunu təsdiqlədi.

Süsənbər sevincək dedi:

– Mərhəba, əmiqızı, kəfəni birkərəmlik cırdın. Daha sənə zaval yoxdu!

Qumaş arvad salavat çevirdi:

– Şükür birliyinə İlahinin. Fəqir bəndələrinə kərəmini əsirgəmədi... Bunnan belə uzun yaşıyacaxsan, qızım, o ürək sənə sədaqətli çıxdı... Amba bir şeyi annamıram, səbəb nəydikin, o cürəm hönkürtüynən ağladın?

Durna xanım susdu. Süsənbər qaşlarını şövqlə dingildətdi:

– Ağlamağın ziyanı yoxdu, Qumaş xala. Əmiqızım ürəyinin köhnə yanğısını bu göz yaşları ilə söndürdü. Canı dincəldi.

– Bəs ürəyi dayansaydı, onda necə? – tibb bacısı onu sancdı.

– Nəhs danışma! – Süsənbər köntöy cavab qaytardı. – Ağzını xeyirriyə aç.

– Nəhs danışmıram, ola biləni deyirəm!

– Yaxşı, boş yerə söz güləşdirməyin! – Qumaş arvad mübahisəni kəsdi. – Hər ikinizin Allah köməyiniz olsun, Durna qızıma can yandırırsınız... Bir para qarannıx şeyləri sonram, ana-bala təkin öz aramızda aydınnaşdıracayıx. Gecələr söhbətimiz çox olur. Aranı dağa daşıyırıx, dağı da arana. İşimizin adı nədi? Bu gecə də sorğu-sualımız çoxdu... – Üzünü Süsənbərə tutdu: – Sən bayaxdannan tələsiyirdin. Uşaxları evdə tək qoyufsan deyirdin, yolunnan qalma. Amba getməzdən qabax, ayax altınnan o gülləri götür, Durna qızıma yaxın qoy. Gözəl ətri var. İyi ordan bura çatır. Onu gətirən hər kimdisə, Durna qızımı çox istiyir.

Süsənbər Qumaş arvada gizlindən göz vurdu:

– Elədi, Qumaş xala. Gülləri gətirən çox böyük ürəkli adamdı. Əmiqızımın başına pərvanədi.

Qumaş arvad şirin-şirin qımışdı.

– Annadım, a bala. Gerisini söyləmə. İç-peçəsinə təklikdə özüm yetəcəm. Dediyimi elə.

Süsənbər böyük gül dəstəsini çarpayının aşağısından götürüb Durna xanıma uzatdı. Durna xanım gülləri ondan utana-utana aldı. Qəhərdən alt dodağı büzülüb, xəfif-xəfif səyirdi.

Qumaş arvad araya tezcə şuxluq qatdı:

– O güllərə təkcənə yiyələnmə, qızım. Onnardan bizim də payımız var. Unutma kin, xeyrimiz-şərimiz burda ortaxdı.

Süsənbər də məzələndi. Süpürgəçinin qapı küncünə qoyduğu zorba zənbili şən işarətlə göstərdi:

– Odur ey, o zənbildə ağız sulandıran qəşəng ərməğanlar da var. Ümid eləyirəm, əmiqızı onlardan da bizi umsundurmaz.

Gülüşdülər. Qaşqabağı hələ də tam açılmamış tibb bacısı yarızarafat, yarıgerçək əlavə etdi:

– Xəstəxanaya gətirilmiş hər bir sovqata tibb bacıları da şərikdirlər. Məni yaddan çıxartmayın!

Gülüş şiddətləndi.

**22.**

Bəhlul xəstəxanadan pərişan uzaqlaşdı. Onu tibb bacısının kobudluğundan daha çox "üç telli"sinin güclü hönkürtüləri təsirləndirmişdi. Bu, qadın acizliyi, yoxsa acı göz yaşları ilə günah yumaq idi? Dürüstləşdirə bilmirdi.

Yolun yarısında maşınını saxlatdı. Sürücüsünə bir az piyada gəzmək, təmiz hava udmaq istədiyini söylədi, iki saatdan sonra Azneft binasının qənşərində gözləməyi tapşırıb asta-asta sahilə endi. Dənizkənarı bulvarda yaxasını açdı, üzü sərin küləyə doğru tələsmədən addımladı.

"Üç telli"si ilə pozuluşandan bəri heç yana ayaq basmırdı. Vaxtının çoxunu işi oldu olmadı, idarədə keçirir; kirayələdiyi mənzilə yalnız gecəyarısı gedirdi. Adamlardan qıraqlarda gəzir, ictimai şənliklərdə, ümumi tədbirlərdə seyrək-seyrək görünürdü. Məzəmmətli baxışlardan yaman dillərdən qaçırdı. Nə çoxdu ağzıgöyçək lağlağıçılar, əsəblə oynayanlar!... Bircə sözlə, sərbəst gəzintiyə, təmiz havaya tamarzı idi.

Bulvar seyri eynini xeyli açdı, pərişan əhvalı nisbətən duruldu. Əzalarındakı süstlük bala-bala sıfqarıldı. Özündə müəyyən dirçəliş duydu. Lakin "üç telli" barədə nigarançılığı burda da onu tərk etmədi; düşüncələrə saldı. Ürəyini ən çox göynədən "üç telli"sinin ziyadə arıqlaması: bir dəri, bir sümük qalması idi. Qaynar, canalan gözləri dərin çuxurda üstünü narın kül örtmüş iki köz kimi korun-korun işıldayırdı. Xəmirçəkləri qabarıb üzə çıxmış isvaha burnunun pərələri genişlənmişdi. Kiçik ağzı da, elə bil, böyümüşdü.

Bəhlul qəlb ağrıdan bu sifət cizgilərini təsəvvüründə canlandıra-canlandıra bir daha bərk təəssüfləndi: "Andır dərd-azar

adamı gör necə pis günlərə, yaman hallara salır?!.. Qənirsiz gözəllikdən hanı əsər-əlamət?! Baxırsan, sinə dağlanır...”

Bəhlul elə həmən anlarda da başqa bir acı hiss keçirdi. Özü xəstə ikən başına gətirilən irsiz davranışlar xəyalında dolandı. Fəqət “üç telli”sinə rəhmi indi də digər hisslərə üstün gəldi. Acığın, nifrətin qarşısına çəpər çəkdi. Son qənaətində bir daha möhkəmləndi: “Durnanın mənə xəyanəti şəhvət gücündən, çılğın ehtiras vacibatından deyildi, ana olmaq arzusundan yaranmışdı. Bunu bayaq Süsənbər xanım da inamla vurğuladı. Belə arzu ən ağıllı, etiqadlı qadını da yolundan sapdıra, ağlını azdıra bilir. Bu faciəyə soyuqqanlı baxıb, qisas hissini alovlandırmaq insanlığa yaraşmayan sifətdi. Mən insafımı unutmamalıyam. Qərarım doğru qərardı. Qoy ağzıgöyçək dil pəhləvanları, qarayaxmaq peşəkarları nə deyirlər desinlər, nə qara yaxırlar yaxsınlar, mən öz “üç tellimi” qəhr olmağa qoymayacağam. Məni acizlikdə qınayanları, qeyrətsiz sayanları vecə almayacam. Məsələnin kökünə getsələr, dərinlərə varsalar, mənim bu insaflı hərəkətimə çoxları haqq qazandırarlar. Haqq qazandırmasalar belə, qərarımdan dönən deyiləm. Çünki lap yəqin bilirəm ki, “üç telli” səhvlərini başa düşüb. Qəbahətinin xəcalətini çəkir. Bayaq xəstəxanada məni görən, tanıyan anda yanğılı hönkürtü ilə ağlaması məhz bu səbəbdən idi. Ayrı bir səbəb yoxdur”.

O, əlavə əminlik üçün başqa dəlil-sübuta ehtiyac duydu. Dərhal da fikrindən Süsənbər keçdi. Mühüm xəbəri – o, xəstəxana otağını tərk edəndən sonra nə baş verdiyini, “üç telli”si nə hallar keçirdiyini yalnız Süsənbərdən öyrənə bilərdi. Süsənbər səmimi qadın idi. Ondan heç nəyi gizlətməzdi.

Biləyini çirməyib, qol saatına baxdı. Aradan iki saata yaxın vaxt ötürdü. Süsənbər xəstəxanada bir belə ləngiməzdi. Evə çoxdan qayıtmış olardı. Ona zəng vurmaq istədi. İdarəyə gedib, öz iş otağından danışmağa hövsələsi çatmadı. Telefon köşkü axtardı. “Kukla teatrı” səmtindəki telefon köşkünü uzaqdan görüb sevindi. Təmkininə, xasiyyətinə yaraşmayan tələskənliklə özünü köşkə saldı. Yaddaşındakı rəqəmləri titrək barmaqlarla yığdı. Dəstəyi Süsənbər götürdü.

– Bir daha salam-əleyküm, Süsənbər xanım. Axşamınız xeyir!

Bəhluldu sizi narahat eləyən. Durnadan nigaranam... Özünə gəlməsi uzunmu çəkdi?

Süsənbər şirin danışdı:

– Hər vaxtınız xeyir, Bəhlul qardaş! Nigaran qalmayın, hər şey yaxşıdı.

Bəhlul eşitdiyinə xoşhal olsa da, sorğusuna davam etdi:

– Güclü hönkürtü ilə ağlamasına səbəb nə idi, aydınlaşdımı?

– Əlbəttə, aydın oldu. – Süsənbər daha şən dilləndi. – Böyük xəcalətindən riqqətlənmişdi. Gözü ilə gördüyünə – sizin onu sayıb gəlişinizə inana bilmədiyindən hövüllənmişdi. Sakitləşəndə bunu özü etiraf elədi.

– Bunlar çox yaxşı, Süsənbər xanım. Xoş xəbərlərinizə görə minnətdaram. Bir cəhətə də aydınlıq gətirməyinizi rica edirəm. Bizim sərbəst söhbət eləməyimizi istəyirmi?

– İstəyir! – Süsənbər qəti əminlik bildirdi: – Bu onun ən böyük arzusudu. Siz gedəndən, ara sakitləşəndən bir xeyli sonra gətirdiyiniz çiçəkləri aparıb onun sinəsi üstünə qoydum. Bunu mənə Qumaş xala başa saldı. Heç etiraz-filan eləmədi. Qucaqlayıb bağrına basdı, qoxuladı, gözlərindən sevinc qığılcımı yağdı. Hələ zəmbildəki ərmağanların da dadına baxdı, onlardan bizə də pay böldü. Ağzınız şirin olsun, çox tamlı meyvələrdi... Hə, onu da deyim ki, bütün işlərdə əsas rolu Qumaş xala oynadı. Əmiqızımı dilə tutub, quzuya döndərdi. Ağlını başına yığdı. Vallah, o arvad nur-ipəkdi, özü boyda qızıl parçasıdı. Hər şeyi elə qılıqla, ustalıqla yoluna qoyur ki, mat qalırsan. Anlaya bilmirəm, o cürə saf ürəkli, xoş diləkli bir insan niyə gəlib xəstəxanaya düşüb; azar-bezar hardan onu tapıb?!

– Hər bir insanın görünən tərəflərindən başqa, görünməyən tərəfləri də var, Süsənbər xanım. Yəqin ki, hansısa könül nisgilinin əzab-iztirabı ondan da yan ötməyib.

– Hə, hə, çox düzdü! – Süsənbər təəssüflə təsdiqlədi. – Dünyanın dərdsiz adamı çox azdı. Bəlkə də heç yoxdu. O nə imkana baxır, nə də insanların yaxşı-pisliyinə.

Bəhlul bir neçə anlığa pauza verib, misal çəkdi:

– Məşhur rus yazıçısı Tolstoyun bu barədə gözəl kəlamı var; o deyir ki: “Bütün xoşbəxt ailələr bir-birinə bənzəyirlər. Bədbəxt ailələrin bədbəxtliyi isə yalnız özlərinə məxsusdur”.

– Ehh, Bəhlul qardaş, həyat çox qəribədi. – Süsənbər yanğılı köks ötürdü. – Baş açılmazdı. Yaxşı insanların dara düşməsinə, dərd-qəm çəkməsinə adamın heyfi gəlir. Şəxsən mən Tanrının belə işlərini heç xoşlamıram. Kaş həyat dəyişəydi, dünya təzədən qurulaydı, yaxşılar hər azar-bezardan, qəm-qüssədən xali olaydı. Allah bütün ahu-zarları pislərə verəydi. Onda həyat daha ədalətli, daha mənalı olardı. Yamanlıqlar dünyadan silinib-süpürülərdi. Yaşamaq asanlaşardı!

Bəhlulun tutqun səsində incə etiraz sezildi:

– Onda da mənəviyyat mizan-tərəzisi, çox güman ki, pozulardı. Yaxşılar pis məxluqat əhatəsində nümunəvi görünürlər. Yaranışın fəlsəfəsi belədir.

– Elədi, düz deyirsiniz... – Süsənbər tezcə razılaşdı. – Küfr eləyib Allah işinə qarışdım. Günaha batdım.

Bəhlul xəfif təbəssümlə:

– Narahat olmayın, Süsənbər xanım. Allaha ağır gedəsi bir söz demədiniz. Öz ürək arzunuzu bildirdiniz. Bunun üçün Allah heç kimi tənbeh eləmir, – dedi.

– Bilirəm. O qurban olduğumun səbri böyükdü. Günahları bağışlayır. Xahiş eləyirəm siz də məni bağışlayın, çənəmi boş qoyub, başınızı ağrıtdım.

– Peşmançılığa dəyməz, xoşdu mənə.

– Zəhmət olmasın, sabah bir də baş çəkin əmiqızıma. Məni gözləməyin. Ancaq, hər etimala qarşı, müalicə həkimi ilə məsləhətləşin, icazəsini alın. Tibb bacısı qanınızı yenə qaralda bilər. Bir yana baxanda, onu qınamaq da olmaz. Xəta bizdən qıl yazdı. Az qalmışdı əmiqızımın həyəcandan ürəyi dayansın. Nə isə, sabah mütləq gedin "üç telli"nizin yanına. Bu görüşünüz onun xəstə ürəyinə məlhəm qoyacaq. Di sağ olun! Sizə uğurlar diləyirəm.

– Siz də sağ olun ki, mənə doğma bacıdan artıq qayğı göstərirsiniz. Bitib-tükənməz təşəkkürümü bildirirəm... – Bəhlul telefon dəstəyini asıb, rahat nəfəs aldı.

**23.**

Həmən dəqiqələrdə xəstəxanada da mehriban söhbət başlamışdı. Qumaş arvad Durna xanımı ciddi sorğu-suala çəkmişdi:

– Hə, qızım, bir ətraflı danış görüm, o uğuru xeyir adam kimdi ki, əhvalını yaxşılığa doğru dəyişdi. Tfu, tfu, yaman gözdən irax, irz-irəngin əməllicə düzəlif. Maşallah, ötən günlərdəkinnən gümrahsan.

Durna xanım çox məmnun dilləndi:

– Mən dünyaya təzədən gəlmişəm, Qumaş xala. Özüm də özümü tanımıram.

– Bax, beləcə şahraz danış! Yoxsam, nə soruşurdum, zıqqıyırdın. Dindirdiyimə peşman olurdum. – Qumaş arvad ədyalı üstündən atıb balıncına dirsəkləndi. – İndi sualıma düzgün cavab ver, yolun altını-üstünü əkmə. Kimiydi o kişi?

Durna xanım xeyli ləng:

– Yoldaşım idi, – dedi.

– Ərin?

– Bəli.

– Bə bu günəcən hardaydı?.. Niyə gəlib görünmürdü?

Durna xanımın ürəyindən qara qanlar axdı. Bu qaralıq onun çöhrəsinə də çökdü. Çiynini çəkdi.

Qumaş arvad qaşlarını sıx-sıx çatdı. İti nəzərlərini Durna xanıma zillədi:

– Sən gəl, mənnən heç nəyi gizdətmə, bala. Onsuz da bəzi mətləflərdən duyux düşmüşəm. Lap birinci günnən – səni bu otaqda mənə yoldaş gətirdikləri vaxtdan ah-uflarınnan, kiməsə qarğışlarınnan şübhələnmişəm. Dərdini soruşmağa məğam gözdüyürdüm. Daha çatıb o məğam. Ürəyini süfrə elə, aç mənə.

Durna xanım gözqapaqlarını günahkar-günahkar endirdi. Solğun yanaqlarına tünd qızartı çiləndi. Danışa bilmədi.

Qumaş arvad təkid etdi:

– Utanma, qızım. Xəcalət çəkdiyini annıyıram. Qır diliyin kilidini. Ahu-zarınnan məni agah elə. Dərdi kimnənsə bölüşmək ürəyə xeyli yüngüllükdü. Arxayın ol, sirrin qırağa çıxmayacax. Bəlkəm də iş ovandına düşdü, sənə bir köməyim-zadım dəydi.

Durna xanım dilini sürüdü. Söhbəti yayındırmağa çalışdı:

– Mən səni özgəsi hesab eləmirəm, Qumaş xala, doğma anam sayıram. Sən burda mənə həqiqi həyan olubsan. Öyüd-nəsihətlərinlə, məsləhətlərinlə məni ovundurubsan. Özümə qəsd

fikrimdən daşındırıbsan. Bu xeyirxahlıqlarını heç zaman unutmayacağam. Sənə çox, lap çox borcluyam, Qumaş xala!

Qumaş arvad narazılıqla ağız-burnunu əydi, sərt-sərt əlini yellədi:

– Bəsdi, sən Allah, ətimi tökmə! Bunnarı deyib bicdik gəlmə mənə. Sorğuma doğru-dürüst cavab ver.

Durna xanım açıq söhbətdən yenə yayındı:

– Mənim az-çox xoşbəxtliyim ondadı ki, səni təki nur-ipək bir insana rast olmuşam, Qumaş xala. Kaş bütün analarımız sənə oxşayaydı!

Qumaş arvad təvazö ilə gülümsündü:

– Biz bəndələr ulu Tanrının mehrinnən yaranmışıx, bala. Yerin-göyün əşrəfiyik. Bir-birimizə vacib qayğımızı, köməyimizi əsirgəməməliyik. Bu fani dünyada yaxşılıxdan savayı halal qazanc yoxdu. Xeyirxahlıx, savabkarlıx adama irəhmət oxutdurur; yamannıx, bədxahlıx gorbagor dedizdirir.

– Rəhmət oxutduranlarımız kaş çoxluq təşkil edəydi!

– Hə, qızım, pis olmazdı... – Qumaş arvad sol gözünü qıyıb, əsas mətləbə qayıtdı: – Səni içinnən qovuran, cızdağını çıxardan böyük bir qəmin var, onu aydınca duyuram. Amba ha fikirrəşirəm, o yanğını törədən səbəbi aydınnaşdırammıram... Zənnim məni yanıltmırsa, ərinlə aranızda nəsə olub. Zənnim düzdümü?

Durna xanım cavabdan yayınmağı daha bacarmadı:

– Düzdü.

– Ucunnan-qulağınnan danış mənə. Qorxma ziyan tapmazsan.

Durna xanım başına gələnləri qısaca danışdı. Qumaş arvad dərinlərə əl atmadı. Eşitdikləri ilə hələlik qənaətləndi.

– Diyəsən, qəliz məsələdi... annıyıram, açıb-ağartmax çətindi sənə. Neynək, bu da bəsimdi. Qandım icmə nədəndi... Amba burasını əvvəlcən deyim ki, sənin ərin böyük ürəkli adamdı, o cürə günahı bağışlamağı bacarır. Bütün kişilər qadın xəyanətinə çox dözümsüzdürlər. Bağışlamaq nədi, qadını cındır əsgiyə döndərib tapdıyırlar.

Durna xanım qəhər qarışıq fərəhlə:

– Onun ürəyinə qurban olum! – deyib umaxşıdı. – Heç ağlıma gəlməzdi ki, o cürə biyabırçı üzqaralığından sonra məni insan sayar, yadına salıb baş çəkməyə gələr. Abrını itirmiş bir qadının səhhəti ilə maraqlanar... Heyif ki, çərhəya tibb bacısı qaraqışqırıqla tez qovdu. Qoymadı gözüm dolusu baxım ona.

– Ürəyini sıxma, çətini ilk dəfəsiydi, genə gələr, inşallah.

– Allah eliyəydi bu xoşbəxtlik bir də nəsib olaydı mənə. Ona deyiləsi çox sözlərim var. İstəyərdim onun ayaqları altında ölüm, gözlərimi o, qapasın.

– Bax genə sarsaxladın! Ölümü arzulamaxdansa, birgə ömür sürməyi, qoşa qarımağı diləsəydin, daha müstəcəf olardı.

– Ona haqqım çatmır...

– Sidqini Allaha bağlasan, o haqqı qaytarar sənə. Tövbə Tanrıya sığınmax deməkdi!.. – Qumaş arvad yenidən bir gözünü qıyıb, Durna xanıma nüfuzedici nəzər saldı. – Bəlkəm indi məsələni tamam açıb deyəsən mənə?

Durna xanım üzünü hər iki ovcu arasında gizlətdi. Utana-utana:

– Mən... ona... vəfasız çıxdım, – dedi. – Bir kələkbazın toruna düşdüm. Ərimi də xar elədim, özümü də...

– Toruna düşdüyün o qurumsax kimiydi, nə karəydi?

– Heç kim... Tələbə idi.

– Yaşda sənnən cavanıydı?

– Hə, çox cavan idi.

– Axırda da atdı səni, eləmi?

Durna xanım dinmədi. Başını tərpətdi.

– Hımm... – Qumaş arvadın alt dodağı sallandı. İncik halda üz-gözünü qırışdırdı. – Elə belə də olmalıydı, – dedi. – Əzəl-axır sənə dirsək göstərəcəkdi... Bə səni namussuzduğa həvəsdəndirən nəydi? Oğlanın yar-yaraşığı?

– Yox, yox! Yaraşıqda deməzdim ki, ərimdən üstündü...

– Bə onda səni nə vadar elədi kin, o çirkin yola ayax qoydun?

– Giclik! – Durna xanım əllərini üzündən çəkdi. Yumruğunu düyüb alnına çırpdı. – Xəcalətimdən ölüb yerə keçirəm...

Qumaş arvad sorğu-sualının arasını kəsdi. Qalxıb çarpayıda bardaş qurdu. Sol üzünü ovcu içinə alıb, Durna xanımı bir müddət maddım-maddım süzdü.

– Mənə bir şeyi də agah elə, ərin qırağa baxandımı – şorgözdümü?

– Ooy, Qumaş xala, siz nə danışırsınız?!.. Qətiyyən! – Durna xanım yırğalandı. – Mənim ərim aydan arı, sudan durudu. Onun

əvəzindən müqəddəs Qurana əl basıb, and içə bilərəm ki, məndən başqa heç bir qadın tanımayıb.

– O döyül, bu döyül, bə nədi səni yolunnan azdıran?!.. – Qumaş arvadın həlim səsi sərtləşdi. Nurlu sifətinə kölgə qondu. – Onda belə çıxır ki, qadın doyumsuzluğudu əməlini azdıran!

Durna xanım bu qeyzli sözlərdən sarsıldı. Tənbeh almış uşaq-sayağı kövrəlib içini çəkdi:

– Dərdim böyükdü, Qumaş xala. Necə deyim...

– Oxu atıb, yayını gizdətmə! – Qumaş arvad bir az da boz danışdı. – Zıqqıma, boşalt ürəyini. Bəsdi əzaf verib xəstəxanalıx elədin onu. Köhnə xıltlardan birkərəmlik təmizdə ki, yaraların tez sağalsın.

Durna xanım qollarını burnu üstündə çarpazlayıb, ahəstə mızıldandı:

– Uşağımız olmurdu.

– Çoxdan evlənibsiz?

– Bəli, çoxdan.

– Həkimlərə yoxlatdırıbsız özünüzü?

– Bir neçə dəfə müayinədən keçmişik.

– Mərəz kimdə tapılıb?

– Məndə.

Qumaş arvad uzun fikrə getdi.

– Sonsuzdux ağır dərddi, qızım. Böyük bəladı. O çox ailələr dağıdıb. Can deyib, can eşidən neçə-neçə sevgilini ayırıb bir-birinnən.

Durna xanım bu sözlərdən cəsarətləndi. Qollarını yanlarına salıb, səmimiyyətlə davam etdi:

– Ancaq mən həkimlərə inanmırdım. Özümü çox sağlam, ana olmağa layiq hesab eləyirdim. Mənə elə gəlirdi ki, zəiflik ərimdədi. Bax, o murdarlıq bundan törədi... Neyləyim, Qumaş xala, evimdən uşaq səsi, körpə gülüşü gəlməsi üçün canım çıxırdı. İstəyirdim mənə də “Ana” deyənim olsun. Çöldən içəri girəndə hay-küylə qabağıma yüyürənim olsun. Boynuma atılanım olsun...

Qumaş arvadın alın qırışları sıxlaşdı.

– Həəə... Səbəb ciddiymiş. İfrat günah döyülmüş...

Durna xanım təsirləndi. Gözləri yaşara-yaşara Qumaş arvada ürəkdolusu təşəkkür etdi:

– Çox sağ ol, Qumaş xala! Yaxşı ki, sən başa düşdün məni, daş-qalaq eləmədin. Ərimin ana-bacılarının, yaxın qohumlarının zəhlələri gedir məndən. Doğub-törəməzliyimi qaxınc eləyib hey başıma qa-

xırdılar. Canımı boğazma yığmışdılar. Elə onların da acığına ana olmaq həvəsindəydim. Amma... murazım gözümdə qaldı.

Qumaş arvad nə üçünsə, birdən şirin-şirin qımışdı:

– Deməli, uşax istiyirsən.

Durna xanım ah çəkdi.

– İstəməklə deyilmiş... Nəsibim olmadı.

– Olar, inşallah! – Qumaş arvadın gözləri də ümidverici tərzdə gülümsündü. – Bu dünyada hər dərdin çarəsi var.

– Doğrudan?!.. – Durna xanım qeyri-adi şadlıqla qışqırdı.

Qumaş arvad tam qətiyyətlə:

– Mənim dilim yalan söz tanımır, – dedi.

Durna xanımın öləzik bəbəkləri par-par parıldadı.

– Oyy, nə gözəl!.. Xeyir xəbər olasan səni, Qumaş xala. Nədi o çarə?!

– Tələsmə! – Qumaş arvad hövsələyə işarə ilə şəhadət barmağını dik qaldırdı. Burnu bərabərində şax saxladı. – Halva səbirlə bişir, qızım. Qoy ərin gəlsin, onun da ağzını arayım. Hər ikinizin razılığınızı alannan sonram deyəcəm o çarəni.

Durna xanım boynunu büküb, küskünlədi.

– Eh, onacan bağrım partlayar mənim.

Qumaş arvad sakitcə yerinə uzanıb, ədyalını başına çəkdi:

– Yuxun şirin olsun. İrahat yat!

## 24.

Bəhlul Ağazadə vədinə əməl edə bilmədi. İdarə işlərindən macal tapmadı. Ürəyi "üç telli"sinin yanında qalsa da ayağını idarədən kənara basmağa imkanı olmadı. Şikayətçilərdən, yanına gəlib-gedənlərdən göz açmadı. Yalnız o biri gün get-gəllər seyrələndə, kağız-kuğuz arasında eşələnmək azalanda, baxdı ki, axşam toranlığı çökhaçökdü, işləri alt-üst qoyub, özünü bayıra atdı. Lazımi tədarükü sürücüsünə əvvəlcədən gördürmüşdü. Bazarlıq sarıdan nigarançılığı yox idi. Tibb bacısından da çəkinmirdi. Müalicə həkiminə səhər-səhər telefon açmışdı, görüşə icazəsini nağdılamışdı. Maşınını birbaşa xəstəxanaya sürdürdü.

Müalicə otağının qapısını ərkyana açdı. Bununla belə, ehtiyatı

da unutmadı. İçəri asta keçdi. Qumaş arvad gülər üzlə:

– Buyur, buyur, a bala! Xoş gəlibsən! – dedi.

Bəhlul ehtiramla baş əydi.

– Salam-əleyküm. Axşamınız xeyir!

– Hər vaxtın xeyir, oğul! Bə niyə ləngidin? Durna qızımın gözü dünənnən yolundadı.

Bəhlul üzrxahlıq elədi:

– İşlərim yaman çox oldu, heç cürə macal tapmadım... Bağışlayın məni.

Qumaş arvad ana mehri göstərdi:

– Bağışdamışıx. Elə biz də fikirrəşdik ki, başını iş qarışdırıb... Di keç nişannıyın yanına.

Bəhlul ürəkləndi. Gülümsəyə-gülümsəyə "üç telli"sinə yaxınlaşdı, canıyananlıqla:

– Necəsən, üç telli? Ürəyin çoxmu incidir səni? – soruşdu.

Durna xanımın qəhərdən büzülüb rezin tək dartılmış dodaqları hey səyridi. Bəhlula tükənməz minnətdarlıqla baxdı. Çox səmimi "üç telli" deyimi onu ilk gənclik çağlarına, sevda dolu bir aləmə qanadlandırmışdı. Şəffaf göz yaşları muncuqlanıb, pərləri genişlənmiş burnunun yançaqları ilə çənəsinin altına diyirləndi.

Bəhlul cibindən yaylığını çıxartdı. "Üç telli"sinin solğun yanaqlarını ehmalca quruladı, ürək-dirək verdi:

– Sakit ol, əzizim. Həyəcanlanmaq, gərgin hisslər keçirmək ziyandı sənə. Xəstə ürəyini əziyyətə salma.

Durna xanım bu qılıqcıl, mərhəmətli sözlərdən daha da duyğulandı. İçin-için, səssiz-səmirsiz ağladı. Və nəhayət ki, boğazının qəhər boğuntusunu birtəhər arıdıb, səsi qırıla-qırıla yalvardı:

– Qurban olum sənə, ayaqlarının altında ölüm, min dəfə, milyon dəfə üzr istəyirəm... bağışla başımdan böyük qələtlərimi...

Qumaş arvad ona acıqlandı:

– Di yaxşı, özünü körpə uşax təkin aparma. Bağışdıyıb ki, ikinci dəfədi yanına gəlir. Onu bir də dilə gətirməyin məlyəti nədi?

Durna xanım Qumaş arvadın danlağına məhəl qoymadı. Yanğılı yalvarışını təkrarladı:

– Can, Bəhlulum, düzünü de!.. Taqsırımdan doğrudan da keçibsənmi? İnandır, şübhədən qurtar məni.

Bəhlul da duyğulanmışdı. Lakin iradəsi zoruna bunu bildir-

mədi. Ciddi şəkildə:

– Sən mənim həmişəki üç tellimsən, – dedi.

Durna xanım dönə-dönə udqundu. Səsi sızıldadı:

– Həqiqi sözündü?

– Bəli. Həqiqi! – Bəhlul sübut üçün əyilib "üç telli"sini öpdü. – Biz həyatımızı təzədən qurmalıyıq!

Durna xanımın qüssədən üşümüş, bürüşüb kiçilmiş bəbəkləri isindi, canlandı. Bəxtiyarlıqla:

– Oyy, sən necə böyük insansan, Bəhlulum, ölünü diriltdin! – deyib, sağ qolunu Bəhlulun boynuna doladı. Sol qolunu da ona köməkçi gətirdi. Ərini hərarətlə köksünə sıxdı.

Elə həmən dəqiqələrdə otağa daxil olmuş Süsənbər bu xoş mənzərəyə əl çaldı. Bir qıraqda dayanıb, heyrətdən donmuş tibb bacısı da ona qoşuldu.

Sürəkli çəpiklər içində Qumaş arvad gözaydınlığı verdi:

– Allaha da, onun rəhminə də qurban olum, iki bəndəsini bir-birinə təzədən qovuşdurdu. Hamılıxnan gözümüz aydın olsun!

Süsənbər barışanlara xeyir-dua dilədi:

– İlahi, bunları qoşa qarıt!

**25.**

Bəhlul növbəti dəfə xəstəxanaya ertə gəldi. İş gününün axırını gözləmədi. Daha heç nədən intizarı yox idi.

Süsənbər də onunla dabanbasaraq içəri girdi. Sözləşməmişdilər. Təsadüfən belə alınmışdı.

Bəhlulun qucağı yenə də tər çiçəklərlə dolu idi (Mer-meyvə, ərzaq sovqatları da öz yerində). İki böyük gül damatı bağlatmışdı. Biri, əlbət ki, "üç tellisi", digəri isə Qumaş arvad üçün.

O, əvvəlcə Qumaş arvada yan aldı. Əlini öpdü, gül dəstəsinin böyüyünü ona təqdim edib, hal-əhval tutdu:

– Yaxşısızmı, ay nur-ipək xala? Gecəni nə cür keçirdiniz?..

Qumaş arvad gülləri ləzzətlə iyləyib, "oxxək!" – deyəndən sonra cavab verdi:

– Payın çox olsun, ağrın alım, kefimiz kökdü! – deyib, qaşgözlə Durna xanıma işarə etdi. – Odu, nişannıyın üzü-gözü gülür. Dünənnən bəri çiçəyi lap çıtdıyıb. Maşallah, cavanca qız ovqa-

tındadı. Şaddığınnan bilmir neyləsin.

Durna xanım, həqiqətən də görünməmiş şadlıq içində idi. Qaçqın bənizi əməllicə durulmuşdu. Həyata qayıdışı adi nəzərlə də apaydın sezilirdi. Bəhlul ruhən rahatlandı. "Üç telli"sinin böyründə oturub, əllərini ovucları içində sığallaya-sığallaya, xüsusi nəvazişlə dindirdi:

– Sən necəsən, gözəlim? Ürəyin sakitləşibmi? Ağrıları azalıbmı?

– Azalıb, canım-ciyərim!.. – Durna xanım dirsəkləndi. Üzünü Bəhlulun üzünə söykəyib, pıçıltı ilə yalvardı: – Sən gələn yollara canım sadağa!.. Nə yaxşı ki, bu fani dünyada səni kimi insaflı adamlar var. Yoxsa, həyat cəhənnəmə dönərdi.

Bəhlul incik halda iki barmağını "üç telli"sinin dodaqları üstünə qoydu.

– Bu olmadı, – dedi. – Biz, axı, belə söhbətləri dünən danışıb qurtarmışıq. Yenidən ona qayıtmaq artıqdı, lazımsız şeydi.

– Yox, mənim əziz Bəhlulum, lazımdı! – Durna xanım nazlı-nazlı davam etdi: – Ürək gərək tam boşalsın, içində köhnənin heç bir qıcığı qalmasın. Bu, onun tam rahatlığı üçündür...

Bəhlul söhbəti dəyişməyə tələsdi:

– Bizim ağbirçəyimiz, nur-ipək xalamız çox düz deyir. Sən bu gün gözümə daha yaxşı görünürsən. Dilin də bülbül təki cəh-cəh vurur. Həmişə belə ol!

Süsənbərə də növbə yetişdi. O da iri bağlancla gəlmişdi. Qabağa yeridi, ağbirçəklə öpüşüb-görüşüb, əmisi qızına zarafatyana sataşdı:

– Əmiqızı, göz dəyməsin, Bəhlul qardaş demiş, bu gün çox dilavərləşibsən. Təbrik eləyirəm. Yar-yara qovuşanda doğrudan da toy-bayram olurmuş!

Durna xanım Bəhlula bərk-bərk sığındı. Hərarətlə pıçıldadı:

– Süsən yanılmır, Bəhlulum. Mənim üçün bu gün əsl toy-bayramdı. Düzünü boynuma alım ki, səni belə bilməmişdim. Ucalığını bu dərəcədə dərindən duymamışdım. Kor olmuşdum, iç dünyanı görməmişdim. Bu gecə yatmayıb, çox düşünmüşəm. Qumaş xalanın da, əmim qızı Süsənin də yanında, onların şahidliyi ilə sidq-ürəklə etiraf eləyirəm: mən sənin heç ayaq tozun da deyiləm!

Bəhlul ciddi etirazla "üç telli"sinin ağzını bu dəfə ovcu ilə

yumdu. Üzünü Süsənbərə çevirdi:

– Sizdən acizanə bir təvəqqem var, Süsənbər xanım. Gəlin, o balaca tumbanın üstünü səliqəyə salın. Zənbildəki meyvələrdən süfrə açın. Söhbətlərimizi meyvələrin dadına baxa-baxa eləyək... İnciməyin, qardaş ərki ilə zəhmət verirəm.

Süsənbər könül xoşluğu ilə razılaşdı:

– Bu zəhmət xoşdu mənə, Bəhlul qardaş. Ancaq meyvələrin dadına baxmazdan əvvəl xəstələrimiz yemək yeməlidilər. Yaxşı xörək bişirib gətirmişəm. Əmiqızımın çox xoşladığı yarpaq dolmasıdı. Yəqin bilirəm, Qumaş xalanın da xoşuna gələr.

Qumaş arvad başını təqdirlə tərpətdi.

– Yanında sarımsaqlı qatığı da olsa hə, xoşduyuram.

Süsənbər bağlancını aça-aça:

– Hər dəm-dəsgahı yerindədi, – dedi.

Bəhlul məzə ilə dodaqlarını marçıldatdı:

– Yarpaq dolmasını bəyənməyən az adam olar. Elə mənim özüm də sino gedirəm onun üçün. "Üç telli"m icazə versə, payına şərik olardım.

Durna xanım zarafatı gerçəklətdi:

– Şərikli yemək məni iştaha gətirər. Sənsiz heç nə boğazımdan ötməz!

Süsənbər bəhanə yeri qoymadı:

– Paya şərik olmağa ehtiyac yoxdur, hamıya çatar. Amma... – Bəhluldan utana-utana üzr istədi. – Gərək bağışlayasız, çəngəl və qaşığı iki nəfərlik gətirmişəm.

– Eyib etməz! – Bəhlul yeni məzə ilə biləklərini çərmədi. – Ulu babalarımız yeməyi əl ilə yeyiblər. Nə çəngəlləri olub, nə qaşıqları. Mənim nəyim artıqdı onlardan?! Ümid eləyirəm ki, "üç telli"m iyrənməz.

Durna xanım ayrı təklif irəli sürdü:

– Mən çəngəlimi sənə verirəm. Özüm qaşıqla yeyərəm.

Razılaşıb kiçik süfrə arxasında cərgələndilər. Deyə-gülə nahar etdilər. Süfrə yığışana yaxın Durna xanım başını Bəhlulun çiyninə qoyub, Qumaş arvadla təklikdəki söhbətini xatırlatdı:

– Bizim indən beləki xoşbəxtliyimiz üçün nur-ipək xalanın bir məsləhəti var, Bəhlulum. Dünən axşam nə qədər yalvarıb-yaxardım, mənə demədi, səni gözlədi. Xahiş elə, məsləhətini açıqlasın bizə.

Qumaş arvad bir az incimiş halda:

– Mənə xahiş eləmək lazım döyül! – deyib qabaqca Durna xanımı, sonra da Bəhlulu sınaqlı baxışla süzdü. Yerini rahatlayıb “sirri” açdı. – Məsləhatımı eləməyə məğam gözdüyürdüm. İndi ki, tələsdin, deməyə məcburam... İstəyərəm bir uşax götürüb saxlayasız.

Durna xanımın gözlərindəki maraq şöləsi dərhal öləzidi. Sifətinə tünd kölgə endi.

– Uşaq götürmək?!.. Hardan? “Yetimlər evi”ndən?!

– Hə, ordan! – Qumaş arvad höcətsayaq dilləndi. – Niyə kinayəynən soruşursan? Bu vasitəynən sevgilərinə sadiq qalannar, ailəni dağılmaxdan qoruyannar azdı, bəyəm? Neçələrinin özüm şahidiyəm! Götürdükləri uşağı öz cannarınnan artıx istəyiblər. Elə biliblər doğmaca körpələridi.

Durna xanım məyus-məyus susdu. Gözucu Bəhlula baxdı. Batqın səsi, elə bil, dərin quyu dibindən çıxdı:

– Elələri, bilirəm var. Amma...

– Nə əmma?!.. – Qumaş arvad qeyzləndi. – Heç bir əmması, filan-bəsmanı yoxdu! Gedib körpələr evinnən bəyəndiyin, könlünə yatan körpəni seçirsən, qanun-qaydaynan öz adına yazdırırsan, aparırsan yanına. Vəssalam, şüttamam!

Durna xanım küskün-küskün:

– Bəs o körpə böyüyəndə özgə uşağı olduğunu bilsə necə? – soruşdu.

– Biləndə də bilsin, nolasıdı?

– O olar ki, qocalan vaxtımızda atıb gedər bizi... Qalarıq yanıb yaxıla-yaxıla.

– Ona qalsa, doğmaca övladlardan da naxələf çıxannar, əmək itirənnər yox döyül. İxtiyar ata-anasını xəstəhal vaxtında çölə atırlar, aparıb “qocalar evi”nə verirlər, heç utanıb-qızarmırlar da. Hələm elələri də var ki, ya vurub öldürürlər, ya da doğrayıb kor quyuya atırlar. Belələri barəsində iradiodan, televizordan az eşitməmişik? Amba götürülüb saxlanmışdar haqqında belə şeyləri mən nə görmüşəm, nə də eşitmişəm. Onnar əmək itirmirlər. Biləndə ki, özgə uşağıdı, valdeyinnəri başqa adamlardı, onu ərsəyə gətirənnəri, daha artıx istəyirlər, bir az da çox mehribannıx göstərirlər. Bunnarı mən səni razı salmax, könülə gətirməkdən ötrü

söyləmirəm. Qırx ilə yaxın "körpələr evi"ndə işləmişəm. Sizin inana bilmədiyiniz möcüzə şeylər görmüşəm.

Durna xanım alnının qırışlarını sıxlaşdırıb, dərin fikrə getdi. Bəhlul yerə baxdı. Süsənbər qaşları dingildəyə-dingildəyə xəbər aldı:

– Qumaş xala, həqiqətənmi, qırx il bir müəssisədə işləyibsən?!

– Hə, eşitdiyin kimi! – Qumaş arvad qəribə inadla öyündü. – Təqaüdə ordan çıxmışam. Buraxmırdılar, zornan xahiş-minnətnən azad olmuşam. Yetmiş yaş zarafat yaş döyül. Bu yaşdakıların çoxunun adı qara torpaxdan çağrılır.

– Sənin yetmiş yaşın var?!.. – Süsənbər bir az da təəccübləndi. – İnana bilmirəm, Qumaş xala, sən bu yaşdan çox-çox cavan görünürsən. Sənə heç altmış yaş da vermək olmaz!

Bəhlul şərh verdi:

– Bu ona görədi ki, nur-ipək xalanın ürək saflığı alnında yazılıb.

Qumaş arvad səmimi təvazö ilə:

– Bəsdi, bəsdi! – dedi. – Çox tərifləyib zayımı çıxartmayın. Qoyun lazım bildiyim məsləhatımı verib, irahat olum. Ona əməl eləsəniz də sağ olun, eləməsəniz də.

Süsənbər sözkəsənliklə hamını qabaqladı:

– Böyük sözünə baxmayan böyürə-böyürə qalır!

Qumaş arvad qurcalanıb, sözünə qüvvət üçün əlavə etdi:

– Uşax götürüb saxlamax savab işdi. Allaha da xoş gedir, onun bəndələrinə də. Daha vacibi özünüzə sərfəlidi. Darıxmazsınız. Evdə uşax olanda, lazımsız deyinmələrə vaxt qalmır, baş uşağa qarışır, onun xatirinə çox şeylərdən keçirsən. Bircə söznən, ayilədə uşax barışıxlıx körpüsüdü. Umu-küsünü dərinləşməyə, dava-qalmağal yaranmasına qoymur. İnsanın ən böyük var-döyləti onun oğul, ya qız payıdır... Hə, ay Bəhlul, a bala, məsləhatıma sənin fikrin nədi? Bayaxdannan susursan. Bir dillən!

Bəhlul "üç telli"sinin üzünə baxıb dinmədi. Qumaş arvad bu susqunluğu arifanə duydu. Səsini alçaldıb, bir az da qılıqcıl ahəngə keçdi:

– Mən hər şeyə yetik arvadam, ay oğul. Sizin aranızdakı qalmağalın nədən tövrədiyini bilirəm. Özgəsinnən yox, öz nişannınnan öyrənmişəm. Dilə tutub ürəyinə girmişəm. Ona dərd verən, o ayıblı

addımı atmağa vadar eliyən işdən xəbərim var. Bu mərəzə çarə dediyim üsuldu. İrazılaşsanız, sizə köməyim dəyə bilər.

Bəhlul qızara-qızara dilləndi:

– Şəxsən mənim etirazım yoxdur. Bir neçə il əvvəl, hələ gərginlik yaranmamışdan bu qərara özüm də gəlmişdim. Amma onu Durnaya açıb deməyə ehtiyatlandım. Qorxdum ki, xətrinə dəyərəm, könlü sınar.

– Bə indi nə fikirdəsən?..

– Mən yenə o qərardayam. Durna könüllənsə, buna şad olaram.

Sorğulu nəzərlər hər tərəfdən Durna xanıma zilləndi. O bürüşüb, səsini çıxartmadı. Qumaş arvadın hövsələsi gödəldi.

– Ağzına su alıb niyə kiriyibsən?!.. Sorğuma cavab ver!

Durna xanım hıqqandı:

– Mən nə deyim?.. Söz Bəhlulundu.

– Urra! – Süsənbər sevincindən atılıb-düşdü. – Kaş bütün müşküllər belə düzələydi!

Bəhlul Qumaş arvadı öpdü:

– Ömrünüz uzun olsun, nur-ipək xala. Bu tədbir ürəyimdən tikan çıxartdı... Bizim rayonun nəznində “körpələr evi” var. Müdiri də mənə simsar adamdı. Xahiş eləyərəm, bizə uyğun bir körpə seçər.

Qumaş arvad narazılıqla başını buladı.

– Yox, ay oğul, – dedi. – Bu xahişdik iş döyül. İsmarıcnan həcc qəbul olunmur. Uşağı özünüz seçməlisiniz. Uşax da gərək elə ilk kərəmnən meylini sizə salsın, isinişsin. Yoxsam sonradan ezyatı çox olur.

Durna xanım təlaşlandı.

– Oyy, elə seçimi mən bacarmaram... Ata-anası bilinməyən, zir-zibillikdən tapılmış uşağa yaxın durammaram.

Süsənbər də yerində qurcanlandı.

– Doğrudan ey, adama birtəhər gəlir. Nə biləsən necə uşaqdı? Nə cürə doğulub?

Qumaş arvad qımışdı:

– Əvvəlcən hə, siz deyəndi. Körpəyə isinişmək çətindi. Amba sonradan üzün-gözün öyrəşir. Bəhlul oğlum məni bağışdasın, elə bilirsən, öz qarnınnan çıxıb, lap çox istəməyə başdıyırsan. Ürəyini yarıb içinə qoymaxdan geri durammırsan... Burasını da bu başdan

deyim kin, "körpələr evi"ndən uşax götürmək sizə asan görünməsin. Dımdım halvası döyül. Hər adama bel bağlıyıb, etibar eliyib uşax vermirlər. Neçə yerdən gərək kağız gətirəsən. Kimliyin, nəçiliyin bilinməlidi. Uşağı saxlamağa şərayıtın yoxlanılmalıdı.

Süsənbər pıqqıltı ilə güldü.

– Ömrü uzun olmuş xalamız qanun-qaydadan elə danışır, deyərsən, "körpələr evi"nin rəsmi bir şəxsidi, onun böyüklərindəndi.

Qumaş arvad cırnadı. Süsənbəri məzəmmətlədi:

– Bıy, a bala, qulaxlarına pambıx tıxayıbsan, nədi? Bir az bunnan əvvəl demədimmi ki, ömrümün qırxca ilini o idarələrin birində keçirmişəm. Qabaxcan körpələrə dayəlik eləmişəm, sonram da baş tərbiyəçi olmuşam. Çox istiyirlər xətrimi. Bayramlarda, ad günümdə gəlib baş çəkirlər mənə. Sovqatlarla, hədiyyələrlə könlümü açırlar. Buraya da neçə kərəm gəliblər. Növbəynən qulluğumda durublar. Hə, indi annadın niyə heylə işi boynuma çəkirəm?!..

– Anladım, qəşəng xala! – Süsənbər üzr istədi. – Bağışla, qayğılarım çoxdu, fikrim dağınıqdı, diqqət yetirməmişəm.

– Bax, belə! – Qumaş arvad məzəli-məzəli yırğalandı. – Adın nədi – Rəşit, birini de, beşini eşit!.. Hə, qulağınız məndə olsun. Uşax barəsinnən əl-ayağa düşməyin. Özgə adamlara ağız açmax, xahiş-filan eləmək hədər zəhmətdi. Belə iş xəlvət görülsə, diləağıza düşməsə yaxşıdı. Adamın on istəyəni varsa, on beş də istəməyəni var. Hamıya car çəkmək xeyir gətirməz.

Bəhlul xoş təbəssümlə:

– Halva şirindi, halvaçı qızı ondan da şirin! – dedi. – Öz mehriban xalamızın halal-hümmət köməyini qoyub, özgəyə minnət eləmək ağılsızlıq olar!

Qumaş arvad nisyəni nağdıladı:

– Bu işin ağır yükü: onun savabkarrığı da, babalı da mənimkidi. Allah qoysa, burdan sağ-salamat çıxarıx, evimizə qayıdıb, bir həftə, on gün dincələrik, sonram birrikdə yollanarıx mən işdədiyim "körpələr evi"nə. Qurban olduğum Pərvərdiyarın köməyiynən murazımıza çatarıx. Hə, necə sözdü, könlünüzə yatır?

Bəhlul "üç telli"sinin razılığına məəttəl qalmadı, təqdirlə özü dilləndi:

– Əla sözdü, lap ürəyimizdəndi!

Süsənbər gur-gur guruldadı:

– Eşq olsun xəmiri xeyirxahlıqdan yoğurulmuş bizim mötəbər xalamıza!! İpək-qumaş xalamıza!

**26.**

Müalicə müddəti daha bir neçə gün uzandı.

Qumaş arvadla Durna xanımın evə buraxılması eyni vaxta düşdü. Çarpayı qonşuluğu onları qəlbən çox yaxınlaşdırmış; can-ciyər edib doğmalaşdırmışdı. Xüsusən də uşaqla bağlı məsələ ortaya gələndən bəri Durna xanım xoş niyyət ağbirçəyə könlünün bütün telləri ilə bağlanmışdı. Ondan aralanmaq istəmirdi. Bəhlul da bu müddət ərzində "nur-ipək" adlandırdığı arvadı özünün həqiqi xalası kimi sevmişdi, xətrini son dərəcə əziz tuturdu. Xəstəxanadan çıxanda təklif etdi ki, getsin bir neçə gün onlarda qalsın, "üç telli"ni darıxmağa qoymasın. Ailə münasibətləri tam qaydasına düşənə qədər ona həyan olsun. Qumaş arvad razılaşmadı. Evdə tək qalmış nəvəsindən ötrü darıxdığını bəhanə gətirdi. Ancaq əlaqəni heç bircə gün də kəsmədilər. Tez-tez telefonlaşdılar. Bir-birindən hal-əhval tutdular, dərdləşdilər. Eyni zamanda da vədlərini unutmadılar; "körpələr evi"nə gedəcəkləri günü səbirsizliklə gözlədilər.

Və bir səhər yaxşıca bəzənib-düzənib niyyət dalınca yollandılar. Hər ehtimala qarşı, Süsənbəri də köməkçi götürdülər. Bəhlulun maşınına əyləşib, Qumaş arvadın bələdçiliyi ilə nəzərdə tutulmuş "körpələr evi"nə gəldilər.

"Körpələr evi" diqqəti xeyli aralıdan çəkdi. İkimərtəbəli bu bina ətrafdakı hündür, bir-birinə oxşar binalardan həm memarlıq yaraşığı, həm də geniş və yaşıl həyəti ilə göz oxşayırdı. Daş hasarlı həyət müxtəlif uşaq oyuncaqları, əyləncələri ilə dopdolu idi. Aydın hiss edilirdi ki, dövlət himayəsindədir, xüsusi qayğı ilə əhatələnmişdir.

Evdən çıxalı ürəyi sirli narahatlıqla döyünən Durna xanım da binanın görünüşündən xoşhal oldu. Tıqqıltılı ürəyi bala-bala sakitləşdi.

Yaraşıqlı binanın içərisi Durna xanımı bir az da heyran qoydu. Hara baxdı, gözləri sevindi. Hündür divarlar ağappaq, parket döşəmələr naxış-naxış, bər-bəzəkli tavanlardan asılmış çilçıraqlar salxım-salxım, qapı və pəncərələr incə işləməli, pərdələri qotaz-qotaz, rəngbərəng. Daha nələr, nələr... Elə bilərdin, böyük imkanlı bir şəxsin iqamətgahıdı.

Körpələr yaş fərqlərinə görə ayrı-ayrı otaqlarda saxlanılırdılar. Tərtəmiz otaqların divarları boyunca cərgə ilə düzülmüş, dövrəsi möhkəm bəndlənmiş (yıxılmamaq üçün) ağ döşəkcəli, kiçik balınclı, allı-güllü adyallı çarpayıcıqların üstü oyuncaqlarla dolu idi. Dil açmamış körpələr əl-qol atıb bu oyuncaqlara toxunur, onları səsləndirir və şənlənirdilər. Şad qığıltılar, cingiltili gülüşlər hər kəsə fərəh gətirirdi.

Qulluqçular (dayələr, tərbiyəçilər, həkimlər) Qumaş arvadı evin girəcəyində dövrələdilər. Hay-küylə boynunu qucaqladılar. Əlindən, üzündən öpdülər. Bir-birinə macal vermədən səhhəti ilə maraqlandılar. Xəbər tezliklə baş həkimə çatdırıldı. O da özünü sevinclə pişvaza yetirdi. Dönə-dönə üzr istədi ki, işin çoxluğundan macal tapıb xəstəxanada ona baş çəkə bilməyib, bağışlasın.

Belə uca hörmətlə, şadyanalıqla qarşılanması Qumaş arvadı çox məmnun etmişdi. Əməllicə qürrələndirmişdi. Kövrək təbəssümlə arabir Durna xanımı, Bəhlulu və Süsənbəri gözucu süzürdü. Özü barədə dediklərinin yalan çıxmadığına bunlar yetərli dəlil-sübut idi.

Bəhlul da, Süsənbər də belə hədsiz hörmətlə qarşılanmaya, doğrudan-doğruya mat qalmışdılar. Öpüş-görüş mənzərəsi hər ikisini heyrətdə qoymuşdu. Bu qəribə tamaşaya yalnız Durna xanım biganə idi. Gərgin fikrə qapılmışdı: "Mən burdan aparacağım körpəyə lazımı şəraiti yarada biləcəyəmmi?.. Buradakı qayğını ona göstərməyi bacaracağammı?.. Yad körpəyə həqiqi ana mehri salmaq mənə çətin olmayacaqmı?.. Birdən heç nə alınmadı, onda necə? Qan-qarğışa, Allah yanında günaha batmarammı?.."

Baş həkim Durna xanıma müraciətlə nə isə soruşdu. Durna xanım onu eşitmədi. Qumaş arvad səsini hündürlətdi:

– Cavab ver, a qızım. Baş həkim sənnən soruşur ki, nə yaşında uşax istiyirsən... Dillənsənə, fikrin hayandadı?

Durna xanım çiynini çəkdi. Hələ də tərəddüdlərindən ayrılmamışdı.

Baş həkim sualını başqa tərzdə təkrarladı:

– Sizə necə uşaq və neçə yaşında uşaq lazımdır?

Durna xanım yenə də susdu. Bəhlulun üzünə baxdı ki, cavabı o versin, məsuliyyət öz boynunda qalmasın. Bəhlul rəsmi danışdı:

– Körpələri yaxından görmək pis olmazdı. Qiyabi olaraq qəti rəyə gəlmək çətindi.

– Mütləq görəcəksiniz!.. – Baş həkim təskinliklə qımışdı. – Bunun üçün də əvvəlcə bilməliyik sizi nisbətən böyük uşaqlar maraqlandırır, ya körpələr.

Qumaş arvad əlavə etdi:

– Bu binada üç yaşınacan körpələr qalırlar. Onlardan irilər ayrı yerdədilər. Biz baxışa hardan başdıyax?

Bəhlul cavabı "üç telli"sindən gözlədi. Durna xanım bu dəfə də dinib-danışmadı. Bəhlul düşünə-düşünə dedi:

– Mən bu qənaətdəyəm ki, uşaq nə qədər körpə olsa, bir o qədər yaxşıdı.

– Körpə dedikdə hansı yaşı nəzərdə tutursunuz? Altıaylığımı, bir yaşımı? Yaxud təzəlikcə doğulmuşumu?

– Zənnimcə, bir yaşlısı daha münasibdi.

Süsənbər yaş seçimini bəyəndi:

– Mən də bu fikirdəyəm. Bir yaşındakı uşağın əziyyəti nisbətən az olur. Əmiqızıma çox zəhmət verməz.

Qumaş arvad Süsənbərə çəp-çəp baxdı. Ağzını büzdü.

– Amba mən özgə cürə fikirrəşirəm... Uşaq nə qədər cəfa verirsə, bir elə də şirinnəşir.

Əhli bir dayə də məsələyə qarışdı:

– Təcrübədən bilirik ki, böyüklərin seçimi çox vaxt faydasız qalır. Gələcək valideynini uşaq özü seçir.

Baş həkim təsdiqlədi:

– Bəli, belə hallar az olmur. Odur ki, gəlin seçimə tələsməyək. Otaqları bir-bir gəzək, körpələrlə tanış olun. Qərar çıxartmaq sonranın işidir. Sən nə deyirsən buna, Qumaş xala? Sənin məsləhətin bizə həmişə xeyir gətirib.

Qumaş arvad qeyd-şərtsiz razılaşdı:

– Ağıllı sözdü, a bala. Gələcək valideyinnər qoy hamı uşaxları görsünnər, bələd olsunnar. Sonradan gözdəri geri yannarında qalmasın, nəyə görəsə peşimançalıq çəkməsinnər.

Təklif ümumilikdə bəyənildi. İlk öncə yaxınlıqdakı otağa yönəldilər. Bura bir yaşına qədərki körpələr otağı idi. Baş həkim

Qumaş arvadla yanaşı addımlayıb, "qonaqlara" bələdçilik etdi. Bəhlulun qoluna girmiş Durna xanım sürüngəl yeridi. Ürəyində yeni uçunma başlamışdı. Süsənbəri də özünə yaxın çəkib, heysiz-heysiz pıçıldadı:

– Halım yaxşı deyil... Ürəyim sıxılır.

Süsənbər onu xısın-xısın qınadı:

– Toxtaqlı ol, əmiqızı, camaatı üstümüzə güldürmə.

Bəhlul "üç telli"sini qılıqladı:

– Özünü darıxdırma, əzizim. Bu həyəcannandı. Tez keçib-gedəcək.

Pıçıltıları Qumaş arvadın qulağı aldı. Dala qanırılıb, öyüd-nəsihət verdi:

– Möhkəm ol, qızım, – dedi. – Ayağını sürümə, Allahın köməkliyinnən hər şey yaxşılıxnan qurtaracax, sevinəcəyik. Ürəknən gəl!

İç tərəfə açılan qapının yumşaraq xışıltısına körpələr balaca başlarını koppuş yastıqlardan dikəltdilər. Ordan-burdan hürkək-hürkək boylanışdılar. Maraq, həyəcan, səksəkə dolu xırdaca, yaşla həlqələnmiş gözlər hər tərəfdən içəri girənlərə tuşlandı. Cəmi bir neçə anlığa davam edən bu hürkək boylanışlardan sonra kimisi nəyə görəsə, nazikcə dodaqlarını büzüb ağladı. Kimisi şən-şən qığıldanıb əl-qol oynatdı. Kimisi də yönünü küskün-küskün divara çevirib mısdı.

Körpələri belə görüb Durna xanım möhkəm sarsıldı. Ayaqları keyləşib yerə yapışdı. Göz çuxurlarında yaş siləndi. Hıçqırtı ilə ağlamaqdan özünü zorla saxladı. Təzadlı, ağrılı hisslər qəlbini göynədə-göynədə düşündü: "Bu zavallıların taqsırı, günahı nədi? Valideyn mehrindən, doğmalar nəvazişindən nə üçün məhrum olunublar?.. Anaları niyə, hansı səbəblərə görə onlardan imtina ediblər? İnsafları necə yol verib buna?! Off, ay Allah, nə yaman daş qəlbli bəndələrin var! Qan-qarğışdan, sənin qəsəmindən də qorxmurlar..."

Baş həkim Durna xanımın ürəyindən keçənləri asanca duydu. Pasiyentlərin (uşaq götürməyə gələnlərin) hiss-həyəcanlarına təcrübədən bələd idi. "Qonaqlarını" acı təəssüflə məlumatlandırdı:

– Bu məsum tifillərin valideyinləri heç kəsə məlum deyil. Əksəriyyəti zibilxanalardan, qəbiristanlıqdan, idarə-müəssisə qapıları ağzından tapılıb gətiriliblər. Ölümcül halda olublar. Onları həyata

qaytarınca bizim işçilər dəridən-qabıqdan çıxıblar. Çəkdikləri əziyyətlərə, ağır zəhmətlərə yuxarıda Allah, aşağıda mən şahidəm.

Qumaş arvad əlini sinəsinə sürtə-sürtə inildəndi:

– Ehh, – dedi, – cəhənnəm zillətləri bunun yanında, mən biləni, heç nədi. Binəvalar kirpikləriynən od götürüblər. Gecələri-gündüzdəri olmuyub, üstərində ələyəz yarpağı təkin əsiblər. Bəlkəm də heç öz körpələrinə göstərmədikləri analıx mehrini onnardan əsirgəməyiblər. Amba burası da var kin, çağalar dirilib, ətə-qana dolanda, bir az ərsəyə gəlib üzə güləndə, çəkilən ağır zəhmət barını verəndə, bütün eziyatdar yaddan çıxır. Dincdik, irahatdıx tapırsan. Söyünürsən kin, çox savab bir iş görübsən, yazıx bir tifili əzrayılın caynağınnan qurtarıb, insannar cərgəsinə qatıbsan.

Baş həkim əlini fəxarətlə Qumaş arvadın çiyninə qoyub, gülümsündü:

– Heç özünün elədiklərini demir! Qumaş xalanın zəhmətləri burada hamıya örnək olub. Dayəlik işinin incəliklərini, tərbiyəçiliyin ustalığını, qayğıkeşlikdə nümunəliyi çox işçilərimiz ondan öyrəniblər. O, bir təcrübə məktəbidir! Hə, əzizimiz Qumaş xala, indi buyur, özün düş qabağa. Köhnə iş üsulun əsasında hörmətli qonaqlarımızı körpə dəcəllərlə görüşdür. Bunu hamıdan yaxşı sən bacarırsan.

– Baş üstə! – Qumaş arvad Bəhlulgilə ərkli işarə etdi: – Gəlin dalımca!

Durna xanım yenidən könülsüzləmişdi. İndi də onun başqa narahatçılığı baş qaldırmışdı: “Mən himayəmə götürəcəyim uşaq da belələrindən ola bilər. Əsli-nəsli pis, geni zay adamlardan törəyər. O zaylıq, xarablıq irsən körpəyə də keçər... yaxud da anası müalicəsiz azar-bezara tutlmuşlardan olar, o amansız xəstəlik qanla uşağı da zədələyər, özünü sonradan büruzə verər. Xəta-bəlaya düşərik...”

Bəhlulun qolunu geri dartdı.

– Gedək burdan. Mən zibilliklərdən tapılmış uşaq istəmirəm.

Qumaş arvad dala qayıtdı. Durna xanımın biləyindən yapışıb, üzünü bozartdı:

– Məsləhatıma axıracan əməl elə! Öküzü öldürüb, quncunda pıçax sındırma! Vallah, elə qəşəng, gözəl-göyçək uşaxlar görəcəksən, onnar üçün ürəyinin başı töküləcək...

Durna xanım ağbirçək sözünü yerə sala bilmədi. Könülsüz-könülsüz addımladı.

Özlərinə oxşar balaca çarpayılarda ya oturmuş, ya da arxası üstə uzanmış körpələr "qonaqlar"ı yaxından görüncə, məsum-məsum irişib-qımışdılar. Qığıldanıb, əl-qollarını işə saldılar. Elə bil, gələnləri salamlayırdılar.

Qumaş arvad körpələrlə köhnə dayəlik vərdişi üzrə davrandı: gülməli işarətlər, him-cimlər, qılıqlarla onları daha da şənləndirdi. Gəlib yanlarından ötəndə hər birinin saçına, üz-gözünə sığal çəkdi, qəribə səslər çıxardıb, nənə mehribanlığı göstərdi. Şad haray-həşir otağı bürüdü.

Susqun, dalğın Durna xanımın da əhvalında getdikcə xoş dəyişiklik duyuldu. Məyus çöhrəsində ara-sıra həlim təbəssüm sezildi. Körpələrə lap yaxınlaşdıqca, onlara diqqətini artırdıqca, qeyri-adi işıltılı baxışların sehrinə düşdükcə, ürək soyuqluğu isindi. Körpələrə qanı qaynamağa başladı. Xırda, həlqəvari gözlərin kökündə gizlənmiş yetimlik nisgilinə nüfuz etdikcə, günahsız tifillərə rəhmi, yazığı gəlməklə bərabər, onlara canı yandı. Tərəddüdlər, şübhələr, qara-qura fikirlər çəkilib beyninin künc-bucaqlarına sıxışdırıldı. Ağır, sürüngəl addımları yeyinlədi. Qumaş arvaddan dala qalmadı. İlahi, necə də sirayətedici, cana-qana keçici idi o saf, o məsum baxışlar!

Bu hələ harasıydı? Aradan bir az ötmüş, Durna xanıma sanki qaibanə vəcd gəldi. Qumaş arvaddan irəli keçib, yetim balalara özü ayrıca nəvaziş göstərdi. Qumaş arvadsayağı hər birini oxşadı, saçlarını tumarladı. Him-cimləşdi, məzəli-məzəli hərəkətlərlə onları qəşş edincə güldürdü. Bu məşğuliyyətindən – yetim könülləri açdığından özü də həzz aldı. Bəhlul da, Süsənbər də, hətta, Qumaş arvad da ona mat-mat tamaşaya durdular. Axırda möcüzə baş verdi: sonuncu çarpayının yançaq taxtasından yapışıb ayağa qalxmış pırpız saçlı, dümqara gözlü, toppuş bir qızcığaz heyrətli hay-küylə çırpındı. Nazikcə qollarını irəli uzadaraq, Durna xanıma doğru qanadlandı. Həm güldü, həm ağlamsındı.

Heyrət hamını daşa döndərdi. Durna xanım da təəccübdən dondu, heykəl kimi lal, hərəkətsiz qaldı. Bu nə məsələ, nə xuda sirri

idi? Qızcığaz ona nə üçün belə mehr salmışdı? Ondan ana qayğısı, doğmalıq məhəbbətimi umurdu?! Axı, hansı səbəbə görə?!

Durna xanımın heyrət donu açılanda, yana çəkildi. Qızcığaza bir elə canıyananlıq hiss etdirmədi. Xoşuna gəlməməsindən əlavə, məqsədi başqa idi. Evdən çıxanda Bəhlulla məsləhətləşib, qəti qərara gəlmişdilər ki, qəyyumluğa yalnız oğlan uşağı götürəcəklər. Çünki oğlan uşağının qayğısı, əziyyəti xeyli az olur.

Haray-həşirli qızcığazı dayələr güc-bəla ilə sakitləşdirdilər.

"Qonaqlar" iç-içə otaqların digərinə qədəm basdılar. Burada yaşyarım-iki yaşına qədərki "dəcəllər" qalırdılar. "Dəcəllərin" çarpayıları boş idi, səliqə ilə yığışdırılmışdı. Özləri otağın ortasında düzülmüş oyuncaqlarla oynayır; hay-harayla atılıb-düşür, yıxılıb-durur, qaçışırdılar. Addım səslərinə hürküb, oyunlarını dayandırdılar. Sonra yüyürüşüb dayələrinin böyrünə sığındılar. Qaşlarını sallayıb, oğrun-oğrun boylanışaraq mısdılar. Ağbəniz, sarısaç, qumral göz bir oğlan uşağı isə durduğu yerdən tərpənmədi. Heç kəsdən pəsinmədi. İrişə-irişə irəli yüyürdü, Bəhlula çatıb öz əziz adamı kimi əlindən tutdu. Uşağın bu istiqanlılığı, Bəhlulun çox xoşuna gəldi, uşaq görkəmcə də xoşagəlim idi. Bəhlul əyilib onu qucaqladı, üzündən öpdü.

Uşağı ilk baxışdan Durna xanım da bəyəndi. Körpənin istiqanlılığı onun da ürəyinə yatmışdı. Yaxına getdi, saçlarını tumarlayıb, şirin qılıqla danışdırmaq istədi. Körpə hələ dil açmamışdı. "Ih-ıh" eləyib, sirli-sorğulu gözlərini gah Durna xanımın, gah da Bəhlulun üzündə dolandırdı. Sanki onların simasında doğmaca valideynlərini görmüşdü. "Hardaydınız bu vaxtacan, niyə gəlmirdiniz?" – deyirdi.

Bu hal Durna xanımı da, Bəhlulu da çox təsirləndirdi. Uşağa olan ilk mehri artırdı. Durna xanım körpəni qucağına götürdü. Hər iki yanağından və alnından öpdü. Saçlarını qarışdırdı. Sonra da onu Bəhlulun qucağına ötürdü. Eyni nəvazişləri körpədən Bəhlul da əsirgəmədi. Və gələcək valideynlər sevinclə baxışdılar. Fikirlərini bir kəlmə ilə bölüşdülər:

– Hə?

– Hə!

Süsənbər məmnunluğunu gizlətmədi:

– Qəşəng uşaqdı!.. Sizə yaraşandı!

Qumaş arvad isə ağbirçək xeyir-duası verdi.

– Mübarəkdi! Nəvəli-nəticəli olun!

O biri otaqlara baş çəkməyə zərurət qalmadı.

**27.**

Qəyyumluq üçün vacib sənədlərin hazırlanması uzun çəkdi. Qumaş arvad doğru deyirmiş, uşaq götürmək dım-dım halvası deyilmiş. Məsələni rəsmiləşdirmək, hüquqi cəhətdən qanuniləşdirmək üçün neçə-neçə dövlət idarəsinə ayaq döymək, sənəd toplamaq lazım oldu.

Durna xanım hövsələsizləşdi. Ürək isindirdiyi oğlan uşağını himayəyə götürməyə bərk darıxdı. Bəhlulu hey tələsdirdi. Lakin "Körpələr evi"nə təkrar, bütün sənədlər hazır halda, qayıdışda ortaya heç gözlənilməyən əngəl çıxdı...

Seçilmiş körpəni aparmağı, geyindirib, səliqə-sahmana salmağı Durna xanım dayələrə etibar etmədi. Hər işi özü görəcəyini bildirdi. Qumaş arvadla Süsənbər də onunla yollandı. Bəhlul baş həkimlə söhbətə əyləndi.

Durna xanım keçid otağına ayaq basan kimi, həşir qopdu. Pırpızsaç qızcığaz bir haray saldı, gəl görəsən! Çarpayını təpikləyib, qollarını yanlarına çırpıb, gücü çatdıqca qıy çəkdi. Göz yaşlarını selə-suya döndərdi. Keçən dəfəkindən beş artıq bir hövüllə Durna xanıma doğru can atdı. Və birdən necə oldusa (bunu heç kim görmədi), böyrü üstə yıxıldı. Burnu harasa toxunaraq cızıldı, çığırtısı qulaq deşdi.

Dayələr əl-ayağa düşdülər. İçəridəki həkimlər, qulluqçular da özlərini köməyə yetirdilər. Balaca burundan şoralanan qanı dava-dərmanla kəsdilər. Ancaq heykirən, çırpınan qızcığazı heç cürə kiridə bilmədilər. Körpənin göyərə-göyərə ağlaması ürəkləri kövrəltdi.

Xəbər baş həkimlə Bəhlula da çatdırıldı. Onlar da hadisə yerinə qaçaraq gəldilər. Aləm bir-birinə dəydi. İşçilərdən üzü danlanan

da oldu, töhmət alan da. Qızcığaz isə nəfəsi kəsilsə də, səsi xırıldasa da haray-həşirini dayandırmadı.

Qumaş arvad irəli durdu. Dayələri kənarlaşdırıb, özü işə qarışdı. Qızcığazın qoltuğunun altını qıdıqlayıb, məzəli hərəkətlər edib, güldürməyə, könlünü almağa çalışdı:

– Nə var, ay həyasız?!.. Nolub?.. Bu nə qara-qışqırıqdı salıbsan? Gəl qucuma!

Qızcığaz üzünü küskünlüklə ondan çevirdi. Durna xanıma doğru qanadlanmaqda davam etdi.

Qumaş arvad dərin heyrətlə əlini üzünə çəkdi, qaşlarını mat-mat dartıb alnına qaldırdı. Durna xanımı yüngülcə dümsüklədi:

– Sən yaxınnaş ona, – dedi. – Qucağına götür görək kiriyirmi. Onu belə ağlar qoymaq olmaz. Allaha ağır gedər, işimiz uğur gətirməz.

Durna xanım razılaşdı. Qızcığazı aralıdan oxşadı, ovundurmaq istədi. Məqsədi baş tutmadı. Qızcığaz öz qəribə hikkəsi ilə qucağa götürülməsini tələb etdi. Durna xanımın çarəsi kəsildi. Məcbur olub balaca həyasızı qucağına götürdü. Qızcığaz dərhal kiridi. Kiçicik qollarını heyrətli bir mehr ilə Durna xanımın boynuna doladı, ona bərk-bərk sarıldı. Hərdən-hərdən içini çəkərək, şeytan-şeytan irişməyə başladı. Yaşı donmuş, təbəssümdən xeylicə qıyılmış dairəvi gözlərinin kömür rəngli qarası şeh yumuş göyəm kimi işım-işım işıldadı.

Durna xanım qucağında mısmış qızcığazı beş addım o yana, beş addım bu yana gəzdirib, atıb-tutub, tam sakitləşdirdiyinə arxayınlaşıb, dayəsinə verəndə, vay-şivən yeni güclə təzələndi. Durna xanımdan möhkəm yapışıb qopmadı. Dayələr, tərbiyəçilər nə illah elədilər, heç nə alınmadı. Qızcığaza zor işlətməyə, sərt hərəkət göstərməyə heç kimin ürəyi gəlmədi. Bunu ilahinin möcüzəsi, xuda sirri sayıb, qorxudan dala çəkildilər. Durna xanımla Bəhlul ortalıqda çaşqın-çaşqın dayandılar. Düşdükləri mürəkkəb vəziyyətdən necə çıxacaqlarını bilmədilər.

Qərarı Qumaş arvad verdi:

– Mən tanrı qəsəminnən qorxuram. Körpə qəlbini sındırmax böyük günahdı. Gəlin, bu həyasız balanı gözü yaşdı qoymuyax.

Qan-qarğış tutar bizi. Durna, a qızım, yerə qoyma onu qucağınnan. Ana iyisini sənnən alır. İlahi qismətidi bu...

Süsənbər də Qumaş arvadın tərəfinə keçdi:

– Belə məsləhətdi, əmiqızı. Ötən dəfədən bəri bu uşaq sidqini sənə salıb, ayrılmaq istəmir. Onu bağrıyanıq qoysaq, Allah da bizim bağrımızı yandırar. Tərəddüd eləmə, sən də sidqini bağla bu uşağa. Peşiman olmazsan.

Baş həkim təqdirlə başını tərpətdi:

– Bayaq mən, bu cür hadisənin baş verə biləcəyinə işarə vurmuşdum. "Öz gələcək valideynlərini uşağın özü seçir"i söz-gəlişi deməmişdim, çünki bir neçə dəfə onun şahidi olmuşuq. Nəticəsi də müsbət alınıb. Heç bir fəsad törəməyib.

Durna xanım tez-tez kirpik çalıb, Bəhlula baxdı. Bəhlul tərəddüdsüz:

– Ciddi fərq yoxdur. Qız, ya oğlan, hər ikisi evladdır, – dedi.

Qumaş arvad Durna xanıma təkidlə üz vurdu:

– Oğlan düşmən toxmağıdısa, qız evin yaraşığıdı. Bunu ulu dədələr deyiblər. Kefini bir zərrə pozma. Gözəl qismətdi. Qız uşağı özünü daha çox istədir. Bir də kin, qızdar daha yanımcıl olurlar. Valideyinnəri qocalıb-qartıyıb məni təkin kaftarraşanda, canı azar-bezar tapanda ata-ana qulluğunda oğullardan beş artıx dururlar. Götür bu uşağı, vəssalam!

Həmən anda başqa bir qeyri-adi hadisə baş verdi: Qızcığaz şən qığıltılarla Durna xanımı öpdü, tumbul barmaqcığazlarını onun üzündə gəzdirə-gəzdirə təəccüblü hərəkətlər göstərdi. Adamların matı-qutu lap qurudu. Doqquz aylıq körpənin yaşına uyğun gəlməyən "işləkləri" başaçılmaz möcüzə idi. Bunun ilahi diktəsi olduğu daha heç kəsdə şəkk doğurmadı...

* * *

Qumaş arvad bir həftədən artıq Bəhlulgildə gecələdi. Körpə üçün gərəkli qulluqları, vacib xidmətləri Durna xanıma necə lazımdı öyrətdi. Durna xanım bu öyrətmələri tez qavradı. Uşağa doğmalıq duyğuları, ana mehri gözlənildiyindən tez alındı. Qumaş arvadın əlavə zəhmətlərinə ehtiyac qalmadı.

Qızcığaz evin kəsif havasını az bir zamanda tamam dəyişdi. Körpə gülüşləri, ağla-sıtqaları, şıltaq mızıltıları otaqların sükunət

buzunu əritdi. Soyuq divarlar isindi. Tale inciklikləri, köhnə umu-küsü xıltları tamam unuduldu. Ailə təzə yaşam tərzinə başladı.

Günlər keçdikcə, Durna xanımın sevinci böyüdü, könül rahatlığı sabitləşdi. Hər dəqiqə, hər saat onun üçün ömür nəşidəsinə çevrildi. Deyərdin, orta yaşlarına qədəm qoymuş, ciddi ruhi sarsıntılar keçirmiş bu qadın dünyanın dadını-duzunu indi-indi dadır. Əl-ayağı yerə dəymirdi, sanki göydə uçurdu. Qızcığazın adi mızıltısına, şıltaqlığına tab gətirmirdi; harda olsa da özünü quş qanadında yetirirdi. Körpəyə bir "can" deyəndə beşi də böyürdən çıxırdı. Heç doğmaca evlad da belə əzizlənməzdi!

Qumaş arvad da savab işindən ziyadə həzz alırdı. Həftədə iki, bəzən üç dəfə Durna xanımgildə peyda olurdu. Körpəyə nənə mehri ilə baş çəkirdi. Qızcığazın bir yeri bekaraca ağrıyanda, halsızlayanda Durna xanım başını itirirdi, çaşıb qalırdı. Nə edəcəyini, nə çarə qılacağını bilmirdi. Cəld telefona əl atırdı. Təlaş, təşviş içində Qumaş arvadı haraylayırdı. Qumaş arvad da hər işini bir kənara atıb, haraya əlüstü hay verirdi. Özü xəstəhal, illacsız olsa da, imdada qaranəfəs çatırdı. Bir sözlə, qoca arvad ən etibarlı "təcili yardım" rolunu oynayırdı. Müstəcəb dəva-dərmanını eləyib, qızcığazı sağaldıb, üzə güldürürdü. Xasiyyətcə şən, oynaq qızcığaz, sanardın ailənin ovqat tənzimləyicisidir.

İkinci "təcili yardım" isə Süsənbər idi. Onun da bir əli telefondaydı. Gündə bir neçə dəfə zəng vururdu. Körpədən hal-əhval tutur, kömək lazım gəldikdə, o da ildırım sürəti ilə Durna xanımın yan-yörəsində olurdu.

Bəhlul Ağazadə də xeyli başqalaşmışdı. Onu ev şəraitində kənardan-kənara müşahidə etsəydilər, tanımazdılar. Sakit, təmkinli, bir çox mətləblərdə soyuqqanlı görünən bu adam evdə uşaq səsi eşidiləndən bəri ailəyə qırılmaz tellərlə bağlanmışdı. İş-güc, idarə məsələləri daha bir elə vecinə deyildi. Əvvəllərdəki kimi bütün günü, gecənin də yarısını kabinetə çaxılıb, kağız-kuğuzla əlləşmirdi, evə tələsirdi. Qızcığazla əylənməyə, məzələnməyə can atırdı. Uşağa qəlbən, ruhən, bütün varlığı ilə bağlanmaqda, onunla nəfəs almaqda Durna xanımı ötmüşdü. Qızcığaz kefsizləyəndə, üzü gülməyəndə onun da kefi pozulur, dünya başına daralırdı.

Təmkini, hövsələsi tükənirdi. Otaqdan-otağa vurnuxur; dinclik, rahatlıq tapmırdı. Az qalırdı şəhərin ən yaxşı uşaq həkimlərinin hamısını çağırıb evinə yığsın. Körpəni xəstəlik cəngindən bacardıqca tez xilas etdirsin.

Gündən-günə, həftədən-həftəyə, aydan-aya qızcığaz daha çox şirinləşdi. Bəhlulu özünə yeni maqnit gücü ilə çəkdi. Onunla oynamağa, əylənməyə, məzələnməyə həvəsi hər şeyi üstələdi. Bütün gün ərzində ayrılığa dözümü çatmadı. İşarası vaxt tapıb evə qaçdı. Qoltuğunun altını qıdıqladıqca uğunub qəşş edən qızcığaz ona bir dünyalıq ləzzət verdi. Bu qıvrımsaç balanın şaqraq səsli gülüşündən, onun şişman ovurdlarının ortasının dairə şəklində çökəlməsindən, qıyılaraq kiçilən badamı gözlərindən şoralanan sevinc yaşlarından doyumsuz həzz aldı. Başı üzərinə qaldırıb, otaqlarda gəzdirə-gəzdirə ruhi rahatlıq tapdı. Evə gəlməyə, qızcığazla əylənməyə gərgin işlərdən macalı olmayanda, Durna xanıma zəng vurub, körpəni telefonun yanına gətirməyi, dəstəyi ona yaxınlaşdırmağı, qıdıqlayıb güldürməyi xahiş etdi ki, səsini eşitsin, ruhən dincəlsin.

Bax, beləcə, hər şey dəyişdi. Boy atdıqca, bir az da dəcəlləşən, şirini-şəkəri artan qızcığaz Bəhlulun saqqızını tamam oğurladı. Onu öpüb-oxşamaqdan bir an da yorulmadı. Evdə qucağından yerə qoymadı, yatanda da özü ilə yatızdırdı. Durna xanıma imkan vermədi ki, körpəni o da lazımınca oxşasın, ana qayğılarını ona ürəyincə göstərsin. Bəzən bunun üstündə yüngül incişmələr, deyinmələr də oldu.

Yad uşağına bu dərəcədə sevgi, ziyadə istək Durna xanımı da, Bəhlulu da hərdən-hərdən heyrətə salırdı. İlahinin başaçılmaz işinə heyran qalır, sevincləri yerə-göyə sığmırdı. Elə bu səbəbdən də pırpızsaç qızcığazın “körpələr evi”ndə ona verilmiş adını dəyişib Fərəh qoydular. Onu hər dəfə sevə-sevə çağırdılar, fərəhləndilər.

Arası heç uzun sürmədi, cəmi dörd-beş aydan sonra uşağın “körpələr evi”ndən götürüldüyü büsbütün yaddan çıxdı. Doğmalıq, həqiqi valideynlik hissiyyatı elə gerçəkləndi, elə möhkəmləndi ki, əgər dili dinc durmayan, ürəyi xıltlı bir nanəcib cürət edib desəydi: “Uşaq sizin öz doğmanız deyil, götürülmədi” – qiyamət qopardı. Bəhlul da, Durna xanım da bunu özlərinə qarşı ən vicdansız təhqir, bir batman balla udulmayan həqarət sayardı. Mütləq dava-dalaşa, ömürlərində etmədikləri saçyolduya, yaxacırdıya başlayardılar...

İndi o vaxtdan beş il ötürdü.

## İKİNCİ HİSSƏ

### 1.

Taksi sərt yırğanışla əyləndi.

Dal oturacağa sərbəst sərilərək, gözlərini yummuş Əfsun Zamanlı yırğanışdan səksənib, dik atıldı. Başı maşının tavanına dəydi.

– Nə oldu?!.. Nə hadisə baş verdi?

Sürücü həvəssiz:

– Heç nə olmayıb. Mənzilə çatmışıq, – dedi.

– Həə?!.. – Əfsun qəribə təəccüblə bayıra boylandı. – Nə tez?

Sürücü susdu.

Əfsun maşının yan pəncərəsindən çölə bir də nəzər saldı. Yekəxana təqdir etdi:

– Afərin, düz tapıbsan ünvanı!

O, gödəkcəsinin yan ciblərini xeyli eşələyib, əzik-üzük pul çıxartdı, sürücünün böyrünə atdı. Sürücü çəp-çəp bir pula, bir də sərnişininə baxdı.

– Bu, azdı, yarım saatdan çoxdu yol gəlirik.

– Olanım odu! – Əfsun çamadanın qulpundan yapışıb düşməyə tələsdi.

Sürücü səsini qaldırdı:

– Sifdəmi kəsmə. Yol haqqının bu heç üçdə biri də deyil.

Əfsun maşından düşüb, qapısını çırpdı.

– Əlavə bir qəpik də yoxumdu!..

Sürücü deyindi:

– Pulun yox idi, minməyəydin taksiyə. Avtobusla gedəydin.

Əfsun şit-şit hırıldadı.

– Avtobusla getsəydim, gec olardı. Görüşünə tələsdiyim adamı evində tapmazdım. Harasa çıxıb gedərdi.

Sürücü qəzəblə əl-qol yellətdi:

– Ah, zalım oğlu! Səhər-səhər gərək elə mənəmi rast gələydin?!.. Qarşıma çıxınca qılçaların niyə sınmırdı?!.. Niyə murdar olub, bir küncdə qalmırdın?!

Əfsun laqeydcəsinə:

– Arvad kimi qarğış tökmə, – dedi. – Əslinə qalsa, məndən gərək pul ummayasan. Dustaqlıq gorxanasından qurtarmışa canın yanmalıdı, ona bacardığın rəhmi eləməlisən. Azərbaycanlı deyilikmi?

Sürücü kükrədi:

– Nə olsun azərbaycanlıyıq?! Ondan mənə nə xeyir? Evdə uşaqlarım rəhm yox, çörək pulu qazanmağı gözləyirlər. Ehtiyac xirtdəkdəndi!

Əfsun həyasızlığına salıb irişdi:

– Bu dəfə, elə bil, sərnişin götürməyibsən, maşını müf sürübsən.

Sürücü sükan arxasında qovşuruldu. Gücü söyüncə çatdı:

– Lotu köpək oğlu! Artıq-əskik danışma, yol haqqını ödə!

Əfsun söyüncü qulaqardına vurdu. Üzünü çevirib öndəki nəhəng doqquz mərtəbəli binaya yönəldi. Arxadan qarğışqarışıq daha bir ağır söyünc haqladı onu:

– İrsiz haramzada! Yeddi arxadan dönəninə lənət sənin!.. Səhər siftəmi abırsızlıqla kəsdin. Allahım da o cavan ömrünü kəssin!!

Əfsun bunu da vecinə almadı. Addımlarını tələsik yeyinlətdi.

Əlacsız sürücü acığının gerisini maşından çıxdı. Mühərriki əsəbi-əsəbi işə saldı. İti sürət götürmüş təkərlər yolu bərk tozladı.

Bu “acıqçıxma” da Əfsunun yel olub yanından ötdü. Hündür binanın ikinci giriş qapısını gözaltılayıb, addımlarının sürətini bir az da artırdı. Qaranəfəs üçüncü mərtəbəyə qalxdı. Bir vaxtlar o, bu pillələri gündə bir neçə dəfə çıxıb-enmişdi. Öz halal evinin pillələri sanmışdı. Həmən xoşbəxt anları xatırladı. Hünərləndi. Lakin qapıya yaxınlaşanda, cəsarəti tükəndi. Beynində sarsıntılı suallar peyda oldu: “İndi mən ona nə deyəcəm? Qapısına gəlməyimə nə bəhanə uyduracam?.. O qalmaqallardan, neçə illik biabırçı ayrılıqdan sonra üz-tutalğacım nə olacaq? Özümə nə cür haqq qazandıracam?..”

O, dala çəkildi. Çamadanını yerə qoyub, alnını ovuşdurdu. Suallarına cavab düşündü. Qarşıya yeni narahatlıqlar çıxdı: “Məni qəbul etməsə, döşümdən geri itələyib, qapını üzümə bağlasa,

halım-günüm necə olacaq? Bu soyuq, şaxtalı qış səhərində harda daldalana biləcəyəm? Küçələrdə veyllənəsi olsam, vay halıma...”

Əfsunun damarlarından gizilti keçdi. Ürəyinin başı göynədi. Dərhal da ümid güvənci köməyinə yetdi: “Yox, sarsaq fikirlər, pis gümanlardı bunlar. Durna xanım məni heç cürə unuda bilməz. Nə olsun ki, aradan beş il keçib. Elə hisslər var ki, ürəkdə daimi yaşayır. Beş il nədir? Lap iyirmi beş il, otuz-qırx il keçsə də köhnəlmir. Ağlım heç kəsmir ki, məhəbbətimi könlündən birdəfəlik silmiş olsun. Axı, o, məni hədsiz sevirdi. Mənsiz bircə gün də ayrı qala bilmirdi. Mənə görə ailəsini dağıtdı. Ərini evdən didərgin saldı... yox, yox! Məhəbbətini ürəyindən həmişəlik silməyi bacarmaz. Qadınlar belə məsələdə kişilərdən möhkəm və etibarlı olurlar. Sevgi torundan çətin çıxırlar. Bəzən də heç çıxa bilmirlər... İndi məni qənşərində görəndə, yalvar-yaxarlarımı, üzrxahlıqlarımı eşidəndə qəlbi yumşalacaq. Yazıq halıma baxıb, hirsini, qəzəbini unudacaq, mum kimi yumşalacaq... İntəhası, gərək mən də, hər ehtimala qarşı, inad göstərim. Bu üzümə tüpürsə, o biri üzümü çevirim. Ayaqları altına döşənib, bağışlanmayınca əl çəkməyim. Ayrı çarəm yoxdur”.

Bu düşüncələr ona yeni inam gətirdi. Qətiyyətlə irəli durdu. Zəngi basmaq istədiyi anda, qapı öz-özünə açıldı. Durna xanım əlindən tutduğu koppuş, qıvrımsaç qızı ilə qapı arxasında göründü. Harasa gedirdilər. Bu qabaqlaşmadan Əfsun, iradəsindən asılı olmadan, qamaşdı, özünü itirən kimi oldu.

Durna xanım çox dəyişmişdi. Əfsunun təsəvvüründəki nərmənazik, incəbel, şux qamətli qadın deyildi. Əməllicə kökəlmişdi. Beli ennənmiş, sifəti ətlənmiş, qəşəng çənəsinin altında balaca buxaq yaranmışdı. Ancaq əvvəlki cazibədarlığını itirməmişdi.

Əfsunun qamaşığı tez açıldı. Cəld irəli atıldı. Könlündən Durna xanımı hərarətlə qucaqlamaq keçdi. Ancaq Durna xanımın kəskin, nifrət dolu nəzərlərindən pəsindi. Eləcənə əl tutuşmağa çalışdı. Təcrübədən bilirdi ki, əl tutuşsa, qeyri işlər asanlıqla düzələcək. Əli boşda qaldı. Sifətindən amansızlıq yağan Durna xanım son dərəcə həqarətlə soruşdu:

– Nəyə gəlibsən?

Əfsun təpərli dayandı. Köhnə qaydası üzrə, dilinin üstündən dil bitirdi:

– Ay salam-əleyküm!.. Ay xoş gördük!.. Necəsən mənim əzizlər-əzizim? Kefin-əhvalın? Tfu, tfu, göz dəyməsin, maşallah, həmişəki təkin min gözələ dəyərsən. Səni belə şux, belə təravətli görməyimə çox şadam. Heç bilirsən, səndən ötrü necə darıxmışam?!.. Aramıza tikanlı çəpər çəkmiş o zalım ayrılıq məni diri-gözlü öldürürdü. Həsrətindən qubar bağlamış biçarə könlüm hər an, hər dəqiqə sənə qovuşmağa can atırdı. Nə gündüz, nə gecə çıxırdın fikrimdən. Bu dünyada bircə arzum vardı: o da səni sağ-salamat, bax, beləcə şux görmək idi. Şükür, arzuma çatdım. Fərəhim yerə-göyə sığmır. Mən hədsiz xoşbəxtəm!

Durna xanımı hirs silkələdi. Səsi lap sərtləşdi:

– Nə bu şit sözləri eşitmək, nə də səni tanımaq istəyirəm! Rədd ol, sürük qapımdan!

Əfsun boynunu yazıq-yazıq bükdü.

– Hara rədd olum?.. Getməyə yerim yoxdu.

Durna xanımın qeyzi gücləndi.

– Bu, məni maraqlandırmır... yerin yoxdur, cəhənnəmə – gora get!

Əfsun fağırhal qımışdı.

– Cəhənnəmə yol uzaqdı. Gorum da ki hələ qazılmayıb. Səni deyib gəlmişəm!

– Çox nahaq! – Durna xanım çımxırdı. – Dedim ki, səni tanımaq istəmirəm! İtil gözümün qabağından!!

Əfsun gərginliyi qəmgin zarafatla yumşaltmağa cəhd etdi:

– Yəni o qədər eybəcər şəklə düşmüşəm ki, tanıya bilmirsən?!.. Meymuna oxşayıram, eləmi?

O, həqiqətən də ilkin baxışda çətinliklə tanınırdı. Beşillik həbsxana həyatı ona möhürünü mükəmməl basmışdı. Dolu bədənli, pəhləvan cüssəli Əfsun çox ərimişdi. Sümükləri görünən çənəsi uzanmış, iri pərli, enli burunu nazilmiş və donqarlanmışdı. Diqqəti çəkən qalın, çatma qaşlarının da, elə bil, tükləri yolunmuşdu, gülməli görünürdü.

Durna xanım acı rişxəndlə:

– Su sənəyi əzəl-axır suda sınır! – dedi.

– Sən məni insafsızcasına ələ salırsan, Durna xanım. Bu yazıq halımı lağa qoyursan... Ahh!.. – Əfsun burada həqiqətən qəhərləndi

və təzədən aciz yalvarışlara başladı: – Onsuz da yaralı bağrımı belə köntöy sözlərlə təzədən yaralama. Qapına tövbəyə gəlmişəm. Mənə nə divan eləyirsən elə. Ancaq könlümə toxunma. O könlüm ki səni sonsuz məhəbbətlə sevib, elə indi də həmən qaydada sevir.

Durna xanım ikrahlıqla burnunu qırışdırdı:

– O saxta məhəbbətin qiyməti bir qara qəpikdən artıq deyil! – deyib, yır-yır yırğalandı.

Əfsun itməkdə olan ümidin son qalığından möhkəm yapışdı. Ən çətin məqamlarında imdadına çatmış əsas silahına – qılığa güc verdi:

– Canım-gözüm, Durna xanım, bilirəm, qəbahətlərim az olmayıb. Kobud səhvlərə yol vermişəm. Atamla, anamla, yeddi arxadan dönənlərimlə qələt eləmişəm. Bu, mənim sənə sidq-ürəklə etirafımdı. Heç bir arxam-dayağım yoxdu səndən savayı. Üzünü gor görmüş məhbəsin cançürüdən nəmli, alaqaranlıq divarları arasında yalnız və yalnız sənin xəyalınla, bir də sənə qovuşmaq arzusu ilə yaşamışam. O sovxa beş ildə dilimə özgə dilək gəlməyib. Və həmişə də özümü inandırmağa çalışmışam ki, məni heç kim başa düşməsə də sən başa düşəcəksən. Geniş, təmiz, rəhmli ürəyin əbləh taqsırlarımdan keçəcək. Həsrətindən ölməyə insafın yol verməyəcək. Amma... min-min təəssüflər ki, düşündüklərimin tam əksi ilə rastlaşıram. Məni nəinki başa düşmək, heç tanımaq da istəmirsən.

Durna xanım bir zərrə yumşalmadı. Daha şiddətli nifrət vurğusu ilə:

– Çəkil qapıdan, axmaq adam! – deyib, Əfsunu çiynindən geri itələdi. Qızın biləyindən bərk-bərk yapışıb, son sözünü söylədi: – Qulaqlarını aç, yaxşı-yaxşı eşit! Bizim yanlış, şərəfsiz münasibətlərimiz qurtarıb. Təkrar eləyirəm: mən sənin kimi vicdansız, alçağın alçağı adamı əsla tanımaq istəmirəm. Hardan gəlibsən, itil, get ora! Bu həndəvərə bir də ayağın dəyməsin! Unut bu ünvanı!!

Əfsun dala doğru səldirləyib, dərhal da irəli təpildi. Qapını arxasınca örtüb, yalvar-yaxarına davam etdi:

– Sən ölənləriyin goru, sən ata-ananın canı, rəhmini əsirgəmə məndən. Qaldır ayaqlarını, altından öpüm, qəzəbin soyusun. Qəddarlıq yaraşmır sənə.

Durna xanım bu miskinliyə laqeyd qaldı. Başını məğrurluqla dikəldib, Əfsunu bir də itələdi. Çölə çıxartmağa çalışdı. Əfsun üzüstə astanaya sərilib, Durna xanımın qılçalarını qamarladı. Naxırdan ayrı düşmüş buğa hövlü ilə heybətli səs çıxartdı:

– Yox, qoymayacam gedəsən!.. Günahlarımdan keçdiyini, məni əfv elədiyini dilindən eşitməsəm, buraxan deyiləm. Bu, qəti sözümdü!

Uşaq qorxub, hündürdən ağladı. Durna xanımın arxasında gizlənərək, tir-tir əsdi. Durna xanım qızcığazı güc-bəla kiridib, Əfsuna təpindi:

– Burax qılçalarımı, vəhşi adam!.. Uşağın bağrını yarma!

Əfsun təpgidən həyalanmadı. Qılçalara bütün gücü ilə sarmandı.

– İstədiyim kəlmələr dilindən çıxmayınca əl çəkməyəcəm. Özün bilirsən xasiyyətimi. Kəs, doğra, əz başımı, nə bacarırsan tənbeh elə. Qanım halaldı sənə.

Uşaq daha da vahimələndi. Qışqırtı ilə hönkürdü. Durna xanımın əsəbləri tarıma çəkildi. Əfsunun üzünü, başını, çiyinlərini şillələdi, yumruqladı. Ən ağır söyünclər, təhqirlər yağdırdı.

– Eşşək balası! Qanmaz oğlu qanmaz!.. Abır-həyasız məxluq! Əl çək, incitmə bizi!

Əfsun müqavimət göstərmədi. Durna xanımı qəsdən cırnatdı:

– Vur, vur! – dedi. – Nə bacarırsan bərk vur, yun çırpan kimi, möhkəm çırp məni. Qoy ürəyin soyusun. Mən bu cəzaya layiqəm. Öldürsən də uf demərəm.

Durna xanım şillə və yumruqlarının arasını kəsmədi. Ha çalışdı, ayaqlarını Əfsunun sarmaşığından çıxarmağı bacarmadı. Yoruldu, heydən düşdü. Qızcığazın yeni hönkürtüləri amanını qırdı. Məcbur olub, sakit danışdı. Həlim-həlim məzəmmətlədi:

– Di bəsdi! Kişiliyin çatsın, sürünmə ayaq altında. Qüruru, mənliyi olan adam özünü bu dərəcədə düşük aparmaz, toz-torpağa bələnməz.

Əfsun qollarını boşaltmadı. Arsız-arsız hırıldadı:

– Bu, xoşdu mənə, – dedi, – öz canından qat-qat artıq istədiyin, onunla nəfəs aldığın bir qadının ayaqları altına döşənmək heç vaxt ayıb sayılmayıb. Həqiqi aşiqlər bundan fəxarət duyublar. Rəvayətlərdə, əfsanələrdə ən şöhrətli igidlər, məğrur kişilər əyilib, sevdikləri gözəllərin ayaqlarını öpüblər. Budur, indi mən də sənin

ayaqlarını həmən öpüşlərə qərq edəcəm... – O, doğrudan da dediyini sübuta yetirdi. Durna xanımın ayaqlarını öpməyə girişdi. – Mən bunu özümə əskiklik saymıram, can rahatlığı duyuram. Ona görə ki, həmən öpüşlərimlə köhnə günahlarımı yuyuram.

Durna xanım ətürpəşdirən marçıltıdan çimrənsə də, biabırçı vəziyyətdən qurtuluş üçün ayaqlarını hey çapalatsa da vəziyyəti dəyişə bilmədi. Əlacsız qalıb, daha həlim danışmalı oldu:

– Adam gərək insanlıq ləyaqətini hər vəziyyətdə qorusun. Dur ayağa. Böyrümdə uşaq tir-tir əsir. Qorxudan pis xəstəlik tapar.

Əfsun sanki sərxoşluqdan ayıldı. Başını qanırıb, altdan-yuxarı qıza baxdı. Uşağın qorxudan azarlaya biləcəyi ağlına batdı. Qolları aramla boşaldı. Ayağa qalxdı, üstünün toz-torpağını təmizləyə-təmizləyə gülməli, məzəli hərəkətlər edib, qızcığazın könlünü almaq, qorxudan çıxarmaq istədi. Qız üzünü ondan gizlətdi. İçini çəkə-çəkə, hıçqıra-hıçqıra anasını qucaqladı. Durna xanım əvvəlki sərt görkəmini aldı:

– İşin olmasın uşaqla! Sakit qoy onu!

Əfsun qımışdı. Durna xanıma bic-bic göz vurdu.

– Mənim məhsulumdu?

Durna xanım ikrahlandı.

– Xeyr! – deyib, üzünü hirslə yana çevirdi.

Əfsun təkrar irişib qımışdı:

– Acığın niyə tutur? Uşağa qanım qaynadı, bilmək istədim.

Durna xanım nəfəsi boğula-boğula:

– Qurtar gic-gici sualları! – dedi. – Həyasızlığın, sırtıqlığın da bir həddi var. Çıx çölə! Elə eləmə ki, qışqırıb bütün qonşuları bura yığım. Milis çağırtdırıb, gəldiyin gorxanaya təzədən göndərtdirim!

Əfsun hədənin zəhmindənmi, ya nədənsə, qapını açıb çölə çıxdı. Qolları qoynunda məzlum-məzlum mızıldandı:

– İndi mən taleyi kəm neyləyim, başıma haranın daşını salım ki, vəziyyətimi anlayasan? Həbsxanadan çıxıb kəndə – ata-anamın yanına getdim. Orda heç bir həftə də qalammadım. Sənin görüşünə, himayənə can atdım. Sən də ki, belə...

Durna xanım qəddini şax tutub dinmədi. Qapını çöldən tələm-tələsik kilidləyib, qızın biləyindən bərk-bərk yapışdı. Pillələri

sürətlə endi. Zərif ayaqqabıların nazik, dəmir dabanlarının qulaqbatıran iti tak-tukları deyəcəyi sözləri əvəzlədi.

Əfsun bir-iki dəqiqə çaş-baş dayandı. Sonra çamadanını qoltuğuna vurub, özünü bir də Durna xanıma yetirdi. Durna xanım qəti tərzdə elan etdi:

– Burdan oyana bizimlə bir addım da atmayacaqsan! İstəmirəm həyətdə məni səninlə görsünlər. Birdəfəlik başa düş ki, biz artıq yad adamlarıq. Sən adda adamı yerli-dibli unutmuşam. Həyatımda buraxdığım o axmaq hərəkətim mənə çox baha oturdu. Onlara görə xəcalətimdən utanıb yerə girdim. Xəstəxanaya düşdüm... Sözün kəsəsi, nifrət eləyirəm sənə. Get, öz tayını tap!!

Əfsun yumruğunu ürəyinin başına çırpıb zarıdı (bu, lotuluq deyildi. Çıxılmaz halının dürüst ifadəsi idi):

– Allaha, tanrıya and verirəm, Durna xanım, bu qədər amansız olma, it kimi qovma qapından. Ümidim təkcə sənədi. Səndən savayı gedib sığınacaq bir kimim-kimsəm yoxdu bu şəhərdə.

Durna xanım zəhləsi lap tökülmüş halda bildirdi:

– Mən öz ərimlə barışmışam. O, rüsvayçı davranışlarımı mənə bağışladı, günahlarımdan keçdi... Əlini üz məndən. Şirin aşıma bir də zəhər qatmağa çalışma. Yoxsa, daha yazıq günlərə qalacaqsan!

Əfsunun həniri batdı. Ağzında dili titrədi:

– Ba...şa düş...düm, anla...dım. Məhəbbət nifrətə çevrilib... – O, aşağı çökdü. Dizlərinin taqəti tükənmişdi. Domuşub inildədi:
– Yaxşı, evinə buraxmırsan, heç olmasa, gecələməyə bir ünvan ver. Qışın bu soyuğunda küçələrdə qalıb donmayım.

– Küçələrdə niyə qalırsan, nə çoxdu mehmanxana.

– Mehmanxana çox olmaqla deyil, məndə o imkan hanı? Ciblərimdə siçanlar civildəşir.

Bunu yalan demirdi. Kənddən bir azacıq cib xərcliyi ilə yola düşmüşdü. Atasının əvvəllərdəki böyük imkanları yox idi. Əfsun həbsxanaya salınan ərəfədə onun da vəziyyəti pisləşmişdi. Sovxoza mərkəzdən yoxlama gəlmişdi. İşdə külli miqdarda mənimsəmə və saxta sənədlər aşkarlanmışdı. Vəzifəsindən dərhal azad edilmişdi. Məsələyə prokurorluq, hüquq-mühafizə işçiləri qarışmışdı. Yumurtadan yun qırxanın dərisini soymuşdular. Bütün var-

yoxunu, “saxlanclarını” verib, tutulmaqdan canını zorla qurtara bilmişdi. Vaxtı ilə kəndin ən imkanlı adamı sayılan sabiq baş mühasib indi yoxsulluq həddində güzəran keçirirdi. Təzə sərgüzəştlər dalınca şəhərə üz tutan (kənddə dirçəlişə ümid çox az idi) oğlunu köhnələrki qaydada haylı-küylü xudahafizləşmək əvəzinə əllərini yana açıb köksünü ötürmüşdü.

Durna xanımın iti addımları alt mərtəbədə yavaşıdı. Nə isə düşündü. Qanrılıb işarətlə Əfsunu yanına çağırdı. Əl çantasından otuz manat pul götürdü (o vaxta görə bu az xərclik deyildi). Qızının başına dolayıb, sədəqə timsalında Əfsuna uzatdı. Və bir daha son dərəcə ciddiyyətlə eşitdirdi:

– Al, gərəyin olar! Ancaq bundan belə narahat eləmə bizi. Ümidini həmişəlik üz!

Əfsun sədəqəni minnətdarlıqla qapıb, söz verdi:

– Yüz faiz, lap min faiz arxayın ol, daha səni heç nədə narahat etməyəcəm.

**2.**

Durna xanımgil xeyli uzaqlaşana qədər o, həyətə çıxmadı. Pilləkənin sonuncu pilləsi üstündə oturub fikirləşdi: indi neyləsin? Hara getsin? Kimdən sığınacaq istəsin? Mehmanxanalarda gecələməkdən vaz keçdi. Durna xanımın sədəqəsinə heyfi gəldi, dar günü üçün saxladı. İşə düzəlincə onunla bir babat girlənməyə çalışardı. İş də ki, kim bilir, haçan və necə düzələcəkdi?

Tələbəlik yaxınlarını, yemək-içmək curlarını, şəhərdə yaşayan, ərki çatan kef əhlilərini xəyalında dolandırdı; xeyri olmadı. Heç birinin nə telefon nömrəsi, nə də ünvanı yadına düşmədi. Aradan çox keçmişdi. Həbsxana şəraiti hafizəsini korşaltmışdı. Telefon və ünvan yazılmış cib dəftərcəsi də haralardasa itib-batmışdı. Bəlkə də təhlükəsizlik əməkdaşları onun daha kimlərləsə əlaqə yaratdığını öyrənmək üçün xəlvətcə ələ keçirmişdilər.

Birdən yadına, necə oldusa, Bakıya ilk gəlişində – instituta qəbul imtahanları verdiyi vaxt kirayələdiyi mənzil düşdü. Bu mənzildə o, birinci kursun ortalarına qədər də qalmışdı. Sonra təklikdən darıxıb, xeyli rüşvət hesabına institut yataqxanasına

köçmüşdü. Amma mehriban, qoca mənzil sahibəsi ilə əlaqəni tamam üzməmişdi, hərdən-hərdən ona baş çəkmişdi. Atası da şəxsi ya idarə işlərinə görə şəhərə tələsik səfərlərində, mehmanxanalarda yer tapmayanda bu mənzildə gecələmişdi.

Sevincək ayağa qalxdı. Ünvana inamla yollandı. Ona qapını gözləri yaşlı, əhvalsız bir qarı açdı. Bu evin sahibəsi Qumaş arvad idi. Yetmiş beş yaşını bu yaxınlarda haqlamışdı. Başı da, çənəsi də əsirdi. Ancaq göyçək sifəti yenə də nurlu idi.

Əfsun Qumaş arvadın qüssəli ovqatından xoşlanmadı. Nəhsə yozdu. Qanı möhkəm qaraldı: "Uğurum nəs gətirir. Taleyim məni peşman qoymaqdan usanmır. Görəsən, indi hansı tərsliklə qarşılaşacam?.. Bu da məni qovsa, günüm göy əsgiyə düyüləcək..." – düşünüb, təlaşla əhvallaşdı:

– Salam, ay gözəl nənə! Necəsən? Nə var, nə yox?

Yad oğlanın ilk kəlmədən ona "nənə" deyə müraciəti, ərkli danışığı Qumaş arvadın bir az  acığına gəldi. Tükü seyrəlmiş qaşlarını narazılıqla qaldırıb saldı:

– Kimsən, a bala?.. Bir suyun şirin gəlir mənə. Tanışa oxşadıram, amba anşırammıram.

Əfsun mehriban sorğudan ürəkləndi. Bir addım qabağa durdu.

– Hə, hə! Lap yaxınca tanışıq. Evinizdə kirayənişin olmuşam.

Qumaş arvad gözlərinin yaşını uzun, enli önlüyünün ətəyi ilə qurulayıb, qarşısında büzüşmüş oğlana xeyli diqqətlə nüfuz etdi. Burnunu çəkdi.

– Andır kaftarrıx huş qoymuyub başımda, haçan qalıbsan bizdə?

– Səkkiz-doqquz il bundan əvvəl. Dörd-beş ay yaşayıb, sonra oxuduğum institutun yataqxanasına köçmüşəm. Hələ atam da şəhərə gələndə qalıb sizdə. Mehmanxanalara getməyib, mənimlə gecələyib.

– Hımm, hımm, – Qumaş arvad gecdən-gec xatırladı. – Düşdü yadıma. Amba adını unutmuşam.

– Adım Əfsundu, mehriban nənə. İcazə ver, içəri keçim. Söhbətimizi evdə eləyək. Soyuq hənirimi kəsir. Canımda üşütmə var.

– Buyur, ağrın alım, buyur. – Qumaş arvad yana çəkildi, yol verib, bekaraca qımışdı. – Çox qılıqlı oğlansan. "Nənə" sözünü elə şirin deyirsən, lap elə bil, öz doğmaca nənənəm.

Əfsun içəri adlayıb, dilinə təzə bal bələdi:

– Bilirsən niyə belədi, nənəcan? Çünki bizim nənələr başqa xalqların nənələrindən çox seçilirlər. Ziyadə mehribandırlar, insaflıdılar. Nəvələr üçün hər şeydən keçəndilər. Sən o tütyə nənələrin ən yaxşılarındansan. Evində qalan vaxtdan belə tanımışam səni. Bir əziz nənəm kənddədi, ikincisi də səni hesab eləyirəm. Mərhəmətini əsirgəmə, bu gündən ol mənim şəhərli nənəm.

Qumaş arvad nəmli kirpiklərini ağır-ağır döyəclədi:

– Hımm... çox bilmişsən... Gəl dalımca. Gedək mətbəxdə eliyək gapımızı. Ora istidi.

Əfsun bərk-bərk qovşurulub, əlini əlinə sürtdü; üşüdüyünü aşkar nümayiş etdirdi:

– İman yeyəsi ol, nənə! Soyuq canıma bərk keçib. Səhərin gözü açılandan bəri hey yüyür-yortdayam. Qılçalarımı bir hovur qatlayıb isti yerdə oturmamışam. İçim buz bağlayıb.

Mətbəxə keçiddə Əfsun evə göz gəzdirdi. İki otaqlı, kasıb avadanlıqlı mənzil çoxdan təmir edilməmişdi. Divar kağızları saralıb, rəngini tamam itirmiş; bir neçə yerdən qopmuş, yarıyadək cırılmışdı. Tavanları isə his-pas içindəydi, əyri-üyrü çatlar vermişdi. Qapı və pəncərə şüşələrinin bir neçəsinin yerinə karton yapışdırılmış, faner bərkidilmişdi. Döşəmə taxtalarının da ucları çürüməyə başlamışdı.

Qumaş arvad dərin köks ötürdü.

– Nə çox baxırsan, a bala?.. Otaqlar da öz sahibi təkin cındırraşıb. Təhər-töhürrərinnən idbarrıx yağır.

Əfsun məyus nəzərlərini otaqlardan çəkdi. Mənzilin miskinliyi ürəyini ağrıtdığını gizlətdi. Güc-bəla tapdığı sığınacağı pisləmək nəyinə gərək idi?

– Narahat olma, nənə. Məsələ evin köhnəliyində, nimdaşlığında deyil. Əsas budur ki, ev sahibinin özünün insanlıqda payı olsun. O da ki səndə boldu. Xoş rəftarlıq ən böyük var-dövlətdi.

– Ehh, bəxtəvər başıma! – Qumaş arvad özünü lağa qoydu. – Üzü daşdan, dəmirdən qayımam. Nə əriyirəm, nə tükənirəm!

Əfsun coşdu. Bəlağət dağarcığının ağzını geniş açdı:

– Yox, nənəcan! Heç elə demə, sən köhnəlməz nənəsən. Bir kitabdan oxumuşam ki, həqiqi nənələrin ürəkləri tükənməz xəzinədi. O ürəklərdə müdrik kəlamlar, hikmətlər saxlanılır. Adət-

ənənələr qorunur. Baba və nənələr olmasa, xalq da, millət də olmaz. Nəsillər öz köklərindən, mənşələrindən aralı düşərlər. Başqa xalqlar içində əriyib-itərlər. Həmən kitabda o da yazılıb ki, hansı nəvənin sinədəftər nənəsi yoxdursa, onun şirin laylalarını, zümzümələrini dinləyib, ta qədimlərdən gələn dastanları, əfsanələri eşitməyibsə, belələrindən həyat üçün faydalı adam yetişmir, alayarımçıq olurlar.

Qumaş arvad ustuf-ustuf yırğalandı:

– Kitab yazan doğru yazır. Nənələr söz-gap dağarcıqlarıdı. Dərd-azar tuluqlarıdı. Ağızları açılmasın, açıldımı yüz arxın suyunu bir yerə qatacaxlar. Aranı dağa, dağı da arana daşıyacaxlar. Dindirdiyinə peşman eliyəcəklər... Hə, nəysə, keç otur, bir istəkan çay verim, iç, canın qızsın.

– Çox sağ ol, nənə. Ürəyimdən xəbər verdin. Çay üçün əldən gedirəm. Ancaq yaxşı olardı ki, qalacağım otağı əvvəlcə göstərəsən, çamadanımı ayaq altından götürüb aparım ora, arxayınlaşım.

Qumaş arvad dalğın-dalğın yerə baxdı.

– Mən çoxdandı kirəkeş saxlamıram, bala. Evimiz darısqaldı, özümüz zornan sığışırıq.

Əfsun lap yazıqladı. Boynunu bükdü.

– Heç olmasa, iki-üç günlüyə... Başqa güman gələn bir yerim yoxdur.

– Hə, onda çamadanını apar axırımıncı otağa... Amba bu şərtnən ki, sözünə xilaf çıxmıyasan.

– Arxayın ol, nənə. Mən sözünə bütöv oğlanam. Ola bilsin işlərimi elə sabah düzüb-qoşdum.

– İşini Allah ovandına salsın!

–Yüz yaşa, nənə! Diləyini Allah eşitsin.

Əfsun ona göstərilən otağa yönəldi. Bu, uzunsov, balaca otaqca idi. Haçansa arakəsmə edilmişdi. Yuxarı başda çox köhnə, sınıq-salxaq paltar şkafı dururdu. Bərabərinə pas atmış dəmir çarpayı yerləşdirilmişdi. Ondan bəridə – pəncərəyə yaxın küncdə kiçik mətbəx masası həcmində dəyirmi masa qoyulmuşdu. Masanın üstünə dəftərlər, kitablar səpələnmişdi. Böyürdəki iki səndələ isə qız paltarları səliqəsiz halda atılmışdı. Cürbəcür rəng-

li bu paltarların – yubka və qoftaların iri yaşlı qıza məxsusluğunu Əfsunun sərraf gözləri dərhal seçdi. Sifətində sevinc təbəssümü cilvələndi: "Allah xoşbəxtlik qapısını adamın üzünə bir yerdən bağlayanda, başqa yerdən açır, – fikirləşdi. – Durna xanımdan əlim üzülsə də, könül məsələm, diyəsən, burda düzələcək..." Dala qanrıldı. Mətbəx astanasında onu gözləyən Qumaş arvaddan soruşdu:

– Bu dəftər-kitablar kimindi, nənə?!

– Nəvəmindi. – Qumaş arvad dilucu dilləndi. – Orda nəvəm yatır. Dərsdərini hazırrıyır... Hələlik keçər mənim yanıma, sən özünə yer tapıncan birrikdə qalarıx.

Əfsunun çiçəyi çırtladı.

– Nəvən yadımdadı, nənə. Mən görəndə çox balacaydı. İndi böyümüş olar. Neçənci sinifdə oxuyur?

– Onuncuda.

– Nə yaxşı! – Əfsunun fərəhi öz-özünə aşıb-daşdı: "Qurdun qismətini duman yetirir. Lap babımdı. Kaş him-cimləşə biləydik". Əfsun niyyətinə dolayısı ilə yaxınlaşdı: – Ay mənim qəşənglərin qəşəngi nənəm, nəvən də sənə oxşayırmı?

Qumaş arvad dinmədi. Sualdan xoşu gəlməmişdi. Əfsun səhvini əlüstü düzəltdi:

– Ayrı mənada soruşmuram, nənə. Xasiyyətini xəbər alıram. Qulluqdar qızdımı? Ev işlərini yaxşı bacarırmı? Sənə köməyi dəyirmi?

– Nayrazı döyüləm.

– Ərköyündü, ya üzüyola?

Qumaş arvadın sifəti turşudu.

– İnkir-minkir suallarnan yorma məni, – dedi. – Onnansa, çamadanı at orda bir küncə. Gəl, çayını iç.

– Hə, hə, can nənə. Doğruca deyirsən. Çay bu dəqiqələrdə şəfaverici loğmandı... bağışla, başını çox ağrıtdım.

Mətbəxə keçdilər. Qumaş arvad qonağının qabağına çay süfrəsi açıb, yemək də təklif etdi:

– Çöldən gəlifsən, bala. Acdığın-zad da olar? Utanma, açığını de.

Əfsunda utanan üz hardaydı. Təklif olunmasa, özü istəyəcəkdi.

– Aclıq əhədimi kəsib, nənə. Hər nəyin var, gətir. Eləcə pendir-çörək də bəsimdi.

Qumaş arvad süfrəyə yağ, pendir və bal gətirdi. Əfsun çayını yarıya qədər hortladıb, yeməyə acgözlüklə girişdi. Alaqarın olanda, dilini yenidən işə saldı:

– İncimə, nənə, səndən bir söz də soruşmaq istəyirəm... Gözümə yaman qəmgin görünürsən. Allah eləməmiş, bir pis hadisəmi var? Bayaq qabağıma da gözü yaşlı çıxmışdın.

Qumaş arvad tezcə umaxşıdı. Boğazını boğan acı qəhər dodaqlarının uclarını əydi.

– Bə bilmirsən?!

– Nəyi, nənə?

– Qırğını... – Qumaş arvad birdən uşaq kimi hönkürdü: – Sırağa gün gecə yarısı Sovetin qo...şunu camaatı güllə...lədi.

Əfsun yalan-doğru həyəcanlandı:

– Eşitmişəm o dəhşəti, nənə. Burda, Bakıda – Dəmiryolu vağzalında eşitdim. Kənddə bu barədə heç nə bilmirlər. Dünən radio da, televizor da susurdu. Deyilənə görə, ölən, yaralanan çox olub.

Qumaş arvad gec toxtadı:

– Şəhərdə heç görünməmiş çatha-çat, parta-partıydı. İşıxlı güllələr göydə sayım-sayım sayrışırdı, qırmızı dolu təkin yağırdı, ölənnərin aralarında qocalar, uşaxlar da var. Bayax televizorda göstərirdilər. Meyitlər yan-yana düzülmüşdü... Axıracan baxammadım, ürəyim xaraf oldu. Sən qapını döyənnən bir az əvvəl keçirmişəm televizeri.

– Əclaflar!.. – Əfsun söydü: – Deməli, əsgərlər öz vətəndaşlarına atəş açıblar?!

– Heç aman vermiyiblər... ot-ələf təkin biçiblər...

Əfsun ora-bura boylandı.

– Hanı televizor, nənə?.. Harda qoyulub?

– Orda... böyük otaxdadı... – Qumaş arvad göz yaşlarını silə-silə işarə etdi. – Get, yandır. Öz gözdərinnən tamaşa elə. Mən dözəmmirəm.

Əfsun yerindən sıçrayıb, göstərilən otağa yüyürdü. Kiçik həcmli, köhnərək televizoru xəttə qoşdu. Ekran işıqlanan kimi

gecədəki vəhşiliklər görüntüyə gəldi. Eybəcər hallara salınmış şəhidləri soyuqqanlı, ürək ağrısız seyr etmək mümkün deyildi. Kimisinin başı paralanmış, gözləri çıxarılmış, kimisinin sinəsi dəlik-deşik edilib al-qana boyadılmış; kimisinin qarnı yırtılıb bağırsaqları çölə tökülmüşdü. Bir çoxları da tək qollu, tək qılçalı idi. Qan gölməçələri içindəki uşaq və qadın cəsədlərinin görüntüsü daha dəhşətliydi...

Əfsun verilişə sona qədər baxa bilmədi. Televizoru söndürüb, dəhlizə atıldı.

– Nənə, mən getdim!

– Hara, a bala?

– Ora!.. – Əfsun tələskənlikdən tövşüdü. – Meydana!.. "Hökumət evi"nin qabağına. Televiziya ilə elan elədilər ki, cənazələri saat birdə o meydana gətirəcəklər. Onlarla ümumxalq vidalaşması olacaq.

– Can, can, ay günahsız balalar! – Qumaş arvad sinəsini yumruqladı. – Get, oğul, get. Orda gördüklərini, eşitdiklərini gəlif danışarsan... Onacan da nəvəm dərsdən qayıdar, otağını sahmana salar, – deyib əllərini göyə qaldırdı. Allahı qəsəmə, canilərə divan tutmağa çağırdı: – Nicatını bizdən əsirgəmə, İlahi. Özün ver o qaniçənlərin cəzasını!!

## 3.

Əfsun Zamanlı "Azadlıq" (o vaxtkı Lenin) meydanına çatanda solğun qış günəşi zirvələnmişdi. Sazaqlı hava xeyli isinmişdi. Şəhər üzərinə alatorandan çökmüş duman günortaya yaxın sorulmuşdu. Səma büsbütün açıq idi.

Ovqatı pozulmuş Bakı tanınmaz olmuşdu. Həmişəki hay-küylərindən, qaynarlığından əsər-əlamət qalmamışdı. Hər şey, hər yan susurdu. Qış girəli hey çırpınan, qabaran, şahə qalxmış dalğaları ilə sahilləri aramsız döyəcləyən Xəzər dənizi də süst idi, hamarlanmış səthi hərdən ölgün-ölgün tərpənirdi. Sanardın, can verirdi.

Get-gəlli, izdihamlı küçələrdə maşın hərəkəti son dərəcə seyrək idi. Hüznlü, qaş-qabaqlı adamlar dəstələrə bölünüb başlarını köksələrinə əyərək, ağır addımlarla meydana doğru axışırdılar. Qabaq cərgələrdə aparılan qara lent haşiyəli bayraqların başları aşağı salınmışdı. Ağ və qırmızı rəngli parçalar, kağız plakatlar üzərinə

yazılmış: “Sovet ordusuna ar olsun!”, “Qatillərə lənət!”, “Azadlıq şəhidlərinin pak ruhlarına alqış!” şüarları əllərdə yellənirdi.

Kütləvi qəzəb, amansızlığa qətiyyətli etiraz əhalini ayağa qaldırmışdı. Qorxu hissini hamıda boğmuşdu. Qocalı, cavanlı, qadınlı yürüşə qoşulmuşdular. Aralarında tələbələr, məktəbli uşaqlar çox idi. Canilərə – qırğını törədənlərə lənətli ittihamlar yağdıra-yağdıra, dəstələrə bölünüb intizamla irəliləyirdilər. Qızlar, gəlinlər qara paltar geyinmişdilər.

Böyük meydan bir  azdan aşıb-daşdı. Dağ seli kimi, hər an, hər dəqiqə gurlaşan, ətrafı bürüyən insanları yaxınlıqdakı “sahil parkı” da tutmadı. Aramsız uğultuları, ağlaşma – şivənləri, səs-küyləri tezliklə matəm musiqisi müşayiətə başladı. Tar, kaman, qaboy, qarmon, klarnet həzin-həzin, növbə ilə dillənir; onsuz da gərgin əsəbləri lap tarıma çəkir, ehtirasları bir az da coşdururdu. Ürək dağlayan bu musiqiyə dənizdə lövbər salmış irili-xırdalı gəmilər də qoşulmuşdu. Uzun fitləri, həyəcan siqnalları ilə baş vermiş müdhiş hadisəyə etiraz qıcıqlarını gücləndirirdi.

Havada vertolyotlar da uçuşurdu. Şəhər üzərində hey dövrə vurur, izdiham üzərinə qanad gərib uzaqlaşırdılar. Bunlar, çox yəqin ki, xalqla həmrəylik uçuşları deyildi, rəsmi dairələrin izdihama nəzarətçiləri idilər.

Meydan həndəvərlərində (bir xeyli aralı) əlisilahlı qoşun hissələri, hərbi texnika da vardı. Tanklar, transportyorlar və qeyri zirehli, zəhmli maşınlar sıx-sıx sıralanıb, xalq üstünə yeriməyə hazır dayanmışdılar. Bərilərdə isə milislər, yüksək çinli daxili qoşun zabitləri nümayişi dördgözlə izləyirdilər. Hələlik heç nəyə müqavimət göstərmir, sakit davranırdılar.

Əfsun Zamanlının nəzərləri ön tərəfə – “xitabət kürsüsü” səmtə zillənmişdi. Əzəmətli və nəhəng, həm də memarlıq cəhətdən göz oxşayan “Hökumət evi”nə calaqlanmış, üzü meydana sarı bu “xitabət kürsüsü”ndə qəribə-qəribə adamlar göründülər. Onlar dövlət rəsmilərinə bənzəmirdilər. Geyimləri də, davranışları da çox sadə idi. Əvvəllər buraya partiya-hökumət rəhbərləri; nazirlər, komitə sədrləri, nomenklatur vəzifə sahibləri, ordu generalları və bir də xüsusi seçimli ziyalılar, orden-medallı zəhmət adamları dəvət

olunardılar. Sovet dövlətinin təntənəli ildönümlərində, “Bir may” bayramında həmən kürsüdən parad qəbul edər, şənlik nitqləri söyləyər, bayrama toplaşanları salamlayardılar. İndi onları müxalifətçilər əvəzləyirdilər...

Mikrofon qəfil guruldadı. Kim isə gər, qəhərli səslə şəhid cənazələrinin gətirildiyini bildirdi. Meydanda onlara yol açılmasını xahiş etdi. Sonra mikrofonun önünə axundlar, mollalar, qeyri-din xadimləri yığışdılar. Ucadan “Yasin surəsi” oxundu. Al-qumaşa bürüdülmüş cənazələri çiyinlərində gətirənlərin ilk dəstəsi meydana daxil oldu.

Şivən qopdu. Qoftalarının sinə tərəfi cırım-cırım, saç-birçəkləri yolum-yolum ana-bacılar, gəlinlər-qızlar heykirdilər. Tükürpədirdici fəryadlar qulaq batırdı. Üzlər cırmaqlandı, yaxalar təzədən cırıldı, saç-birçəklər bir daha yolmalandı. Aramsız deyilən ağılar, bayatılar, zümzümələr matəm musiqisinə qarışıb, acı faciə simfoniyası yaratdı; dözümlü, toxtaqlı kişiləri də ağlatdı.

Cənazələr gətirilməkdə davam edirdi. Sayı bilinmirdi. İzdihamda ağızdan-ağıza gəzən sözlərə görə, şəhidlərdən ətraf kənd qəbiristanlıqlarında dəfn edilənlər, rayonlara aparılanlar da çox idi.

Azadlıq şəhidləri ilə vidalaşma mərasimi gərgin və uzun sürdü. Şəhidlərin ruhuna zikr olunan dualar bitən kimi, siyasətçilər növbə ilə nitqlərə başladılar. “Xalq cəbhəsi” liderləri alovlu çıxışlarla mövcud hakimiyyətə qarşı ciddi ittihamlar irəli sürdülər. Taqsırsız, əliyalın insanların qətlə yetirilməsində, amansız qırğın törədilməsində günahlandırdılar. Vəhşilik törətmiş Sovet Ordusunu və onun qaniçən komandanlığını bir ağızdan lənətlədilər. Yerli hakimiyyət rəhbərlərindən də yan ötmədilər. Ordunun şəhərə yeridilməsinə, dinc əhaliyə atəş açılmasına razılıq vermiş fərsiz respublika başçılarını öz xalqına düşmən damğası ilə damğaladılar. Və sonda camaatı mütəşəkkil mübarizəyə səslədilər. Çağırışa elm, ədəbiyyat, mədəniyyət xadimləri, eləcə də başqa ixtisas sahələrinin qabaqcıl nümayəndələri qoşuldular. Ağıllı, məntiqli fikirlər söyləyənlər də oldu, boşboğazlıq eləyənlər də.

Əfsun çıxışları dinləyə-dinləyə, özü də nitq söyləmək həvəsinə düşdü. Söz üyütməkdə, maşallah, çənəsi saz idi. Natiqlərin ək-

sərindən yaxşı qarşılanardı. Həmən anlarda ağlına bu da yerləşdi ki, belə fürsət əlinə çətin düşər. Müxalifətçilərə özünü zərərdidələrdən, sovet quruluşunda nahaq zərbə alanlardan, hakimiyyət əleyhdarlarından biri kimi tanıtsın, hörmətə minsin. Axı, beş il həbs cəzası çəkmişdi. Gəncliyinin ən yaxşı illərini nəmli məhbəs divarları arasında keçirmişdi. Hansı günaha görə tutulduğunu bu qarışıq, dolaşıq zamanda kim arayıb-axtaracaqdı? Bulanlıq suda balıq tutmaq məqamı idi. Quruluş əleyhdarı qiyafəsinə girmək hazırkı dövr üçün ona daha sərfəli ola bilərdi. Lakin nə qədər cəhd etsə, vurnuxsa da onu "xitabət kürsüsü"nə yaxın buraxmadılar. Döşündən itələyib dala qaytardılar. Bir azdan matəm mitinqinin bitdiyi, çıxışların kəsildiyi elan edildi.

İzdiham ləngərləndi. Sanki zəlzələ baş verdi. Bu qeyri-adi tərpəniş iki-üç dəfə təkrarlandı. Həyəcanlı, intizarlı camaat şəhidləri ziyarət etməyə imkan axtardı. Çaxnaşma başladı. Adamları sakitləşdirmək, nizam-intizam yaratmaq lazım gəldi. Belə getsə, cənazələr ayaq altında qalar, əlavə peşmançılıq törəyərdi. Müxalifətçilərdən ibarət qeyri-rəsmi dəfn komissiyasının üzvləri və vida mərasiminin təşkilatçıları əl-ələ tutuşub araya sədd çəkdilər, qarışıqlıq düşməsinin qarşısını aldılar. Əfsun da kənarda seyrçi kimi dayanmadı. Asayişi qoruyanlar sırasına qatıldı. Gözə görünmək, diqqəti çəkmək üçün bu da bir fürsət idi. Haylı-küylü yalvarış və qılıqla, bəzən də zor işlətməklə çaxnaşanların qabağına durdu, cənazələri aparmağa yol açmaqda özünü əsas təşkilatçılardan biri kimi apardı. Yeri gələndə, ona-buna göstərişlər verib, istədiyinə tezcə nail oldu. Asayiş köməkçilərinin əksəriyyəti onun əmri, sərəncamı ilə davrandılar.

Mərasimə rəsmi cavabdehlər kənar şəxslərin işə qarışmasından ciddi narahatçılıq keçirdilər. Belələri gözlənilməz təxribat törədə bilərdilər. Nə çoxdu daxili və xarici casuslar, maskalı fırıldaqçılar.

Əfsunu yaxaladılar. Arakəsməyə alıb təpindilər:

– Bura bax, ey!.. Sən kimsən bu məsələyə burnunu soxursan?! Sürüş burdan!

Əfsun geri çəkilmədi. Mülayimliklə:

– Narahat olmayın, qardaşlar! – pıçıldadı. – Mən sizlərdənəm.

Azadlıq uğrunda işgəncələr çəkənlərdənəm. Şanlı şəhidlərimizin ruhunu şad eləmək mənim də mənəvi borcumdu. Haqqım çatır buna!

Höcətləşmə yeri deyildi. Güzəştə getdilər. Əfsun daha da fəallaşdı. Harda aş, orda baş oldu.

Cənazələr çiyinlərə götürülən məqamda təlatüm təzələndi. Qadınlar, qızlar, gəlinlər sızıldaşdılar, xısın hönkürtülər ucaldı. Ürək göynərtiləri yeni vüsət aldı. Ağıçılar ağı dedilər, yanğılı bayatı çəkdilər, ağlaşmanı şiddətləndirdilər. Məğrur kişilər də ciblərindən yaylıq çıxardıb gözlərinə basdılar.

Bu arada mikrofon yenidən guruldadı. Qafqaz müsəlmanlarının şeyxi camaata xahişyana üz tutdu:

– Möhtərəm tədbir iştirakçıları, əziz müsəlman qardaş və bacılarım, rica eləyirəm bir hovur məni dinləyəsiniz, – dedi və qəhərlə nəfəs dərdi. – Səbirli, iradəli olun! Təmkininizi, qürurunuzu pozmayın! Gəlin qəddar düşmənlərimizi üstümüzə güldürməyək. Çox şərəfli bir amal, müqəddəs arzu uğrunda canlarını fəda etmiş igid oğul və qızlarımızı, mərd qocalarımızı, məsum körpələrimizi son mənzilə ləyaqətlə yola salaq. Qadir Allahdan dua diləyək ki, bu günahsız bəndələrinin cənnətməkan ruhlarını xürrəm eləsin. Qaniçən düşmənlərimizin ağırdan-ağır cəzasını versin. Qoy qurban olduğumuz Allah-təala mərhəmətini bizdən əsirgəməsin, ali məqsədimizdə bizə arxa dursun, Amin!!

Şeyxin son kəlməsini bütün mərasim iştirakçıları bir ağızdan təkrarladılar.

Mikrofona ən sonda çal saqqallı, hündürboylu, qaraşın sifətindən hədsiz qəm-qayğı yağan, əlli-əlli beş yaşlarında, ziyalı görkəmli bir nəfər yaxınlaşdı. Əfsun onu tanımadı. Saqqallı kişi əllərini qoynunda çarpazlayıb, köksünü irəli verdi. Camaata aramla, təmkinlə müraciətə başladı:

– Hörmətli həmvətənlilərim, sevimli və qüdrətli xalqım! Bu gün unudulmaz bir gündür. Tarix kitablarında, salnamələrdə öz parlaq əksini tapacaq, kino lentlərinə çəkilib, neçə-neçə nəsillərə ötürüləcək, əbədiləşəcək, qəmli olduğu qədər də şanlı gündür! Azadlıq heç bir dövrdə qurbanlarsız, məhrumiyyətlərsiz əldə olunmayıb. Müstəmləkəçilik boyunduruğundan qurtarıb, müstə-

qillik qazanmış xalqlar bu müsibətlərdən keçiblər. Çox madar oğullar, kişiqeyrətli qızlar itiriblər. Amma təəssüflər ki, bizim istiqlal itkilərimiz xəyanətin, namərdliyin nəticələridir. Adları, soyadları bizim xalqa məxsus; ürəkləri, ruhları isə yadlara xidmət edənlərin törətdikləri dəhşətli faciədir. Heç eybi yoxdur! Lap tezliklə o xainlər, murdar cinayətkarlar cəzalarını alacaqlar. Ədalət məhkəməsi önündə bu rəzalətin cavabını verəcəklər. Qoy o milli çirkinlər sevinməsinlər, yəqin bilsinlər ki, şəhidlərimizin qanı batmayacaq. Biz qalib gələcəyik! Əziz qardaş və bacılar, hər birinizi sıx birliyə, mətinliyə çağırıram. Birləşib möhkəm yumruğa dönmüş xalqı heç bir qüvvə sarsıda, diz çökdürə bilmir. Səbriniz böyük, mübarizə əzminiz tükənməz olsun!

İzdiham həmrəylik bildirdi. Hirslə düyülmüş yumruqlar başlar üzərinə dikəlib yelləndi. "Düşmənlərə ölüm!" – səsləndi. Bunun ardınca da "Dəfn komissiyası"nın sədri günün vacib xəbərini çatdırdı:

– Mərasimin davamı "Dağüstü park"da olacaq. Şəhidlər orada dəfn ediləcəklər. Müqəddəslərimizin ruhuna hörmət üçün cənazələr ora qədər çiyinlərdə aparılacaq. Güclü, sağlam cavanlar irəli gəlsinlər. Kəcavəyə yaxınlaşsınlar. Nizamla, növbə ilə çiyinlərini tabut altına versinlər. Ancaq lazımsız sıxlıq yaratmasınlar. Kəcavəni müşayiət edənlər isə ara saxlamalıdılar... Allah qeyri xətalardan qorusun bizi!

Boylu-buxunlu, pəhləvan cüssəli oğlanlar cənazələri dərhal dövrələdilər, növbəyə dayandılar.

Mollalar "xitabət kürsüsü"ndən düşüb önə keçdilər. Dualar oxundu, cənazələr çiyinlərə hop götürüldü. Karvan tərpəndi.

Sahil küçəsi heç belə insan daşqını görməmişdi. İzdiham dörd cərgəyə düzülsə də, bir az irəlidə daşqın böyüdü. Axına qonşu küçələrdən də qoşuldular. Səkilərdə də boş yer qalmadı. Azyaşlı uşaqlar da, ayağı yer tutan qarı-qocalar da özlərini matəmə yetirmişdilər.

"Kəcavə" yola tam düzlənən kimi, qəmgin musiqi təzələndi. Gəmilərdən fitlər gücləndi. Ana-bacı, qız-gəlin fəryadları artdı, sükuta qərq olmuş yaxın küçələrdə güclü əks-səda verdi.

Matəm karvanı "Azneft" tərəfdən Filarmoniya binasına doğru

dikləléndə yolun hər iki tərəfində sıxlaşıb tamaşaya durmuş gözüyaşlı adamlardan cənazələr üstünə qırmızı qərənfillər “yağışı” yağmağa başladı. “İstixana”larda yetişdirilmiş tər-təzə güllər, çiçəklər hər yandan ayaqlar altına səpələndi, yolu bəzədi. Qəzəbdən alovlanmış ürəklərə bu da xeyli təsəlli idi.

Ən təsirli, ən sarsıdıcı mənzərə isə dörd nəfər ahıl kişinin balaca uşaq cənazəsini ağır qaşqabaqla lap qabaqda aparmaları idi. Yəqin ki, bu ağır zəhmli kişilər mərhum körpənin qohumları: əmi-dayıları idilər. Balaca şəhidin böyüdülmüş şəkli tabutun ön tərəfinə bərkidilmişdi. Qara lent haşiyəli bu şəkildən  çox göyçək, şən baxışlı oğlan uşağı boylanırdı. Mənalı-mənalı qımışan körpə ona vəfasız çıxmış həyatdan, qətlinə qıymış canilərdən sanki acıq çıxırdı. Bu mənzərəyə heç kim laqeyd qala bilmirdi. Gözlərdən yaş öz-özünə axırdı...

**4.**

“Dağüstü park” (sonralar o “Şəhidlər xiyabanı” adlandırılacaqdı) görkəmini bu gün çox dəyişmişdi. Aşağılarından ta zirvəsinə – qəbirlər qazılan yerə qədər, bütün yol kənarlarına ağ və qırmızı qərənfillər naxış-naxış düzülmüşdü. Dar macalda bir belə güllərin haradan və necə gətirildiyi heyrət doğururdu. İzdihama insan axınının arası hələ də kəsilmirdi. Sıralar uzandıqca – uzanırdı. Öndə gedənlər parka çatmışdılar. Arxadan gələnlər isə sahil küçəsi ilə addımlayırdılar.

Cənazələr hazır qəbirlərə eyni vaxtda, müsəlman qaydası ilə sallandırıldı.

Qadınlar burada da həşir-qiyamət qopartdılar. Onların qəbiristanlığa gəlməsinə, adət üzrə, icazə verilməsə də bir çoxları üzə durmuşdular, dava-qalmaqal salıb, öz zorlarına gəlmişdilər. Bunlar şəhidlərin ana-bacıları, doğmaları idilər. Onları bağrıyanıq qoymağa heç kəsin insafı  yol verməmişdi.

Vay-şivənlər ərşə dayandı. Saçyolmalar, üzcırmalar, dizləri, sinələri döyəcləmələr burda bir az da gücləndi. Mollalara son vida duasını bitirməyə aman olmadı. Ağı deyənlərin, bayatı çəkənlərin qışqırtılı səslərindən heç nə eşidilmədi. Bayılan, özündən gedən

kim, ürəyi keçən kim! Həşir-həşirə qarışdı. Elə həmən anlarda da ağlagəlməz, təsəvvüredilməz dəhşət törəndi. Şəhid analarından biri gözdən yayınıb, özünü qəbrə atmağa, oğlu ilə birlikdə diri-diri basdırılmağa cəhd göstərdi. Bu, cavanca gəlin idi. Cənazələr karvanı önündə gətirilmiş uşağın bədbəxt anası idi...

Əfsun uzaqda deyildi. Yeni fəlakətdən duyuq düşmüş kimi, həmən anda yana çöndü. Qəbrin qaşına çatıb, özünü məzarın içinə athaatda, özünü yetirib arxadan gəlini tutdu. Var gücü ilə qırağa çəkdi. Hər ikisi böyrü üstə yerə sərildi. Əfsunun dizləri və dirsəkləri daş-kəsəyə dəyib sıyrıldı. Gəlin isə huşunu bayaqdan itirmişdi. Torpağa döşəli qaldı.

Başları hay-küyə, vay-şivənə qarışıb, hadisələrə nəzarəti itirmiş mərasim təşkilatçıları ayıldılar. Vaqiə yerinə yüyürüşdülər. Hardansa həkim və tibb bacısı da özünü yetirdi. İlk tibbi yardım göstərildi. Gəlinə ürəksakitləşdirici iynə vurub "təcili yardım" maşını ilə yaxınlıqdakı xəstəxanaya göndərdilər. Əfsunun yaralarına yod sürtüb sarıdılar. Aradan bir müddət keçəndən sonra xəstəxanadan xəbər çatdırıldı ki, gəlini əcəlin pəncəsindən çətinliklə ala biliblər.

Əfsunu təbrik etdilər, "sağ ol" dedilər. Qəmli baxışlardan ona aydın minnətdarlıq oxundu. Adi şücaəti əsil qəhrəmanlıq kimi qiymətləndirildi.

Artıq şər qarışırdı. Axşam toranlığı şəhər üzərinə qanadını gərhagər idi. Adamların çoxu dağılışmışdı. Qəbirlərin yanında yalnız şəhidlərin öz ailə üzvləri qalmışdı. Təzə məzarların yan-yörəsini sahmana salır, torpağının daş-kəsəyini təmizləyib hamarlayır, üstünün güllərini ibçin-ibçin düzür, dövrəsini qırmızı lentlə çəpərləyir, "yaraşığa" mindirirdilər. Daha bilmirdilər ürəklərinin əbədi ayrılıq yanğısını nə ilə və necə söndürsünlər.

Hava tam seçər-seçməz olanda, qohumlar da seyrəldilər. Həyatın dəyişilməz ölüm-itim qanunu ilə barışıb, bölük-bölük evlərinə qayıtdılar. Əfsun da sona qalanlar arasındaydı. Qohum-qonşu kişiləri ağlamaqdan, başlarını, dizlərini, sinələrini yumruqlamaqdan heydən düşmüş ahıl anaların, xala-bibilərin, bacıların qollarına girərək, onları qəbirlərdən güc-bəla ilə aralasalar da vay-şivənlər, yorğun-arğın sızıltılar hələ də eşidilməkdə idi.

Enişlərdə, dönüm-döngələrdə qərənfillərin naxışlı düzümü pozulmuş, tapdanıb xıncım-xıncım edilmiş; əzik-üzük vəziyyətdə kənarlara atılmışdı. Bir xeyli hissəsi də asfaltlara yapışıb qalmışdı. Sanardın, indi də bu yamangünlü çiçəklər ağlaşma qurmuşdular...

Təklənmiş Əfsun dağın ətəyində – şəhərə girəcəkdə köhnə yataqxana yoldaşı Fəridlə rastlaşdı. Zəif küçə lampası işığında onu güclə tanıdı. Fəridin belə çətin tanınmasına günahkar küçə işığının zəifliyi deyildi. Tələbəlikdəki arıq, çəlimsiz Fərid zahirən başqalaşmışdı. Əməllicə ətə-qana dolub kişiləşmişdi. Geyim-kecimi də diqqət çəkəndi. Paltosu, boğaz şərfi təp-təzəydi. Başındakı papaq isə bahalı dəridən tikilənlərdəndi. Əfsun ürəyində paxıllandı ona: "Gorun çatdasın, baba! Bu da adam olub, adamlar cərgəsinə qatılıb..." – düşündü. Üzdə isə özünü şad göstərdi:

– Ə, Fərid, sənsən?! Tfu-tfu, balam, göz dəyməsin, maşallah, çox qəşəngləşibsən. Gözəllər könlünə od salanlardan olubsan, – dedi. Gülə-gülə əl tutuşdu. Hətta onu qucaqlayıb öpdü də. – Səni belə şıq geyimdə, bazburtola görməyimə hədsiz şadam.

Fərid soyuqtəhər görüşdü. Yataqxana yoldaşının "sərgüzəştlərindən" xəbəri vardı.

– Sən də çox dəyişibsən, – dedi. – Özün tanışlıq verməsən, tanımazdım.

Bu soyuqluq Əfsunun mənini zədələdi. Ancaq incidiyini büruzə vermədi.

– Ehh, əzizim Fərid, – dedi, – başıma gətirilən haqsızlıqlara mən idim dözdüm. Duz dağı olsaydı, çoxdan əriyib, yeri dümdüz qalardı. Nahaqdan şərlənmək, həbsxana künclərinə atılmaq, məhrumiyyətlərə qatlaşmaq böyük zülmdü. Allah onu heç kəsə qıymasın.

Fərid ciddi və açıq danışdı:

– Səni heç kim şərləməmişdi. Tələyə dələduzluq üstündə düşdün. Bunu bütün institut bildi. İclaslarda antipod bir ünsür kimi hallandırdılar səni.

Əfsun qaraçılar sayağı and-qəsəmlə daş atıb başını onun altına tutdu:

– Yox, əsla yox! Sənin əziz canın üçün sırf yalandı, bədxahların uydurmalarıdı! Özün ki bələdsən mənə. İki ilə yaxın otaq yoldaşı

olmuşuq... Zəif oxuyan tələbələrə kömәkdən, xeyirxahlıqdan savayı neyləmişəm mən?

Fərid sataşqan təkzib verdi:

– Yanmayan yerdən tüstü çıxmır. Nəsə eləyibsən ki, cəzasını çəkibsən... Dolanışığın tələbə dolanışığına heç oxşamırdı. Bəy, xan balası kimi yaşayırdın.

– Bunun səbəbi sənə hamıdan yaxşı bəllidi. Cananımın hesabınaydı onlar. Elə onun da zibilinə düşdüm. Sonradan məlum oldu ki, tutulmağıma cananımın əri binagüzarlıq eləyib. Qisasını alıb məndən.

– Amma sənin ucbatından iki müəllimimiz həbs olundu. “Qaraqabaq” adlandırdığımız hörmətli professor İmanlını da institutdan uzaqlaşdırdılar.

Əfsun mövzunu tələsik dəyişdi:

– Bu, qəliz məsələdi. Başqa bir vaxt açıb deyərəm hər şeyi. Özün barədə danış. Sur-sinçindən görünür ki, imkanların yaxşıdı. Harda işləyirsən?

Fərid başını dik tutdu. Səlahiyyətli adamlara məxsus əda ilə yırğalandı. Yəqin ki, tələbəlik illərində Əfsunun onu saymamağının heyfini çıxırdı.

– “Yardım kom”da, – dedi.

Əfsun xeyli duruxdu.

– O nə təşkilatdı?.. Qəribə adı var... Təzə yaradılıb-nədi?

– Hə, təzə yaradılıb... – Fərid qürurla vurğuladı. – Bir ildən bir az artıqdı... İdarənin bütöv adı “Qarabağa yardım komitəsi”di.

– Orda işin-gücün nədi? Babat bir vəzifən varmı?

– Var!.. Komitənin maliyyə məsələlərinə baxıram. Şöbə müdiriyəm.

Əfsun həsədini gizlətməyi bacarmadı:

– Gorun çatdasın, baba!.. Ə, deməli, orda hamı sənin əlinə baxır... Təbrik eləyirəm. Qazancın-filanın pis olmaz...

– Hə, pis deyil. Maaşım yüksəkdi.

Əfsun ona paxıl-paxıl baxdı. Tezcə də xahişə keçdi:

– İstərdim məni də orda işə düzəltdirəsən.

Fərid rəsmi dilləndi:

– Bizdə bu məsələ xeyli çətindi. Hər adamı işə götürmürlər.

Əfsun bir neçə anlığa kiridi. Bir vaxtlar ondan tük salan, gözünü ağardanda sarısını udan "yolux" Fərid indi onunla gör necə danışırdı?.. Belə vəziyyətlə barışmaq istəmədi. Ancaq işinin düzəlməsi xatirinə güzəştə getdi:

– Ə, Fərid, başına dönüm, niyə etinasız danışırsan mənimlə? Olmuya, köhnə hayıflarını alırsan? Hər nə qələtim olub, bağışla. Onlar ilk gəncliyin, – duza getmək vaxtlarının səhvləridi. Biz artıq böyümüşük, hər şey arxada qalıb. Bir-birimizin ətini yesək də, sümüyünü çölə atmamalıyıq... Mən dustaqlıqdan təzəcə çıxmışam. Səfil vəziyyətindəyəm. Mənə canı yanmaq, əl tutmaq əvəzinə yazıq halıma sevinirsən. Köhnə yoldaşlığa yaraşırmı bu?!

Fərid səmimiyyətlə:

– Səni başa düşürəm, – dedi, – işsizlik çox ağır şeydi. Adamı hər cəhətdən sıxır. Ancaq...

Əfsun "boğazımı üz, ümidimi üzmə" mənasında əlini çənəsinin altına aparıb, hülqumunda gəzdirdi.

– Çox xahiş eləyirəm, köməkdən boyun qaçırma. Mümkün olmayanı çalış mümkün elə. Bu, mənim səndən ərkyana təvəqqemdi. İnanıram ki, istəsən, məni öz yanında bir işə götürtməyi bacararsan. Söz verirəm, nə cür iş olsa, öhdəsindən gələrəm.

Fərid qımışdı:

– Bacarığına bələdəm, dəyirmanın boğazından ölü salsan, aşağısından diri çıxarsan.

Əfsun atmacanı özündən yan ötürdü. Minnətini həqiqi yalvarışa çevirdi:

– Qadan alım, Fəri, lağ eləmə. İşin düzələninə get. Məni məğmun qoyma!

– Lağ eləmirəm... – Fərid tam ciddiləşdi. – Zirək adamsan. O zirəkliyi bayaq, dəfn mərasimində də göstərdin. Kənardan göz qoyurdum sənə. Cavan ananı xilas elədiyini aydınca gördüm. Xoşum gəldi, ürəyimdə alqışladım səni.

– Bu, mənim alqışsız borcumdu. – Əfsun təvazö ilə başını köksünə əydi. – İnsanın insana köməyi dəyməlidi. Ulu babalarımızın öyüdü, nəsihəti belədi. Yaxşılıq böyük savabkarlıqdı, deyiblər o rəhmətliklər. Sən də bu dar günümdə yaxşılığını mənə əsirgəmə.

Həyat hündür bir nərdivandı. Kimini qaldırır, kimini endirir. Sən qalxanlar cərgəsindəsən. Allah eləsin, daha da ucalasan. Ən yüksək vəzifələrdə qərar tutasan. Mən isə o həyat nərdivanının dibindən də aşağıdayam. Tut əlimdən, qaldır pillələri. Dünyanın işini bilmək olmaz, vaxt gələr, xəcalətindən lazımından artıq çıxaram. Heç kəsə borclu qalan oğul deyiləm mən.

Fərid xeyli düşünüb:

– Qəti söz vermirəm, – dedi, – amma bir şey fikirləşərəm.

Əfsun nisyəni nağdılamağa cəhd etdi:

– Ciddi çalışsan, mütləq düzələcək. Mən təsadüflərin zərurət doğurduğuna inanıram. Biz gözlənilməz bir yerdə elə-belə rastlaşmamışıq. Burada ilahi hikməti var. İdarənizin ünvanını, telefonunu yaz ver mənə. Qoy, Allahım bizə yar olsun!

Fərid imtina edə bilmədi.

## 5.

Qədim, yaraşıqlı Bakı özünə bənzəmirdi.

Axşamları çıraqban, işıqları ulduz-ulduz sayrışan, çal-çağırlı bu şəhərə ölü bir sükut hakim idi. Şıq geyimli oğlanlar, bərbəzəkli qız-gəlinlər, xoşəhval qocalar, kişi və qadınlarla həmişə dolu olan küçələr büsbütün boşalmışdı. Elə bilərdin, əhali harasa köçüb getmişdir. Hər şey yas içindəydi.

Ətrafdakı gərgin hüzn Əfsun Zamanlıya az təsir etdi. Özündən çox razı idi. "Şücaəti"nə görə Fəridin tərifi onu lap qanadlandırmışdı. Hiss edirdi ki, öndəki uğurlarına işıq ucu açılmaqdadır. Uzunmüddətli uğursuz həyat tərzindən sonra şəhərə ilk gəlişi ilə hörmət qazanması çox şeydən xəbər verirdi.

O, əlini əlinə sürtdü. Ağır addımlarını birdən yeyinlətdi. Bağırsaqları üsyana qalxmışdı. Aclıq amanını qırırdı. Özünü Qumaş arvadgilə tez çatdırmağa tələsdi. Necə deyərlər, dabanlarına tüpürüb, bütün gün bir hovur dincəlməmiş yorğun ayaqlarını əlavə cəfaya saldı.

Qumaş arvadgilə çatanda artistcəsinə ayrı sifətə girdi. Qəm dəryasına batdı. Hədsiz pərişan görünüşü ilə Qumaş arvadı dərhal kövrəltdi.

– Meydana getdinmi, ağrın alım?.. Nə gördün, nə eşitdin? Gəl otur, bir yaxşı-yaxşı danış.

– Getdim, nənə! – Əfsun səsini sızıldatdı. – Gördüklərimi dil ilə söyləmək çətindi mənə. Bircə burasını deyə bilərəm ki, ağlaşma-şivən xırtdəkdəniydi. Adam əlindən tərpənmək olmurdu. İynə atsan, yerə düşməzdi.

– Onu televizir də göstərirdi. Sən ayrı şeylərdən danış.

– Darıxma, nənə, danışacam. Elə əsas söhbətə gəlirəm... Cənazələr çiyinlərə götürülüb yola düzələndə, camaat elə çaxnaşma saldı ki, az qaldı meyidlər çiyinlərdən yerə düşsün.

– Of, off!.. Hayıf sizə günahsız balalar!.. – Qumaş arvad çırpındı.

– Hə, nənə, çox hayıf!.. Yüyürüb özümü köməyə yetirdim. Camaatı sakitləşdirənlərə qoşuldum. Çığır-bağırdan boğazım yırtılıb, irəli-geri yortmaqdan heydən düşmüşəm. Ortaya əngəl-filan çıxmamaqdan ötrü özümə divan eləmişəm, canımda can qoymamışam. Hər yerim zoqquldayır...

Qumaş arvad canıyananlıqla ona yaxın durdu. Gödəkcəsini soyunmaqda kömək etdi:

– Ezyatın elə üz-gözünnən də görükür, ay bala. Əldən-ayaxdan düşdüyün, deməsən də bilinir. – Birdən gözü Əfsunun dirsək sarğılarına sataşdı, təlaş keçirdi. – Bu sarğılar nədi? Kimnən dalaşıbsan?

Əfsun qəsdən zarıdı:

– Dalaşmamışam, möhkəm yıxılmışam. Dizlərim, dirsəklərim yaralanıb.

– Boy, a bala, hardan yıxılıbsan?

– Biçarə bir ananın qanının arasına girmişəm, nənə. Nağdı ölümdən qurtarmışam.

– Nə cürə, ay bala? – Qumaş arvadın həyəcanlı marağı artdı. – Yerri-yataxlı danış. Kimiydi o baxtıqara?

– Otuz yaşı olar, ya olmaz, çox gənc, yaraşıqlı bir gəlin idi. Cənazə qəbrə sallanıb, üstü torpaqlanan dəqiqələrdə gözdən yayınıb, özünü tabutun yanına atmaq istəyirdi...

– Boy, boy!.. Allah sən saxla!.. – Qumaş arvad vaysındı. – Ölən kimiymiş?.. Əri, ya qardaşı?

– Nə əri, nə qardaşı... körpəcə oğlu!

– Can, can!.. – Qumaş arvad üzünü cırdı. Gözləri qan ağladı. – Uşağa da mı qıyıblar, o qaniçənnər?!..

– Deyilənə görə, uşaq atası ilə hardansa gəlirmiş. Heç nəyin üstündə azğın əsgərlər atəş açıblar. Uşaq ölüb, atası da ağır yaralanıb.

– Of, ooff! – Qumaş arvad yumruğunu düyüb, zərblə sinəsinə vurdu. – Sən bir amansızdığa bax?! Gözdəri çıxmışdarın qudurğannığına bax!.. Qaragünnü ana özünü qəbrə atmasın, bə neyləsin?!.. Murazı gözündə qalanın özgə çarəsi nədi?!

Bu anda Əfsunun qulağı aralıdan asta hıçqırtı eşitdi. Diqqəti Qumaş arvaddan yayınıb, hıçqırtı gələn səmtə yönəldi. Bəri otağın qapı çərçivəsinə söykənərək, söhbəti dinləyən qızı gördü. Qumaş arvadı da, söhbətini də unutdu. Gözəlliyə aludə nəzərləri qızın tamaşasına durdu. Bu, ortaboy, yumrusifət, dolubədənli çox göyçək bir qız idi. "Qızlar bulağı"ndan doyunca su içmişdi.

Ovsunlanmış Əfsun iştahla dodaqlarını yaladı: "Lap mən istəyəndi! – düşündü. – Şirin canı qurban verməyə dəyəndi. Kaş Allahım məni umsuq qoymayaydı, toruma asan düşəydi...".

O, kirpiklərini heyran-heyran qırpdı. Bir vaxtlar Durna xanımın onu hayıl-mayıl qoymuş gözəlliyi ilə bu qızın cazibəsini xəyalən müqayisə etdi. Üstünlüyü qıza verdi: "Heç keçiləsi, əldən buraxılası ceyran deyil. İşi fəndlə düzüb-qoşub, onu halal malım eləməliyəm. Durna xanımın acığına bu sütül cananla aşiq-məşuq olmalıyam... mütləq olmalıyam!" – deyə qəti qərara gəlib, geri çöndü. Önlüyünün ətəyini gözlərinə basıb, xısın-xısın ağlayan, onun qızın marağına durduğunu görməyən Qumaş arvaddan sözarası soruşdu:

– Bu qız sənin nəvəndi, nənə?

– Hə. – Qumaş arvad bir az toxtayandan sonra dilləndi. – Sən qalan otağı səliqəyə salıb. Get, otağında əynini dəyiş, bir az irahatdan, çox ezyat çəkibsən. Sonram gəl, çörək yeyə-yeyə qəziyyənin gerisini yerri-yataxlı danış.

Əfsun qıza heyranlığını açıq söylədi:

– Maşallah, böyüyüb əməllicə gözəlləşib. Elə balacalıqda da çox göyçək idi.

Qumaş arvad heç nə demədi. Oğlanın qırımını bəyənməmişdi.

Əfsun qızın yanından ötəndə bic-bic irişdi görüşmək istədi.

Qız əl tutuşmadı. Sərtliklə üzünü turşudub, kənara çəkildi. Əfsunun qolu havadan asılı qaldı. Əfsun pərt olsa da, özünü sındırmadı. Zarafatla Qumaş arvada gileyləndi:

– Nəvən dəli bir ceyranmış, nənə. Mənimlə heç görüşmək də istəmir.

Qumaş arvad nəvəsinin tərəfini saxladı:

– Xəsyəti tünddü, bala. Bənd olma ona.

Əfsun qızın qılığına girməyə çalışdı:

– Salam, Allah salamıdı. Onu almamaq günah sayılır. Əlimi havada qoyma!

Qız ikrahlıqla nənəsinin yanına şütüdü. Əfsun kor-peşman otağına keçdi. Orada dodaqaltı pıçıltı ilə qızı hədələdi: "Eyb etməz, indi əl tutuşmağı mənə çox görürsən, əlimi havada qoyursan, ürəyimi sındırırsan. Vaxt gələcək, təlik quzu təkin özün kölgəmi izləyəcəksən, dalımca yüyürəcəksən. Mənə də Əfsun deyərlər. Baxarsan, saqqızını necə oğurlayacam, heç nədən xəbərin olmayacaq".

Otaq yaxşıca silinib-süpürülmüş, pəncərə şüşələri və döşəmə yuyulmuş, kiçik masa ilə onun ətrafındakı nimdaş səndəllər yığışdırılıb harasa aparılmışdı. Otaq, elə bil, xeyli genişlənmişdi. Çarpayının döşəkağı, balınc və yorğan üzlükləri təzələnmişdi. Bunlar qonağa, əlbəttə, hörmət əlamətləri idi. Ürəyindən yeni bir hiss keçdi: "Ah, nolaydı bu sahmanlı yatacaqda o dəli ceyranla birgə yataydım, onun ənbər ətirli qoynunda şirin-şirin xumarlanaydım... neçə illərin tamarzılığından sonra yeni keflər çəkəydim..." Birdən gözü ön divardakı böyüdülmüş şəklə sataşdı. (Nə cür olmuşdusa, səhər-səhər bu şəkli sərfi-nəzər etmişdi) şəkil çox canlı çəkilmişdi. Təzə fotoya oxşayırdı. Qız oradan şən təbəssümlə boylanırdı. Əfsun şəklin yaxınına gəldi. Onu öpməkdən özünü saxlaya bilmədi. Öpə-öpə də könlündən indicə keçmiş arzusu möhkəmləndi: "Budur, bu dəqiqə şəklini öpməkdən doymuram. Çox çəkməz ki, özünü də beləcə öpərəm. O alma yanaqlarını soraram, qaymaq dodaqlarını əmərəm... İnan sözlərimə, qoymaram murazım qalsın gözümdə".

O, düşündüklərini təsəvvüründə canlandırıb, ovcunu ovcuna sürtdü. Gizlində qıza müraciətli səsini azacıq ucaltdı:

– Bəli, dəli ceyran, yəqin bil, mən sözümün ağasıyam.

Məqsədim uğrunda ölümə də gedirəm. Görəcəksən, bu lələşin səni necə muma-şama döndərir. Mənim dilimin ovsunu əfi ilanı da fağırladıb yuvadan çıxartmağı bacarır. Valideynlərim mənə Əfsun adını qoymaqda yanılmayıblar. İlahidən verilib mənə bu fərasət. Durna xanımdan artıq olmayacaqsan ki?!.. O da çox yuxarıdan gedirdi. Məni yaxına buraxmaq istəmirdi. Qadasın alım yüyürək dilimin, soyuqluq buzunu elə məharətlə əritdi ki, özüm də heyran qaldım. Bax, səni də eləcə halal malım eləyəcəm!..

Qumaş arvadın qəhərli səsi mətbəxdən eşidildi:

– Niyə ləngidin, a bala?.. Çay süzmüşəm. Gəl, qaynar-qaynar iç ki, canın qızsın.

– Gəldim, nənə, gəldim!

O, qərarının behi olaraq, şəkli bir də hərarətlə öpdü. Və əvvəlki qəm-qüssəli görkəmlə dala qayıtdı.

Qumaş arvadın gözlərinin yaşı qurumamışdı. Nəmli kirpiklərinin uclarında kiçicik damlalar işarırdı. Nənəsinin böyrünə sığınmış qızın da burnunun yancaqlarında muncuğa bənzər iki damla yaş çuxura ilişib parıldayırdı.

Əfsun əlavə təklif gözləmədi. Özünü bu ailənin köhnə üzvü kimi apardı. Ərklə irəli getdi. Bir ucu divara söykədilmiş sınıq-salxaq mətbəx masasının arxasına keçib, ağır əyləşdi. Boğmalı stəkanda buğlanan çayı tələsik götürüb, qəndsiz-filansız horuldatdı. Sonra tələsikliyindən utandı (qız gözaltı ona baxırdı). Toxtaqlı davrandı. Qənddandan qənd götürdü. İfallıca ağzına aldı, çayın qalığını mədəni qaydada içdi. Soluğunu dərib, bir gözü qızda, yarımçıq qalmış söhbətinə davam etdi:

– Əzizim, iki gözüm nənə, birdən elə bil ilahidən mənə səda gəldi. “Bir dön, geri – yanına bax” – dedi. Dönəndə nə görsəm yaxşıdı?.. Bayaq haqqında danışdığım cavanca gəlin xəlvətcə keçib, qəbrin lap qaşında dayanıb, özünü məzara atmağa hazırlaşır, yaxınlığındakı adamların da heç nədən xəbərləri yox. O, qollarını yana açıb, içəri tullanmaq istəyən məqamda yüyürüb belindən yapışdım. Bütün gücümlə qırağa dartdım. İkimiz də böyrü üstə yıxıldıq, daşa-kəsəyə dəydik...

– Sonra?.. Sonra noldu?.. – Qumaş arvad səsi xırıldaya-xırıldaya, səbirsizlədi. – Axırı nəynən qurtardı?

– Sonra da heç nə... – Əfsunun fikri yenə qızda idi. Gözünü ondan çəkmirdi. Qızın dodaqları büzülmüşdü. Faciəyə için-için ağlayırdı. Elə bu görkəmdə də qəşəng görünürdü. Əfsun sualı ləng cavablandırdı: – Yaxşı qurtardı. Allaha şükür, nə o, nə də mən ciddi zədə almadıq. Amma gəlinin huşu başından çıxmışdı. Özündən getmişdi... Mənim də dizlərim və dirsəklərim yaman haldaydı.

Qumaş arvad dərin-dərin inildəndi:

– Ümidi hər yerdən üzülmüş bədbəxt belə dərdnən çətin yaşayar...

Qız hıçqıra-hıçqıra dedi:

– Məktəbdə müəllimlərimiz çox adam ölüb, deyirdilər. "Təcili yardım" maşınları yüzdən çox meyid daşıyıblar, yaralananların sayı yeddi yüzü keçib.

Əfsun qızın sözünə coşqunluqla qüvvət verdi:

– Vəhşidilər də! İnsan cildində yırtıcıdılar, canidilər!.. Silahsız, dinc adamları çəmən otu kimi biçmək, qanı su yerinə axıtmaq heç yanda, heç bir ölkədə görünməmiş cəlladlıqdı!

Qumaş arvad əllərini göyə qaldırıb nifrətlə qarğışladı:

– Daş tök, Allah! O qaniçənlərin başına ildırım daşı tök! Yer üzünnən bir kərəmlik sil-süpür, köklərini kəs!!

Qız başını nənəsinin çiyninə söykədi. Qəhərlə pıçıldadı:

– Məktəbdə onu da danışırdılar ki, güllə dəyən uşaq ailənin tək övladıymış...

Əfsun həyəcanla təsdiqlədi:

– Doğrudur, qəbir üstündə də danışırdılar onu. Uşaqları sağ qalmırmış, doğulan kimi ölürmüş. Bircə bu uşaq sevindirib qohum-əqrəbanı. Onun da taleyi belə...

Qumaş arvadın ürəyi bir az da bərk göynədi, yumruqlarını qoşalayıb, zərblə sinəsinə çırpdı. Ağır yumruqlar mətbəxə guppultu saldı.

– Can-can, a körpə, can-can!

Əfsun qıza acıq verirmiş kimi təşəxxüslə öyündü:

– Yaxşı ki, mən vaxtında özümü yetirdim. Azacıq ləngisəydim, faciə üstündən faciə baş verəcəkdi. Bütün bir ailə güdaza gedəcəkdi.

Nənə ilə nəvə qucaqlaşıb ağlaşdılar.

Əfsun ayrı mətləbə keçdi. Aclıq hənirini kəsmişdi. Qarnını ovuşdurub, Qumaş arvada yazıq-yazıq üz tutdu:

– Nəvənə qurban olum, nənə. Acından ölürəm. Bəlkə bir qismət çörək verəsən... yavanlıqsız da ötüşərəm.

Qumaş arvad nəvəsini özündən aralayıb, əl-ayağa düşdü.

– Bu sahat, ağrın alım, bu sahat... xörəyim hazırdı. Gəldi bu ağrı-acılı söybət araya düşdü... huşum başımnan çıxdı...

O, düməlnib qaz peçinə yaxınlaşdı. Xörək qazanını qızmağa qoya-qoya nəvəsini buyurdu:

– Dur, süfrə aç, a canım-ciyərim. Mən xörəyi qızdırınca çörək doğra, çəngəl-pıçaq qoy qonağımızın qabağına. Bu gün o, savab işdər görüb, əcəl əlinnən qaragün bir gəlini qurtarıb. Anasının südü halaldı ona.

Qız qulluqdarlığa ərinmədi. Masanın üstündəki artıq şeyləri yığışdırdı. Süfrəni təzələdi. Ortaya çəngəl-bıçaq düzüb, çörək doğramağa başladı.

Əfsun qızı yaxından, xüsusi aludəliklə marıtladı. Qız çörək doğradıqca qoltuqları altında tərpəşən yumruca məmələrdən gözünü çəkmədi. Qumaş arvaddan dil xoşluğu soruşdu:

– Nəvənin adı nədi, nənə. Unutmuşam.

– Adı Tamaşadı.

– Çox gözəl addı! Özünə oxşayandı. Afərin bu adı ona qoyana!

– Mən qoymuşam. – Qumaş arvadın səsində qəribə qürur duyuldu. – Çağa vaxtınnan qəşəngiydi. Tamaşa eləməkdən doymurdum. Ona görəm də adını Tamaşa qoydum.

– Əla ad seçibsən, nənə. Həm təzədi, həm də yaxşı səslənir.

– Yaxşı, günün olsun, bala. Addı də, ağlıma gəlib, qoymuşam. Təkin yığvalınnan yarısın!

Ortaya xörək gətirildi. Toyuq çığırtmasının xoş ətri ac Əfsunun burnunu qıcıqlandırdı. Yeməyə möhkəm girişdi.

Qarnı doyub, canı rahatlanandan sonra qızı sorğu-suala çəkmək, arada isinişgənlik yaratmağa çalışdı. Nə fayda ki, cəhdi uğursuz oldu. Üzgün bədəni tezcə süstləşdi. Toxluq kirpikləri arasına mürgü çirişi yaydı. Göz qapaqları ağır-ağır sallandı. Başı üç-dörd dəfə köksünə dəyib çətinliklə qalxdı. Bütün günkü qaçqovdular, yüyür-yortmalar öz təsirini birdən göstərmişdi. Özünü heç cürə tarazlaya bilmədi.

Qumaş arvad canıyananlıqla:

– Oturduğun yerdəcə yatırsan, ay oğul. Bunnansa get, otağında soyun, irahat yat, – dedi.

Əfsun mürgü içində üzr istədi:

– Bağışlayın, bərk yorulmuşam, yuxu amanımı qırır.

Qumaş arvad yaxın gəlib, onun qolundan tutdu, qalxmasına kömək etdi:

– Yuxu sənin amanını qırınca, sən yuxunun amanını qır. Özünə eziyat vermə.

Əfsun bir daha üzr istəyib, səndirləyə-səndirləyə yatmağa yollandı. Arası heç beş dəqiqə çəkmədi, küncdəki otaqdan asta, qırıq-qırıq mışıltılar eşidildi.

**6.**

O, yuxudan günortaya yaxın oyandı. Gecəni bir böyrü üstündə, daş kimi yatmışdı. Altında qalmış sağ qolu əməlli-başlı keyimişdi.

Barmaqlarını bala-bala, ustuf-ustuf tərpədib əlinin, qolunun üyüşüyünü xeyli çətinliklə açdı. Sonra küncləri zığlanmış kirpiklərini ovuşdurdu, tam genişliyi ilə açdı. Bədənində heç bir sızıltı, göynərti sezmədi. Dizlərinin, dirsəklərinin sıyrımtılarının bekara ağrıları da keçib getmişdi. Fikirlərini başına cəmləyə-cəmləyə dünənki hadisələri yadına saldı. Xəyalında ilk növbədə qəşəng qız canlandı. Tamaşaya işıqgözünə tamaşa etməyə can atdı. Könlündən yeni cəhd keçdi. Amma... kefinə soğan doğrandı. Axı, qız çoxdan məktəbdə idi. Bunu yatanda macal tapıb biləyindən açmadığı qol saatına baxanda anladı. Acı təəssüf ürəyini göynətdi.

Elə həmən anlarda da iş üçün Fəridlə görüş təyin etdiyini xatırladı. Şalvar-köynəyini cəld əyninə keçirdi. Tualetə yüyürdü, oradan "vanna otağı"na şığıdı. Alababat yuyunub, mətbəxə gəldi. Qumaş arvadı giley-güzarla salamladı:

– Sabahın xeyir, nənə. Məni niyə oyatmayıbsan? Nə üçün qoyubsan bu vaxtacan yatım?

Əlində köhnə alt paltarı yamayan Qumaş arvad işini saxladı. Gözlüyünü alnına qaldırıb, kövrək-kövrək dilləndi:

– Sabahın yox, günortan xeyir, oğul. Çox şirin yatmışdın, oyatmağa qıymadım. Dünən ezyatın çox olmuşdu.

– Orası düzdü, nənə. Dünən izafi yorulmuşdum. Yuxu kirpiklərimdən sallanmışdı. Həm də yatacağım rahat idi. Elə bilirdim qu tükü üstündəyəm. Çox minnətdaram. Doğmaca nənə qayğısı görürəm səndən.

Qumaş arvad paltarı qırağa qoyub, ayağa durdu. Qonağına səhər yeməyi hazırladı. Əfsun coşdu:

– İmanın kamil olsun, ay nənə! Sənə poladdan da möhkəm cansağlığı arzulayıram. Gün o gün olsun, nəticə, kötücə beşiyi yırğalayıb, onlara şirin nənə laylası çalasan!

Qumaş arvad başını yırğaladı:

– Yox, ay bala, daha mənim köçüm hazırdı. Barmax sayı ömrüm qalıf. Siz cavannar xoşbaxt yaşayın. Sırağa günkü müsibəti ilahim bir də heç vaxt göstərməsin. Dünənnən özümə gələmmirəm. Bütün gecəni də ağlamışam, səhər obaşdannan da genə yadıma düşüflər, bağrımın başı oddanıb.

Əfsun  xal qazanmaq xatirinə vaqiə uydurdu:

– Faciəmiz, çox böyük faciədi, nənə. Səhərə yaxın ölümdən xilas elədiyim gəlin yuxuma girmişdi. Məni söyür, qarğıyırdı ki, onu qəbrin içinə atılmağa niyə qoymamışam.

– Yuxuda söylənən qarğış gerçəkdə alqışdı. İşin avand olacax! – Qumaş arvad darmacal bişirdiyi xörəyi Əfsunun qabağına qoyub tələsdirdi: – Tez ye ki, sarfan qarışmasın. İrax olsun, azar-bezar taparsan.

İki yumurtanın qayğanağını Əfsun pəh-pəhlə yedi. Üstündən də bir stəkan təzədəm çay içib, ayağa durdu.

– Süfrənə min bərəkət, nənə! İndi mənə bir ağbirçək diləyi də söylə ki, dalınca getdiyim iş düzəlsin, peşman qayıtmayım.

Qumaş arvadın dodaqları səssizcə tərpəndi. Sonra sağ əlini Əfsunun çiyinlərinə toxundurub duasını ucadan səsləndirdi:

– Get, uğurun xeyirli olsun, şad xəbər gətir!

Əfsun xeyir-duanın xoş təsiri ilə həyətə düşüb, bir-iki küçə getmişdi ki, qarşısına çıxan maneələr qanını qurutdu. Keçidlər, sıx gediş-gəliş yerləri bağlanmışdı. Çiyni silahlı hərbçilər ilə milis nəfərləri hər yanda qaynaşırdılar. Adamları saxlayıb, sənədlərini yoxlayırdılar. Bəzilərini qara maşınlara basıb harasa göndərirdilər. Nizam-intizam tədbirləri tam ciddiləşmişdi. Ötən gecə radio və televiziya ilə əhaliyə

rəsmi xəbərdarlıqlar edilmişdi. "Komendant saatı" yaradıldığı bildirilmişdi. Bərk yatmış Əfsun bunları, şübhəsiz ki, eşitməmişdi.

O, dərin çaşqınlıq içində irəli getdi. Əsgərlər arasından saymazyana keçib, yoluna davam etmək istədi. Aman vermədilər. Sorğu-suala tutdular: Kimsən? Hara gedirsən? Nə üçün gedirsən? Sənəd göstər!

Əfsun qorxuya düşdü. Hərbçilərin boz sifəti, hiddətli baxışları canına vicvicə saldı. Qeyd-şərtsiz itaət göstərdi.

Təhlükədən ötüşdü. Sənədlərinin ora-burasına baxıb, hansısa kağızla tutuşdurub (yəqin ki, "şübhəli şəxs"lərin siyahısı idi), yoluna davam etməyə icazə verdilər.

Yoxlanışlar qabaqlarda da eynən, bir neçə yerdə təkrarlandı. Hamısından xətasız sovuşdu. Di gəl ki, Fəridin iş yerində zəhləsi töküldü.

– Sənə  kim lazımdı?

– Fərid.

– Familini de.

– Familini unutmuşam… Yaddaşım korlanıb.

– Get, yadına düşəndə gələrsən.

– Biz tələbəlik yoldaşıyıq. Yataqxanada bir otaqda qalmışıq... Özü məni çağırıb.

– Bizdə bu barədə məlumat yoxdur. İcazə al, sonra bizə yaxınlaş!

– İcazəni kimdən alım?

Qapıçı hirslənib "əlaqə pəncərəsi"ni örtdü.

Əfsun fağırhal qılığa keçdi:

– Ə, qağa, qadan alım, köməyini əsirgəmə məndən. Başım çox bəlalar çəkib. Bəzən öz adımı da unuduram. İnsafı arada gör.

Qapıçı nə üçünsə gülümsünüb pəncərəni araladı:

– Yaxşı, tutaq ki, famili yadından çıxıb, heç olmasa, nə vəzifədə işlədiyini de.

Əfsun şadlandı.

– Ə, qağa, sağ ol! Bax, bunu soruş, cavabını bayaqdan verim... Sizin komitənin maliyyə şöbəsinin böyüyüdü. Dünən mənə özü belə demişdi.

– Yoldaş Cəbizadənin yanına gəlibsən?

– Hə, hə, onun! – Əfsun ötkəmləndi. – Əvvəllərdə, bizim tələ-

bəlik vaxtlarımızda familini Cəbiyev yazdırırdı. İndi Cəbizadə eləyib... Görünür, belə lazımdı. Hər dövrün öz tələbi var.

Qapıçı “pəncərə”ni yenidən örtüb, telefona əl atdı. Kiminləsə astadan danışdı. Dəstəyi yerinə qoyub “Nəzarət köşkü”dən bayıra çıxdı. Ədəblə yol göstərdi:

– Buyurun, bu pilləkənlə qalxın ikinci mərtəbəyə. Yoldaş Cəbizadə sizi iyirmi üçüncü otaqda gözləyir.

Əfsun pillələri qalxa-qalxa öz bəxtinə küsəndi. Fəridə həsəd apardı: “Gorun çatdasın, baba! Gör, kim kimin ayağına gedir?!.. Həmişə qapazaltım olmuş fərsizin birisi indi böyük adam sayılır. Qəbuluna xahişlə, minnətlə düşə bilirəm... Ehh, zalım həyat!..”

O, ağırlaşmış addımlarını inadla yeyinlətdi. Özünə ürək-dirək verdi: “Yox, başıma mütləq bir çarə qılmalıyam. Fərid kimilərindən qabağa getməliyəm. Buna hünərim, təpərim də var, iti ağlım, fərasətim də. Mübarizəsiz, ciddi-cəhdsiz heç nə əldə olunmur. Hələlik işim keçənə baş əyib, “bəli, bəli” – deməliyəm. Xəncərimin qaşı düşməz. Atalar “Eşşəyi min ata çatınca” – deyiblər. Elə ki, ayağıma yer elədim, sonrası çim-yağ olacaq. Fərid Cəbizadələr yenə əl quzuma dönəcəklər”.

O, pillələri sakit ürəklə qalxdı. Fəridin kabineti uzun dəhlizin qurtaracağında idi. Qapını şəstlə açıb, daxilindəki qibtə hissini məzələnmə ilə ödəzitdi:

– İcazə olarmı, Fərid müəllim?.. Yox, ey, bağışla, yoldaş Cəbizadə.

Fərid rəsmi dilləndi:

– Buyur!

Əfsun darıldı. Görüşü belə zənn etməmişdi. Düşünürdü ki, Fərid yerindən sıçrayıb qabağına gələcək, qoluna girib içəri aparacaq, altına stul çəkib oturdacaq. Heyhat... İçəri keçib çox incik salamlaşdı.

– Hər vaxtın xeyir!

– Salam, salam! – Fərid qarşısındakı kağızlardan gözünü çəkmədən soruşdu: – Necəsən?

– Əzilmiş pomidor kimi.

– Elə niyə?

– Niyəsi budur ki... – Əfsun umu-küsüsünü köntöy açıqladı: – Bəzi yoldaşlar özlərini quru aparırlar. Köhnə yoldaşlığı vecə

almırlar. Adi səmimiyyəti əsirgəyirlər.

– Kimi nəzərdə tutursan?

– Elə səni!.. Özünü çəkib qoyubsan dağ başına. Heç düz-əməlli "xoş gəldin" də eləmirsən. Elə bil, yad adamlarıq, otaq yoldaşlığı eləməmişik…

Fərid qələmini kağız üstünə atıb, dala çəkildi. Arxasını əyləşdiyi meşin oturacaqlı kreslosunun hündür söykənəcəyinə dayayıb, yarı zarafatla onu sancdı:

– Narahat olma, hər şey yadımdadı. Hansı oyunlardan çıxdığını yaxşı xatırlayıram.

Əfsun tam bir dəqiqə susdu. Pərtliyi dərinləşdi:

– Başa düşdüm səni. Kin saxlayırsan. Köhnə ədavətlə yaşayırsan...

O, burnunda çöp qalmış kimi bərk fınxırdı. Bir istədi Fəridə ağzından çıxanı deyib dönsün geri, lakin tüpürdüyünü yalamağa məcbur oldu. Yaşam çətinliyi qabağını kəsdi. Təklifsiz əyləşib qılığa başladı:

– Ə, Fərid qağa, ilk gəncliyimizdə nə olubsa, unut getsin. Biz axı böyümüşük, kişiləşmişik. Xırda hisslərlə yaşamaq bizə yaraşmır... köhnə-köşgül umu-küsülərdənsə, mərdlik göstər, mənə kömək əli uzat. Elə bilginən ölmüşəm, cənazəmi yerdən götürürsən.

Fərid qəsdənmi, ya nə üçünsə, yelləncəkli kreslosunu astaca yellədərək, burnunu qaşıdı.

– Məndən xahişin nədi?

Əfsunun içi alovlandı. "Fərsiz" Fəridin rəsmiyyəti yandırıb cızdağını çıxartdı: "Gorun çatdasın, baba!.. Xahiş ha?!.. Nə deyəsən beləsinə?!" Əlacsızlıq amanını yenə qırdı:

– Ə, qağa, qadan-bəlan mənə gəlsin, sənə olan ümidimi daşa çırpma. Göydə Allah, yerdə sənsən pənahım. Mərdlik göstər, imdadıma yet.

– Neyləyim? İmdadına nə cürə yetim?

– Necə nə cürə?.. Axı dünən söz vermişdin, iş barəmdə kiminləsə danışacaqdın.

– Başım qarışdı... Bağışla.

– Bağışlayıram. Ancaq dur bu dəqiqə get o adamın yanına.

Məsələni danış, "hə" – "yox" cavabı gətir. Çalış peşman getməyim burdan.

Fərid tərpənmədi.

– Getməyim mənasızdı. Arada ciddi əngəl var.

Əfsun inciklikl ağız-burnunu əydi.

– Nə əngəl?

– Sən axı həbs olunubsan.

– Həbs olunan, bəyəm, cəmiyyətdən təcrid edilməlidi? Haqqı yoxdu insanlar cərgəsinə qatılsın?

– Bizim komitə mühüm dövlət idarəsidi. Belə şeylərə mənfi yanaşırlar. Sən adi günah üstündə tutulmayıbsan. Dələduzluq maddəsi ilə cəza alıbsan...

Əfsun təəssüflə qurcalandı.

– Eh, Fəri, sən qaşınmayan yerdən qan çıxardırsan. Keçi ölüb, qoturu kəsilib. Köhnə palan içi eşələmək nəyə gərəkdi?

Fərid təmkinli davrandı. Məsuliyyət nümayiş etdirdi:

– Mən palan içi eşələmirəm. İşə düzəlmək üçün anket dolduranda bunlar mütləq göstərilməlidir. Heç nə gizlətmək olmaz. Hər şey bittə-bittə yoxlanılır.

– Onun babalı mənim boynuma. Orasını elə düzüb-qoşacam nə şiş yanacaq, nə kabab. O sarıdan zərrəcə narahat olma.

– Narahat olmaya bilmərəm. Arada mən varam. Bir vasitəçi kimi məni taqsırlandıracaqlar.

– Yamanın-yaman günü deyərsən bu işdən xəbərim yoxdur, həbsdə yatdığımı bilməyibsən... İnan mənə, bu qarışıqlıq vaxtı, aləm çaxnaşan zamanda ona heç əhəmiyyət verən də olmayacaq... "Qarğa, məndə qoz var" – demək əbləhlikdi.

Fərid çıxılmaz vəziyyətdə qaldı, dərin fikrə getdi. Əfsun üzə durdu, qır-saqqız olub, and-amanını şiddətləndirdi:

– Ə, Fəri, qurban olum, başına dolanım, bir çarə qıl. Ərinmə, dur get o lazımlı adamın yanına. Ümid çırağımı öləzitmə.

Fərid alakönül qalxdı. Əfsun onu qapıya qədər ötürdü. Burada həm qəti, həm də acizanə tapşırdı:

– Bax, ha! Olmaya-bilməyə, həbs olunmağım barədə dilinə bir kəlmə gətirəsən, ağzından söz qaçırdasan. Sən eləcənə de

ki, yaxın tələbə yoldaşı olmuşuq. Məni yaxşı tərəfdən tanıyırsan. Biliyimi, zirəkliyimi, işgüzarlığımı bacardıqca çox təriflə. Ona da çalış ki, məni şəxsən qəbul eləsin. Gerisini özüm bilərəm neyləyəcəm.

* * *

Fərid tez qayıtdı. Şən sir-sifətindən işin müsbət həlli duyulurdu. Əfsun qımışa-qımışa onun qabağına yeridi.

– Ə, qağa, deyəsən, uğurun xeyirlidi, söhbətiniz necə alındı?

Fərid də qımışdı:

– Pis alınmadı. Müəyyən razılığa gəlindi.

Əfsunun baxışları bir qədər məyusladı.

– Müəyyən razılıq nə deməkdi?

– Yəni, düzəlməyə şans var.

Əfsun darıxdı.

– Di yaxşı, bağrımı yarma, konkret cavab de.

– Konkret cavabı onun özü deyəcək. Get yanına, səninlə söhbətləşmək istəyir.

– Əla! – Əfsun çırtıq çaldı. – Söhbətləşmək ürəyimnəndi... Adı nədi?.. Necə müraciət eləyim?

– Eləcənə "müəllim" de. Bu müraciətdən çox xoşu gəlir.

– Vəzifəsi nədi?

– Komitənin sədr müavinidi. Kadr məsələlərinə baxır.

– Xasiyyəti necədi? Yumşaq adamdı, ya zıqqıdı?

– Həlim xasiyyətdi. Deyilənə görə, yazıçıdı. Ancaq mən onun əsərlərini oxumamışam.

– Yazıçıdı?!.. – Əfsun nə üçünsə sevindi. – Bu lap yaxşı! Mən yazıçılarımızın çoxunu qiyabi tanıyıram. Özün bilirsən ki, mütaliəçiyəm, bədii ədəbiyyatla maraqlanıram... ümumiyyətlə, yazıçı tayfası yumşaq təbiətli olur. Onlarla dil tapmaq asandı... hansı imza ilə yazır?

– Şakir Şadmanlı imzası tanışdı sənə?

– Şadmanlı?.. – Əfsun xeyli duruxdu. – Yox, balam, tanış deyil. Belə yazıçı heç eşitməmişəm... Bircə kitabının adını bilsəydim, sözdən-söz icad eləyib qılıq damarını tutardım.

Fərid incə zarafatla:

– Özünü kasıb salma, – dedi. – Sən ki, maşallah, dil pəhli-

vanısan. Yüz faiz inanıram ki, onun da qılığına girə biləcəksən. Nə bacarırsan, təriflə.

Əfsun sinəsini sığalladı:

– Hə, düz deyirsən, balam. Tərif çox köpəkoğlu şeydi, daşı-dəmiri də yumşaldır. Özüm dönə-dönə sınamışam ondakı bu gücü. Ancaq gərək əndazəsini gözləyəsən. Elə eləyəsən ki, nə çox yağlı olub ürək bulandırsın, nə də çımxır yavan olub ağız büzdürsün.

Fərid eyhamını açıq söylədi:

– O sarıdan da səriştən heç pis deyil. Biclikdə şeytana papış tikirsən!

Əfsun cırnamadı. Əksinə, sinəsini bir də sığallayıb öyündü:

– Əzizim Fərid, sən onu yaxşı-yaxşı bil ki, şeytan məğlubedilməz məxluqdur. Ulu Allahımızın özü də onun öhdəsindən gələmmir. Mən hardasa şeytana papış tikməyi bacarıramsa, deməli, az-çox hünər sahibiyəm. Bu hünərimlə açıq-açığına fəxr eləyirəm.

Fərid onu rəsmən tələsdirdi:

– Bəsdi öyündün, cəld ol. Kişi səni gözləyir. Bu hünərini get, ona da göstər. Döşünə sonra döyərsən.

Əfsun gedə-gedə:

– Haqlısan, qağa. Cücəni payızda sayırlar, – dedi.

## 7.

Şakir Şadmanlı adı siyahıda var, özü yox yazıçılardan idi. Haçansa beş-on alababat hekayə, bir-iki də alaçiy povest yazıb, qələmi korşaltmışdı. Orta yaşa çatmamış "ilham bulağı" qupquru qurumuşdu. Ha gücənmiş, ha əlləşmişdisə, ortaya daha heç nə çıxarda bilməmişdi. Elə bil, qarayel əsib, ipə-sapa düzülməyən sözləri başından büsbütün sovurmuşdu.

Amma hələ də yazıçılıq xülyası, qələm əhli iddiası ilə yaşayırdı. Yazıçılar cəmiyyətinin vəsiqəsini qumaş parçaya büküb, döş cibində xüsusi qürur-qürrə ilə gəzdirirdi. Yeri gəldi-gəlmədi, onunla öyünürdü. Mühüm iclaslardan, tədbirlərdən, yığıncaqlardan qalmırdı. Çağırılmamışdan gəlib ön sıraların birində əyləşir; televiziya ekranlarında görsənməyə cəhd edirdi ki, ertəsi gün desinlər; filan yerdə, filan məclisdə sən də vardın. Və söz yox ki, ya-

radıcılıq qısırlığının xəcalətini qəlbinin dərin-dərin guşələrində mütəmadi çəkirdi; bağrının başı korun-korun hey yanırdı.

Fəqət bu dərdini üzdə heç kəsə hiss etdirmirdi. Özünü şən, şadman aparırdı. Çünki ulu Tanrı onu yazı-pozuda yarıtmasa da ayrı bir xoşbəxtliklə mükafatlandırmışdı: yaxşı təşkilatçılıq qabiliyyəti vermişdi. El arasında nahaq demirlər ki, bir yandan bağlayan fələk, o biri yandan açır. Şakir Şadmanlı ictimai işlərdə çox fəal və bacarıqlı idi. Hövsələsi geniş, iradəsi möhkəmdi. Məhz bu keyfiyyətləri ilə də yüksək rütbəlilər tərəfindən xətri istənilirdi. Lap cavanlıqdan yuxarı təşkilatların, səlahiyyətli şəxslərin diqqətini özünə çəkə bilmişdi. Məsul vəzifələrə maneəsiz irəli çəkilmişdi. Yaradıcılıq şikəstliyinin ağrı-acılarını təşkilatçılıq istedadı səngitmişdi.

"Qarabağa yardım Komitəsi" təşkil ediləndə də Şakir Şadmanlı yada birinci düşənlərdən oldu. Bu əziyyətli və çox məsuliyyətli işin öhdəsindən yaxşı gələ biləcək rəhbər axtarışında Şakir Şadmanlının üstündə dayandılar. Yurd-yuvalarından didərgin salınmış, dözülməz dolanışıq şəraitindən bezikmiş dar hövsələli, ölüm-itimli, yaslı insanlarla o, daha asan dil tapardı; onların tələblərini ürək yanğısı ilə yerinə yetirərdi. Səviyyəli təşkilatçılığından, ünsiyyət bacarığından əlavə, həm də əslən qarabağlı idi. El-oba xidmətində qeyrilərindən qat-qat yaxşı durardı. Lakin son anda onu komitəyə sədr yox, müavin təyin etdilər. Birinci şəxs olmağa hansısa daha mühüm keyfiyyət göstəricisi çatışmadı.

Şakir Şadmanlı incimədi. Haqq üçün şöhrət ölüsü, vəzifə düşkünü deyildi. Layiq görüldüyü işə qollarını çırmayıb girişdi. Burada da lazımi nüfuz və hörməti tez qazana bildi. Di gəl ki, bədii yaradıcılıqda fəaliyyətsizliyi indi onu daha çox sıxdı. Qaçqın-köçkünlərin dərdi-sərlərinə yaxından bələd olduqca, əhvalları dərindən öyrəndikcə, qələmə sarılmağa böyük ehtiyac duydu; sözün həqiqi mənasında çırpındı. Heyhat ki, üzüdönük "ilham pərisi" köməyinə gəlmirdi ki, gəlmirdi! Gücsüz qələmi ağ kağız üzərində beş-on sətir cızma-qara eləyib dirənirdi. Ondan o yana getmirdi. Alnında puçur-puçur soyuq tər cərgələnir; gözləri qan çanağına dönürdü, nəticə isə bir çürük qoz!

Qələmlə məşhurlaşmaq, ad-san qazanmaq bizdə ümumi bəladır.

Başqa xalqlarda bu həvəs, bu istək nə səviyyədədir, dəqiq fikir söyləyə bilmərik. Çünki səhih məlumatımız yoxdur. Ancaq bizimkilər... nə deyim, vallah, özgə biçimlidir. Şair, yazıçı olmaq hər kəsin könlündən keçir. Xüsusən də böyük rütbəli, yüksək vəzifəli məmurların (ziyadə pulluların) ən sevimli xobbisidi. "Sandıq ədəbiyyatı" kimin evindən, iş otağındakı seyfinin dərinliyindən çıxmaz!? Bəxtəvər başımıza! Bizə nahaq yerə "şair xalq" deməyirlər ki!?..

Əfsun Zamanlı iti fəhmi ilə Şakir Şadmanlının zəif damarını əvvəldən tutdu. Kabinetinin qara meşinli qapısını çöldən ehmalca tıqqıldadıb, içəri keçəndə bir bəlağətə başladı:

– Xoş gördük, çox hörmətli Şakir müəllim! Sizə, – bizim sevimli yazıçımıza bu başdan böyük oxucu kütləsinin-pərəstişkarlarınızın atəşin salamlarını yetirirəm. İcazə verin onların adından qələm tutan mübarək əlinizi qəlbimin bütün hərarəti ilə sıxım! – Təklif gözləmədən irəli atıldı. Hay-küyə mat qalmış Şadmanlının sağ əlini qamarlayıb, hər iki ovcu arasına alaraq möhkəm silkələdi. Kişini basıb-bağladı: – Təəccüblənməyin, Şakir müəllim! Sevincimdən aşıb-daşıram. Sizi canlı görməyimə sonsuz, hədsiz-hüudsuz dərəcədə şadam. İndiyəcən yalnız şəklinizi görmüşdüm. Kitablarınızdakı gülümsər çöhrənizə baxmaqdan doymurdum, özünüzü şəxsən görmək, ziyarət etmək arzusundaydım. Allahdan bol-bol razıyam ki, məni bu arzuma çatdırdı. İşıqlı simanıza əyani tamaşa etmək, nəhayət ki, mənə nəsib oldu.

Şakir Şadmanlı təvazö ilə qımışıb nə isə demək, yəqin ki, minnətdarlığını bildirmək istədi. Əfsun macal vermədi. Bərbəzəkli, ərş-gürzlü sözləri yenidən uc-uca caladı:

– Mən sizin milyonlarla fanatiklərinizdən biriyəm, Şakir müəllim. Daimi, doyumsuz oxucunuzam. Çox gözəl, çox rəvan yazırsınız. Dilinizin şirinliyi, müşahidələrinizin dəqiqliyi adamı heyran qoyur. Təsvir elədiyiniz əhvalatların sehrindən çıxmaq olmur. Oxuduqca oxumaq istəyirsən. Sizin bir əsərinizi xüsusi ilə vurğunuyam. Adı dilimin ucundadı... o qədər həyəcanlıyam ki, bircə dəqiqənin içində unutdum...

Şadmanlının yanaqları qızardı. Yazıçılığı ilə bağlı heç vaxt, heç kəsdən eşitmədiyi tərif bolluğu sinəsinə sarı yağ kimi yayılmışdı.

Böyük məmnunluqla özünün daha çox bəyəndiyi povestini xatırlatdı:

– Bəlkə “Sübh çağında görüş”ü nəzərdə tutursunuz?

– Bəli, bəli, elə onu! – Əfsun tələm-tələsik təsdiqlədi. Qorxdu ki, əsər barədə nə isə soruşar, yalanı üzə çıxar. – Qiyamət əsər yazmısınız, Şakir müəllim. Üzünüzə görə demirəm, olduqca dəyərli kitabdı. Həyat bilikləri ilə zəngindi. Obrazları çox canlıdı. Hər birinin öz taleyi, fərqli yaşam tərzi, fərdi dili var. Gənclər üçün böyük tərbiyəvi əhəmiyyətə malikdi. Onu oxumayan çox şey itirir. Şəxsən mən üç dəfə oxumuşam, ləzzət almışam.

Şakir Şadmanlı yaşına və vəzifəsinə uyuşmayan yüngüllüklə əzilib-büzüldü. Anası ölmüş tərif dağdan ağır kişini yerindən oynatmışdı. Sümüklərini çırtdatmışdı. Uşaq məsumluğu ilə şirin-şirin qımışdı:

– Təşəkkür eləyirəm, – dedi, – əsərimin sizə bu dərəcədə xoş gəlməsindən çox mütəəssirəm, zövqünüzə valehəm.

Əfsun ilk baxışda zəhmi bağır yaran bu çalsaç adamın hədsiz sıyılmasına ürəyində gülsə də, üzərdə ciddi davrandı. Yalanını bir az da inamlı, inandırıcı söylədi:

– “Sübh çağında görüş” əsəriniz doğrudan-doğruya böyük yazıçı əməyinin məhsuludur. Hər sözü, hər cümləsi ürək qanı ilə yazılıb. Dərin mənalar, hikmətlər, müdrik ifadələrlə sip-silədi... Özünütərif düşməsin, yeri gəlmişkən, sizə bildirim ki, mən mütaliəni çox sevirəm. Bədii əsərləri su kimi içirəm. Sizin kimi təbii yazan, dərin müşahidəli ikinci yazıçı rastıma çıxmayıb. Qələminizə min alqış!

Şakir Şadmanlının qaşları birdən çatıldı. Dilotu yemiş müsahibinə zəndlə baxdı.

– Deyəsən, siz də yazı-pozu ilə məşğulsunuz. Təzə yazanlardan deyilsiniz?

– Xeyr, – Əfsun ciddiyyətlə başını buladı. – Mən iqtisadçıyam. Dövlət iqtisad institutunda ali təhsil almışam.

– Bəs?.. – Şadmanlı duruxdu. Sualını yarımçıq saxladı.

Əfsun bicərtək təbəssümünü dodaqlarının bir ucundan o biri ucuna ötürdü.

– Sizi anlayıram, Şakir müəllim. Təəccüblənirsiniz ki, yazıçılıq peşəsinə dair bu incəlikləri necə, hardan bilirəm... Düzdü?

Şadmanlı mat-mat təsdiqlədi:

– Doğrudan təəccüblüdü... Bizim sənətin incəliklərinə bələdsiniz. Belə şey adi mütaliə ilə əxz edilmir.

– Düz buyurursuz, Şakir müəllim. Mən bunları ayrı mənbədən öyrənmişəm. Sizdən yaxşı olmasın, sevdiyim başqa bir yazıçının öz həyatından bəhs eləyən kitabından məlumatlanmışam. Biz naşılara yazıçılıq asan görünür. Düşünürük ki, istedadın varsa əgər, bir kağızdı, bir də qələm, döşə getsin. Sən demə, istedadın olması kifayət deyilmiş. Bir əsəri yazıb qurtarınca cəfadan can üzülürmüş.

Şadmanlının çibanı deşildi:

– Can üzməyi az şeydi. Əsər yazmaq iynə ilə gor qazmağa bərabərdi. O dünyanı görüb qayıdırsan.

– Öz həyatını qələmə almış yazıçı da o zillətlərdən açıq danışır. Məşhur bir romanına görə başına müsibətlər gətiriblər. Çap eləməyiblər, işdən qovublar. Neçə il çox acı günlər keçirib. Adicə çörək pulu da tapmayıb, dilənçi vəziyyətinə düşüb. Nə var, nə var ki, həqiqəti yazıb, yaşadığı cəmiyyətin eybəcərliklərini göstərib. Heç nəyi ört-basdır eləməyib... Buna bənzər bir halla, yəqin ki, siz də üzləşibsiz. Axı, həqiqətin gözünün içinə düz baxan yazıçılarımızdan biri də sizsiniz.

Şadmanlı xəcalətdən bu dəfə lap möhkəm qızardı. Başını aşağı salıb dinmədi. Əfsun şirinlik üçün təəssüfünü bildirdi:

– Amma bir oxucu iradımı da burda sizdən gizlətmək istəmirəm, Şakir müəllim. Çox-çox heyiflər olsun ki, az yazırsınız. Pərəstişkarlarınızın gözlərini yolda çox qoyursunuz. Səbəbi nədi?

– Səbəbi... – Şadmanlı düşündü, inandırıcı cavab axtardı. – Taqsır vaxt çatışmazlığındadı. Yaradıcılıqla müntəzəm məşğul ola bilmirəm. İdarə işləri başımı çox qatır.

Əfsun sözə qüvvət verdi:

– Müdriklər “vaxt qızıldı” – deyiblər. Nə fayda ki, o qızılı əksər halda boş-boşuna xərcləyirik.

Şadmanlı başını aşağı saldı. Kağız-kuğuzla qurdalandı. Bu, söhbəti qurtarmağa işarə idi. Əfsun mətləbə yaxınlaşdı:

– Atalar “uman yerdən küsərlər” – deyiblər, Şakir müəllim. Bütün oxucularınız adından sizə daha bir iradım var: az yazmağınız öz işinizdi, ona qarışa bilmərik. Lakin Qarabağda cərəyan

eləyən dəhşətli hadisələr barədə susmağınız, gərəkli və görkəmli bir əsər ortaya qoymamağınız biz oxucular üçün qaranlıqdır, anlaşılmaz haldı. İstərdik ki, bu mövzuda sanballı bir kitabınızı oxuyaq. Məsələn, lap elə "20 yanvar" faciəsi haqqında. Bu faciə heç yerdə, heç ölkədə analoqu olmayan vəhşilik nümunəsidi. İstərdik ki, azğınlamış sovet ordusunun dinc əhaliyə qarşı amansız divanını, işğalçılıq xülyasına düşən məkrli qonşumuz ermənilər lazımınca ifşa eləyən bir roman yazıb gələcək nəsillərə yadigar qoyasınız. Nəvə-nəticələr başımıza gətirilən müsibətləri oxuyub, düşmənlərini yaxşı tanısınlar. Biz oxucular bunu yalnız sizin qələminizdən gözləyirik. O biri yazıçılarımızın qələminin gücü belə mövzuya çatmaz. Siz hara, onlar hara?!.. Hə, Şakir müəllim,  başqa məsələlər qalsın bir yana, dünənki dəfn mərasiminin özü elə mükəmməl bir roman mövzusudu. Azadlıq qurbanlarının torpağa tapşırılmasında bütün şəhər camaatı iştirak edirdi. Orada baş vermiş dəhşəti – gənc ananın özünü qəbrə atması cəhdini, yəqin ki, eşidibsiniz...

– Bəli, bəli, eşitmişəm... – Şakir Şadmanlı bərk həyəcanlandı. – Gənc ananın halına çox acıdım, ürəyim ağrıdı. Halal olsun onu xilas eləyən oğlana. Əsl igidlik göstərib. Xalqı bədnamlıqdan qurtarıb.

Əfsun döşünü qabağa verib qürrələndi:

– Həmən oğlan mənəm, Şakir müəllim.

– Həə?! Sizsiniz?! – Şadmanlı heyrətlənən kimi oldu. Oğlana qəribə təəccüblə baxdı. – Doğrudan?!

– Bəyəm oxşamıram? – Əfsun təkəbbürlə gülümsündü. – Fikirləşirsiniz ki, o savab işi mən görə bilmərəm?

– Yox, yox! – Şadmanlı səsinə mehribanlıq qatdı. – Afərin! İgid oğlansınız. Bu hərəkətiniz böyük vətəndaşlıq nümunəsidi.

Əfsun şadyanalıqla qımışdı. Hər iki əlini döşünə sıxıb, təzim etdi.

– Minnətdaram, Şakir müəllim. Bağışlayın, yekəxanalıq olmasın, mən dəfn mərasiminin nizamlı keçməsində də cəhdlər göstərmişəm. Meydandan ta "Dağüstü park"a qədər qayda-qanuna riayət edilməsinə çalışmışam. Heç bir pozuntuya yol verdirməmişəm. Təşkilatçılara artıqlaması ilə kömək durmuşam.

Şadmanlı məmnun-məmnun başını  tərpətdi.

– Bəyəndim sizi. Məndən nə kömək lazımdır?

– Sizin bu komitənizdə münasib iş istəyirəm.

Şadmanlı gicgahını qaşıya-qaşıya düşündü. Əfsun ayağına yer elədi:

– Bilməmiş olmazsınız, Şakir müəllim. Peyğəmbərimiz buyurur ki, xeyirxahlıq lalların danışan dili, karların eşidən qulağıdı. Siz də elə Tanrı-peyğəmbər övladısınız. Soraqlaya-soraqlaya gəlmişəm yanınıza. Böyük yazıçımıza pənah gətirmişəm. Vəziyyətim son dərəcə ağırdı. Neçə müddətdi işsizəm. Himayənizi məndən əsirgəməyin.

Şadmanlı həlim təbəssümlə soruşdu:

– Gərək ki, iqtisad institutunu bitiribsiz. Özünüzü təqdimdən belə başa düşdüm, yanılmıram ki?

– Xeyr, Şakir müəllim, yanılmamısınız. – Əfsun cavabı bir an belə ləngitmədi. – O institutun maliyyə-kredit şöbəsində yüksək qiymətlərlə oxumuşam. Son kursa qədər əlaçılıq təqaüdü almışam.

Şadmanlı təqdirlə dilləndi:

– Çox yaxşı! Bəyəndim sizi. – O, kreslosunu yana sürütdü. Əlini üstü rəqəmlərsiz telefon aparatına uzatdı. (Bu, daxili telefon idi.) Dəstəyi aramla götürüb qulağına yaxınlaşdırdı. Xəttin o biri ucundan tələsik gələn xırıltılı səsi Əfsun da eşitdi:

– Buyurun, Şakir müəllim!

– Yanına cavan bir oğlan gələcək. Onun sənədlərini vakant yerimiz üçün hazırla... Hə, elə indi gələcək, yanımdadı. Sabahdan gec olmayaraq işə başlasın. Məsim Müslümoviçə özüm məruzə edəcəm.

– Baş üstə, Şakir müəllim!

Şadmanlı şad tərzdə üzünü Əfsuna çevirdi:

– Birbaşa gedin kadrlar şöbəsinə – on altıncı otağa. Hələlik o işlə məşğul olun. Sonrasına baxarıq.

Əfsun ikiqat əyildi.

– Təşəkkür edirəm, Şakir müəllim! Zəndim məni aldatmadı. Doğrudan da sizdə həssas yazıçı ürəyi var. İnsanlığa bir naxışsınız! – deyib xeyli daldalı getdi. Qapıdan şıdırğı çıxdı.

## 8.

Əfsun Zamanlı "Yardımkom"da az dayandı. Kadrlar şöbəsində

işini bitirən kimi, şəhəri seyrə çıxmaq həvəsinə düşdü. Bakının gəzməli, görməli yerlərinə istiqamət götürdü. Həbsxananın dar, darıxdırıcı künc-bucaqlarında yatdığı müddətdə belə azad, sərbəst gəzintilər üçün burnunun ucu göynəmişdi, həsrətini çəkmişdi. Bu seyrlər zamanı gözəl qız-gəlinlərə gözüdoyunca tamaşa etmək, təzə sevda macəraları yaşamaq intizarında çox qovrulmuşdu. İndi budur, asudəlikdə idi. İşi də öz çəmini tapırdı. Durna xanımın acığına yeni "sərgüzəşt" axtarışına başlaya bilərdi. "Gəzəyən ayağa daş dəyər" – deyiblər. Bəlkə, bu gəzintisində köhnə "çuvixa"lardan hansınasa rast gələr, gününü onunla keçirərdi. Gör neçə illərdi üzünə hərarətli qadın nəfəsi dəymirdi.

O, şəhərin baş küçəsinə yönəldi. Köhnə "Bakı Soveti" binası yanından üzüaşağı aramla addımladı. Burada da gediş-gəliş seyrək idi. İnsanlarla həmişə aşıb-daşan bu geniş küçə də dünəndən bəri boşalmışdı. Qarşıya tək-tük çıxan adamlar başlarını kökslərinə əyib, fikirli-fikirli harasa tələsirdilər. Bir hovur əylənib, heç kəs heç kəslə kəlmələşmirdi. Ara-bərədə vurnuxan hərbi nəzarətçilərlə mülki geyimli asayiş keşikçiləri, sözün həqiqi mənasında, əl-ayağa dolaşırdılar.

Əfsun məşhur Nizami muzeyinin qənşənirdən sola buruldu. "Fontanlar" meydanını arxada qoyub, əsas gəzinti küçəsinə döndü. Elarası "Teatrlar küçəsi" adlanan bu sahmanlı küçə heç vaxt kimsəsizləşmirdi. Axşam çağları daha gur olurdu. Tanış-biliş görüşünə can atanlar, deyib-gülməyə, şənlənməyə həvəslilər, aşiq-məşuqluğa meyllilər "başmaq seyrini" məhz buranı seçirdilər. Bəzək-düzəkli qız-gəlinlər, "xanımça"lar da əsasən bu məkanda işvə-naz satardılar.

"Komendant saatı", "Fövqəladə vəziyyət" elanına baxmayaraq, həmən küçə qeyri küçələrə nisbətdə indi də get-gəlli idi. Ara-bərədə deyib-gülənlər, şənlənənlər az deyildi. Çoxmillətli şəhərdə bu hal bəlkə də mümkün sayılmalıdır. Qırğına məruz qalmış yerli əhalinin dərdi-səri qeyrilərinin nə vecinə idi? Yalnız şən musiqi səsləndirilmirdi.

Əfsun gəzinti azarkeşlərinə qoşuldu. Ağır-ağır yeriyib, yanından ötüb-keçənlərə qaşaltı göz qoydu. Başqa millətlərdən olan bərbəzəkli qız-gəlinlərə, hallıca-dulluca xanımlara umacaqlı baxa-

baxa, küçəni üç dəfə o baş-bu başa ölçdü. Rastına nə köhnə, nə də təzə "ov" çıxdı. Cibinin boşluğu təhər-tövründən bilinirdi.

Heysizlədi. Özünü nahaq yerə yorduğunu anlayıb peşmanladı. Lakin bir az sonra əhvalı düzəldi. Qumaş arvadın məktəbli nəvəsi yadına düşdü. Yumruğunu düyüb, alnına çırpdı: "Kül mənim təpəmə! Nağdını evdə qoyub, nisyə dalınca küçələrdə veyllənirəm. Ayaqlarıma əziyyət verirəm... Üzü üzlər görmüş şortu-mortu axtarıram... Nəfəsi ətir qoxuyan sütülcə qız hara, küçə-müçə şintırları hara?!.."

O, acığından təpəsinə yağlıca bir qapaz da ilişdirdi: "Doğrudan əbləhəm! Allah yetirən halalca qismətimi unudub, səmə it kimi şəhərdə vurnuxuram. Nə deyəsən belə ipləmə ağıla?!.."

Əsəbi-əsəbi yırğalandı. Təsəllisini gerçəklətdi: "Gedib o dəli ceyranı dilə tutub, ipə-sapa yatırtmalıyım. Ehmal-ehmal ürəyinə girməliyəm. Çox da ki tərslik eləyir, göylə əlləşir, xam dayça kimi şıllaq atıb, qeyz-qəzəblə fınxırır. Naz-qəmzə satmaq, uşaq kosu kimi atılıb-düşmək qızların qədimi adətidi. Hünər o adəti heçə endirib, məqsədə çatmaqdadır. Bu hünər də ki məndə!"

Adamlardan aralandı. Qətiyyətlə avtobus dayanacağına gəldi. Burada gözü gül-çiçək dükanına sataşdı. Dərhal ağlına gəldi ki, iki çiçək dəməti bağlatsın. Birini Tamaşaya təqdim etsin, o birini Qumaş nənəsinə. Axı, işə düzəlmişdi, bu çiçəklər muştuluq rolu oynayardı. Ən əsası da araya qızla yaxınlıq körpüsü salardı...

Dükan astanasında beyninə başqa bir fikir də yol tapdı: "Qıza hər cəhətdən bələd olub, xasiyyətini də bəyənsəm, lap ona evlənərəm də. Gedib kirayələrdə can çürüdüncə, həmişəlik qalaram onlarda. Yaxşıca evdi, bir az təmir eləmək lazımdı. İmkanım olanda ora-burasına əl gəzdirtdirərəm, aboylarını təzələtdirərəm, yaşamağa yarayar. Yoxsa, bu şəhərdə dövlətdən mənzil almaq uzun həngamədi. Onun üçün gərək qeydiyyatdan keçəsən, növbəyə durasan, illərlə gözləyəsən. İdarələrə ayaq döyməkdən, tilsimli qapılar açıb-örtməkdən, qəbullara yazılmaqdan zəhləm töküləcək... Nənə də ki o dünyalığa namizəddi. Hay-hayı gedib, vay-vayı qalıb. Bir ayağı burda, o biri ayağı gordadı. Ayrı yerdə kirayə sorağına düşməyə nə ehtiyac var?!.."

Dükana həvəslə daxil oldu. Gülləri özü seçdi. İki buket

bağlatdı. Qızınkini əlvan lentlə, bəzək-düzəklərlə hazırlatdı. Durna xanımın sədəqə məqsədi ilə verdiyi pulu oradaca xırdaladıb güllərin xərcini ödədi, qalmışını qatlayıb şalvarının arxa cibinə soxdu: "Allah kərimdi, qazanc yetirər. Qoy Durnanın həqarətlə verdiyi sadağa pulu gələcək xoşbəxtliyim üçün "qızıl açar" olsun. Hər pisliyin axırında bir yaxşılıq gizlənir. Pul sarıdan çətinliyim olsa, Fəriddən borc götürərəm. Bəlkə heç ona da ağız açmadım. İşlərim ki belə uğurlu alınır, sonrası çim-yağ olacaq. Analar mənim kimi oğul doğmayıb hələ!"

Evə çatınca birinci Qumaş arvadı muştuluqladı:

– Gözlərin aydın, ay nənə, işim düzəldi, çətinliklər arxada qaldı!

Qumaş arvad qonağının şadlığını doğma nənə qaydasınca bölüşdü:

– Çox mübarək, ay bala, çox mübarək! Uğurun həmişə xeyirə calansın. Heç vaxt neylim, necə eləyim demiyəsən!

– İman yiyəsi ol, mənim doğmadan doğma nənəm! – Əlində hazır tutduğu kiçik gül bağlancını irəli uzatdı. – Al bu gülləri, nənə, sənə hədiyyədi. Səhər-səhər mənə dilədiyin xeyir-duanın əvəzidi!

– Payın çox olsun! – Qumaş arvad gülləri alıb həvəslə qoxuladı. – İlahidən arzum budur, yollarına bax, bu gül-çiçəklər səpilsin!

– Allah arzunu çin eləsin, nənə! – Əfsun içərilərə intizarla boylandı. – Bəs qız hanı? Tamaşanı soruşuram.

– Dərs oxuyur. – Qumaş arvad pıçıltı ilə dilləndi. Əfsuna da alçaqdan danışmağı, qıza mane olmamağı başa saldı. – Məytəfdən gələli çıxmır otaxdan, işim çoxdu deyir.

– Həəə... – Əfsun səsini alçaltdı, – onda özüm gedim onun gül payını orda verim. Qoy təzə gül-çiçək ətri otağının havasını dəyişsin. Ətirli havada oxunan dərs yadda yaxşı qalır.

O, Qumaş arvadın razılığına vaxt itirmədən qızın yanına şığıdı. Gülləri təklikdə təqdim etmək ona daha sərfəli idi.

Otağın qapısını ustuf-ustuf aralayıb, ayağının biri içəridə, o biri çöldə icazə istədi:

– Bağışla, cəmi bircə dəqiqə vaxtını alacam... Bu gün mənim bayramımdı. İşə düzəlmişəm. Ümidvaram bu xəbərə sən də sevinəcəksən. Odur ki, gül hədiyyəsi gətirmişəm. Qəbul eləsən, ik-

iqat bayramım olacaq.

Tamaşa ona fikir vermədi. Başını kitab üzərinə bir az da əyib susdu.

Əfsun israr etdi:

– Çox xahiş eləyirəm, diqqətini bir hovurluğa kitabdan ayır. Gülləri al, sonra yenə dərsinlə məşğul ol.

Tamaşa sərt və qısaca:

– Mən gül sevmirəm! – dedi.

Əfsun qızın böyrünü kəsdirdi. Səsini həzinlətdi:

– Könlümü sındırma, bunu sənə xoş niyyətlə gətirmişəm.

Tamaşa dinmədi. Əlini yellətməklə rədd işarəsi verdi. Əfsun inadını yeritdi:

– Məyus qaytarma məni...İnciyərəm.

Tamaşa qəzəblə qışqırdı:

– Mane olma mənə!

Əfsun sakit davranmağa çalışsa da əlinə qadağa qoymağı bacarmadı. Nəzərləri qızın yumruca məmələrinə bayaqdan sancılmışdı. Gülləri şux sinənin ortasına sıxdı.

Tamaşa hürkmüş halda ayağa sıçradı. Əfsunu bütün hiddəti ilə itələyib, tövşüyə-tövşüyə çımxırdı:

– Bu nə hərəkətdi?.. Əlini dinc qoy!

Qumaş arvad mətbəxdən soruşdu:

– Noldu orda?

Əfsun dərhal özünü yığışdırdı. Yerə düşmüş gülləri götürüb, Tamaşanı cavabda qabaqladı:

– Heç nə olmayıb, nənə... Nəvən cığallıq eləyir, gülü götürmür.

Qumaş arvad ona acıqlandı:

– Sənə demişəm, işin olmasın qıznan. Gəl bu yana!

Əfsun dilxor-dilxor geri qayıtdı. Əlüstü bəraət uydurdu:

– Çox tərs nəvən var, nənə. Hədiyyəmi yerə atdı. Mən, axı, onu özümə bacı gözündə görürəm.

Qumaş arvad sərt dilləndi:

– Şitdik eləmə! Ağır otur, batman gəl!

Əfsun növbəti lotuluq gəldi:

– Nənə canı, şitdik eləmirəm. Hərəkətimə pis məna verməyin. Mən sizi öz doğmalarım sayıram. Sənə də, nəvənə də qırılmaz könül telləri ilə bağlanmışam. O telləri heç bir qüvvə qıra bilməz!

Qumaş arvad qaş-qabaqla üzünü yana çevirdi. Yalanı doğrudan seçməyə təcrübəsi yetərincə idi.

**9.**

1990-cı ilin müdhiş 20 Yanvar qırğını bütün xalqı silkələmişdi. Uzun əsrlərin qəflət yuxusundan bir gecədə oyatmışdı. Özünü-özünə tanıtmışdı. İtaəti, mütiliyi, qara-qorxu hisslərini ürəklərdən silib-süpürmüşdü. Şəhidlərin küçələrdə göllənmiş qanı dil açıb, hamını intiqama çağırmışdı. Bu ümumxalq hərəkatından qırağa çəkilmişlər, necə deyərlər, arvadlarının donunu geyib küncdə-bucaqda gizlənmişlər də namusa boğulub, izdihama qatılmışdılar. Camaat səhərin gözü açılandan bəri uşaqlı-böyüklü, qocalı-cavanlı "Dağüstü park"a – şəhidləri ziyarətə axışırdı. Əllərdə qərənfil çiçəkləri qızarışırdı.

O gün nə iqtidar mövcud idi, nə də müxalifət. Yalnız xalqın özü vardı. Hər tədbirini, hər vacib işini özü görürdü. Hakimiyyət nümayəndələri gözə görünməkdən çəkinirdilər, çünki qoşunun şəhərə girməsinə, məlum vəhşiliklərin törənməsinə razılıq vermişdilər. Müxalifətçilər isə özlərini üzüqara gəlin ovqatında hiss edirdilər. Hərəkatı idarə etməyi bacarmamışdılar. Əhali aldadılmışdı. Əliyalın adamlar müsəlləh ordu ilə üz-üzə gətirilmişdi...

Şəhər yenə çaxnaşırdı. Yaxın kəndlərdən, rayonlardan da şəhidləri ziyarətə gələnlər çoxalmışdı. İzdihamın ucu görünmürdü. Bu təlatüm öz təsirini sanki dənizə də keçirmişdi. Neçə gündən bəri quzu yatımlı Xəzər yenə qabarmışdı, hey çalxalanırdı. Ağır, köpüklü dalğalarını sahil qayalarına qəzəblə çırpır, yazıq hövl ilə geri qayıdırdı. Elə bilərdin, qocaman dəniz, ağbirçək şəhid analarının özünə divanını təkrarlayır.

Tısbağa addımları ilə irəliləyib ucsuz-bucaqsız növbədə saatlarla ayaq üstə qalmaq heç də asan deyildi; dizlərə qara su enir, topuqlar aramsız sızıldayırdı. Ancaq cərgədən dala qalmağı, yarıyoldan qayıtmağı heç kəs ağlına gətirmir, şəninə sığışdırmırdı. "20 Yanvar" şəhidlərinin ziyarətini hamı özünə müqəddəs borc sanır, bundan mənəvi təskinlik tapırdı.

Təskinliklər bununla da bitmirdi. Şəhid ailələrinə kömək etməyi,

himayə göstərməyi də yaddan çıxarmırdılar. "Dağüstü park"ın qurtaracağında qəbirqazanlara, məzarların üstünü hörənlərə dincəlmək, soyuqdan, şaxtadan qorunmaq üçün sığınacaq çadırı qurulmuşdu. İş hələ çox idi. Ayrı-ayrı kənd və rayon qəbiristanlıqlarında dəfn edilmiş şəhidlərin də buraya köçürülməsi, hər qəbrin sinə və başdaşıları eyni biçimli qara mərmərdən hörülməsi qərara alınmışdı.

Ziyarətə qoşulmuş qarı-qocalar, şil-şikəstlər arabir bu çadıra gəlirdilər. Nəfəslərini dərib, su içib gedirdilər. Burada çay da, hətta, bir qarın yemək də olurdu. Parkın yaxınlığındakı binalarda yaşayan xeyirxah insanlar çadırdan ayaqlarını çəkmirdilər. Öz imkanları müqabilində evlərində çay hazırlayır, xörək bişirib gətirir; zəhmət çəkənlərin qulluğunda dururdular. Bundan əlavə cibxərcliyi verənlər də yox deyildi.

Əfsun Zamanlı Qarabağa Yardım Komitəsində ilk fəaliyyətini buradan başladı. "Şəhidlər xiyabanı"nda görülən işlərə rəsmi nəzarətçi göndərildi. Hakim qüvvələr hələ müəyyən gücə malik idilər. Müxalifətçiləri, hər yerdə ictimaiyyətlə təmasdan qıraqda qoymağa çalışırdılar.

Əfsun fərasətini burada ikiqat göstərdi. "Yardımkom" vəsiqəsini gözə soxub, hər işə qarışdı. Dəfn günündəkindən artıq canfəşanlıq nümayiş etdirdi. Mühüm işləri dəstələyib əlinə aldı. Onsuz bir çöp belə yerindən tərpədilmədi.

Həmən gün şəhidləri ziyarətə gələnlər arasında ciblərinin ağzını səxavətlə açanlar daha çox oldu. Əvvəlki günlərdə "yardımı" xəlvəti, kənar gözlərdən gizlin edirdilərsə, indi açıq-aşkar gətirib ortaya qoyurdular. Böyük məbləğ yaranmışdı, onu rəsmi qeydiyyata götürmək, vacib ehtiyaclar üçün xərcləmək lazım idi.

Dəfn komissiyası üzvləri də, müxalifətçilər də yaxalarını bu işdən kənara çəkdilər. Onun məsuliyyətindən ehtiyatlandılar. Əfsun mühüm dövlət idarəsi nümayəndəsi kimi irəli durdu. Səhər bura gələndə özü ilə iki-üç şagird dəftəri və qələm götürmüşdü. İti fəhmi sanki belə bir işə cəlb ediləcəyini əvvəlcədən duymuşdu.

Dəftərləri qoltuq cibindən tələsik çıxartdı, qələmi əlinə aldı. Domuşuqlu oturub, dizləri üstündə qeydiyyat apardı. Lazımi qaydada pulları sayıb, ipçinləyib, haradansa əldə etdiyi kağız torbaya doldurub ağzını kəndirlə möhkəm bağladı. Söz yox ki, arada öz cib-

inin də hayına qaldı. Amma, insafən, ona çox tamah salmadı, etimad qazanmağı fikirləşdi. Belə fürsət irəli günlərdə də ola bilərdi.

O, pulları axşamçağı idarəyə gətirdi. Qarabağa Yardım Komitəsinin maliyyə şöbəsinə rəsmən təhvil-təslim etdi. Məsələni Şakir Şadmanlıya da çatdırdı, "sağ ol!" qazandı. Hələ könlündən komitə sədrinin təşəkkürünü almaq da keçdi.

Bu istəyi də baş tutdu. Ertəsi gün saat on bir radələrində komitənin sədri onu yanına çağırtdırdı. Məsul işçilərin iştirakı ilə səmimi razılığını söylədi:

– Bizim əməkdaşlar sizin ilk fəaliyyətinizdən çox razıdırlar, – dedi. – Birinci gündən işə uğurla, yaxşı səriştə ilə başlayıbsınız. Məlumatıma görə, müxalifətçilərə heç nədə göz açmağa imkan verməyibsiniz. Dövlətçiliyimizə qənimləri, o lovğa hay-küyçül gədələri hər cəhətdən üstələyibsiniz. Afərin! Alqışlayıram məharətinizi. Bax, bu cür işləmək lazımdır. Əhali arasında, kütlə içində sovet dövlətinin, kommunist partiyasının əvvəlki nüfuzunu bərpa etmək hər birimizin təxirəsalınmaz vəzifəmizdir. Bir dəstə atasından xəbərsizlər, ana əmcəyi kəsən residivistlər meydana atılıb, camaatı çaşbaş salıblar. Hökumət əleyhinə, kommunist partiyası ziddinə gic-gici təbliğat aparırlar. Sosializm cəmiyyəti kimi analoqsuz bir cəmiyyəti müstəsna quruluşu çirkin böhtanlar, uydurma nöqsanlarla ləkələmək istəyirlər. Dayaqları qranitdən də möhkəm bir hakimiyyəti devirmək xülyası ilə yaşayırlar. Ətraflarına da elə özləri təki yaramaz ünsürləri, antipodları, insanlığa layiq olmayanları toplayıb, meydan yığıncaqları, küçə yürüşləri keçirirlər... "İyirmi yanvar" faciəsini qəsdən yerli hökumət rəhbərlərinin üstünə yıxırlar ki, gözə kül üfürsünlər. Qırğını öz absurd məqsədləri üçün yaratdıqlarını ört-basdır eləsinlər. Belə təxribatçılarla amansız olmalıyıq. Bilməliyik ki, bizim əsas düşmənimiz ermənilərdən öncə daxilimizdəki parazitlərdi. Bütün gücümüz, var qüvvəmizlə çalışmalıyıq ki, o boşboğaz hay-küyçülər, irsiz böhtançılar kütlə nəzərindən tamam düşüb, heç kim olsunlar!

Komitə sədri əsəb qıcığı ilə yırğalandı. Handan-hana özünü ələ alıb toxtadı. Göyçək sifət cizgiləri qəddinə düşdü. Məmnun baxışlarla Şakir Şadmanlıya təşəkkürünü bildirdi:

– Yeri gəlmişkən, sizə də şəxsi minnətdarlığımı elan edirəm, Şakir müəllim. Bu oğlanı, – gülümsünərək Əfsuna işarə etdi, – sizin nadir tapıntınız sayıram. Bizə hazırkı mürəkkəb dövrdə məhz belə diribaş, işgüzar gənclər hava və su kimi lazımdır. Burasını da sözgəlişi açıqlayım ki, bizim komitə "cəbhəçilər"ə alternativ bir təşkilat olaraq yaradılmışdır. Odur ki, daxili düşmənlərimizə "Qarabağ kartından" sui-istifadə etməyə əsla yol verməməliyik. Yerlərində fas-farağat oturtmağı bacarmalıyıq. Bunun üçünsə, bir daha vurğulayıram: sağlam ruhlu, sovet ideologiyasına ehtiramlı gəncləri ətrafımıza toplayıb, onlarla sarsılmaz birlik yaratmalıyıq. Yad təsirlərə müvəqqəti uymuşları da çalışıb öz sıralarımıza qaytarmalıyıq. Gənclik bizim vuran qolumuz, daşdan ağır yumruğumuzdur. Onlarsız heç bir qələbə, heç bir uğur yoxdur. Qoy bütün əməkdaşlarımız yaxşı kadr üçün gözdə-qulaqda olsunlar.

Şakir Şadmanlı təvazö ilə qımışıb, müdaxiləyə icazə istədi:

– Məsim Müslümoviç, sizə bir mühüm məlumatı da çatdırmağı özümə borc bilirəm.

Məsim Müslümoviç müavininə görklü etimad göstərdi:

– Buyurun, Şakir müəllim, sizi məmnuniyyətlə dinləyirəm.

Şadmanlı xeyli dikəlib, fəxarətlə ərz etdi:

– Şəhidlərin dəfnində özünü qəbrin içinə atmağa çalışan gənc ananı tutub saxlayan da bu oğlandı. O gün bu cəsurluqdan özünüz də çox razı qalmışdınız.

– Bəli, bəli. Ziyadə razı qalmışdım. – Məsim Müslümoviç Əfsuna yeni diqqət yetirdi. Ala gözləri geniş-geniş açılıb şölələndi. – Deməli, o qəhrəman budur!? Çox şadam ki, belə bir qoçaq oğlan bizim işçidir. Bundan qürur duyuram. – O, sağ əlini irəli uzadıb, Əfsunu yaxınındakı boş stula dəvət etdi. – Keçin, burda, gözümün önündə əyləşin. Xalqına, dövlətinə başucalığı gətirən oğullara mənim xüsusi rəğbətim var. Bu torpağın suyu, çörəyi, havası, ana südü qədər halaldı sizə!

Əfsun təklif olunan yerdə əyləşməyə tələsmədi. Özünü ağır apardı. Fəhmi ilə anladı ki, təvazölü davranış bu dəqiqələrdə ona daha xeyirlidir.

Məsim Müslümoviç Əfsunu böyründə təkidlə əyləşdirib, zərif eynəyini gözlərindən götürdü, əməkdaşlarına üz tutdu:

– Hörmətli həmkarlarım, sizi inandırıram ki, əgər dərddən huşunu itirmiş, ağlını çaşmış o gənc ana özünü qəbrə atıb həlak olsaydı, böyük qaxınc sahibi olacaqdıq. Cahanşümul şöhrətimizi istəməyənlər, xəlvətdə ayağımızın altını qazan iftiraçılar milçəkdən fil düzəldəcəkdilər. Bunu ümumi nöqsan kimi, aləmə car çəkəcəkdilər ki, baxın, sovetlər ölkəsində ölülərlə bərabər, diriləri də qəbrə gömürlər.

Şakir Şadmanlı icazəsiz təsdiqlədi:

– Tamamilə doğrudur, Məsim Müslümoviç. Bu fakt mütləq şişirdiləcəkdi. Öz cılız qəzetlərində şər-şamartılarla dolu cızma-qara yazılar verəcəkdilər. Xarici radiolara, qərbin bizə qarşı qərəzli mətbuatına uydurma məlumat ötürəcəkdilər. Sosializmin dünyəvi nüfuzuna xələl gətirməyə can atacaqdılar.

Əməkdaşlardan biri siyasi səbatlıq göstərdi:

– Dünyada qüdrətinin tayı-bərabəri olmayan Sovet dövləti çoxlarının gözlərini dağlayır. Xüsusən də Amerika Birləşmiş Ştatları bizimlə gözyağı yeyib. Çünki bizi özündən çox-çox üstün görür. Paxıllığından bağrı partlayır!

Məsim Müslümoviç yüngül təkzib verdi:

– Gözləri dağlanmaqla, paxıllıqdan bağırları partlatmaqla iş qurtarmır. Həm hərbi qüdrətimizi, iqtisadi inkişafımızı, həm də sovet xalqlarının mətin dostluğunu, möhkəm əqidə birliyini görüb, hər sahədə bizimlə üz-üzə gəlməkdən çəkinirlər. Çirkin əməllərinə gizlin qəsd hazırlayırlar. Bizi daxildən sarsıtmağa çalışırlar. Bəzi nankor, umsuq, şarlatan vətəndaşlarımızı pulla, başqa şirnikdirici üsullarla satın alıb, xalqı öz can-ciyər hökumətinə qarşı qoymaq siyasətinə keçiblər. Soyuq müharibə üsulu seçiblər. Ona görə də bir daha ayıq-sayıq olmalıyıq. Arxayınçılığa uymamalıyıq. İlk növbədə gənclərlə tərbiyəvi işləri gücləndirməliyik. Bəzi gənclər təcrübəsizlik ucbatından "şirnikdirmələrə" daha çox meyllidirlər.

Başqa bir əməkdaş şit-şit öyündü:

– Sağlam ruhlu, polad iradəli, əqidəsini heç nəyə dəyişməz gənclərimiz miqyasa sığmaz qədərdi, Məsim Müslümoviç. Narahat olmağa dəyməz!

Məsim Müslümoviç eynəyini qaytarıb burnunun üstünə taxdı. Nə üçünsə köks ötürdü.

– Bununla belə, heç vaxt arxayınlaşmamalıyıq, – deyib bir neçə anlığa susdu. Düşüncəli-düşüncəli əlavə etdi: – Bu saat siyasi iqlim çox ağırdı. Vəziyyət bizim fərzimizdən qat-qat gərgindi. Maksimum sayıqlıq tələb olunur. Təkrar eləyirəm: "Cəbhəçi"lərə göz verib işıq verməməliyik. "Meydan hərəkatı"na son qoyulmalıdı. Qarşımızda duran əsas vəzifə budur!

Daha heç kim danışmadı. Sədrin qırımını başa düşmüşdülər. Əlavə söz qıcıq doğurardı.

Məsim Müslümoviç eynəyini şəhadət barmağının ucu ilə geri itələyib Əfsunu bir də gözaltıladı:

– Siz düzgün yoldasınız, cavan oğlan. Bütün gəncliyə nümunə olacaq ağıl və fərasətiniz məni sevindirir. Şücaətinizdən razıyam. Gələcəyinizi daha parlaq arzulayıram.

Əfsun ədəb-ərkanla sədrə baş əydi. Ölçü-biçili razılıq söylədi:

– Çox sağ olun, Məsim Müslümoviç! Minnətdaram ki, adi bir işi bu dərəcədə yüksək qiymətləndirirsiniz. Vallah, utanıram. Axı, mən elə də böyük hünər göstərməmişəm. Öz vətəndaşlıq borcumu, insanlıq vəzifəmi yerinə yetirmişəm.

Sədr bu təvazödən son dərəcə xoşhal oldu. Eynəyini asta-asta alnına qaldırdı, Əfsuna gözləri dolusu heyranlıqla baxdı. Həmən heyranlıq səsində də sezildi:

– Kaş vətəndaşlıq borcunu, insanlıq vəzifəsini hamı sizin kimi anlayaydı. Onda həll olunmamış problemimiz qalmazdı!.. – O, dərin nəfəs çəkdi. Şadmanlıya rəsmən tapşırdı: – Bu oğlanı diqqətdə saxlayın. Zənnimcə, ona ən məsul, ən vacib işləri tərəddüdsüz həvalə etmək mümkündür. Hələlik şəhidləri ziyarətə gələnlər arasında olsun. Oradakı məsələləri nizamlasın, təcrübə toplasın. Onun haqqında fikrim başqadı. Belə gənclər tərəddüdsüz qabağa çəkilməlidir, onlara yüksək etimad göstərilməlidir!

Əməkdaşlar həsədli nəzərlərini hər yandan Əfsuna tuşladılar. Bu, tezliklə rəhbərliyin belə rəğbətini qazanmaq nadir hal idi. Bayıra çıxanda Fərid yarızarafat, yarıgerçək ona sataşdı:

– Dünən şeş, bu gün beş!.. Əziz-mehriban dost, göz dəyməsin,

çox iri addımlarla qabağa gedirsən. İşə düzəldiyin heç üç gün deyil, sədrimizin gözünün işığı olubsan. O, bu vaxta qədər heç kəsə bir belə xoş sözlər deməyib. Biz yazıqlar ümumi iş üçün dəridən-qabıqdan çıxırıq, canımızı oda-közə yaxırıq, neçə ildi adicə bir "sağ ol"u da qazana bilməmişik.

Əfsun burda da özünü təvazö ilə apardı. Fəridin qoluna girdi, şirin dil-ağız elədi:

– Mənim qazandığım az-çox bu uğurdan sənə də pay düşür, – dedi. – Mən sənin xeyirxahlığınla burda işə düzəlmişəm. Çalışacağam ki, bu etimadı həmişə doğruldum. İndi isə, gəl düşək bufetə, uğurumuzu ayaqüstə qeyd eləyək. Əsas qonaqlığım qalsın bir az sonraya.

Qol-qola girdilər. Binanın zirzəmisinə endilər.

## 10.

Havalar mülayim keçməkdə davam edirdi. Sanardın, ana təbiət rəhmə gəlmişdi. İmkan verirdi matəmli insanlar ölü-diri qayğısına yetərli qalsınlar.

Rəsmi məlumata görə, həmən günlərdə Azərbaycanın bütün "Doğum evləri"ndə dünyaya göz açmış körpələrin böyük əksəriyyəti oğlan olmuşdu. Bu, bəlkə də, ulu Tanrının məyuslaşmış bəndələrinə təsəlli mesajı idi. İtkilərin yerini doldurur, şərin at oynatmasının qarşısını alırdı.

Əfsun Zamanlı rəhbərliyin etimadını daha artıq qazanmaq, Məsim Müslümoviçin nəzərində bir az da ucalmaq üçün axşamlar evə qayıtmamağa, növbəli qəbirqazanlarla birlikdə çadır sığınacağında gecələməyə üstünlük verdi. Nigarançılıq yaranmasın deyə, Qumaş arvadı məsələdən hali elədi. Onun nəvəsi ilə könül sövdasını isə istər-istəməz təxirə saldı: əvvəlcə ticarət, sonra ziyarət!

Şəhidlərin valideynləri, yaxın qohumları, simsarları da qəbir üstündən çox gec dağılışırdılar. Gecənin yarısınadək qalır, məzarlara mərmər döşəyənlərə, palçıq qarışdıranlara, ətrafı sahmana salanlara bacardıqları köməyi göstərməkdən ruhi rahatlıq tapırdılar. Məzarların səliqə-sahmanı şəhidlərin "qırxı"na qədər qurtarılmalı idi.

Xeyriyyəçilik miqyası da get-gedə genişlənməkdə idi. Elə bil, hamı bir-biri ilə bəhsə girmişdi. Hərə öz imkanı daxilində yardıma

könüllü qoşulmuşdu. Xalqına, milli kökünə göbəkdən bağlı müəssisə və təşkilat başçıları, fabrik-zavod müdirləri, gizli sex sahibləri bu yardıma əlaltından böyük məbləğlərdə pul köçürürdülər. Və heç kəs də etdiyi yardım üçün hansısa bir sənəd istəmirdi. Hamı mənən təmizlənmişdi. Oğurlanma, mənimsənmə barədə düşülmürdü. Belə çirkin halın mümkünlüyü ağıla-şayna gəlmirdi. Müqəddəs amal adına toplanan vəsaitə hansı tamahkarın, fırıldaqçınınsa meyil salacağına güman gətirmək yaddaşlardan silinmişdi. Qəzetlər o günlərdə məxsusi iftixar hissi ilə yazırdılar ki, cinayətkar aləm də ümumxalq dərdinə həmrəylik göstərmişdir, şəhərdə  bir dənə də cinayət qeydə alınmamışdır.

Lakin meşə heç vaxt çaqqalsız olmur!

Əfsun Zamanlı bu dəfə daha tədbirli tərpəndi. Çadırda yerini lazımınca möhkəmlətdi. Daxil olan pulları heç kimə etibar etmədi. Əvvəldə olduğu kimi, qeydiyyatı özü apardı. Rəhbərlikdən xahiş edib Fəridi də özünə köməkçi, maliyyə işlərinə nəzarətçi göndərtdirdi ki, əmin-amanlıq olsun.

Şəhidlərin ilk “cümə axşamı məclisi” şəhərin müxtəlif yerlərində (qadağalara baxmayaraq) mütəşəkkil keçirildi. Ümumi inad göstərildi. “Dağüstü park”da isə xeyriyyəçilərin çadır qarşısında növbəsi get-gedə uzandı. Qeydə almaqdan Əfsunun barmaqları keyidi, biləyi sızıldadı. Lakin belə əziyyət ona ləzzət verirdi. Elə başa düşülməsin ki, xalqın məqsəd birliyindən, əzmindən məmnun idi. Xeyr! Sadəcə, yığılan pulların çoxluğuna, məbləğin ağıl çaşdırıcı böyüklüyünə mat qalmışdı. Ondan özünün necə bəhrələnəcəyi üçün baş sındırıb üsullar düşünürdü. Hərdən-hərdən də Fəridi sınağa çəkmək, onu qara niyyətinə qoşmaq qəsdi ilə məzə qurur, artistsayağı rola girirdi. Gələn-gedənlərin ara verən, ətrafda heç kəsin gözə dəyməyən vaxtlarda gedib pul təpəcəyini hərarətlə qucaqlayır, şən mızıltı ilə ona mədhiyyə oxuyurdu:

– Canım-gözüm, sənə qurban özüm, ey pul! Səndən şirin, səndən əziz, səndən qüdrətli heç nə yoxdur bu dünyada. Sənsən hörmətsizi hörmətə mindirən, ləyaqətsizi ləyaqətli eləyən, heç nədən hər şey yaradan! Sənin bacardığını bu yer üzündə yüksək ağıl, çox qüdrətli zəka sahibləri bacara bilmir. Lap şah olsun, imperator

olsun, sənin gücün qarşısında acizdi. Elə şahı, imperatoru hökmlü eləyən, qəhrəmanları ona diz çökdürən də yenə sən özünsən. Ey idealım, sevgi amalım pul, nə olar, mən yetimin, cibi boş fəqirin də karına gəl, ciblərinə dol, xoşbəxt elə!

Fərid bu mədhiyyələri yalnız zarafat oyunu, şuxluq kimi başa düşür, heç nə demədən dodaqucu qımışırdı.

Axşama doğru, get-gəllər tamam kəsilən zaman Əfsun məzələnməsini bir qədər gerçək tərzdə təzələdi:

– Ə, Fərid, can-ciyər dost, Allahın altında bu qədər pulumuz olsaydı, görəsən neyləyərdik?

– Heç  nə eləməzdik! – Fərid etinasız dilləndi.

– Ə, necə heç nə eləməzdik?! Zarafatsız soruşuram.

– Mən də zarafatsız deyirəm, heç nə!

– Səni bilmirəm, mən papağımı şadlığımdan göyə atardım.

– İçi boş papağı da Bakı küləyi qapıb dənizə atardı!

– Dənizə atardı, mən də gedib qızqaytaranını alardım.

– Qız qaytaran papaq bahadı, pulun çatmaz.

– Pul budur, gözümüzün qabağında!

Fərid təəccübləndi:

– Sən bunu doğru deyirsən?

– Hə, lap doğru! – Əfsun zarafat ahəngini ciddiləşdirdi: – Belə fürsəti ötürsək, sonradan dizimizə çox döyərik. Bizi güdən yox, hesabı bilən yox.

Fəridin matı-qutu qurudu.

– Sən ağlını çaşıbsan-nədi? – Dili-dodağı təpimiş halda pıçıldadı. – Bu vəsaiti adamlar öz ailəsinin öynəsindən kəsib, qara gün üçün qəpik-qəpik yığdığı xərclikdən ayırıb, şəhidlərin ailələrinə yardım, yaralıların müalicəsinə kömək üçün veriblər. Müqəddəs əmanətə tamah salmağı özünə necə rəva bilirsən?

Əfsun bic-bic irişdi.

– Mən beləyəm... Gözüm gördüyündən göz kirəsi istəyirəm.

Fərid bir anlığa duruxub, bağırdı:

– Sən əclafsan!.. Bir misqal namus, vicdan yoxdu səndə! Gör nəyə iştahlanırsan! Səndə canavar xisləti var!

Əfsun hay-küyü vecinə almadı, arsızlıqla:

– Mən canavar deyiləm, hadisələrə ayıq gözlə baxan insanam, – dedi.

Fərid dərin təəssüflə başını buladı:

– Sən dəhşətli adamsan! Beşillik həbs cəzası da ağlını başına yığmayıb.

Əfsun ucadan, rişxəndlə güldü.

– Mənim ağlım yetgindi. Amma səninki hələ də kaldı. Yaşın artsa da heç nəyin dəyişməyib. Elə tələbəlik vaxtındakı hürkək, öz kölgəsindən qorxan Fəridsən. Boş-boş təbliğatlar təsirindəsən.

Fərid sərtliklə ona arxasını çevirdi. Danışmağı lüzum bilmədi. Əfsun ara verib şitəngi-şitəngi soruşdu:

– Evlənibsən?

– Bunun sənə dəxli yoxdur!

– Dəxli var ki, soruşuram.

– Hə... evliyəm. Sonra?

– Sonra da canına sağlıq... uşağın var?

– Bəli var! – Fərid hirs fısıltısı ilə cavab verdi: – Bir oğul və bir qız atasıyam.

– Allah saxlasın!

– İnşallah, saxlayar!

– Harda qalırsan?

– Bunu bilmək belə vacibdi?

– Qorxma, qonaq gəlməyəcəm... Kirayədəsən, ya ev alıbsan?

– ...Kirayədəyəm.

– Ehh, binəva! – Əfsun onun cırnatmaq məqsədi ilə halına acıdı: – Bilirəm, nə zillət çəkirsən. Aldığın maaşın yarısını bəlkə də ona verirsən. Hər gün də üzün danlanır ki, işığı çox yandırırsan, qazı-suyu artıq işlədirsən... o da bəlli deyil ki, hökumət sənə haçan mənzil verəcək... ümumiyyətlə, verəcəkmi?

– Mütləq verəcək! Komitəmiz öz işçiləri üçün bina tikdirməyə hazırlaşır.

– Ölmə, eşşəyim, ölmə. Yaz gələr, yonca bitər! – Əfsun əlini tovlayıb, çadırda irəli-geri addımladı. – Eh, əziz-mehriban dost, boynuna alsan da, almasan da əhvalına bələdəm. Kor deyiləm, görürəm, dolanışığın o qədər də ürək açan deyil. Mən də ki səndən beş-betərəm.

Axı, niyə belə olmalıdı? Biz də bu millətin övladıyıq. Kimdən, hansı cəhətdən əsgiyik? Fəhm-fərasatda, bacarıqda beşindən dala qalsaq da, yüzündən irəliyik. Mənəm-mənəm deyənləri suya susuz aparıb, susuz da qaytararıq. O gün gördün Məsim Müslümoviç haqqımda necə yüksək sözlər dedi?! Kişinin dili yox, ürəyi danışdı. Belə olduğu halda nə üçün fərasətsizlər, kütbeyinlər pula pul deməsinlər, onu xəzəl yerinə işlətsinlər. Səninlə mən isə ehtiyac içində, maddi sıxıntı məngənəsində çapalayaq?!.. Bu ədalətsizlikdi, həyatın paradoksudu! Sabah, o biri gün gəncliyimizlə xudafizləşəcəyik. Məlum deyil, ömrümüzdən nə gedib, nə qalıb. Olsun ki, heç əlli yaşı da haqlamadıq. Bəs haçan insan kimi yaşayacağıq? Həyatımızı boş-boşunamı çürütməliyik? Cavab ver mənə!

Fərid çiyinlərini yırğalayıb ona baş qoşmadı.

Əfsun hücuma keçdi:

– Bax, görürsənmi cavab verəmmirsən, susmağa məcbursan... Əslinə qalanda, sən də, mən də cümə axşamına yığışdığımız günahsız qurbanların bir tayıyıq. Onlardan fərqimiz yalnız quruca nəfəsimizin gedib-gəlməsidi.

Fərid dözmədi. Geri çevrilib, nifrətlə çımxırdı:

– Qurtar bu şitəngi söhbəti! Mən sənə qulaq asmaq istəmirəm. Aydındı, bu çərənləmələrin arxasında hansı məqsəd durur. Məni cinayətə sürükləyə bilməzsən!

Əfsun onu bir xeyli qaşaltı süzdü. Birdən közü artıq düşmüş samovar kimi pıq-pıq pıqqıldadı. Bu xımır gülüş sonra güclü qəhqəhə ilə əvəzləndi:

– Hi-hi-hiii... ha-ha-haaa!.. Qəribə oğlansan, Fərid Cəbizadə, çox qəribə oğlansan!.. Ə, mən dedim, sən də inandın?!.. Sadəlövhsən, vallah, uşaqdan da sadəlövhsən!

Fərid ona yenidən arxasını çevirdi.

– Dilə tutma məni! İç üzün büsbütün üzə çıxdı. Bilindi hansı yuvanın quşusan.

Əfsun qızarıb-bozardı:

– Ə, mənə bax, doğrudan inandın?

– Aldatmağa get ayrı adam tap!

– Ə, sən öl, sənin əziz canın haqqı...

– Özün öl! – Fərid rəsmi, vəzifəli şəxs olduğunu anlatdı: – Danışığını bil! Ağzında sözünü bişir, sonra söylə!

– Di yaxşı, özüm ölüm... ə, səninlə məzələnirdim e, zarafatlaşırdım... lap doğrusu, sınağa çəkirdim. Qəsdən dilə tuturdum ki, görüm, azacıq da olsa, mən deyənə sıyılırsanmı. Mərhəba! Möhkəm oğlansan. Əqidənə, məsləkinə sadiqsən.

– Ört-basdıra cəhd eləmə. Ət yeyən quş dimdiyindən bəllidi!

– İncidim səndən... – Əfsun ciddiyyətini artırdı. – Möhkəm incidim!.. Ə, sən məni bu qədər əclaf sayırsan?!.. Üz-gözümün ifadələrindən, səsimdəki zarafat ahəngindən anlamırsan ki, bunlar gülməcədi, şəbih çıxartmadı? Mən yəni belə ağılsızam ki, o çirkin yola gedim?!

Fərid höcətlə susdu.

Əfsun Fəridin qırımından ehtiyatlanıb yenə qılığa, mehribanlığa güc verdi:

– Fərid, əzizim, sən bəlkə elə düşünürsən ki, mən ar-namusu, insaf-mürvəti it ağzına atıb, insanlığımı tamam itirmişəm? Həşərata dönüb yetim-yesir qismətlərinə, sədəqə paylarına göz dikmişəm?!.. Vallah, billah yanılırsan. Bu yeri-göyü yaradan haqqı, babala batırsan... Ə, inan mənə, səni elə-belə cırnadırdım. Otaq yoldaşlığımız yadıma düşmüşdü... Ehh, nə gözəlmiş tələbəlik həyatı! Heyf ki, qədri çox-çox sonralar bilinir.

Fərid çiyni üstündən atmaca atdı:

– Əlbəttə, heyfsinərsən. Abırlı bir qadını həyasızlıqla yoldan çıxartdın. Onun hesabına bəy, xan balası kimi yaşadın. Tələbəlik çətinlikləri bilmədin nədi.

– Hə, haqlısan. – Əfsun acı təəssüfünü açıq bildirdi: – Əlimdən uçurdum o xoş günləri.

– Qudurğanlıq səndə həmişədən var. Lotuluğun da bir üstəlik!

– Lotu təkcə mən deyiləm, Fərid qağa, zəmanəmizin özü lotuluq zəmanəsidi. Onunla bacarmayanları küncə-bucağa atır, dəmir kimi paslandırır... Ha-ha-ha!.. Bilirsən, nəyə güldüm?.. Yadıma bizim o qaraqabaq professorumuz Cəmil İmanlının mənim haqqımda dediyi məşhur kəlam düşdü. Onu sən də eşitmiş olardın. Bütün institutumuza yayılmışdı o kəlam.

– “Sən lotuluğunla dünyanı yorub yola salacaqsan!” – bunu deyirsən?

– Hə, elə onu! – Əfsun başını qürrəli-qürrəli dikəltdi. – Düz sözə zaval yoxdur, balam. Kişi uzağı görürmüş...

Fərid dabanları üstündə fırlanıb, Əfsunla bir də göz-gözə dayandı:

– Sən isə o cürə təmiz, büllur kimi saf, həqiqi alimi vicdansızcasına şərlədin. Guya o da tələbələrə rüşvətlə qiymət yazırmış.

– Hardan bilirsən bunu?

– O vaxt bütün institut danışırdı... həbsxanada kişinin üzünə durubsan... heç xəcalət çəkirsən?!

Əfsunun üzü kölgələndi, mis rəngi aldı. Amma bu xəcalətdən deyildi. Dərindən nəfəsini dərib, qırıq-qırıq:

– O qəliz əhvalatdı, – dedi. – Çox su aparan xəmirdi... Ürəyim sıxıldı. Qoy gedim çöldə havamı dəyişim, qayıdıb hər şeyi olduğu kimi danışacam.

Fərid acı-acı gülümsədi:

– Get, növbəti yalanını fikirləş! Amma unutma ki, yalan ayaq açar, yeriməz!

**11.**

Əfsun çöldə ləngimədi. Aradan heç on dəqiqə keçməmiş qolları qoynunda, titrəyə-titrəyə özünü içəri saldı. Yüyürüb çadırın tən ortasında qoyulmuş qaz sobasının böyründə domuşdu. Əllərini hovxura-hovxura deyindi:

– Bayır yamanca soyuqdu, balam. Adamı qılınc kimi kəsir. Baxırsan, göyün üzü tər-təmizdi, bir çəngə də bulud-filan yoxdu. Di gəl ki, sazaq bədənə vicvicə salır... Sağ olsunlar bu qaz sobasını gətirib bura quraşdıranlar. Ağıllı iş görüblər, yoxsa soyuq iliyimizi dondurardı.

Fərid dillənmədi. Əfsun canı qızandan sonra şuxlandı. Boğazını arıdıb, təzə məzəyə başladı:

– Heç bilirsən, xəyalımdan nə dolandı? İlin fəsilləri haqqında müdrik xalq deyimi:

Yaz ola, dovğa ola yarpız ilə,
Yay ola, sərin sular sal buz ilə,

Payız ola, pendir-çörək, qarpız ilə,
Qış ola, isti otaq bir qız ilə!

Hə, necədi sənin üçün? Bu yazıqca, soyuqdan bürüşmüş halımızda gözəl bir qız qoynunda xumarlanmaq əla olardı, hı?

Fərid üz-gözünü qırışdırdı.

– Onu özündən soruş! Sənsən elə şeyin xiridarı.

– Düz deyirsən, xiridarı idim... – Əfsun boynunu bükdü. – Amma indi əlim daş altındadı. Ovu bol ovlaqda silahsız ovçu günündəyəm.

– Sənə yazığım gəlir!

– Elə yazıq gəlinəsi haldayam. – Əfsun Fəridin kinayəsinə doğru yozum verdi. – Ancaq ümidsizliyə dəyməz. Təzə gözaltım var. Evində qaldığım qoca arvadın nəvəsi könlümə yaman yatıb. Canalan, sütülcə bir qızdı. Sevdam baş tutsa, sənə ürəyin istəyən qonaqlıq verəcəm.

– Qonaqlığın özünə qalsın! – Fərid kinayəsini gerçəklətdi: – Sənin üzündə şeytan tükü var. Bunu sənə tələbəlik vaxtı da demişəm. Ürəklərə asanca girirsən. O yazıq qızı da toruna salacağına şübhəm yoxdur.

– Ha-ha-haa!.. – Əfsun nəşələndi. Sobanın böyründən qalxıb, xeyli qırağa çəkildi (canı qızmışdı). Fəriddən acıq çıxdı: – O sözü mənə təkcə sən deməyibsən, çoxlarından eşitmişəm. Hələ bir kitabda da oxumuşam ki, gözəllik uğrunda iblis Allahla mübarizədədi. Onların döyüş yeri isə insanların ürəkləridi.

– İblisi də ulu Allah yaradıb!

– Doğrudur. Ancaq burası çox qəribədi ki, mübarizədə yaradılan yaradana çox hallarda üstün gəlir.

– Ona görə ki, insan qəlbində şərə, böhtana, bədxahlığa yer çoxdur. İblis o yer çoxluğundan bəhrələnir.

– Bəhrələnməyə də hünər və istedad lazımdı, qadası! İblis ulu Tanrının yaratdığı məxluqatın ən bacarıqlısı, ən istedadlısıdı.

– Pula hərislik, hər şeyi ona qurban verməklik də şeytan əməlidi?

– Şübhəsiz! – Əfsun cırnaqsız razılaşdı. – Pul gözəllər gözəlidi. Ona pərəstiş etməmək mümkünsüzdü. Kimin ki, karlıca pulu mövcuddu, dünya nazi-neməti onundu, heç nəyə tamarzı qalmır.

Kef-damaqla yaşayır. Kimin də ki, cibi boşdu, ayaqlarını uzadıb ölməyi məsləhətdi. Umsuna-umsuna yaşamağın mənası nədi?!

– Pula aludəlik adama xoşbəxtlik gətirmir!

– Pula umsuqluq isə ən böyük bədbəxtlikdi! Pul bütün dövrlərdə hakim olub. “Siyasi iqtisad” dərsindən öyrəndiklərimiz yadından nə tez çıxıb?.. Həyatda hər şey satılır və alınır.

– Satılmayan, heç nə ilə alına bilməyən nəsnələr də mövcuddur!

– Məsələn?

– Namus, qeyrət, vicdan, məslək, nəcabət!

– Yanılırsan. – Əfsun ağzını büzüb, dodaqlarını nırçıldatdı. – Sənin sadaladığın o mənəvi dəyərlərin də öz bazarı var. O bazar kütlə gözündən gizlin bazardır. Vəzifə, rütbə, şöhrət və sairə pərdə arxasında satılır da, alınır da.

– O bazar alçaqlıq alğı-satqısıdı! Onun alıcıları yaltaqlar, məddahlar, gün-görməzi öpənlərdi. Elə səni kimilərdi!

Əfsun özünü sındırmadı. Araya bir də şuxluq qatdı:

– Gorun çatdasın, baba!.. Nəvəni gör kim və nədə qınayır?!

Fərid kəskin tərzdə yarımçıq söhbətə qayıtdı:

– Keçək professorun məsələsinə!.. Havanı dəyişib, ürəyini sakitləşdirib, gəlibsən. Vədinə əməl elə!

Əfsun zıqqıdı:

– Vallah, çətinlik çəkirəm... Üstündən beş il ötüb.

Fərid təkid etdi:

– Təmiz etiraf kişilikdəndi! Az-çox kişiliyin çatırsa, qəbahətini boynuna al. Hamıya gün kimi aydındı ki, o professor rüşvətin nə olduğunu, necə alındığını bilmirdi. Onu heç təsəvvürünə də gətirmirdi. Mən özüm də onun tələbəsiyəm. Kimdənsə, nəsə aldığını nə görmüşəm, nə eşitmişəm. Suyu da üfürə-üfürə içən adam idi. Onu çirkə bələməyə insafın necə yol verdi?

– ...

– Lal olub kiriyirsən!.. Çünki çirkin hərəkətinə bəraətin yoxdu. Heç yalan da uydurammırsan... – Fərid ikrahlıqla üzünü yana çevirdi. – O cürə böyük alimini, hər cəhətdən nəfsi tox, vicdan mücəssəməsi olan yüksək bir insanın həyatına sən zəhər qatdın. Sənin abırsız böhtanın ucbatından o mələk xislətli adam üç ay həbs-

xanaya salındı. Əsaslı bir dəlil-sübut tapmadıqlarına görə, məcburi bəraət verdilər. Ancaq professorluğunu, kafedra müdirliyini haqsız yerə əlindən aldılar. İnstitutda adi müəllim işləməsinə də qadağa qoydular. Gedib şəhərin ucqar, gözdəniraq bir orta məktəbində şagirdlərə dərs dedi. Məişət çətinlikləri, mənəvi sıxıntılar məngənəsində ürəyini üzdülər. Elmi fəaliyyətdən uzaqlaşdırdılar. Əyin-başı, irz-irəngi çox pis hallara düşdü. Görəndə adamın ürəyi ağrıdı... Bax, budur sənin iç üzün!.. Gizlətsən də hamıya məlumdu.

Əfsun haldan-hala düşdü. Qaraşın sifəti bir az da qaraldı.

– Dərdimin odunu közərtdin, Fərid! – deyib, var-gələ başladı. – Başıma gətirilənlərdən xəbərin yoxdur. Onları bilsən, məni bu qədər qınamazsan.

– Döydülər, təpik altına salıb, qabırğalarını sındırdılar, neylədilər? – Fərid lağla soruşdu.

– Döyülmək, qabırğaları sındırılmaq onların yanında toya getməlidi! Sən o əzabları heç ağlına da gətirə bilməzsən... Xatırlayanda tüklərim biz-biz durur, o dəhşətləri təzədən yaşayıram... Budur, bax, tüklərim indi də qabarıb.

– Amma başqa vaxtlar bol-bol öyünürsən. Döşünə döyüb hünərdən, cəsarətdən dəm vurursan... Ümumiyyətlə, deyəsən, mən sənin barəndə səhvə yol vermişəm. Dəyişdiyini zənn eləyib, işə düzəlməyinə minnətçi oldum... Sən elə köhnəki lotusan. Pula tamah salmağın, məni də ona şirnikdirməyin boş-boşuna deyil, adi məzələnmə məsələsinə bənzəmir.

Əfsun təlaş keçirdi. Fəridin zəndini yanılda bilməməsi onu təşvişə saldı. Təzə qılığa girdi:

– Ə, dost, yaxşılığını nə tez başıma qaxdın? İnan, etiqad elə mənə, tamam ayrı Əfsunam. İntəhası, keçmişlərə qayıtmaq istəmirəm. Ürəyimi bulandırmaqdan çəkinirəm.

Fərid inadından dönmədi:

– Mən isə həqiqəti çılpaqlığı ilə bilmək fikrindəyəm. Səni dəqiq tanımaq istəyirəm. Bunun yeganə yolu, təkrar deyirəm, səmimi etirafdı.

Əfsun əlacsız:

– Necə başa salım səni? – dedi. – Ora elə murdar, elə dəhşətli

bir dağılmışdı ki, demək istəmədiklərini bülbül kimi oxutdururlar. Dilini malazandan çıxardıb, quzu təkin mələdə-mələdə dedizdirirlər.

– Aydın oldu! Deməli, öz canını qurtarmaq üçün özgəsini fənaya verdin... Sənin kimi dil pəhləvanlarından özgə nə gözləyəsən?!

Əfsun birdən cırnadı:

– Neynək, indi ki, israr eləyirsən, danışıram!.. Qaradan o yana rəng yoxdur. Qulaqlarını geniş aç, eşit... O viranxanada dilimdən rəsmi iltizam almışdılar ki, heç vaxt, heç yerdə heç nə söyləməyim. Qoy cəhənnəm olsunlar! Ürəyimi boşaldacam sənə. Bəlkə bir az yüngülləşdim…

**12.**

– Məni institutun həyətində, dərsarası tənəffüs vaxtı yaxaladılar. Üç nəfər idilər. Üçü də mülki geyimdəydilər. Biri qabağımı kəsdi, o birilər sağ-solumu. Təhlükəsizlik idarəsinin sənədini göstərib “bizimlə gedəcəksən!” – dedilər. Adamların gözləri qarşısında qollarıma qandal vurub, qulağıma pıçıldadılar ki, hay-küy salma, özünü sakit apar, yoxsa cəzanı ağırlaşdıracaqsan!

Cınqırımı çıxartmadım. Məsələdən duyuq düşmüşdüm. Neyləsəm də faydası yox idi, caynaqlarından qopa bilməyəcəkdim. Təslim oldum. Huşum keyləşmişdi, köməyə çağıracaq səlahiyyətli adam da ağlıma gəlmədi. Çaşqınlıq yaddaşı kütləşdirir.

Küçəyə çıxartdılar. Qara rəngli maşına basdılar. Təhlükəsizlik işçilərindən biri (bu yəqin ki, böyükləri idi) qabaqda, sürücünün yanında oturdu. O birilər arxa oturacaqda məni ortaya aldılar. İdarəyə çatana qədər mənimlə bir kəlmə kəsmədilər. Aydın idi ki, qara maşın məni qara uğura aparır.

Fərid dilini dinc saxlamadı:

– O qara uğuru özün qazanmışdın, özgələrində günah görmə!

Əfsun atmacaya darıldı:

– Sözümü kəsmə! Əgər hər şeyi ətraflı bilmək istəyirsənsə, imkan ver, təfsilatıynan danışım. Onsuz da əzab çəkirəm, əziyyətlərim gözümün qabağında canlanır, ürəyim üzülür.

– Yaxşı, mən susdum. – Fərid kənara çəkildi. Qollarını qoynunda çarpazlayıb diqqət kəsildi. – Gopla gəlsin!

Əfsun ciyərlərində hava çatışmırmış kimi, ağzını göyə açdı, iki-üç dəfə geniş-geniş nəfəs alıb, aramla davam etdi:

– Maşın xeyli getdikdən sonra harayasa buruldu. Çaşqın, dolaşıq fikirlərdən ayıldım. Maşından məni kobudluqla düşürdülər. Qarşıdakı binanın ağır zəhmi bağrımı yardı. Cod daşlı pillələrlə aparıb alaqaranlıq, buzxana bir otağa saldılar. Ona otaq demək olmazdı, gorxana adlandırmaq uyğundu. Dəmir qapısını şaqq-şaraqla örtüb, çöl tərəfdən qıfılladılar. Vahimədən ödümü uddum. Bu gorxanadan qurtuluşa ümidim qalmadı. Dizlərim öz-özünə büküldü, sement döşəməyə arxası üstə sərildim. Ağlım başımdan burda tamam uçmuşdu. Yarıyuxulu, yarıhuşsuz vəziyyətdəydim. Xeyli süst, hərəkətsiz qaldım...

Birdən-birə bərk üşürgələndim. Alnımda küt ağrılar peyda oldu. Gicgahlarım dayanmadan sancdı. Kürəklərimin ortası buzladı. Təsəvvür elə, iyul ayının ortaları ola, bayırda bürkü can sıxa, burda isə qışın oğlan çağının sərt soyuğu!..

Gecdən-gec özümdə güc tapıb dikəldim. Ovcumu ovcuma sürtə-sürtə, ora-buramı ovuşdura-ovuşdura, gah alnıma, gah gicgahlarıma əl gəzdirə-gəzdirə oturdum. Qəribədir ki, göz qapaqlarım da zindan ağırlığındaydı. Gilələrimə iynə-sancaq batırılırdı. Çox çətinliklə araladım. Ciddi-cəhdlə otaqcanın içinə boylandım. Nəmli, idbar divarların küncündə pas atmış, yöndəmsiz dəmir çarpayı gördüm, üstündə mitilin-mitili döşəkcə, cındır ədyal, başaltısı-filanı da yox. Qapının əlyetər-yetməzində isə kiçik nəfəslik. Sonradan bildim ki, dustağa su və acından ölməmək üçün zəqqutun yemək oradan verilir. Tənhalıq, qulaqbatırıcı sükut, idbarlıq da bu dəhşətli mənzərəyə əlavə ürək sıxıntısı!

Yarıq bağrım bir daha yarıldı. Vallah-billah, adam dəli olmaq dərəcəsinə gəlirdi. Hələ də qanammırdım bu nə oyun, nə hərəkətdi başıma gətirirdilər. Hansı günahıma görə bu it əzabını verirlər? Beynim heç nə düşünmək qabiliyyətində deyildi, içində yel əsirdi... Nə başını ağrıdım, o gorxanada ilk gecəni heç çimir də eləyə bilmədim. Səhəri necə dəhşət içində açdığım təkcə Allaha agahdı. Tam bir sutka özümdə olmadım. Aclığım, susuzluğum da yadıma düşmürdü. Sanki bütün hisslərim, duyğularım ölmüşdü. Bu müddət ərzində yanıma gəlib, bir kəlmə nəsə soruşmadılar.

O biri sutka da yada salınmadım. Yəqin ki, bu, onların cəza

üsullarındandı. Nəfəslik yerinə gətirib his-paslı dolçada su qoydular, vəssalam. Əl boyda quruca çörəyi də mənə qıymadılar. Üçüncü gün acından ürəyim doğram-doğram doğrandı. Mədəm tez-tez sancdı. Boş bağırsaqlarımın qurultusu qulaqlarımı batırdı. Təsəvvürünə gətir, həmişə kef-damaq sürmüş, ləziz xörəklər yeməyə öyrəşmiş adam nə kökə düşər? Cındır ədyala bürünüb, qarnımı qucaqlayıb uşaq təkin ağladım. Susuzluq da bir yandan amanımı qırmışdı. Dilim ağzımda qaxaca dönmüşdü. Dodaqlarım qımıldanmırdı. Qışqırmaq, haray-həşir salmaq istəyirdim, alınmırdı.

Nəhayət ki, günortadan sonra insafı arada gördülər. His-paslı dolçada içəri çay ötürdülər. Yanında da üç-dörd ədəd kirli, xırda qənd qırıntısı. Sonra da horraya bənzəyən boz rəngli sıyıq yeməklə əlboyda quru çörək verdilər. Çimrəndim. Amma çarəm nə idi? Əlacsızlıq köpək oğlu şeydi. Ayrı vaxt qusmağım tutacağı bu tula paylarını gözümə təpdim. Mədəmin sancıları, bağırsaqlarımın qar-quru nisbətən kəsdi. Azacıq da olsa, toxtadım. Ağlım-huşum yavaş-yavaş aydınlaşmağa başladı. Sən demə, "insafı arada görmək" hədər deyilmiş; arxasında məqsəd dururmuş. Təxminən saat beş-altı radələrində (təxminən deyirəm, çünki o xarabaxanada vaxt dəqiq bilinmir. Gündüzlə gecə o qədər də seçilmir), məni gəlib harasa apardılar.

Alaqaranlıq dəhlizlə uzun yol getdik. Dəhlizin qurtaracağına yaxın qara meşinli bir qapı öz-özünə açıldı. Anlamadım onu arxadan açdılar, ya avtomatik idi. Birdən-birə ildır işığa düşmüş gözlərim möhkəm qamaşdı. Ətrafda heç nə seçə bilmədim. Ayaqlarım büdrədi. Yazıq gözdə nə günah var? İki sutka qaranlıq öz işini görmüşdü, bəbəklərim şoxunu itirmişdi. Məni müşayiət edən milis nəfəri qolumdan tutub yıxılmaqdan saxladı. Bir əlimi qaşlarımın üstünə qoyub, gur işıqdan qorundum. Korsayağı yeridim. Gətirib haradasa oturtdular. Kirpiklərimi xeyli ovuşdurub, gözlərimi işığa alışdıranda, uzunsov masa arxasında ağır, qaşqabaqlı, orta yaşlı, dolğun sifətli bir kişini gördüm. Mülki geyimli, seyrək saçlı, qarayanız bu kişinin oturuşundan da zəhm yağırdı. Qabağında səliqə ilə ipçimlənmiş ağ kağızlar və bir yığın qələm vardı. Dərhal anladım ki, sifəti turşumuş bu adam müstəntiqdi. İlan işıltılı, qıyıq nəzərləri

üzümə sancıldı; mızıltıya bənzər səslə soruşdu:

– Necədi əhvalın? İşığa alışa bildinmi?

Dilimin qorxu kilidini çətinliklə açdım:

– Bəli, – dedim, – alışdım.

Müstəntiq qaşlarını sıx-sıx çatdı. Qabağındakı kağızları təzədən ipçinləyib qələmlərdən birini götürdü. Mızıltısı rəsmiləşdi:

– İfadə verməyə hazırsanmı?

Dinmədim. Daha doğrusu, sualı anlamadım, həm də diqqətim ayrı yerdə idi. Masanın üstündə su görmüşdüm. İçimin yanğısı güclənmişdi. Özümdən asılı olmadan, yönəldim ki, stəkana su töküb başıma çəkim, arxamdakı milisioner çiynimdən aşağı basdı. Müstəntiq isə gözlərini ağartdı:

– Əli uzunluq eləmə!

Qınıma çəkildim. Amma diqqətimi su şüşəsindən ayırmağı bacarmadım, yazıq-yazıq yalvardım:

– Ciyərim alışıb-yanır... Boğazım quruyub... Danışmağa heyim yoxdu, – dedim.

Müstəntiq üzümə amansızlıqla baxdı, yenə burnunda mızıldandı:

– Bunun üçün icazə istəmək lazımdı!

Yalnız indi qandım ki, mızıldamaq, burnunda danışmaq onun vərdişidi. Mən də mızıldandım. Onu qəsdən yamsılamadım, öz-özünə belə alındı. Udquna-udquna:

– Bağışlayın, çox-çox üzr istəyirəm, – dedim. – Bir içimlik su verin, heç olmasa, boğazım yaşlansın.

Müstəntiq fıs-fıs fısıldadı. Elə bilərdin ilandı, quyruğu basılıb. Ancaq xahişimi rədd etmədi. Arxamda dayanmış milisionerə işarə ilə göstəriş verdi. Milisioner mənim gözaltıladığım su şüşəsinə yaxın getmədi, ayrı yerdən bir stəkan su gətirdi. Gözlərimi yumub, stəkanı birkərəmə soğdum. Qurumuş boğazımdan su qəribə qurultu ilə ötdü. Bu səsə müstəntiq də, milisioner də rişxəndvari gülümsündülər. Elə özümün də gülməyim tutdu. Vəziyyətin mülayimləşdiyini zənn eləyib, dedim:

– O sudan bir stəkan da verin, boğazım sizi yenə güldürsün.

Müstəntiq bircə anda bomboz bozardı.

– Olmaz! – deyib ayağa qalxdı, yanıma gəldi. Qarşıma kağız

və qələm qoydu. Suallara düzgün cavab verəcəyimə, ifadələrimi sonradan dəyişdirməyəcəyimə dilimdən iltizam aldı. Altından qol çəkdirdi. Və qayıdıb yerində arxayın əyləşdi. Əsil həngamə də bundan sonra başlandı...

Əfsun ah çəkdi, Fəridi yamanladı:

– Sənə necə söyüş, necə qarğış eləyim, zalım balası?!.. Məni o lənətli günlərə nə üçün qaytardın? Bu sənin nəyinə gərəkdi?! Heç bilirsən, o dəhşətləri yaddaşda təzələmək necə zülüm-zillətdi?! Off!

Fərid sakitliklə:

– Danış, danış! – dedi. – Saxta ah-uflarla aranı qatma!

Əfsun bir neçə dəfə qovşurulub, acı söhbətinə əsəbi qayıtdı:

– Belə-filan müstəntiq amanımı qıran mızıltısını artırdı. İlan gözləri qıyıldı: "Tutduğun işdə özünü günahkar sayırsanmı?" – soruşdu. Mən başımı buladım. O, cinnəndi. Göz bəbəkləri soğulub-soğulub lap balacalaşdı.

– Nə üstündə taqsırlandırıldığın sənə bəlli deyil, bəyəm? – deyib, dodaqlarını büzdü.

Mən:

– Xeyr, – dedim, – bəlli deyil.

Müstəntiq məni çəp-çəp süzdü. Və nə fikirləşdisə, sualını dəyişdi.

– İnstituta tələbə qəbul elətdirmək üçün valideynlərdən aldığın pulları kimlərlə bölüşürdün?

Mən:

– Heç kəsdən nə pul almışam, nə də onu bölüşmüşəm, – dedim.

Müstəntiq boz üzünü turşudub, məni hədələdi:

– Sappa vurma! Rəsmi dövlət sənədinə qol çəkibsən ki, sualları düzgün cavablandıracaqsan. Yolun altını-üstünü əksən, nəticəsi pis olacaq, – dedi.

Mən möhkəm durdum, ittihamı rədd elədim. Müstəntiq qəzəbdən qurcuxsa da, hələlik səbirli davrandı. Mənə öyüd-nəsihət verdi:

– Ağlını başına yığ, – dedi. – İnkarçılıqla canını qurtaracağına ümid eləmə. Günahlarını çək-çevirsiz boynuna al ki, başqa üsullar işlətməyə məcbur olmayaq.

Mən inadla susdum. Müstəntiq kükrədi, var gücü ilə bar-bar bağırdı. Seliyinin bir damlası üzümə düşdü.

– Deмək, boynuna almaq istəmirsən?! – deyib mənə barmaq silkələdi. Və masasının böyründən qalın bir qovluq götürdü. Bağını açıb, içindən çoxlu şəkillər çıxartdı. Qarşımda sərgilədi. Mızıltı ilə xəbər aldı: – Bu adamlar sənə tanışdımı?

– Yox, – dedim.

O, hirs fısıltısı ilə həmən qovluqdan başqa şəkillər də götürüb bir-bir göstərdi.

– Bunları da tanımırsan?!

Baxdım ki, tələdəyəm, tora düşmüşəm. Göstərdiyi adamları ayrı-ayrılıqda mənimlə görüş zamanı çəkmişdilər. Onlardan pul aldığım məqam da aydınca fotoya alınmışdı. Deməli, hər addımım izlənmişdi. Matım-qutum tamam qurudu. Məni ən çox təəccübləndirən pulun alınma məqamının çəkilişi idi. Axı, biz bu işi çox xəlvət yerdə, gizlin künc-bucaqda görürdük. Üçüncü bir adam ondan xəbər tutmurdu...

Fərid xısın-xısın güldü.

– Dəvə başını soxur kolluğa, elə bilir görən yoxdu onu!

Əfsun incidi.

– Gülmə, Fərid, gülmə! Başına gələr.

– Sən eləyən qələtləri mən eləmərəm ki, başıma gəlsin.

– Doğrudan, maraqlı məsələdi. Çəkiliş necə ola bilər?

– Olsun ki, sənə pulu verənin özü çəkib. Gizlin aparatla.

– Hımm...

– Yaxud da...

– Yaxud da nə?

– Çoxluca pulu görübsən, gözlərin qamaşıb. Ətrafı seçməyibsən. Sizi uzaqdan da çəkə bilərdilər.

– Ağılkəsən sözdü. Müasir texnika möcüzələr yaradır. Vaxt gələcək, zərif cihazlarla adamın beynindən keçənləri də öyrənəcəklər. Hətta, ürəyinin içinə də girəcəklər.

– Onda sənin kimilərinin işi əngəlləşəcək. Fırıldaqlarınız baş tutmayacaq!

– O barədə heç narahat olma. Möcüzəli cihazları icad eləyən insanlardı. Onların arasından həməncə cihazları aldadanlar da yetişəcək.

– İnanıram. Şeytan törəmələri həmişə sərvaxtdılar.

– Çünki qarışqa şıllaq atanda dəvənin qılçı sınır!
– Murdar əsgi isə oda alışmır!

## 13.

Söz güləşdirmələri uzun sürmədi. Əfsun söhbətini həvəssiz-həvəssiz təzələdi:

– Müstəntiq çəlpəşik suallarla məni karıxdırmağa, dilimi büdrətməyə cəhd elədi. Mən karıxmamağa çalışdım. Çəlpəşik sualları elə o cür də cavablandırdım. Dodaqlarını çeynəyə-çeynəyə xəbər aldı:

– Valideynlərdən aldığın pullar üst-üstə neçə min manat olardı?

Dedim:

– Kənar valideynlərdən almamışam, onlar öz qohumlarımdı.

Üzümə çəp-çəp baxdı:

– Tutalım, qohumlarındı, hərəsindən nə qədər götürübsən?

– Götürməmişəm, borc almışam, – dedim.

Ağzı yana əyildi:

– Məbləği de! – deyib üstümə şeşələndi.

Dedim:

– Hamısı birlikdə dörd yüz, ya beş yüz olardı.

Burda o, yumruğunu masaya çırpıb qışqırdı:

– Gözlərinin içinəcən yalan danışırsan! – dedi. – Birindən on iki min, ikincisindən on min, üçüncüsündən isə səkkiz min manat mənimsəyibsən!

Heyrətdən dondum. Pulların sayını dübbədüz deyirdi. Daha bir sarsıdıcı sualla nəfəsimi kəsdi:

– Belə fərz eləyək ki, borc götürübsən, o boyda borcu necə ödəyəcəkdin? Sən, axı, tələbəsən, heç yerdə işləmirsən, gəlir yerin yoxdur.

Nıxdım tutuldu. Fikirləşib nəsə bir şey uydurmaq istədim, heç nə alınmadı. O, cavab gözləmədi. Başqa sualla məni divara qısnadı:

– Pul aldığın "qohumların" adlarını və familllərini söyləyə bilərsənmi?

Mən ağlıma gələni söylədim. Müstəntiqin səbri büsbütün tükəndi. Mızıltılı bağırtısı otağı titrətdi:

– Artistlik eləmə, qodux! – deyib, ana-bacı söyüşü söydü. – Məni aldatma! Sənin kimi yaramazları burda yetim quzu kimi çox

mələtmişəm. Elə hala saldırmışam, söz ağzımdan çıxmamış, dil-dil ötüblər. Yazıqsan, özünü o günə qoydurma!

Mən başımı aşağı salıb kiridim. Müstəntiq, qaydası üzrə, mənə həmlə gəldi:

– Sənin pul aldığın adamların heç biri “qohumun” deyil. Tamam yad adamlardı, – dedi. – Sən institut müəllimləri ilə əlaqəyə girib küllü miqdarda pulla tələbə alveri eləyirsən. Pul aldığın şəxslər də filankəslər, filankəslərdi!

Dilim bağlandı. Daha burcutmağa, yalan uydurmağa yer yox idi.

Müstəntiq əhvalımı duydu. Bu vəziyyət onu qane saldı. Xeyli sakitləşib, yenidən həlim sorğuya keçdi:

– İndi çəkinmədən de görüm, o pulları hansı professor və müəllimlərlə bölüşürdün? Şəriklərin kimlər idi?

Anladım ki, gizlətməyim əhəmiyyətsizdir, yalanlarım baş tutmayacaq. Bununla belə, heç kəsi ələ verməməyə çalışdım.

– Şərikim yoxdur, – dedim.

Müstəntiq yenidən ciddiləşdi:

– Boş-boş çərənləmə! – dedi. – Sən kimsən ki, təkbaşına iş görəsən? Sualıma dəqiq cavab ver.

Dinmədim. Vaxt qazanmaq, bundan sonrakı cavablarımda xətaya yol verməmək xəyalındaydım. Orasını unutmuşdum ki, zor işlədib, xurd-xəşil eləyərlər...

Fərid burada da atmacasız keçinmədi:

– Sənin təki dələduza zor işlətmək də azdı. İlan ulduz görməsə ölməz!

Əfsun həzin səslə:

– Ulduzu göstərdi də! – deyib, sağ əli ilə sol üzünü ovuşdurdu. – Zalım oğlu ayı kimi bir şey idi. Əli də elə ayı pəncəsindən geri qalmırdı. Ayağa sıçrayıb sol üzümə nə cür şillə çəkdisə, bəbəklərim od saçdı. Qarşımda rəngbərəng qığılcımlar oynaşdı. İkinci zorba şillə isə ağlımı başımdan uçurdu. Gözlərimə zülmət çökdü. Kətil qarışıq döşəməyə sərildim. Üzümə soyuq su səpib ayıltdılar. Döşəmədən qaldırıb, kətildə təzədən oturtdular. Böyrümdə, əlləri belində dayanmış müstəntiq hırıldaya-hırıldaya soruşdu:

– Hə, necədi sənin üçün? Ağıllandın?

Yandım, cızdağım çıxdı. Deyə bilmədim ki, nə üçün vurursan?

Dustağı döymək, ona zor işlətmək hüquqa ziddir. Qanuna əks getməkdir. Dilimi qorxumdan dinc saxladım. Höcətləşsəm, bir az da hirslənərdi. Zindan ağırlığındakı yumruğu ilə vurub çənəmin çüyünü çıxardardı...

Bu arada müstəntiqi harasa çağırdılar. Keşiyimi çəkən milisioner canı yandığındanmı, ya nədənsə, mənə him-cim elədi, özümə əzab verdirməməyi işarətlə başa saldı. Bu da ona bəs etmədi, yaxınlaşıb qulağıma pıçıldadı:

– Nə deyir, razılaş. Cavanlığına heyfin gəlsin. Şil-küt olarsan.

Bir söz deməyə macal tapmadım. Müstəntiq iti addımlarla gəlib çıxdı. Qənşərimdə höcətlə dayanıb sərt-sərt mızıldandı:

– Mənə yenə lotuluq gələcəksən, ya doğru-düzgün cavab verəcəksən?

Dodaqlarım öz-özünə əsdi. Kəkələdim:

– Ve-e-e-rəcəm, – dedim.

Müstəntiq qürrəli-qürrəli qımışdı.

– Bax, belə. Malades! Xeyli ağıllanıbsan! Di, buyur, bayaqkı suala cavab ver: hansı müəllimlər idi sənin vasitəçilərin?.. Konkret adları və familiyaları.

İşi düzüb-qoşan əsas iki müəllim idi. Hər ikisinin adını və familini dəqiq dedim. Müstəntiq razı qaldı. Masasının divara birləşən küncündə ayrıca qoyulmuş üç şəkil götürdü. Birini gizlədib, ikisini burnumun ucuna yaxın tutdu.

– Bunlardı? – soruşdu.

– Hə, bunlardı, – dedim.

O, gizlətdiyi şəkli də göstərdi.

– Yəqin ki, bu adamı da tanıyırsan.

Bu şəkil bizim qaraqabaq professorumuzun şəkli idi. Təəccübləndim, onun belə məsələyə nə dəxli vardı?

Müstəntiq məni dümsüklədi.

– Nə oldu? – soruşdu. – Niyə susursan? Bəyəm tanımırsan?!

Udquna-udquna dedim:

– Tanıyıram. Bizə dərs keçib.

– Necə adamdı? – soruşdu.

Olduğunu söylədim:

– Xasiyyəti çox ağırdı. Hədsiz tələbkardı. Ondan müsbət qiymət almaq müsibətdi.

Müstəntiq bekaraca qımışdı.

– Çətin qiymət verməkdə nə məqsəd güdür? – soruşdu.

– Məqsədi keçdiyi fənni tələbələrə dərindən öyrətməkdi, – dedim.

Müstəntiq bozardı.

– Ağ yalan danışırsan! – deyib, yumruğunu gözüm önündə sağa-sola hərlədi. – Təmizə çıxartmağa çalışdığın o professor rüşvətxorun yekəsidi! Bizə məlumdu onun əməlləri. Boynuna al!

Nəyi boynuma almalıydım? Onun rüşvət götürməyini, sənin kimi, nə görmüşdüm, nə də bir kəsdən eşitmişdim. İftiranı təsdiqləməyə dilim gəlmədi.

Müstəntiq təpiyini döşəməyə çırpdı.

– Deyəsən, bayaqkı şillələr bəsin olmayıb... Bu saat dadarsan yenilərini!

O, məni bir qırpımda təpiyinin altına saldı. Çığna ki, çığnayasan. Qabırğalarımın çoxu zədələndi. Ağız-burnumun qanı bir-birinə qarışdı. Özümdən getdim. Sonra neylədi, nə törətdi hiss eləmədim. Gözlərimi dəhşətli ağrılar içində açanda, özümü sement döşəməyə döşəli gördüm. Tanıdım viranxananı. Alaqaranlıq otaqcam idi. Könlümdən durub andır taxtın üstünə uzanmaq keçdi. Soyuq sement yan-yançağımı göynədirdi. Qımıldanmağa heyim çatmadı. Ağrılar amanımı qırdı. Bədənimdə bir salamat yer yox idi. Hər yanım sızım-sızım sızıldayırdı. Qabırğalarımın arasına sanki korş iynə-sancaq batırırdılar. O gecəni nə cür keçirdim, o dəhşətli ağrı və sızıltılara necə dözdüm, indinin özündə də mənə bir sirdi.

Ertəsi gün də həmən ağrılar, sızıltılar ara vermədi. Hayımahoyuma yetən olmadı. Bircə qurtum suyu da mənə qıymadılar. Çığırtıma, çağırışıma məhəl qoymadılar.

Taqətim, dözümüm tükənmişdi. Əzab-əziyyətlər axırıma çıxırdı. Fikirləşdim ki, əşi, rədd olsun hər şey! Düzlük, canıyananlıq mənəmi qalıb? Özgənin yerinə bu zülmlərə niyə tablaşmalıyam?! Nə tələb olunur onu deyim, qurtarsın canım…

**14.**

– ...Növbəti dindirməyə məni tez apardılar. Səhər saat on-onbir radələri olardı. Əzrayılım indi də hirsli idi. Mısmırığı yer süpürdü. Sərt qarşıladı:

– Mənə çatdırdılar ki, suallara düzgün cavab verəcəksən. Yanlış ifadələrlə bizi incitməyəcəksən. Məlumat dürüstümü?

Dərhal təsdiqlədim:

– Dürüstdü, yoldaş müstəntiq, – dedim.

Bərk cırnadı. Qəzəblə çımxırdı:

– Mən sənin kimilərlə yoldaş ola bilmərəm. "Vətəndaş müstəntiq" – deyə müraciət elə!

Əlimi döşümə qoyub, baş əydim. Çarəm nə idi?

– Baş üstə, vətəndaş müstəntiq... Sizə necə lazımdısa, o cürə ifadə verəcəm, –dedim.

O:

– Verəcəyin ifadə mənə gərək deyil, istintaq üçündü. Başa duş ki, dindirmənin uzanması ziyanınadı. Əzabların artacaq... – dedi.

Ötən günlərki dəhşətlər gözümə durdu. Sağalmamış yaralarımı zoqquldatdı. Tezcə razılaşdım.

O, sakit tərzdə məni masaya yaxın əyləşdirdi. Qarşıma bir vərəq ağ kağız və qələm qoydu. Amiranə dedi:

– Professor İmanlı haqqında nə bilirsən, bircə-bircə yaz. Heç nədən çəkinmə! Dikbaşlar qanun qarşısında mütləq əyilməlidi!

Mən qələm əlimdə çaşbaş dayandım. Nə yazım, nədən yazım? Ha fikirləşdim, professorun ifrat tələbkarlığından və güzəştsizliyindən başqa bir qüsuru ağlıma gəlmədi. Müstəntiq məni ələ saldı:

– Niyə yazmırsan? Yaddaşın sözünə baxmırsa, mən köməyinə çata bilərəm.

Mən ona xahişlə baxdım. O, gəlib böyrümdə müəllim sayağı dayandı. Kəlmə-kəlmə diktə elədi, mən onun ağzından çıxanları eynən yazdım. Yazının altından yenə qol çəkdirdi, tarix qoydurdu. Dərhal da alıb qalın qovluğun içinə atdı. Rahat nəfəs dərdi. Duydum ki, kiminsə sifarişini yerinə yetirdiyinə sevinir. Yanılmamışdım. Dilini sözarası büdrətdi: "Bununla təkcə öz canını yox, mənim də canımı qurtardın. Professorla üzləşmədə də özünü belə sözəbaxım aparsan, xeyir tapacaqsan", – dedi.

– Nə yazdırmışdı? – Fərid ciddi maraqlandı.

– Yazdırmışdı ki... – Əfsun, yadına salırmış kimi, xeyli duruxdu. – Professor Cəmil İmanlı rüşvətxordu. Tələbələrdən pul

yığmaq üçün qiymət yazmağa xəsislik eləyir. Get-gələ salır. Mən onun tələbələrdən pul yığanı olmuşam...

Fərid onu həqarətlə süzdü.

– Daha nə qara yaxdın müəlliminə?

Əfsun bəraət üçün ötkəm dilləndi:

– Qaranı ona mən yaxmadım, yaxdırdılar.

– Fərqi birdi! – Fərid iradını kəskinlətdi. – Özün yaxdın, ya sənin əlinlə yaxdırdılar. Hər ikisi eyni günah sayılır... Hə, sonra? Ayrı nə böhtan uydurdun?

Əfsun höcətləşdi:

– Sən də mənə burda bir yandan məhkəmə qurubsan. Heç aman vermirsən. Elə bil, amanımı qırmış o müstəntiqin əlindən su içibsən.

Fərid tələb etdi:

– Danış, danış! Səmimi etiraf üzağlığıdı.

Əfsun dil altında qalmadı:

– Allah yanında üzüm ağdı onsuz da, – dedi. – Başıma gətirilənlərin şahididi o!

– Bildik bunu. Daha neylədi?

– Dəlil-sübut üçün iki tələbənin adını qeyd elətdirdi. O tələbələr bizim kursda ən zəif oxuyan tələbələr idi. Professordan məqbul qiymət ala bilmirdilər. İnstitutdan qovulmaq ərəfəsindəydilər. Vəziyyətdən belə başa düşdüm ki, professorun əleyhinə həmən tələbələrdən də izahat götürüblər.

– Professorla üzləşməniz haçan oldu?

– Elə həmin gün. Axşam tərəfi görüşdürdü bizi. Üzləşmədən əvvəl müstəntiq məni bir də sınağa çəkdi, məşq elədi. Əlavə olaraq xatırlatdı ki, bu üzləşmə mənim taleyimi həll eləyəcək. Ondan "üzüağ" çıxsam, azadlığa buraxıla bilərəm. Və kağızda yazdıqlarımı dönə-dönə oxutdu, əzbərlətdi. Professorun zəhmindən karıxıb, hətərən-pətərən danışmayacağıma tam əmin olandan sonra lap qıraqda, diqqət çəkməyən küncdə qoyulmuş kətili göstərib, tapşırdı:

– Keç, hələlik əyləş orda. İşarətimi gözlə. Mən barmağımla "gəl" işarəsi verəndə, dur, irəli yeri.

Mən deyilənə əməl elədim. Müstəntiq saçlarına ovcunun içi ilə sığal çəkdi. Qaşlarına, gözlərinə, qalstukuna əl gəzdirdi. Hətta,

masaüstü balaca güzgüdə də özünə diqqət yetirdi. Sanki, əcnəbi qonaqla rəsmi görüşə hazırlaşırdı. Sonra kimlərə isə əmr verdi:

– Müqəssiri gətirin!

Aradan heç üç dəqiqə ötməmiş professoru gətirdilər. Məni görmədi. Düz qabağa baxa-baxa, həmişəki ağır addımlarla irəli getdi. Müstəntiq onu saxta nəzakətlə qarşıladı. Ayağa durub salamlaşdı. Oturmağa yer təklif elədi. Hələ üzr də istədi:

– Bağışlayın, sizi bir az gözlətdim.

Professor gec və incik dilləndi:

– Bir az yox, bir saatdan artıq gözlətdiniz. Nədi bu hörmətsizliyə səbəb? – soruşdu.

Müstəntiq siyasət işlətdi:

– Hörmətsiz bir hərəkət yoxdu burda, professor. Sadəcə, işin çoxluğu belə tələb edir, – dedi.

Professorun arxası mənə sarı olduğuna görə, üzünü görmürdüm. Hansı gərginlikləri keçirdiyi mənə məlum deyildi. Narazılığını yalnız səsindən hiss eləyirdim. Cod-cod soruşdu:

– Məni bura çağırmağınızın səbəbini bilmək olarmı?

Müstəntiq məlum mızıltısını qəsdənmi, ya nə üçünsə azaltdı:

– Əlbəttə, olar, professor. Bizim idarəyə şikayət məktubları daxil olub, onları araşdırmaq, həqiqəti üzə çıxartmaq lazımdı, – dedi.

Professor xəbər aldı:

– Kimdəndi şikayət?

Müstəntiq rişxəndyana qımışdı:

– Sizdəndi. Tələbələriniz yazıblar, – dedi.

Professor tövrünü pozmadı.

– Şikayətləri nə barədədi? Nədən narazıdırlar? – soruşdu.

Müstəntiq təşəxxüslə:

– Onları incitməyinizdən. Qiymət yazmamağınızdan, – dedi.

Professor çox sakit tərzdə qayıtdı ki, qoy özlərindən incisinlər, savadsızlara müsbət qiymət yazılmır!

Müstəntiq bic-bic yenə qımışdı. Professoru qısnamağa çalışdı:

– Digər bir cəhət də var, professor. Tələbəni get-gələ salıb süründürmək, pul almamış qiymət yazmamaq halları da az deyil! – dedi.

Baxdım ki, professor silkələndi, yəqin ki, əsəbiləşmişdi. Səsi xırıldadı.

– Belə hallardan mənim bilgim yoxdur, onu sizdən eşidirəm, – söylədi.

Müstəntiq başını bulayıb, hücuma keçdi:

– Demək istəyirsiniz ki, o hallar sizin institutda mövcud deyil? İqtisad institutunun professor və müəllim heyəti aydan arı, sudan durudu?!

Professorun təmkininə, qürurunu pozmamasına heyrət elədim. Qıcıqlandırıcı suala aram cavab verdi:

– Başqalarını bilmirəm, şəxsən mənim belə şey ağlıma sığışmır, – dedi.

Müstəntiq qarşısındakı qovluğu eşələdi. Mızıltılı sorğuya keçdi:

– Akif Qafarovu və Dadaş Dadaşovu tanıyırsınızmı?

Professor astaca:

– Kimdi onlar? – soruşdu.

Müstəntiq boynunun ardını qaşıya-qaşıya məzələndi:

– Sizin sabiq tələbələrdi, – dedi.

Professor qürurla bildirdi:

– Mənim tələbələrim yüzlərlədi. Hansı birini yadda saxlayım?

Müstəntiq mən tərəfə boylandı. Ürəyim uçundu. Səksəkələndim ki, mənim də adımı çəkəcək. Ancaq məndən yan ötdü. Professora höcət-höcət dedi:

– Onlar sizin yadınızda mütləq qalmalıdı, professor. Dəfələrlə yanınızda olublar, imtahan veriblər. Qiymət isə ala bilməyiblər. Nə üçün?

Professor eyni höcətlə cavab verdi:

– Bunu soruşmaq məntiqə uyğun deyil. Görünür, cavabları məni qane etməyib, – dedi.

Müstəntiq professorun üzünə sərt nəzər saldı:

– Onlar sizin tərsliyiniz ucbatından institutdan qovulmaq təhlükəsi ilə üzləşiblər, – deyə ittiham verdi.

Professor israrla dedi:

– Elə zəif tələbələrin olmasından olmaması məsləhətdi!

Müstəntiq professoru qınadı:

– Onlar üçüncü kursa gəlib çatıblar. Ali təhsili yarılayıblar. İnstitutdan qovulmaları ürəyinizi ağrıtmırmı? İnsafınız buna necə yol verir?

Professor dedi:

– Bəs savadsız kadr yetişdirmək, sizcə, insafdandı? Sabah, ya başqa bir gün onlar ixtisas sahibi kimi idarələrə, müəssisələrə,

təşkilatlara təyinat alacaqlar. O savadsızlardan, kütbeyinlilərdən cəmiyyət nə xeyir görəcək?

Müstəntiq susdu. Mənə belə gəldi ki, professorun tutarlı cavabından qamaşdı. Birdən kəskin həmləyə keçdi:

– Tələbələriniz sizi tamahda, rüşvətxorluqda günahlandırırlar. Qiymət yazmaq üçün böyük məbləğdə pul umduğunuzu yazıblar, – dedi.

Professor laqeydliklə əlini yellədi:

– Əsassız iftiradı, – dedi.

Müstəntiq hazır saxladığı şikayət ərizələrini ona uzatdı.

– Budur şikayətlər... Tanış ola bilərsiniz! – deyib gülümsədi.

Professor heç bir təlaş keçirmədi. Kağızları sakit aldı, eynəyini təmkinlə cibindən çıxardıb gözünə taxdı. Diqqətini kağızlara yönəltdi.

Müstəntiq fürsət ikən, mənə sarı təkrar boylandı. Him-cimlə üzləşməyə hazır olmağı anlatdı.

Professor kağızları həyəcansız geri qaytardı.

– Bunlar uydurmadı. Diktə ilə yazdırılıb! – dedi. Eynəyini gözündən götürüb qəddini qürurla dikəltdi.

Onun laqeydliyi müstəntiqin xoşuna gəlmədi, sir-sifəti qırcaşdı. Dilxor mızıltı ilə soruşdu:

– Əfsun Zamanlı adında tələbəniz də olub, onu necə, xatırlayırsınızmı?

Adım çəkiləndə məni soyuq tər basdı. Bədənimdə vicvicə gəzdi. Professorun mən haqda nə deyəcəyini təşvişlə gözlədim. O, xeyli duruxduqdan sonra:

– Bəli, xatırlayıram, – dedi.

Müstəntiq təcili sual verdi:

– Nə cür tələbə olub?

Professor dilini sürüdü:

– Oxumağı pis deyildi, çulunu sudan çıxarırdı, – dedi.

Söz qəlbimə toxundu, ondan ayrı cavab umurdum. Axı, mən əlaçıydım.

Müstəntiq "dindirmə vərəqəsi"ndə qeydlər edib, sualını dəqiqləşdirdi:

– Zamanlının xətrini çox istəyibsiniz. İstedadlı tələbəniz olub, elədir? – soruşdu.

Professor istehza ilə:

– O istedadlı tələbə yox, istedadlı kələkbazdı! Xətrini də heç vaxt istəməmişəm, – dedi.

Yandım, cızdağım çıxdı. Müstəntiq mənə ötəri nəzər yetirib, lağlağı ilə xəbər aldı:

– Zamanlının kələkbazlıq istedadını siz nədə görürsünüz?

Professor asta-asta sadaladı:

– Sırtıqlığında, üzlülüyündə, qılığa girmək səriştəsində. Və bir də qıyısız dilində!

Mən bu dəfə incimədim. Deyilənlər düz idi. O keyfiyyətlərin nəyi pisdi?!

Müstəntiq hiyləyə əl atdı:

– Zamanlı isə deyir ki, sizinlə sıx əlaqədə olub. Heç bir xahişini yerə salmayıbsınız. Tələbələrə təmənnalı qiymətlər yazıbsınız.

Professor qəfilcən kükrədi:

– Ağ yalandı!.. Həyasız böhtandı!! – deyib, əl-qolla danışdı: – Zamanlı heç vaxt mənim həndəvərimə ayaq basa bilməyib. İmkan verməmişəm yaxınıma gəlsin... Belə şeyi dilinə gətirən adam arnamusdan xəbərsizdi. Vicdansızdı!

Mən xəcalətimdən bürüşdüm. Ədəbli söyüncün bir ucu da müstəntiqin özünü tuturdu. O da astaca yırğandı. Qızarıb-bozardı və hökmlü adam ədası ilə bir vərəq yazılı kağızı professora uzatdı. Ürəyimə damdı ki, mənə diktə ilə yazdırdığı kağızdı.

– Bizə inanmırsınız, buyurun, diqqətlə oxuyun! – dedi. – Sizin tələbəniz Əfsun Zamanlının istintaqa verdiyi ifadədi!

Mən möhkəm sarsıldım. Həmən anlarda özüm-özümə nifrət elədim. Başa düşdüm ki, çox əskik bir iş tutmuşam. Lakin neyləyə bilərdim? Boğazım kəndirdəydi... Mənə elə kinli-kinli baxma, Fərid. Məni qınama, təpərim çatmadı. Ora, bayaq da dedim, köpək oğlu yerdi, tülkü tülkülüyünü sübuta yetirincə dərisini çəkib boğazından çıxardırlar.

Fəridin üzündə acı təbəssüm dolaşdı:

– Özündən razı adamlar həmişə qorxaq olurlar! Gerisini danış.

Əfsun həvəssiz-həvəssiz davam etdi:

...Professor kağızı barmaqlarının ucu ilə götürdü. Sanki murdar əsgiyə toxunurdu. Burası da qəribədi ki, onu eynəksiz oxudu.

Tezcə də kənara atdı.

– Məsələ məlumdu. Bu da diktə ilə yazdırılıb! – dedi.

Müstəntiq mızıltısını tamam sərtləşdirdi:

– Təsəvvürünüz yanlışdı, professor, yazıya heç bir müdaxilə yoxdur. – dedi.

Professor dediyindən dönmədi:

– Şübhəm dəqiqdi, – dedi. – Zəndim məni yanıltmır. Belə səlis yazı Zamanlıya məxsus deyil. Xətt onunku olsa da cümlələr özgəninkidi. Bələdəm onun qabiliyyətinə.

Müstəntiq höcətini yeritdi:

– Belə çıxır ki, yazıda deyilənləri təkzib edirsiniz, böhtan sayırsınız. Nə olar, çalışarıq hər şey dəqiqliyi ilə sübuta yetsin. Əfsun Zamanlı uzaqda deyil, yanımızdadı. Sizi üzləşdirə bilərik... Zamanlı, dur, yaxına gəl. Hörmətli professoru şəkk-şübhədən qurtar!

Dizlərim əsdi. Yerimdən dura bilmədim. Soyuq tər alnımda puçurlandı. Uyğunsuz yalanları üzə necə deyəydim!?..

Müstəntiq mənə gözünü ağartdı.

– Cəld ol! Yazdıqlarını, gəl necə var, professorun üzünə söylə!

Kətildən ölüm-zülüm qalxdım. Qılçalarım büdrəyə-büdrəyə irəli yeridim. Professora baş əyib, salam verdim. Professor üzünü ikrahlıqla yana çöndərdi. Qəzəblə yamanladı məni:

– Utanmırsan, hələ salam da verirsən?! Üzündə bir damcı həya suyu yoxmu sənin? – dedi.

Müstəntiq mənə qahmar durdu. Professoru kobud tərzdə qınadı:

– Bu davranış, etika göstəricisidi, – dedi. – Tələbəniz olmuş cavan oğlanı ehtiram bildirməkdə töhmətləndirmək nahaqdır!

Professor sözünü ona yox, mənə dedi:

– Etik qaydalara riayət edən adam belə qələt işləri tutmaz! Böhtançılıq, kimlərinsə öyrətməsi ilə adam şərləmək ən alçaq sifətdi. Kimdi, nədi səni bu yola sövq edən? Az-çox abır-həyan varsa, düzünü danış!

Mən qamaşdım. Həqiqəti necə danışaydım? Udquna-udquna qaldım. Müstəntiq diplomatik üsulla məni professorun caynağından qurtardı:

– Belə olmaz, professor! – dedi. – Siz qara məni basınca, mən qara-

nı basım cəhdi eləyirsiniz. Tələbəni müəllim zəhminizlə öz mövqeyindən çəkindirməyə çalışırsınız. Bu cəhd hüquqi cəhətdən yolverilməzdir.

Professorun rəngi qapqara qaraldı. Çənə əzələləri qabardı. Müstəntiqdən kinayə ilə soruşdu:

– Bəs haqsızlıq, yalançılıq, böhtançılıq necə? Onlar hüquqi cəhətdən yol veriləndi?!

Müstəntiq cavabı soyuq rəsmiyyətlə verdi:

– Harda olduğunuzu unutmayın, vətəndaş professor! Zəhmət çəkin istintaq qaydalarına riayət edin. Siz mənim hüzuruma günahkar qismində gətirilibsiniz!

Professor sınmadı:

– İfadənizə diqqət yetirin, – dedi, – günahı sübuta çatdırarlar, sonra belə ifadələri işlədərlər!

Müstəntiq duruxdu. Haqlı irada söz tapmadı. Professor fürsəti ötürməyib sözünü axıracan söylədi:

– Məqsədiniz aydındı. Xüsusi göstərişlə məni ləkələmək fikrindəsiniz. Bəri başdan deyirəm: əl çəkin bu çirkin niyyətdən. Heç nəyə nail olmayacaqsınız!

Müstəntiq arxalı adama oxşayırdı. Professoru yekəxana süzüb, boz-boz dedi:

– Cəfəng iraddır! Siz belə bəhanələrlə ictimai fikri yanıltmaq, hüquq-mühafizə işçiləri barədə mənfi rəy yaratmaq istəyirsiniz. Orasını yaddan çıxardırsız ki, hüquq-mühafizə orqanlarında işləyənlər insanların asayişi, dinc yaşayışı üçün sizlərdən daha artıq zəhmət çəkirlər. Cəmiyyəti ziyanlı ünsürlərdən, antipodlardan təmizləmək uğrunda can çürüdürlər!

Professor da ona köntöy atmaca atdı:

– Əfsus ki, hüquq-mühafizə işçilərinin hamısı siz deyən həqiqi asayiş keşikçiləri deyillər. Aralarında saxtaları çoxdu. Bəzi dələduzların əli ilə cəmiyyətə yararlı adamları qəsdən ləkələndirirlər. Fakt göz qabağındadı!

Müstəntiq mübahisəni hövsələsizliklə kəsdi:

– Nə isə, qayıdaq əsas məsələyə. Zamanlının yazdıqlarını təsdiqləyirsinizmi? Hə, ya yox! – soruşdu.

Professorun da cavabı səbirsiz səsləndi:

– Yox!

Müstəntiq hirsli nəzərlərini mənə tuşladı. Əmr elədi:

– Başla, Zamanlı! Nə olub, necə olub, bircə-bircə danış, yaddaşı zəifləmiş professora. Xatırlat ona hər şeyi.

Mən odla su arasında qalmış adam vəziyyətdə idim. Heç bilməzdim, yalandan üzə durmaq bu qədər ağır olarmış!

Fərid acı köks ötürdü.

– Amma sən alçaqlığa getdin… Necə də rəzil hərəkət!!

Əfsun arsız-arsız razılaşdı.

– Hə, mən də o fikirdəyəm – rəzalətdi. Adamı məcburən çirkinliyə sürükləyirlər.

Fərid bir dəqiqədən artıq susub, Əfsuna təəccüblə baxdı:

– Heyrət eləyirəm, danışdığın əhvalatları yaddaşında dəqiqliyi ilə nə cür saxlayıbsan. Bəlkə mənim zəndimi yanıltmaq üçün özündən uydururdun?.. Axı, belə məsələdə səriştən yaxşıdı, uydurmağı əla bacarırsan.

Əfsun belindən sürüşmüş şalvarını yuxarı dartdı. İrsizliklə gülümsədi.

– Mənim səriştəm hər şeydə yetərindən artıqdı, Fərid qağa. Nahaq heyrətlənirsən. O ki qaldı yaddaşıma, fenomen yaddaşdı. Nə olursa, beynimə nöqtəbənöqtə həkk edilir. Hafizəmdə həmişəlik saxlanca dönür. Dərs oxuyanda da beləydi. Siz bir dərsi dörd-beş dəfə hıqqana-hıqqana hazırlayanda, mənə onu bircə kərə gözdən keçirmək kifayət idi. Hamısı dərhal hopurdu başıma. Bir də, axı, həyatda elə hadisələr, əhvalatlar var ki, onlar bütün ömür boyu unudulmur… Xülasə, hər nə olub, keçmişdə qalıb. Təəssüflənməklə heç şey geri qayıtmır. Ondansa, gəl sənə gülməli, çox məzəli bir sərgüzəştimi nağıllayım, qaramat fikirlər bizdən uzaqlaşsın... Ancaq qoy havamı gedib yenə dəyişim, nağıllamaq istədiyim sərgüzəştim bir növ qaravəlliyə bənzəyir. Uğunub özündən gedəcəksən...

## 15.

...O, çadırın qapısı səmtinə gəldi. Başını yarıya qədər, sonra bütünlüklə çölə uzatdı, ətrafa boylandı, “uxxək!” – dedi.

– Hava bayaqkından babatdı. Elə bil, xeyli isinib. Ay zirvədən boylanır. Ulduz ulduzla məzələnir. Göyün duruluğu nəfəs genişləndirir.

Səsi uzaqlaşdı. On-onbeş dəqiqədən yenə qolları qoynunda, bürüşmüş içəri girdi.

– Heyf ki, duru havada bir az sazaq qalıb... əslində elə belə də olmalıdı. Yanvar ayının axır-uxurudu. Qışın ömrü yarılanır. Həmişə bu vaxtlar küçələri, yolları, dam örtüklərini qar bürüyərdi. Evlərin girəcəklərində buz salxımları qatarlanardı, şaxta üz göynədərdi. Allaha şükür, bu il qış mülayim keçir. Görünür, təbiət insafa gəlib, şəhidlərin ruhunu əzizləyir. Onların ziyarətinə gələnləri yağış-yağmur, kəskin soyuq əziyyətlərindən qurtarır. Ümumiyyətlə, Bakının iqlimi başaçılmazdı. Bol küləklər şəhəridi. Elə ki, "xəzri" əsir. Yeri-göyü uçurur. Aləmi toz-torpağa bürüyür, yayın lap qızmar çağında da qış ovqatı yaradır. O vaxt ki, "gilavar" əsməyə başlayır, can rahatlanır, hər tərəfə xoş sərinlik gətirir. Astaqanad mehin də ki, əvəzi yoxdur.

Fərid dinib-danışmadı:

Əfsun "nağılının" gerisinə özü bir ağız ucadan güləndən sonra başladı:

– Hə, əziz-mehriban dost, sənə nədən danışım, o gorxana həbsxana həyatının bəzi gülməcələrindən... Mən artıq bir ili tamamıydı dustaqlar arasındaydım. "Bayıl qalası"nda yatırdım. Özün bələdsən xasiyyətimə. Qurban olduğum Allahım ayrı şeyləri əsirgəsə də yağlıca-ballıca dil verib mənə. Bu dillə çox tilsimli qapılar açmışam. Qılıqlara girib, istəyimə çatmışam. Mənim dilavərliyim, şirin qılığım həbsxanada daköməyimə çatdı. Dustaqların hörmətini çox tez qazandım. Şirin söhbətlərim, lətifələrim, lağlağılarımla ürəklərinə yol tapdım. Aşıqlardan eşitdiyim, kitablardan oxuyub öyrəndiyim əfsanələr, rəvayətlər, eşq-məhəbbət dastanlarından maraqlı macəralar söyləyib keflərini açdım. Bir neçə saatlıq olsa da dərdlərini yüngülləşdirdim. Beləcə, hamı ilə yaxınlaşdım. Həbs düşərgələrinin hərəsinin öz lotu başçısı olur. Ona orada "avtoritet" deyirlər. Bütün dustaqlar ondan tük salır. Kimin həddi nədi "avtoritetin" bir sözünü iki eləsin. Neçə "cangüdəni", qulbeçəsi var, gecənin birində aradan götürürlər. Mən, xoşbəxtlikdən, "avtoritet"lə də şirin münasibət qura bildim. Elə ilk günlərdəcə davranışlarım xoşuna gəldi. Qulbeçələri vasitəsi ilə ismarış göndərdi ki, "lotuluğa" qəbul edilmişəm, fəaliyyətim diqqətdədi, işini görsün. Mən də təşəkkür yolladım ki, məni bəyəndiyi üçün çox sağ

olsun, mən elə anadangəlmə lotuyam. Xülasə, çox çəkmədi, onlara “qaranoy” oldum. “Qaranoy” cinayətkar aləmdə “bizim adam” deməkdi. Həm öz səriştəm, həm də qaranoyların sayəsində günlərim elə də pis keçmədi. Hətta iş avandına düşdü, həbsxana rəhbərliyinə də özümü şirin sala bildim. Şuxluğum, şıtıq xasiyyətim onlara da xoş getdi. Məni o biri dustaqlardan fərqləndirdilər. Oldum rəhbərliyin də “öz adamı”. Bayram şənliklərində, çal-çağırlı günlərdə çağırdılar klub səhnəsinə. Dustaqlar adından hökumət xeyrinə nitq söylətdilər, şüarlar dedirtdilər. Hələ artist yerinə də istifadə elədilər. Məzəli lətifələr, şən-şux əhvalatlar, gülməcələr danışdırtdılar. Özləri də əyləndilər, dustaqların da qəm-qüssələrini az-çox dağıtdırdılar...

Fərid burda da onu sözgəlişi sancdı:

– Bir sözlə, təlxəklik eləyibsən, səni şut yerinə oynadıblar!

Əfsun pərt olmadı. Yarı zarafatla:

– Ə, mərifətin olsun, – dedi. – Atmacalarını yığışdır. Adam kimi axıracan dinlə məni. Baməzələr irəlilədi. – O, şən-şən irişib-qımışdı. Sinəsini sığallayıb davam etdi: – Həmən şənliklərin birində gülməcələrimlə könülləri şadlandırandan sonra yaxınlaşdım həbsxana rəisinin müavininə. Aramız onunla açıxıydı. Hərdən-hərdən məni öz xəlvəti kef məclislərinə gətirtdirirdi. Qarnımı ləziz yeməklərlə doydurub, yüz əlli, iki yüz qram araq içirdib, danışdırırdılar. Sonra da əllərini əllərinə vurub hey uğunurdular. Yemək-içməkdən çox mənim söylədiklərimdən həzz alırdılar. Bir dəfə müavindən xahiş elədim ki, daha doğrusu, acizanə yalvardım ki, amanın bir günüdü, mənə birgecəliyə qadın gətirt. O məsələ məni dara çəkir...

Fərid onu hirslə küylədi:

– Bəsdi, sən Allah! Gop olar, daha bu boydası yox!

– Ə, gop eləmirəm, düzünü deyirəm… Bu elə-belə, göydəndüşmə xahiş deyildi, əsasım varıydı…

– Dedim ki, qurtar, məni həriflə mə!

– Ə, özümün ölmüşümə hap-gop eləmirəm, çılpaq həqiqəti danışıram… Eşitmişdim ki, həbsxanaya hardansa, bəlkə də qadınlar dustaqxanasından gizlicə qadın gətirirlər. Bəzi kişilərlə görüşdürürlər.

Fərid ikrahlıqla əlini yellətdi.

– Yox bir, priton da açırlar!

Əfsun and içdi:

– Ə, babamın əziz urfu haqqı olanı söyləyirəm. Sən demə, belə şeylər mümkünmüş orda. Müftə yox ha, əməlli-başlı pulnan, karlı haqq-hesabnan. Tək-tək imkanlı adamlar üçün…

Fərid ağzını büzdü:

– Deməyindən belə çıxır ki, hərəmxanaları var, dustaqları kefə baxdırırlar!

Əfsun bir də and içdi:

– Ə, müqəddəslərimizin goru haqqı, çiy söz dilimə gətirmirəm. Aman ver, gerisini nağıllayım. İnan mənə, gülməkdən özündən gedəcəksən… Bilirsən də, mən qadın ölüsüyəm. Başıma qaravəlli gəldi.

Fərid bezikib razılaşdı:

– Başına qaravəlli gətiriləcəyinə inanıram. Çərənlə görək, indi nə çərənləyirsən!

Əfsun dirsəkləri ilə şalvarını bir də yuxarı dartıb “nağılını” hihildəməklə şirinlətdi:

– Hi-hi-hi... uzun sözün qısası, istədiyim şeyi gecələrin birində təşkil elədilər. Çoxdanıydı əlim qadın əlinə dəymirdi. Dodaqlarım gözəl qadın dodaqları öpmürdü. İsti ağuş həsrətindəydim. Görüşümə gətirilən qadının necəliyinin, cavan, yaxud yaşlı olmasının fərqinə varmadım. Heç sifətini də düz-əməlli görmədim. Görüş yerimiz alaqaranlıq idi. Göz gözü zorla seçirdi. Qucdum qadını, nə qucdum! Dodaqlarını bal kimi sümürdüm, bağrıma basdım... səhər hava işıqlaşanda nə görsəm yaxşıdı? Qucağımdakı qadın idbarın idbarıdı. Çirkinliyi, eybəcərliyi cəhənnəm, sifəti çopur-çopurdu. Üstünə bir cam darı töksən, bir dənəsi də yerə düşməz. İyrəndim. Ürəyim ağzıma gəldi. Qusmağım tutdu. Hey öyüdüm. Tüpür ha tüpürəsən. Mənim yazıq əhvalım köpəyin qızına ləzzət verdi. Şaqqanaq çəkib uğundu. “Tüpürmə, dadı qaçar!” – dedi. Bu söz məni ayıltdı. Başa düşdüm ki, işi məsxərə üçün düzüb-qoşublar. Həmən gün nəzarətçilər mənə baxıb, xısın-xısın hey gülüşdülər… Düz bir həftə ürəyim bulandı. Tüpürməkdən ağzımda tüpürcək qalmadı. Qancıq qızının iyrənc sir-sifəti, iri-iri çopurları gözümün

qabağına gəldikcə, onları yaladığım yadıma düşdükcə, içim-çalatım çaxnaşdı. İştahla çörək də yeyə bilmədim. Ha-ha-ha!

Qəhqəhəsini birdən xırp kəsib, Fəridə baxdı, onu qaşqabaqlı görüb təəccübləndi:

– Ə, niyə gülmürsən? Sənin üçün gülməli deyil, bəyəm?

– Yox, gülməli deyil! – Fərid üzünü  tam bozartdı. – Ağlamalıdı! Utan barı! Bu heyvani əhvalatı bir də heç kəsin yanında danışma. Adamları ikrahlaşdırma!

Əfsun acığa düşüb, bir ağız da qəhqəhə çəkdi. Fasilə verib, höcətlə dedi:

– Qulaq as, çox ibrətamiz rəvayət yadıma düşdü. Bir rus yazıçısının əsərindən oxumuşam. O rəvayətin sənə də aidiyyəti var… Guya ulu Allah kainatı yaradandan bir xeyli sonra yerə baxıb görür ki, çox sıxlıqdı. Məxluqatı Yer kürəsi tutmur. Bir qarış məkan uğrunda qırğındı, dava-dalaşdı, bitib-tükənməyən qalmağaldı. Aranı səngitmək üçün yaratdığı canlılara müəyyən yaşam müddəti ayırmaq qərarına gəlir. Məxluqatından seçib bir dəstəsini: Adəmi, uzunqulağı, iti və meymunu mələklər vasitəsi ilə hüzuruna çağırtdırır. Üzünü Adəmə – ən çox sevdiyi məxluquna tutub buyurur: “Adəm, sən mənim xüsusi sevgi ilə yaratdığım məxluqsan. Səni cümlə məxluqlardan əziz sayıram. Yer üzünün əşrəfi hesab eləyirəm. Odur ki, ömür payı verməyi səndən başlayıram. De görüm, nə qədər yaşam müddəti istəyirsən?” Adəm ayağa durur, yaradanına ehtiramla baş əyib, təzim edib, cavab verir ki, mən nə deyim, ulu tanrım, özün bilən məsləhətdi. Allah-təala deyir: “Mən sənə otuz il ömür bağışlayıram, razısanmı?” Adəm duruxur, çiynini çəkib dinmir. Allah onun ürəyini oxuyur, narazı qaldığını duyur, əlavə heç nə soruşmur. Uzunqulağa sarı çevrilir: “Ay eşşək, – deyir, – sənə mən əlli il yaşamağa möhlət verirəm. Etirazın varmı?” Uzunqulaq gözlərindən gildir-gildir yaş axıdıb, yalvarır: “Ədalətli Allahım, çox rica eləyirəm kəs o ömrü yarıbayarı. Həmişə yük altındayam, zillət çəkirəm. Nəyimə gərəkdi bu cəfalı həyat?” Rəhmli tanrı bəyənir ricanı. Yenə üz tutur Adəmə: “Ya Adəm, iyirmi il də artırdım ömrünə. İndi necə, razı qaldınmı məndən?” Adəm zıqqıyır, başını

aşağı salıb susur. Allah itə müraciətlə buyurur: "Ay məzlum it, sənin vəziyyətini nəzərə alıb, iyirmi beş il ömür payı bölürəm, qəbulundurmu?". İt eşşəkdən betər qan-yaş tökür, aman diləyir: "Sənə qurban olum, pərvərdigar, – deyir, – zülmümü artırma. Özünə bəyandır ki, bir zərrə urvatım yoxdur. Gələnə də çəmkirirəm, gedənə də, yoldan ötənə də. Gecə-gündüz hürməkdən nəfəsim kəsilir. Bu nə yaşamaqdı mən yaşayıram? On il bəsimdi". Allah-təala itin də yalvar-yaxarını eşidir. Bir daha üz tutur Adəmə. Gülümsünərək buyurur: "Ya Adəm, it ömrünün də yarıdan çoxunu sənin ömrünə calayıram. Başqa təmənnan yenə varmı?" Adəm razılığını alakönül bildirir. Allah ən axırda meymunu dindirir. Ona daha uzun – altmış il ömür ayırdığını söyləyir. Meymun vay-şivən qoparır. Eşşəkdən də, itdən də artıq ağla-sıtqaya başlayır. Allahın ayaqları altına döşənib, aman eləyir ki, "məni bağışla böyüklüyünə. Onsuz da çirkinəm, eybəcərəm. Hamının rişxənd hədəfiyəm. Uşaqlar da, böyüklər də gülürlər mənə. Kaftarlaşanda daha idbar olaram. Yarıya endir ömrümü". Adəm bu dəfə Allahdan müraciət gözləmir, cəld ayağa durur, ulu yaradana dərin-dərin təşəkkür eləyir. Çünki meymundan da kəsilən illərin onun ömrünə calanacağına əmin idi…

Fərid etinasız soruşdu:

– Başa düşmədim, bu rəvayətin mənə aidiyyəti nədi?

– Aidiyyətini bu dəqiqə izah eləyəcəm… Nuh əyyamından da çox-çox qədimlərdən bəri nəsillər beləcə ömür sürür. Əvvəlcə, Allahın ona ilk verdiyi ömrü yaşayır, ata-ana himayəsində hər cür qayğılardan, ağır zəhmətdən uzaq olur; günlərini kef-damaqla keçirir. Elə ki, evlənir, dünyaya övladlar gətirir, ata-anası ixtiyarlaşıb əldən düşür, başlayır özü ailə dərd-səri çəkməyə; ruzi üçün ora-bura qaç-qovduya, eşşəkçilik eləməyə. Sonra gəlib çatır it illəri. Yaş ötkünləyir, hövsələ daralır, səs-küyə, söz-söhbətə dözüm tükənir, başlayır deyingənliyə. Hər adi şeyə acığı tutur, söyüb-söylənir, onun-bunun üstünə it təkin çəmkirir. Bir az da keçir, lap qocalır; sir-sifəti qırışlarla, çal-keçir çapıqlarla örtülür, ağzında bir dənə salamat diş qalmır, alt çənəsi laxlayır, başı əsir, əlləri titrəyir, əydəş-üydəş dodaqlarının yan-yancaqlarından selik axır, dönüb

olur meymunun bir tayı. Nəvə-nəticələri baxır ona gülüşür...

– Açıqlaman qəliz oldu. Bir az aydın de.

– Açığı budur ki, gərək ağlını oğurlatmayasan, başını aparıb tez-tələsik torbaya salmayasan.

– Torba nədir?

– Torba odur ki, sənin təki tezbazar evlənməyəsən. Cavanlığın dadını-duzunu dadmamış, subaylıq-sultanlıq ləzzəti çəkməmiş özünü bəlaya salıbsan. Ailə qayğıları, dolanışıq dərdi-səri qovurur səni. İndicə danışdığım rəvayətin uzunqulaqlıq dövrünü vaxtından qabaq yaşayırsan. Otuz yaşın heç yoxdu, baxıram, saçlarına dən düşüb.

Fərid, Əfsunun sözlərinə ürəyində istər-istəməz haqq qazandırdı. Doğrudan da evlənməyə tələsmişdi. İnstitutu qurtaran ilin payızında ailə qurmuşdu. Südəcər iki övladı doğulmuşdu. Qayğıları artmışdı. Həm də kirayədə yaşayırdı. Aldığı maaş kirayə pulu ilə, yemək-içməyə zorla çatırdı. Lakin qürurunu sındırmadı:

– Hər halda, öz ailəsi olmaq, yassar qadın dodaqlarını sümürüb, sonra da günlərlə öyüməkdən qat-qat yaxşıdı!

Əfsun da arxasını yerə vurdurmadı:

– Elə şey bir dəfə olub, – dedi. – Bəs ondan qabaqkılar? Gözəl-göyçək xanımları yanımda görüb, ağzının suyu axdığını niyə demirsən?!

– Onlar da üstü bəzək, altı təzəkdilər! Atıcı atar, tayını tapar! Onu da bil ki, küçələrdən ötüb-keçən qırmızı don qız-gəlinlərin arxasınca umsuq-umsuq baxmaqdansa, evlilik min faiz yaxşıdı. Ailəyə xidmət – cəmiyyətə xidmətdi. Vətən üçün layiqli övladlar böyütmək ən şərəfli işdir!

– Ə, dost, bu gün nə olub sənə? Hey atmacalayırsan məni. İynə-sancaq batırırsan.

– Taqsırı özündə axtar. Çiy söz qəlp pul kimidi, sahibinə qayıdır!

Əfsun höcətə getmədi. Fəndgirliklə canıyananlıq göstərdi:

– Məndən gizlətsən də duyuram halını, nəyinsə intizarı gözlərindən boylanır.

Fərid gizlətmədi, nigarançılığını boynuna aldı.

– Hə, – dedi, – oğlum sarıdan intizaram. Dünəndən azarlayıb. Gecə hey ağlayıb. Nə özü yatıb, nə də bizi çimir eləməyə qoyub...

səhər mən işə gələndə də halı pisiydi... Bəlkə mən gedim? Onsuz da burda mənlik elə bir iş qalmayıb.

Əfsun ürəkdən razılaşdı:

– Get, get! Bilsəydim uşağın xəstədi, səni bayaqdan yollayardım evə... Mən özüm də yığışmaq fikrindəyəm. Gələn-gedən yoxdu daha. Bir azdan da "Komendant saatı" başlayacaq. Bu qədər pulla onların əlindən çətin qurtararam.

– O pulları qaldığın evə aparacaqsan?

– Çarəm nədi? Gedib idarədə heç kəsi tapmaram, çox gecdi. Gözətçidən savayı ağlım kəsmir ki, bir işçi orda olsun. Yaxşısı budur, öz qaldığım evə daşıyım. Ev sahibləri gözü-könlü tox adamlardı. Ən salamat saxlanc yeri elə oradı. Əgər istəyirsən, sizə aparaq. Amma gərək toxunub-eləyən olmasın.

– Yox, yox! – Fərid ciddi etiraz etdi. – Məni bu məsələyə qarışdırma. Özün necə bilirsən, elə də elə. Onun məsuliyyəti sənin boynundadı.

Əfsun məmnunluqla:

– Onda səndən bir xahişim var, – dedi. – Buralarda hərlənən milisionerlərdən gör kim rastına çıxır. Bir sağ-əməllisini tap, mənə köməyə göndər. Şər söyləməsən, xeyir gəlməz. Anasının əmcəyini kəsənlər iyləyib-imsiləyib böyürdən çıxarlar, pullara sahib durarlar, biabır olarıq. Böyüklər yanında az-çox qazandığımız hörmət zaya dönər.

– Arxayın ol, ifallı bir milisioner tapıb göndərərəm.

Fərid sağollaşıb getməyə hazırlaşanda Əfsun əlini cibinə saldı. Özəlləşdirdiyi pullardan bir qədərini götürüb, Fəridin ovcuna basmaq istədi. Fərid diksinib dala çəkildi.

– Bu nədi?

– Dost payıdı! – Əfsun gülümsünüb, göz vurdu. – Uşağın xəstədi. Dava-dərmana gərək olar.

Fərid sərt hərəkətlə pulları yerə atdı.

– Mənə heç kəsin payı lazım deyil! Uşağımın dərmanına da, başqa şeylərə də pulum var!

Əfsun sakitliklə pulları yerdən götürüb, Fəridə təkrar uzatdı.

– Tərslik eləmə, götür. Pulun cibdə çoxluğu yaxşıdır! Şöbə müdiri olsan da, ayrı gəlirin yoxdur. Bilirəm, maaşa baxırsan.

Fərid üzünü bozartdı.

– Dedim, lazım deyil! Mən heç vaxt özgəsinin əlinə baxmamışam, kimsədən heç nə ummamışam.

– Ə, birdən elə bilərsən, camaatdan toplanan pullardandı... əstəğfürullah! Öz halal pulumdu. Kənddən dədəm göndərib. İşə düzəldiyimdən xəbərsizdi... Poçtdan dünən almışam. İnanmırsansa, bu dəqiqə qəbzini göstərim.

O, üst köynəyinin ciblərini (bura pul qoymamışdı) yalan-yanlış eşələdi. Fərid sübut gözləmədi. Çadırın qapısını çırpıb uzaqlaşdı.

Əfsun onu rişxəndli gülüşlə yola saldı:

– Eh, səfeh! Allah, müf yerdən yetirmiş pula da yaxın durmur. Di get, boğazına qurd düşsün. Bütün ömrün boyu ehtiyaclar içində çapala!!

## 16.

Milisioner tez gəldi. Bu iri gövdəli, zırpı bir adam idi.

Əfsun onu qəsdən hay-küylə qarşıladı:

– Xoş gördük, əşi! Səni mən vağzalda görmüşəm, buralarda neyləyirsən?

Zırpı özünü dartdı:

– Asayişi qoruyuram!

Əfsun sataşdı:

– Vağzalda böyük əmin-amanlıq yaradıb, indi də burda at oynadırsan?

Zırpı ötkəm dedi:

– Biz at oynatmırıq, qadası. Əmin-amanlığa keşik çəkirik!

Əfsun həlim ahəngə keçdi. Milisioneri cırnatmaq olmazdı. Ona işi düşəcəkdi.

– Ə, qağa, zarafat eləyirəm ey. Acığın tutmasın.

Zırpının köpü yatdı.

– Biz əl buyruqçusuyuq. Sapan daşı eləyib, istədikləri yerə atırlar. Harda bir narahatçılıq var, ora yollayırlar. Bizim peşə zayıl peşədi. Dincliyə, rahatlığa tamarzıyıq.

– Bunun əvəzində də aldığınız maaş qəpik-quruşdu. – Əfsun sarı simə toxundu. – Külfətin böyükdümü?

– Altı nəfər baxır o qəpik-quruşa. – Zırpı gəlir yeri hiss etmiş

kimi, özünü yazıqlatdı. – Qoca, xəstəhal anam, üç uşağım, həyat yoldaşım və bəndəniz.

– Acıyıram halına! – Əfsun Fəridə ayırdığı pulu yarı bölüb, zırpının döş cibinə soxdu. – Bu, az pul deyil, evə qayıdanda yolunu dükan-bazardan sal. Arvad-uşaqlarını sevindir.

Zırpının üzündə yaltaq təbəssüm səyridi.

– Çox razıyam. Allah əvəzini yetirsin!.. Mənə dair buyruğunuza hazıram.

Zırpının mütiliyi Əfsuna ləzzət verdi. Səxavəti artdı. Ovcunda qalmış pul qalığını da ona ötürdü.

– Di, vaxt itirmə! Götür o torbanı gedək.

– Hara gedəcəyik?

– Hara lazımdı ora!

– Baş üstə.

Əfsun iri kağız kisəsini zırpının belinə şələləyib, kiçik torbanı öz qoltuğuna aldı, yola düzəldilər.

"Dağüstü park"ın təhlükəli dolaylarını xətərsiz endilər. "Qurumsaq gədələr" künc-bucaqda görünmədilər. Ən təhlükəli yerləri əmin-amanlıqla arxada qoydular.

Şəhərin içəriləri sakitlik idi. Adamlar nəzərə az-az çarpırdı. Küçələrdə maşın hərəkəti də yox dərəcəsindəydi. Məlum faciədən sonra şəhər hələ də öz növrağına qayıtmamışdı.

Onlar bir xeyli irəlidə ayaq saxladılar. Əfsunun qaldığı ev buradan çox uzaqda idi. Piyada gedib çatmaq mümkün deyildi. Taksi axtarmalı oldular. Həmişə ora-bura şütüyən, qarışqa tək qaynaşan taksilər qəhətə çəkilmişdi. Çox gözlədilər. Səbirləri tükənhatükəndə, bir sınıq-salxaq taksi tak-turaqla gəlib çıxdı. Əfsun sevincək maşının qabağını kəsdi. Taksiçi ilə sövdələşmədən yolhaqqını qabaqcadan artıqlaması ilə ödəyib, ünvanı söylədi. Amma hər ehtimala qarşı, milisioneri də yanında oturtdu. Hardan biləydi, taksi sürücüsü nə cannı-cinnidi.

Mənzil başına rahat çatdılar. Əfsun maşını həyətə sürdürmədi. Bir döngə bəridə saxlatdı. Evi milisionerə də tanıtmaq istəmədi. Onun da qayıtmaq haqqını verib, xoşluqla xudahafizləşdi.

Qapını Qumaş arvad açdı. Kirayənişinini ağır yük altında tövşüyən görüb təəccübləndi:

– Bu nə şeydi, ay bala? Niyə təkcənə daşıyırsan? Özünə nədən ötrü ezyat verirsən?

Əfsun çanağında gizlənmiş tısbağa vəziyyətində idi. Çiyinlərindəki yüklərin arasından başı güclə görünürdü. Cavabı ləngidi. Torbaları içəridə düşürüb, nəfəsini bir neçə dəfə dərin-dərin dərəndən sonra dilləndi:

– Can nənə, bu şeylər heç kəsə etibar olunası deyil, çox qiymətli dövlət əmanətidi.

Qumaş arvad  şəkləndi.

– Elədisə, bə niyə aparıb döylət idarəsinə vermirsən?

Əfsun:

– İndi idarələr bağlıdı, – dedi. – Allah qoysa, sabah tezdən aparıb təhvil-təslim eləyəcəm. Narahat olma, öz idarəmizin kağız-kuğuzlarıdı.

– Özün bilən məsləhətdi, bala. Apar qoy öz yatdığın otağa, əldən-ayaxdan uzağa. Büyün əvvəllərdəkinnən çox gec gəldin. Xörəyini neçə kərəm qızdırmışam... Acmış olarsan. Tez elə, get yuyun, gəl yeməyini ye.

– Hə, hə, ay nənə, bərk acımışam. Bu gün işim lap başımdan aşdı. Ağzıma bir loxma çörək atmağa da macal tapmamışam.

Əfsun torbaları sürütləyib, axırıncı otaqda küncün birinə qoydu. Gödəkcəsini də soyunub onların üstünə sərdi. Dala dönəndə, nigarançılıqla soruşdu:

– Bəs nəvən hanı, nənə?.. Niyə görünmür?

– Qonşuya gedib... – Sinif yoldaşıynan dərs hazırrıyır.

– Hm... – Əfsun açıqca təəssüfləndi. – Onsuz bu ev çox yoxsul görünür, nənə. Maşallah, sənin nəvən gözəl nəvədi!

Qumaş arvad üzünü turşudub dinmədi. Əfsun yuyunmağa getdi. Hamamxananın girəcəyində gözü Tamaşanın səliqə ilə cütlənmiş yaraşıqlı başmaqlarına sataşdı. Əyilib əlinə götürdü, it kimi iylədi. Qızın ətrini başmaqlarından aldı. Qumaş arvad  bunu gördü, acıqlı-acıqlı soruşdu:

– Sən orda neyliyirsən, a bala?! Qızın başmaqlarını niyə iyləyirsən?

Əfsun arsızlıqla hırıldadı:

– Başmaqları iyləmirəm, nənə. Bəzək-düzəyi xoşuma gəldi, ona baxıram.

Qumaş arvad narazılığını başıörtülü bildirdi:

– Vaxtını boş-boş şeylərə itirmə! Xörəyin süfrədədi, soyuyur.

Əfsun xəlvətə salıb qızın başmaqlarını bağrına basdı, canı odlu-odlu pıçıldadı:

– Ah, əziz, gözəl başmaqlar! Nə olaydı, sənin o göyçək sahibəni də bax beləcə, bağrıma basıb, köksümə sıxıb, kamımı alaydım!

Qumaş arvad pıçıltını ala-çula eşitdi. Mətbəxdən səsləndi:

– Nə deyirsən? Eşidəmmədim.

Əfsun dodaqaltı deyindi: "Bu kaftar qarının qulağı darı dəlir, adicə pıçıltı da gedib ona çatır. Aman vermir canımın odunu heç olmasa, bu təsəllilərlə söndürüm...".

Səsini məcburi mehribançılıqla ucaltdı:

– Səninlə deyiləm, can nənə. Öz-özümə danışıram. Sənə alqış eləyirəm. Allahdan sağlıq diləyirəm. Qayğımı doğmalarımdan artıq çəkirsən.

Tamaşa qonşudan gec qayıtdı. Bu müddətdə Əfsun çörəyini yedi. Üstündən iki stəkan çay içdi, yorğun bədəni süstləşib kirpiklərindən mürgü sallansa da yatmağa getmədi. Qızı görməmiş, onunla bir-iki kəlmə kəsməmiş gözlərini yummaq istəmədi. Bunsuz yuxusu şirin olmayacaqdı...

Tamaşa dəhlizə ayaq basan kimi, o, yerindən sıçrayıb qımışa-qımışa qənşərinə yeridi, salamlaşdı. Qız salamı dodaqucu aldı. Əfsunun böyründən ötüb iti addımlarla nənəsi ilə qaldığı otağa şığıdı, qapını arxasınca kip örtdü.

Əfsunun ürəyindən qara qanlar axdı. Qızın etinasızlığı onu bərk ağrıtdı. Özünü təhqir olunmuş saydı. Çönüb Qumaş arvada gileyləndi:

– Bu nəvən yamanca dikbaşdı, nənə. Quruca salam-kəlamı da əsirgəyir məndən. Anlaya bilmirəm nə pislik eləmişəm ona, mənimlə niyə kobud davranır. Ona bir öyüd-nəsihət versənə!

Qumaş arvad sərt-sərt:

– Şit hərəkətdəri xoşdamır. Sən özünü ciddi apar! – dedi.

Əfsun qeyzini dəli bir fikirlə söndürdü: "Heç eybi yoxdur, naz-

lı gözəl! Bu, qoy borc olsun lələşinə. Sənin inadını yenib, istədiyimə çatmasam, bu dünyada gərək yaşamayım!”

## 17.

Hirs onun mürgüsünü dağıtdı, yuxusu ərşə çəkildi. Başını qarışdırmağa məşğuliyyət axtardı. Pulları saymaq yadına düşdü.

Durub otağın qapısını arxadan cəftələdi. Öncə cibindəkiləri çıxardıb qabağına tökdü. Əzik-üzük əsginasları əlinin tini ilə bir-bir, yaxşı-yaxşı sığalladı. Qırışığını, bürüşüyünü hamarladı. Şax hala salıb, səliqə ilə üst-üstə yığdı. Pul qalağı xeyli hündür göründü. Sevincdən göz bəbəkləri işıldadı. Qürur duydu. Kasıbçılığın daşını birdəfəlik atdığını düşündü. Şadlığı birə-on artdı.

Sonra sahmanlı pulları xüsusi həvəslə saymağa başladı. Şax əsginaslar barmaqları arasında xışıldadıqca kefi daha da kökəldi. Bu xoş xışıltının həzzi ürəyini dağa döndərdi. Özünü hamıdan güclü, hünərli duydu. İndən belə heç bir xalasıgöyçək onun qabağında dura bilməzdi. Könlündən keçən hər istəyə maneəsiz, əngəlsiz çatacaqdı. Necə ki, tələbəlik illərində müftə gəlirlə yağ yeyib, yaxada gəzmişdi. O pullar indikilərin müqabilində heç şey idi. Hələ kiçik torbadakılar, Allah bilir, nə qədərdi!..

Şadlığından çırtıq çaldı. Asta zümzümə etdi. Bəxtəvər-bəxtəvər pıçıldadı:

–Yaman gözdən iraq, Əfsun, dünya sənindi! Bir həftə əvvəlki yazıq, miskin halın hara, bu saatkı xoşbəxtliyin hara!.. Allah pulu başından yağdırır. Sənin həqiqi şən həyatın bundan belə başlayacaq. Sayılıb-seçilən, barmaqla göstərilən adamlardan olacaqsan. Mərhəba ağlına, fərasətinə!!

O, özünü öyə-öyə sayıqlığını da unutmadı. Qəlbinə damdı ki, yaxınlıqda kimsə var, pulları görür. Hövülləndi. Təşvişlə qanrılıb ora-bura nəzər fırlatdı. Gözünə heç nə çarpmadı. Bununla belə, rahatlanmadı. Qalxıb pəncələri ucunda qapıya yaxınlaşdı, ətrafı diqqətlə dinsədi. Bir hənirti, çınqırtı eşitmədi. Yenə də arxayınlaşmadı, cəftəni açıb, qapını ustuf-ustuf aralayıb kip-kirimiş boylandı. Evin hər yanında işıq söndürülmüşdü. Nənə və nəvə şirin yuxudaydı.

Tam sakitləşdi. Döşəmədə – pul torbalarının böyründə bardaş qurub oturdu. Cibxərcliyi üçün ayırdığı pulu bölüb bir neçə cibində yerləşdirdi. Düyməsi olanı düymələdi, düyməsi olmayanın ağzını sancaqla bağladı. Bir qismini də çamadanında gizlədib çarpayının altına, dərinə itələdi. Və gərnəşərək, kiçik pul torbasını yaxına çəkdi. Xudmani qımışa-qımışa bağını açdı. İçindəkiləri boşaltdı. Önündə əməlli-başlı pul təpəciyi yarandı. Gözlərinə yeni işıq gəldi. Bu pullar ciblərinə təpişdirdiklərindən üç-dörd dəfə artıq idi. Fərəhi böyüdü. Pul təpəciyini hərarətlə qucaqladı. Pullar qucağına sığışmadı, kənarlara səpələndi. O, iki-üç dəqiqə sərxoş vəziyyətində qaldı, huşyar oldu. Məstliyi ötüb-keçəndə, aramla dikəldi. Pulları bir yerə toparladı. Saymağa hövsələsi çatmadı. Bunu ayrı vaxta, daha asudə zamana saxladı. Çəngələyib yenidən torbaya doldurdu. Ağzını möhkəm-möhkəm bağladı. Gətirib yatdığı çarpayının baş tərəfində, balıncla yanaşı qoydu. Bura kənar nəzər-diqqətdən xali idi. Gizli saxlanc olduğu ağıla gəlməzdi. Böyük torbanı idarəyə aparacağını isə açıq halda divara söykədi. Toxunulacağından nigaran olmadı.

Hər işini sahmanda görüb, əmin-amanlıqla yatmağa hazırlaşdı. Paltarlarını soyunan anda ürəyini başqa bir intizar qovurmağa başladı. Tamaşa yadına düşdü. Qızın ona laqeydliyi, saymaz hərəkətləri bağrının başına od saldı. Bayaq özünə verdiyi sözə çatmaq istəyi canına qaynar qor doldurdu. Şəhvət ehtirası ağlını başından uçurdu.

Qapını səssizcə açıb, dəhlizə çıxdı. Qaranlıq qatılaşmışdı. Yalnız bir yerdən – nənə ilə nəvə yatan otağın kip örtülmüş qapısının dəlmə-deşikləri arasından gecə lampasının mavi işartıları sızıb, hədəfi nişan verirdi.

Əfsun kirimişcə, ayaq barmaqlarının ucunda hədəfə yaxınlaşdı. Qapını çox ehmallı araladı. Tamaşanı gördü. Mavi işıq qızın üzünü yalayırdı. Bəm-bəyaz sinəsini, yup yumruca məmələrini qəribə sehr ilə sezdirirdi.

Damarlarında qanı coşdu. Özünü, necə olur olsun, qızın ağuşuna çatdırmaq həvəsi qarşısıalınmaz gücə çevrildi. Sonra nə baş verə biləcəyini əsla düşünmədi. Qız yuxudan qorxu içində oyanıb

haray-həşir salsa, nənəsini də oyatsa, nə törəyərdi? Qumaş arvad qəzəblənib onu həmən dəqiqə evdən qovsa, halı-günü necə olardı?..

Yox, belə vəziyyəti fikirləşəcək halda deyildi. Şəhvət hissinin tüğyanında heç nə qavramırdı. Beyni kütləşmişdi. Bütün varlığına bircə şey hakim idi: arzusuna qovuşmaq, vəssalam!

Asta-asta sivişib içəri girhagirdə, Qumaş arvad yatağında qımıldandı. Kirpiklərini xıppıldadıb, göz qapaqlarını azacıq qaldırdı, yuxulu-yuxulu soruşdu:

– Nə axtarırsan, a bala? Sənə nə lazımdı?

Əfsuna sanki qəfil və zorba şillə vuruldu. Diksinib dumanlı hisslərdən ayıldı. Qumaş arvadı ürəyində kinli-kinli söydü: "Canına dərd, boğazına boğma axtarıram!.. Kaftar qarı, qoymazsanmı işimizi görək?!.. Gərək elə hər şeyi biləsən?! Adicə pıçıltını, hənirtini də eşidirsən. Haçan lal-kar olacaqsan, canımız qurtarsın səndən?!.."

Qumaş arvad təkrar, həm də açıq narazılıqla xəbər aldı:

– Eşitmədinmi, a bala, sənnənəm! Nə vurnuxursan buralarda?

Əfsun kor-peşiman dala qayıtdı.

– Susamışam, nənə. Dilim-ağzım quruyub, səndən içməli su yerini öyrənmək istəyirdim. Saxlancında mineral su ola bəlkə? Adi sulardan istifadəni həkimlər mənə qadağa eləyib. Mədəmdə nasazlıq var.

Qumaş arvad acıqlı dilləndi:

– Get, mətbəxin işığını yandır, soyuducunun alt gözünə bax. Orda bir şüşə "Badamlı" olmalıdı. Amba innən belə yanına su qoy, yatanları nayrahat eləmə!

– Bildim, nənə. Bağışla!

Əfsun mətbəxə adladı. Deyilən yerdən "Badamlı"nı götürdü. Qapağını açıb stəkansız-filansız başına çəkdi. Sən demə, ciyəri doğrudan yanırmış, özündən xəbəri yoxmuş. Butulkanı yarıya qədər soğdu.

Bir azdan soyuq su içini üşütdü. Təkcə ciyər yanğısını deyil, şəhvət ehtirasını da söndürdü. Ağlını başına yığdı. Həlim, ipək xasiyyət Qumaş arvadı heç nəsiz hirsləndirmişdi. Qıza toxunsa, gör nə həngamə qopardı!..

Bürüşə-bürüşə otağına döndü. Tələsik soyunub yatağına girdi. Acı təəssüf gözlərini bir müddət açıq qoydu...

**18.**

Səhər tezdən hay-küyə oyandı. Nəvə ilə nənə höcətləşirdilər. Qalmaqal yemək üstündəydi. Məktəbə gedən Tamaşa ağzına bir tikə çörək almaqdan imtina edirdi, iştahasızlığını bəhanə gətirirdi. Nənə isə onu ac-susuz yola salmaq istəmirdi. Nəhayətdə nənə nəvəsini üstələdi.

Əfsun çarpayıdan xüsusi çeviklıklə düşüb, paltarlarını tələm-tələsik geyindi. Tamaşa çay içən müddətdə əl-üzünü yuyub, qurulandı. Evdən Tamaşa ilə birlikdə çıxmaq, gecə baş tutmamış məqsədinə gündüz çatmaq, qızı elə yoldaca qılıqlayıb aranı açmaq xəyalında idi.

Lakin Qumaş arvadı şübhələndirməmək üçün bir qədər ləngiməli oldu. Otağında qurdalanıb, özünü məşğul göstərdi. Tamaşanın məktəbə gedən yoluna bələd idi. Bunu əvvəldən, xəlvəti öyrənmişdi. Durna xanımla ilk yaxınlaşma təcrübəsinin burda da işinə yarayacağına arxayın idi.

Astanaya yönələndə Qumaş arvad qənşərində dirək kimi durdu.

– Hara tələsirsən? Yeməyin süfrədə hazırdı.

Əfsun sivişə-sivişə:

– Ona macalım yoxdu, nənəcan. Yemək yadıma düşmür. Çox vacib işim var, - deyib aradan çıxdı.

Qumaş arvad deyindi:

– Tələsən təndirə düşür, bala. Canın qeydinə cavannıxdan qalmax lazımdı. Sonram gec olur, azar-bezar tapır... Axşam özün deyirdin ki, mədən incidir səni.

Əfsun cavab vermədi. Özünü qıza yetirmək üçün kəsə yol seçdi. Hündür binaların böyür-bucağından şıdırğı keçərək, get-gəlsiz bir döngədə qızı haqladı. Tövşüyə-tövşüyə:

– Yaman yeyin gedirsən, – dedi. – Dalından zorla çatdım.

Tamaşa hürkdü. Ona çəp-çəp, narazı-narazı baxıb üzünü yana tutdu, addımlarını bir az da yeyinlətdi.

Əfsun dala qalmadı. Qızın gah sağ, gah da sol böyrünə keçərək, ovsunlu dilini yağlayıb işə saldı:

– Tamaşa, əzizim, hürkmə məndən, bir hovurluğa ayaq saxla. Ürək sözüm var sənə. Xahiş eləyirəm onu dinlə.

Tamaşa əylənmədi. Heç dinmədi də. Əfsun qır-saqqız olub, ondan qopmadı.

– Sən mənim hədsiz-hüdudsuz dərəcədə xoşuma gəlirsən, sevirəm səni. İlk gündən ağlımı başımdan alıbsan. Açıq-aşkar eşq dəlisiyəm. İcazə versən, pərvanən olub gündə yüz yol başına fırlanaram. Əziyyət çəkib yeriməyinə qıymaram, hara getsən, qollarım üstündə apararam. Çiyinlərimə mindirib dünyanı gəzdirərəm. Heç vaxt yoruldum demərəm. Çünki səninlə nəfəs alıram. Sən mənə öz canım qədər, hələ ondan da qiymətlisən. Bu yer üzündə hər şey bir yanadı, sən bir yanasan!

Tamaşa əlləri ilə qulaqlarını qapayıb yürüməyə başladı. Əfsun özü ilə bərabər dilini də yüyürtdü:

– Ancaq sən mənimlə olduqca amansız davranırsan, adam yerinə qoymursan. Salam verirəm, salamımı almırsan. Qəlbimin istəyi ilə gül-çiçək hədiyyəsi gətirirəm, götürmürsən, hirslə yerə atırsan. Ha çalışıram mənə mərhəmətini əsirgəməyəsən, bir xoş üz göstərəsən, ipə-sapa heç cürə yatmırsan. İndi də budur, ürəyimin qanına bələyib söz deyirəm, sənə könül açıram, yenə həmən etinasızlığı göstərirsən. Sinəmə dağ üstündən dağ çəkirsən. Axı, nə üçün?

Tamaşa bir kəlmə dinmədi. Üzünü ondan gizlədib, yolunu dəyişdi, ayrı səmtə buruldu. Yaxasını zəhləsi gedən bu qır-saqqız oğlandan bacardıqca tez xilasa çalışdı.

Əfsunun səbri tükəndi, zor işlətdi, qızın qolundan yapışıb əylədi. Təkidlə cavab istədi:

– Yox, belə olmayacaq! Dillən, bir söz de. Daha dözümüm qalmayıb.

Tamaşa bərk dartındı. Uşaqcasına ağlamsınıb çımxırdı:

– Burax qolumu! Əl çək məndən!

Əfsun inadla yırğalandı.

– Əl çəkməyəcəm. Sən mənim olmalısan!

Tamaşa hirsindən tövşüdü. Bütün gücünü toplayıb qolunu Əfsunun pəncəsindən çıxartdı. Canavar ağzından qurtulmuş ceyran kimi hoppana-hoppana qaçdı. Əfsun iki-üç sıçrayışla onu bir də yaxaladı. Qollarını yana açıb höcətlə yolu kəsdi:

– Yol bağlıdı! Heç vaxt açılmayacaq! Bircə çarəsi var: ya mənə "hə" de, ya da öldür, meyidimin üstündən keç!

Tamaşa göz yaşı içində bir də çımxırdı:

– İncitmə məni, kənara dur!

Əfsun ayaqlarını aralayıb, möhkəm dayandı.

– Mən səni qətiyyən incitmərəm. Əzizləyib, gözlərimin üstündə bəsləyərəm. Qəlbimin səsinə hay ver. Bu qədər zülm olmaz!

Tamaşa əlacsızlıqdan hönkürdü:

– Çəkil yolumdan! Dərsə gecikirəm.

Əfsun güzəştə getmədi:

– Sən dərsə gecikirsən, mən də işə... Sualıma cavab almayınca semafor açılmayacaq.

Tamaşa qıcanmış dişləri arasından onu söydü, qarğadı:

– Əclaf!! İt balası! Allah öldürsün səni!

Əfsun arsızlığa saldı:

– Mən əclaf deyiləm, sənin vurğununam!

Tamaşa hövüllə irəli-geri boylanıb qışqırdı:

– Mən nifrət eləyirəm sənə! Zəhləm gedir!

Əfsun qürur, qürrə ilə qımışdı.

– Nifrət eləmək yox, sevmək lazımdı məni. Mən pullu oğlanam. Kasıbçılıq daşını atmışam. Çox imkanlıyam. – Şalvarına ağırlıq salmış dolu ciblərinə işarə etdi: – Səni yağ içində böyrək təkin bəsləyəcəm. Heç nədən korluq-darlıq çəkməyə qoymayacam. İstəsən, bu pulların özündən sənə don da tikdirərəm.

Tamaşa məktəb çantasını çiynindən endirib, sağ əlində əsəbi-əsəbi yelləndirdi.

– Apar o donu əzizlərinə tikdir. Məni rahat qoy!

Əfsun göz-qaş oynatdı.

– Mənim səndən əziz, səndən çox istədiyim bir kəsim yoxdur. Bunu səmimi bildirirəm.

Tamaşa onu nənəsi ilə hədələdi:

– Nənəmə deyəcəm...

Əfsun onun sözünü qəhqəhə ilə kəsdi:

– Nənəyə də canım qurban, sənə də! Razıyam, de. Nənən mənim tərəfimi saxlayacaq. Mən sənə pis söz demirəm, ürəyimi açıram.

Tamaşa əlacsızlıqdan oğlanın üstünə cumdu. Hər iki əli ilə itələdi, yolundan kənarlaşdırmaq istədi. Əfsuna da elə bu lazım idi. Fürsəti ötürmədi. Bircə cəhdlə qollarını qızın belinə doladı, özünə möhkəm sıxdı. Təcrübəsi vardı. "Dəli ceyran"ları ram etmək qaydasını yaxşı bilirdi. Qızın yanaqlarından tələsə-tələsə öpdü.

Tamaşa bir həmlə ilə ram edilən "dəli ceyran"lara bənzəmədi, təslim olmadı. Haray-həşirlə müqavimət göstərdi. Ayrı şeyə gücü çatmayıb, cırnaqlarını işə saldı. Ucları iti dırnaqlarını Əfsunun üzünə sancdı. Bir neçə yerini möhkəm cızdı. Əfsun üzündəki ağrı və sızıltılara dözməyib qollarını boşaltmalı oldu.

Qız dərhal geri çəkildi. Hirsindən hönkürə-hönkürə Əfsundan acığını çantası ilə çıxdı. İçi kitab-dəftərlə dolu, ağır çantasını fırladıb zəhləsini tökmüş oğlanın başına çırpdı və qılçaları dolaşa-dolaşa, hələ də hönkürə-hönkürə yüyürüb xeyli irəlidə məktəbə gedən bir dəstə şagirdə qoşuldu.

Əfsun qızdan belə hünərli intiqamçılıq gözləmədiyindən mat qalmışdı. Bir müddət süst, hərəkətsiz dayandı. Özünə gələndə, Tamaşanı uzaqda, şagirdlər arasında görüb, təpiyini torpağa çırpdı. Yanıb yaxıla-yaxıla ona barmaq silkələdi:

– Qoy bu da borc olsun mənə, ərköyün qız! Səndən elə əvəz çıxım ki, dadı damağından getməsin... Mənim torumdan hələ heç kəs qurtarmağı bacarmayıb. Elə bu gecə səni özümünkü eləyəcəm!

O, üzünün cırmaqlanmış yerlərini görməsə də getdikcə artan sızıltılarından duyurdu ki, bunlar adi, yüngül cızılmaq deyil, dırnaqlar dərinə işləyib. Deyinə-deyinə cibindən yaylığını götürdü. Qatını açıb üzünə sərdi. Göynəyən cırmaq izlərini ehmallıqla sildi. Yaylıq qana bələndi, göynərtilər şiddətləndi. Qızı hündürdən asıb-kəsdi:

– Cırnaqların andırına dönsün! Tikan yaraları kimi yerləri zoqquldayır... Bu sir-sifətlə camaat içinə necə çıxacam? İdarə böyüklərinin gözlərinə nə cürə görünəcəm? Yaralar heç iki-üç günə də sağalmaz. Sağalsa da izləri qalacaq. Kaş çürüyüb töküləydi o dırnaqlar!

Yaylığı tüpürcəkləri ilə yaşladı. Yara yerlərinə basdı. Laxtalanmış qan damlalarını ustufluqla təkrar sildi, yaylıqda qan izləri

bayaqkından az bilindi. Tamaşanın qarasınca bir də deyinib asfalt yola çıxdı. Əmanəti idarəyə çatdırmaq üçün taksi saxladı. Qumaş arvadgilin həyətinə sürdürdü. Qumaş arvad onun sifətini al-qanlı görüncə, vaysındı:

– Boy, boy, a bala, üz-gözün niyə bu haldadı? Kim səni belə yazıq günə qoyub?

Əfsun bir istədi desin sənin ərköyün nəvən eləyib. Lakin dilini dişlədi, ağılkəsdirən yalan danışdı:

– Xəta məndən qıl yazdı, nənə. Gecədən gətirib evdə saxladığım o vacib kağız-kuğuzları idarəyə tez çatdırmaq üçün böyrümdən şütüyüb keçən taksi maşınını əyləməyə tələsdim. Yolkənarı kolların içindən keçəndə, şax-şəvəllərə üzümü cızdırdım... Sən bayaq düzcə demişdin, tələsən təndirə düşürmüş!

Qumaş arvad qaşlarını alnına dartıb, astaraq başını buladı.

– Yaxşı qurtarıbsan, şax-şəvəl gözünə girməyib. Allah eləməmiş, kor qalardın... Di tez ol, keç hamam otağına. İsti suynan, sabınnan üzünü yaxşı-yaxşı yu, yaralanan yerlərə şax-şəvəldən mikrof keçər, səni azara salar.

Əfsun hamam otağında güzgüyə baxdı. Üzü üç-dörd yerdən əməllicə şırımlanmışdı. Bərk ofuldandı. Bu ofultu yara ağrılarının yox, ürək dağının sədası idi.

## 19.

Onun sifət dəyişikliyi idarədə də diqqəti çəkdi. Sorğu-suala tutdular. Əfsun heç kimə açıqlama vermədi. Belində pul şələsi ilə birbaşa Şadmanlının kabinetinə yollandı. Qapını bekaraca tıqqıldadıb, ərklə içəri təpildi.

– Salam-əleyküm, Şakir müəllim. İcazə varmı bir dəqiqə vaxtınızı alım?

Şakir Şadmanlı başını fikirli-fikirli dikəltdi:

– Hə, sənsən? Buyur! – desə də çöhrəsi dərhal kölgələndi. – Gətirdiyin nədir?

Əfsun yükünü qapı küncündə belindən düşürüb qımışa-qımışa irəli yeridi.

– Puldu, Şakir müəllim.

Şadmanlı son dərəcə ehtiyatlandı. Haldan-hala düşdü. Həlim səsi rəsmiləşdi:

– Nə pul?! O boyda pul hardan və nə üçündür?

– Komitəmiz üçündü, Şakir müəllim.

Şadmanlı yeni həyəcan keçirdi. Tez-tez kirpik çaldı.

– Onu hardan və kim göndərib?

– Heç kim göndərməyib, Şakir müəllim. Mən özüm gətirmişəm.

Şadmanlının bənizi avazıdı. Qorxuya düşdü. Səsi alçalıb həzinlədi:

– Möcüzə danışma, Zamanlı. Mənə aydın izahat ver, bu çoxluqda pulu sən necə əldə eləyibsən?

Əfsun icazə almadan, altına stul çəkib ağır və arxayın əyləşdi.

– Şakir müəllim, deyəsən, unudubsunuz. Məni, axı, "Dağüstü park"a komitəmizdən məsul nümayəndə göndərmisiniz. Orda hər şeyə nəzarətçi və cavabdehəm. Bu pullar da zəkat pullarıdı. Əhalinin azadlıq şəhidlərinin ailələrinə könüllü yardımıdı. Mənim xidmətim qeydiyyat aparmaqda, o halal xalq malını salamat və kəm-kəsirsiz gətirib idarəmizə çatdırmaqdadı.

Şadmanlının irz-irəngi düzəldi. Anlaşılmazlıq kölgəsinin yerini xoş təbəssüm bəzədi.

– Belə söylələə!.. Çox yaxşı, çox əcəb! Bizim xalq səxavətli xalqdı. Ölüsünə-dirisinə yeyə durandı… Bəs sifətinə nə olub? O nə yaralarıdı?

Əfsun əlavə hörmət və etimad qazanmağa çalışdı:

– Döyüblər, Şakir müəllim.

Şadmanlı təzədən təşvişləndi:

– Döyüblər?! Harda? Nə üstündə?

– Elə o pulların üstündə.

– Hadisə necə olub?

– Axşam "Dağüstü park"dan pul torbası çiynimdə enəndə, xəlvət bir döngədə qabağımı kəsdilər. İki, ya üç nəfər idilər, qaranlıqda yaxşı seçə bilmədim. Qəfil cumdular üstümə, hərəsi bir yandan təpiklə, şillə və yumruqla çırpdılar məni. Pulu qamarlamaq istədilər. Yəqin ertədən pusqumda durublarmış...

– Bəs belə yüklə yola niyə tək çıxırdın? Bilmirdinmi şəhərdə oğru-əyri yox deyil?

– Bilirdim. Ürəyimə nəsə dammışdı, ona görə də oralarda asayişə keşik çəkən milisionerlərdən birini xahiş-minnətlə özümə yoldaş eləmişdim. Amma yükümün nə olduğunu deməmişdim.

– Milisioner həyanlıq eləmədi bəs?

– Elədi, o, olmasaydı, meyidimi sərərdilər. Zırpı-zırpı oğlanlardı. Milisioner tapançasından atəş açdı. Güllə səsinə quldurlar qaçışdılar...

Şadmanlı təəssüfləndi:

– Yaramazlar! Atalarından bixəbər, küçə törəmələri! Cəmiyyətdə bir balaca nisbi boşluq, daxili çaxnaşma yaranan kimi, parazitlər baş qaldırırlar. Kökləri bir yolluq kəsilmir ki, kəsilmir!

– Pərpətöyün toxumudurlar da, Şakir müəllim. Münbit şəraitdə tez cücərirlər!

Şadmanlı torbaya göz yetirib ciddi maraqlandı:

– Məbləğ çoxmu böyükdü?

Əfsun duruxdu.

– Hesabını apara bilməmişəm. Ona vaxtım olmayıb... Zənnimcə, bir neçə milyon var.

Şadmanlı lap şadlandı.

– Halal olsun sənə, Zamanlı! Etimadımızı lazımından artıq doğruldursan. Komitəmizə gör nə qədər xeyir, necə başucalığı gətirirsən! İqtisadi vəziyyətimizin bu ağır durumunda “qaçqın-köçkünlər” fondumuza böyük köməklikdir. Çox sağ ol!

Əfsun ədəblə ayağa qalxıb, baş əydi.

– Dəyməz, Şakir müəllim. Bu etimadları doğrulda bilməyimdə şəxsən sizə minnətdaram. Çünki belə imkanı mənə siz yaratdınız. Siz alicənablıq, həssas yazıçı qayğısı göstərib həyatın əzdiyi bir kimsəsizə əl tutdunuz, himayədarlıq elədiniz. Siz olmasaydınız, kim bilir, indi haralarda səfil-səfil veyillənərdim... O yaman hallara düşsəydim vətənimizə, cəmiyyətimizə belə xidmətləri etməyi bacarmazdım. Odur ki, az-çox elədiklərim sizin sayənizdədir.

Şakir Şadmanlı xoş sözləri səmimi qəbul etdi. Əfsunun üz cızıqlarına məhrəm nəzər saldı.

– Yaraların çox incidirsə, həkimimizi çağırtdırım, dava-dərman eləsin.

Əfsun təşəkkür bildirdi:

– Lazım deyil, Şakir müəllim. Narahat olmayın. Kirayədə qaldığım evin sahibəsi gecə dava-dərman elədi, yaraların hovunu aldı. Daha qorxusu yoxdu.

Şadmanlı başqa narahatlığına da aydınlıq istədi:

– Sənin bu hərəkətin, təkrar eləyirəm, yüksək təqdirə layiqdi. Hamıya nümunədi. Ancaq... bir şey mənə qaranlıqdı. O pulları nə üçün mənim yanıma gətiribsən? Axı, belə işlərlə məşğul olan şöbə mövcuddur. Savadlı finansistlərimiz var.

Əfsun bir an belə fikirləşmədi. Gülümsünə-gülümsünə cavab verdi:

– Bunun da səbəbi bayaq dediklərimdi, Şakir müəllim. Bizim idarədə ən çox ürək qızdırdığım, inandığım şəxs sizsiniz. Mənim kumirim, himayədarım olmaqla yanaşı, böyük yazıçısınız. Heç nədə tamahı olmayan insansınız. Komitəmizin sədri, çox hörmətli Məsim Müslümoviç də, duyuram ki, hamıdan artıq sizə bel bağlayır. İstədim ki, məsələdən sizin xəbəriniz olsun, öz gözünüzlə görəsiniz. Komitəmizin adamlarını hələ yaxşı tanımıram. Birdən nə olar, nə keçər, üzüqara qalaram. Döyülməyim, sir-sifətimin biabırçı hala salınması mənə havayı dərd olar.

Şadmanlı səbəbi bəyəndi, təqdir elədi:

– Düz hərəkətdi, Zamanlı. Ağıllı oğlansan, – deyib daxili telefonla baş mühasibi yanına çağırdı.

Mühasib aradan bir az keçmiş hüzurda müntəzir dayandı.

– Sizi eşidirəm, Şakir Şahvələdoviç.

Şadmanlı barmağını fəxarətlə irəli – qapı küncündəki kağız torbaya uzatdı.

– Bax, o kisənin içindəkilər könüllü xalq yardımıdı. Yəni böyük məbləğdə puldur. Camaatımız balalarının boğazından kəsib, yetim-yesirlərimizə yardım eləyiblər. Fondumuz üçün qiymətli sərmayədi. Cibi dolu, maddi imkanları bitib-tükənməsin səxavətli millətimizin. Dövlətimizdən heç nəyini əsirgəmir. Hökumətinin keşiyində mərd durur. Onun həmişəyaşarlığı uğrunda, yeri gələndə madar oğullarından, qeyrətli qızlarından keçir. Bu xalq həm də dərdi, faciəni dəyanətlə qarşılamağı bacarır. Təcavüzlər qabağında sınmır, əzilmir. Qəddini tarixin bütün zamanlarında şax tutub. Yadelli qəsbkarlara ağla-sıtqa ilə təslim olmayıb. Necə sev-

məyəsən, vurğunu olmayasan belə xalqın?!

Baş mühasiblə Əfsun bir ağızdan hay basdılar:

– Vurğun olmamaq mümkünsüzdür!

Şadmanlı, şad-şad əlavə etdi:

– Bəli, doğru deyirsiz, mümkünsüzdür! Və mən Zamanlıya xüsusi razılığımı çatdırıram. Üzü ağ olsun, əziyyətə qatlaşıb. Quldurlar, qabaqkəsən zibilçələr tərəfindən döyülsə də, ciddi zərbələr alsa da, böyük fədakarlıq göstərib. Xalq yardımını tələfatsız-filansız komitəmizə çatdırıb. Fondumuzu bir qədər də zənginləşdirib. Hə, nə isə, götürün o əmanəti aparın, maliyyə şöbəsinin iştirakı ilə sayın, rəsmi qaydada təhvil-təslim edib, sənədləşdirin. Bu sənəd nə vaxtsa lazım ola bilər.

Baş mühasiblə Əfsun pul torbasını köməkli götürüb gedəndə, Şadmanlı onlara iftixarla eşitdirdi:

– Məsim Müslümoviçə bu barədə necə lazımdı məruzə edəcəm. Fondumuza xalq tərəfindən könüllü kömək çox mühüm faktordur. Millətimizin sovet quruluşuna hüdudsuz sevgisinin rəmzidi. Şübhəm yoxdur ki, Məsim Müslümoviç bundan əlahiddə məmnunluq duyacaq. Bizim sədr tütyə rəhbərlərdəndir. Özü yanımızda deyil, Allahı yanımızdadı. Üstümüzdən əskik olmasın!

...Elə həmin gün Qarabağa Yardım Komitəsinin əməkdaşları arasına Əfsun Zamanlının yeni qəhrəmanlıq sərgüzəşti yayıldı...

## 20.

Təhvil-təslim uzun çəkdi. Əfsun yoruldu, işin gerisini baş mühasibin öhdəsinə atıb, nahar fasiləsinə yollandı. Nəyinə gərəkdi kağız-kuğuzla əlləşsin? Öz yükünü gen-bol tutmuşdu. Ciblərindəki, çamadanındakı bir yana, kiçik torbadakı iri əsginaslar ölüsünə də bəs idi, dirisinə də. Ən mühüm məsələ də bu idi ki, mənimsədiyi pulların üstü açılmamışdı. Heç kəsdə şəkk-şübhə doğurmamışdı. Rəhbərlik nəzərində bir az da ucalmışdı. İndən belənin məsuliyyətini daşımırdı. Bacarırlarsa, səriştələri çatırsa, qoy onlar da bəhrələnsinlər. Varlığa nə darlıq?!

O, komitə binasından iti addımlarla çıxdı. Heç yanda əylənmədi. Sanki kim isə, hansı məsələ üçünsə saxlayacağından ehtiyatlanırdı. Yaxınlıqdakı qəlyanaltıya da nəzər salmadı. Kön-

lündən keçdi ki, ən yaxşı restoranlardan birinin qapısını açsın. Kəmərinin altını ləziz-ləziz yeməklərlə bərkitsin. Neçə illər idi naz-nemətlərə tamarzı qalmışdı. Həbsxanada onlar üçün çox darıxmışdı. Tələbəlikdəki kef-damaqlarını həsrətlə, ağzı sulana-sulana xatırlamışdı. Daha o həsrətlər, burunucu göynədən darıxmalar arxada, uzaqda qalmışdı. Budur, maddi imkanları yenə aşıb-daşırdı. Əvvəlkilərdən qat-qat artıq, qorxusuz və təhlükəsiz!

Qayıdıb Fəridi də özünə yoldaş eləmək istədi. Təklik cansıxıcı olardı. Lakin fikrindən tez daşındı. Düşündü ki, Fəriddən ona kef-damaq yoldaşı olmayacaq. Nə toyda oynayandandı, nə yasda ağlayandan. Araya ixtilaf qatıb, kefinə soğan doğrayacaq. Qoy rədd olsun!

O, yoluna davam edə-edə tanıdığı, vaxtilə qapılarını tez-tez açıb-örtdüyü məşhur restoranları xəyalında dolandırdı. Hansına getsin? Babatına, ya dəbdəbəlisinə?

Ciblərinə ağırlıq salan pullar onu dəbdəbəyə çəkdi: “Kefə adam kimi baxmaq lazımdı. Ucuz ətin şorbası olmur. Pul xərcləyəndə gərək əlasına xərcləyəsən. Elə kefə baxasan ki, dadı damağından getməsin. Kənardan sənə göz qoyanlar qibtə eləsinlər. Xəsislik, simiclik göstərmək axmaqlıqdı. Bir də axı, pul məni qazanmayıb, mən onu qazanmışam. Həyatı yüksək səviyyədə yaşamalıyam!..”

Götür-qoyu uzun sürmədi. Vaxtı ilə çox bəyəndiyi, ən geci həftədə iki-üç dəfə qonağı olduğu “Azərbaycan” mehmanxanasının “Xrustal” restoranını seçdi. Buranın həm gözoxşayan bər-bəzəyi, həm də yeməkləri digər restoranlardan fərqlənirdi. Şəhərin ən hörmətli, say-seçmə sakinləri “Xrustal”a axışırdılar. Ad günlərini, başqa şənliklərini burada keçirirdilər. Əyləncə, “xoş ovqat” həvəskarı qız-gəlinlər, “gecə quşları” da ən çox bu restoranın həndəvərində fırlanırdılar. Güman gətirdi ki, o cavanəzənlərdən bir babatı bəlkə rastına çıxar, tək qalıb xiffətlənməz. Tamaşadan umduğu həzzi  başqasından alar…

Yol uzaq idi. Taksi əylədi. Onbeş-iyirmi dəqiqəyə özünü restorana yetirdi. “Xrustal”ın dəbdəbəsi, səliqə-sahmanı yenə xoşuna gəldi. Heç nə dəyişməmişdi. Bəzi bəzək-düzəklər təzələnmiş, müasirləşdirilmişdi. İçəri girən kimi “gəl-gəl!” – deyib çağıran şahmatvari düzülmüş üstü gül-çiçəkli masalar könlünü açdı. Belə gözəl

yerdə şən vaxt keçirməyə, iştahlı nahar etməyə, əlbəttə, dəyərdi.

Salona boylandı, əyləşməyə xudmani künc axtardı. Masaların əksəriyyəti boş idi. Axşama çox qaldığından adamlar seyrək nəzərə çarpırdılar. Orda-burda iki bir, üç bir oturmuşdular. Onların da əsas qismi uzaqlardan gəlmiş qonaqlar, evlərində xörək bişirib-düşürəni olmayan subaylar və qocalar idi. Kef çəkməyə, əylənməyə yox, adi qaydada nahara yığışmışdılar. Xüsusi geyimli, döşü önlüklü, qolunun üstü ağ dəsmallı mətbəx qulluqçuları girəcəkdə sıralanıb müştəri gözləyirdilər.

Əfsun dənizə baxan masalardan birini gözaltıladı. Şakəri vardı: uzaqdan dənizi seyr etməyi, küçədən gəlib-keçən qadınlara, qız-gəlinlərə diqqət kəsilməyi sevirdi.

Təzəcə əyləşmişdi ki, mətbəx qulluqçusu hüzurunda hazır dayandı. Əlində tutduğu "xörəklər siyahısı" kitabçasını açıb, nəzakətlə onun önünə qoydu. Sonra da sifariş dəftərcəsini ovcunda sahmanladı. Önlüyünün döş cibindən qələm götürüb sifarişi gözlədi.

Əfsun "xörəklər siyahısı"na həvəssiz göz gəzdirib yana itələdi. Gərşəlib yekəxana əmr etdi:

– Xörək seçməyə hövsələm yoxdur. Restoranınızın firmenni yeməyi hansıdısa, onu gətir. Amma ləngimə, bərk acmışam.

Mətbəx qulluqçusu astaraq soruşdu:

– Təksiniz?

Əfsun qeyri-müəyyən cavab verdi:

– Hələlik təkəm.

– Salat da yeyəcəksiniz?

– Göyərti-filan gərək deyil. Pomidorla xiyar gətir.

Mətbəx qulluqçusu qeydlərini edib, bir qədər ehtiyatla xəbər aldı:

– İçməyə nə gətirim?

Əfsun duruxdu. Dillənincə, böyürdən kim isə gər, xırıltılı səslə:

– Əlbəttə, araq! – dedi. – İçkilərin şahı araqdı. O birilər havayı şeylərdi. Konyak, şərab, viski, şampan dilxoşlux üçündü. Elə-belə məzələnmə içkiləridi. Amma araq məcundu. Əsil kişilər yalnız araq içirlər. Düz demirəm, qardaş?

Əfsun səsə doğru çöndü. Qonşu masada arıq, orta yaşlarında, çəlimsiz bir kişi oturmuşdu. Qırış-qırış üzünü cod saqqal basmışdı.

Qalınqaş tükləri pırpızlanıb gözlərinin üstünə sallanmışdı. Saçları da pırtlaşıq idi. Orda-burda saçaqlanıb alnını örtmüşdü. Qabağında tam yetişməmiş pomidor salatı, quru pendir, bir tikə qara çörək və iki yüz əlli qramlıq araq şüşəsi vardı. Şüşədəki araq sıfqarılmışdı. Adi stəkandakı da yarıdan aşağı idi.

Əfsun gözünü ondan tez çəkdi. Qaşqabağını turşudub araq və mineral su sifariş verdi:

– Amma yerli araqlardan olmasın, Moskva istehsalı olsun.

Qonşu masadakı kişi heykirti ilə təqdir etdi:

– Tamamilə haqlısız, qardaş! Yerli araqlar geydirmədi, içirsən, ləzzət eləmir. Spirtinin təsiri azdı. Tamı da yaxşı deyil, zəqqutun dadıyır. Rus arağı isə başqa məsələ. Tayı-bərabəri yoxdu. Düz beyinə işləyir.

Əfsun ona baş qoşmadı. Bilirdi ki, üz versə, astar da istəyəcək. Ürəyində deyindi: "Qır-saqqızım çatmırdı!.. Bu qəmiş hardan peyda oldu?!.. Kefimə soğan doğrayacaq. Vaxtında yerimi dəyişsəm yaxşıdı".

O, durmaq istədiyi məqamda, mətbəx xidmətçisi qucağı dolu gəldi. Yer dəyişməyə macal qalmadı. Süfrəyə düzülən qəlyanaltılar və bəzəkli kasada buğlanan xörək ona narahatçılığını unutdurdu. Dərhal yeməyə girişdi. Mətbəx qulluqçusunun balaca qədəhə süzdüyü arağa isə hələ toxunmadı. Boş bağırsaqları araqla qıcıqlandırmağa adətkar deyildi.

Masa  qonşusu onu yenə rahatsız etdi:

– Matahı niyə soyudursan, qardaş? Tez vur bədənə ki, iştah üstündən iştah gətirsin. Zaya döndərmə "ceyran südünü", hayıfdı!

Əfsun bu dəfə də dinmədi, işində oldu.

"Qonşu" üz verilməsə də üzünə salıb əlində yarımçıq araq stəkanı ilə o masadan bu masaya adladı. Altına stul çəkib ərkyana əyləşdi. Əfsuna diqqətlə baxıb güldü.

– Hi-hi-hi... üzünü pişik cırmaqlayıb?

Əfsun əsəbi soruşdu:

– Nə pişik, nə cırmaq?!

"Qonşu" gülməyinə davam etdi:

– Hi-hi-hi... acığın niyə tutur, qardaş? Mənim bir pişiyim var, adı "Pələng"di. Elə pələngə də oxşayır. Özüm qoymuşam bu adı ona. Gecələr yanımda yatır. Bir dəfə yuxulu-yuxulu quyruğunu

basmışdım, üzümü sizinki kimi iki-üç yerdən cırmaqladı...

Əfsun sərt və hövsələsiz:

– Mən pişik saxlamıram! Ondan zəhləm gedir, – dedi.

– Çox nahaq! – "Qonşu" narazılıqla yırğalandı. – Pişik ev heyvanları içində insana ən mehribanıdı. Həm də yazıqdı. Yazıqlara rəhmli olmaq Allaha xoş gedir.

Əfsun cinləndi. Bilmədi bu "ənzəli qəmişi"ndən necə xilas olsun. İstədi acı sözlərlə qovsun. "Qonşu" macal vermədi:

– Bağışla, qardaş, quşum qonub sənə. Hal əhlinə oxşayırsan. Yanına təşrif buyurdum ki, söhbət eləyək...

Əfsun onun "sən" ifadəsinə keçməsindən acığı tutdu, sözünü qəzəblə kəsdi:

– Söhbətə mənim vaxtım yoxdu. Qayıdın yerinizə. Qulluqçuya deyərəm sizə də xörək gətirər. Mənim istirahətimi pozmayın!

"Qonşu" dərin-dərin köks ötürdü.

– Eeh, qardaş, məni düzgün başa düşmədin... Elə bilirsən, onun-bunun hesabına qarın otaranlardanam, restoranlar siçovullarındanam, yox, ey, yox!.. – O, gözlərini bir neçə anlığa yumdu. Daxili yanğı ilə dərdini açdı: – Haqqımda yanlış fikirdəsən. Mən içki düşkünü, yemək acı deyiləm, söhbət acıyam. Dərd anlayan, qəmə ürək yandıran insan oğlu axtarıram. Elə insan ki, ciyərlərimi oda tutub alışdıran fərağımı bölüşdürüb, bir azacıq sakitləşim. İndicə ərz elədim ki, hal əhlinə oxşayırsan. Bəlkə mən axtaran adamsan?

Əfsun başını aşağı salıb heç nə demədi. Çəngəl-bıçağı qeyzlə cingildədərək, yeməyindən qalmadı ki, çərənçi "qonşu" çərənləmələrini qurtarıb, yaxasından əl çəksin.

"Qonşu" bu susqunluğa məhəl qoymadı. Hərdən tövşüyüb, hərdən də içini çəkərək, həzin-həzin davam etdi:

– Bu viranxana zəmanədə ürək qızdırıb sirr açası, dərd danışası Allah bəndəsi qəhətə çəkilib. Hamı bir-birindən qorxur, hürkür, şübhələnir. Heç kəs heç kəsə etibar eləmir. İcazə versən, bir az söhbətləşərdik. Yenə deyirəm, boğazortağı olmayacam sənə, yeməyə ehtiyacım yoxdur. Ümumiyyətlə, qarınqulu adam deyiləm. Əl boyda çörəklə bir tikə pendir, bir də azacıq pomidor-xiyar salatı bəs eləyir mənə. Çox vaxt heç onları da meylim çəkmir. Odur, əldəyməmiş

qalıb orda. Bir hal əhli, qəm yoldaşı istəyirəm, vəssalam.

Əfsun yeməyini dayandırdı. "Qonşu"nun adi əyyaş danışığına bənzəməyən sözləri onda birdən-birə mərhəmət hissi oyatdı. Başını dikəltdi, süfrə arxasında büzüşmüş "qonşusuna" ciddi diqqət yetirdi, onun qəhərdən nəmlənmiş kirpiklərini, göz çuxurlarında işaran yaşı gördü. Ürəyindən anlaşılmaz ağrı keçdi. "Qonşunun" baxışında da bir qeyri-adilik vardı. Peşəkar əyyaşların boş, sönük baxışlarına bənzəri yox idi, çox ifadəliydi. Ona münasibəti dəyişdi.

– Siz sözlü adama oxşayırsınız... – dedi. – Buyurun, dinləyirəm.

"Qonşu" güclü ah çəkdi.

– Diyəsən, gec də olsa, məni başa düşdün. Başqaları üstümü unlu görüb, adımı dəyirmançı çağırır. Orasını dərk eləmirlər ki, kül altında isti qor yatır... Nə isə, gəl, qabaqca boğazımızı yaşlayaq, sonra keçək əsas mətləblərə. Etiraz eləmirsən?

– Xeyr. – Əfsun "qonşunun" yarımçıq stəkanına araq süzüb, qədəhini qaldırdı. – Bir az alaqarın oldum, indi boğaz yaşlaya bilərəm.

"Qonşu" stəkanını yerdən götürməyə tələsmədi. Sağ əlini irəli uzatdı:

– Amma gərək etikanı da pozmayaq, tanış olaq. Axı, sən bilmirsən kiminlə həmsöhbətsən. – O, gözlərini azacıq yana çəkdi, bir neçə anlığa susub, özünü təqdim etdi: – Mən Salman Salmanzadəyəm, – dedi və Əfsuna zəndlə baxdı. – Bu ad sənə heç nə demir?

Əfsun əl tutuşub çiynini çəkdi:

– Nə deməlidi?

– Heç eşitməmisən?

– Yox.

– Bəyəm televizora baxmırsan?.. Teatra getmirsən?

– Əvvəllərdə hərdənbir getmişəm.

– Əh, hərdənbir... əcəb oğlandı bu! – "Qonşu"nun nəzərləri çəpləndi, ağzı əyildi. – Nə sənətin sahibisən?

– İqtisadçıyam.

"Qonşu" dodaq büzdü. İncikliklə mızıldandı:

– Hımm... iqtisadçı!.. Mədəniyyət korafəhmləri! Xətrinə dəyməsin, siz iqtisadçılar bir az quru adamlarsınız. Mədəni həyatdan, mənəvi aləmdən uzaqsınız. İşiniz-peşəniz pul saymaq, gəlir-çıxar hesablamaqdı. Ayrı zövqü-səfa bilmirsiniz.

Əfsun etiraza hazırlaşdı. “Qonşu” işarə ilə onu saxladı:

– Amma aranızda tək-tük şəxs tapılır ki, mədəni aləmlə ayaqlaşmağı bacarır. Ədəbiyyat, musiqi, incəsənətlə aşnalıq eləyə bilir. Məsələn, biri elə mənim qapıbir qonşum professor Cəmil İmanlı. Canlara dəyən kişidi. Mükəmməl biliyə sahibdi. Hər şeydən xəbərdardı. Həm də mərd, məğrurdu, əyilməzdi, sözü üzə deyəndi. Heyf ki, qədri bilinmir. Beyni mayıflar onu gözümçıxdıya saldılar, şərlədilər. Əclaf bir gədəni, lotu-bambılını öyrədib üzünə qoydular. Guya rüşvətxordu... Professorluğunu, elmi rütbələrini əlindən aldılar, yaman günlərə qoydular, məni kimi...

Əfsun ünvanına söylənən təhqiramiz sözlərdən qovşuruldu. “Qonşu” yarımçıq təqdimatını öyüncəkliklə tamamladı:

– Mən artistəm. Neçə-neçə məşhur tamaşanın baş rollarında oynamışam. Əməkdar incəsənət xadimiyəm. Teatr sənətinin tanınmış simalarından biriyəm.

Əfsun, yeri gəlmişkən, bayaqkı təhqirə əvəz üçün “qonşu”nun kasıb geyiminə, yazıq halına eyham vurdu:

– Bəs onda niyə bu görkəmdəsiniz? Mən bilən, artistlər, rəssamlar, kino işçiləri geyim-kecimə xüsusi fikir verirlər. Hamıdan fərqlənməyə çalışırlar.

– Hə, düzdü, çalışırlar... – Artist çeçədi. Dərd yanğısı dilini qarsıdı. – Deməli, sən də üstümü unlu gördün... min təəssüf!.. Bu dünyanın üzü dönükdü. Şair demişkən, dünən dövran sürən bu gün can verir. Vaxt vardı, Salman Salmanzadə küçəyə çıxanda hamı ona həsədlə baxırdı. Zövqlə, son dəblə geyinənlərin biri də o idi. İndi it günündədi...

– Görünür, qədərindən artıq içirsiniz. Arağa doyumsuzluq salıb sizi bu hala?

– Heç də elə deyil, yanlış təsəvvürdü! – Artist az qala heykirdi. – Məni yaman günə qoyan xain, xəbis, paxıl, vicdansız insanlardı. Beyni boş, ağlı kəm vəzifəlilərdi. Yüksək rütbəli məmurlardı. Dəmir nəmdən, insan qəmdən pas atır. Araqda günah axtarmaq nahaqdı. İşlərimin cağbacağ vaxtları içkiyə həvəsim yox dərəcəsindəydi. Toylarda, nişanlarda, ad günlərində, dost-tanış şənliklərində dilimə az miqdarda vururdum. Amma könlümə yatmayan

məclisdən uzaq qaçırdım.

Əfsun da özünü haqqı tapdanmışlar, bədxahlar tərəfindən zərbə almışlar qismində nəzərə çarpdırdı.

– Yaxşı başa düşürəm sizi. O müsibətlər bir az başqa şəkildə mənim də başıma gətirilib. Ürəyinizi sıxmayın, keçib gedər.

Artist qeyz-qəzəblə başını buladı.

– Eh, qardaş çətin zəmanədi. Bizim bu sovet cəmiyyəti düzələn deyil. Sözdə ali humanizmdən, insana bol qayğıdan dəm vururlar. Əslində isə dara düşəni itələyib dərənin dibinə kəlləmayallaq salırlar. Hələ nə yaxşı ki, tək-tük dərd əhliləri, sənətkarlara canıyananlar qalıb. Bu restoranın müdiri onlardan biridi, canlara dəyən adamdı. Orta məktəbi birlikdə bitirmişik. Məni himayəyə götürüb. Hərdən gəlirəm, yemək-işməyimi müftə verdirir. Ailə dolanışığı xərclərini isə gedib toylarda tamadalıq eləməklə birtəhər qazanıram. Buna da min şükür, tamam nəzərdən düşməmişəm. Sənətkar hörmətini uca tutanlar az-çox var.

Əfsun təsəlli üçün artistin qoltuğunun altını şişirtdi:

– Xalq məhəbbəti hər sənətkara nəsib olmur. Döşü orden-medallarla dolu, yüksək fəxri adlar almışların çoxunu xalq bəyənmir. O, hər şeyi aydın görür, seçimini düzgün edir. Nahaq demirlər ki, xalqın gözü tərəzidi.

Artistin qıyıq, yanları qırış-qırış gözləri böyüdü. Heyranlıqdan emosiyasını cilovlaya bilmədi:

– Ooo!.. Nə qədər ulu söz!.. Nə qədər məntiqli ifadə, dahiyanə qiymət!! – O, harada olduğunu unudub (bəlkə də özünü səhnədə hiss edib) bar-bar bağırırdı. – Sən, deyəsən, gündüzün günorta çağı çıraqla axtarılan tütyə adamlardansan. Sənət və sənətkar qiymətini dərindən bilənlərdənsən. Eşq olsun sənə!

Əfsun artisti özündən çıxartdığından daxilən sevinsə də, səsi qulağına düşdü. Sakitliyə çağırdı:

– Həyəcanlanmayın, – dedi, – bir az asta danışın. Başqalarına mane olmayaq.

Artist qolunu etinasızlıqla yana qovzadı. Daha emosionallıqla:

– Necə həyəcanlanmayım, qardaş! Elə incə, elə həssas nöqtəyə toxundun ki, bütün hiss və duyğularım oyandı. İcazə ver gəlim

bütün incəsənət xadimlərinin ağzı ilə öpüm səni.

Əfsun etiraza macal tapmadı. Artist bir sıçrayışla onun boynuna sarılıb, hər iki üzündən marçıltı ilə öpdü.

– Sən həqiqi sənət xiridarı təsiri bağışladın mənə. Bayaqdan ürəyim pencər təkin sıxılırdı. Allahdan yaxşı bir söhbət yoldaşı diləyirdim. Mən bilən, çatdım arzuma.

Əfsun artistdən yeni söz çəkməyə çalışdı:

– Deyilənə görə, siz tayfanın – artist zümrəsinin adamları təkliyi xoşlayırlar. Özlərinə qapılmaq onlarda adətdir. Həmişəmi belədi?

– Əslində doğru deyirlər. El ağzı faldı, yanlışı olur, yalanı olmur. Bu xasiyyət sənət adamlarının hamısına xasdı. Şair olsun, yazıçı olsun, bəstəkar, rəssam və qeyriləri olsun, tənhalığı sevirlər. Fikir-düşüncə onlara ən sadiq yoldaşdı. Xəyallarında nələri isə hey götür-qoy eləyir; düşünüb-danışırlar. Ancaq mənim hal-hazırkı təklənməyim ondan deyil, bir yaxşı dostum üçün darıxırdım... Heyf, çox heyf ondan!

– Nə üçün heyf? Bəyəm, bir hadisə olub?

– Hüü... hü... hü! – Artist hönkürdü. – O, yoxdu daha. Öz xoşu ilə köçdü bu fani dünyadan.

– Necə yəni öz xoşu ilə?

– O cürə ki... – Artist hönkürtüsünü birdən-birə kəsdi. – Canını qurtardı pis adamların, əclaf zəmanənin üzündən!

– İntihar etdi?

– Ülgüclə venasını kəsdi.

– Həəə?! Allah rəhmət eləsin! Səbəb nə oldu?

– Axx! – Artist yumruğunu düyüb masaya çırpdı. – Acıq elədi bu zəmanəyə, onun ədalətsizliyinə! Çox böyük istedada malik kinorejissoru idi. Təzə, əsl sənət nümunəsi olan film çəkmişdi. “İnsaf naminə” adlanırdı. Mövcud cəmiyyətin qüsurlarından danışırdı. Vəzifəli şəxslərin rüşvətxorluğundan, məmur azğınlığını, süründürməçiliklərini qamçılayırdı. İstedadsız həmkarlar, quruluş məddahları hay-küy qaldırdılar. Binəvanı böhtançılıqda, antisovetizmdə günahlandırdılar. Filmi bağlatdılar, özünü də işdən kənarlaşdırdılar... O cürə böyük istedadın, kino dahisinin taleyi ilə heç maraqlanan olmadı. Niyə belə daşürəkli, insafsız, mürvətsizdi

bu adamlar? Səbəbini bəlkə sən bilərsən?!

Əfsun çiynini çəkdi.

– Nə deyim?.. Mənim bilgim də elə sizinki qədərdi.

– Off!.. – Artist yumruğunu bu dəfə sinəsinə endirdi. – Çox yaramaz bir əyyamda yaşayırıq. Gərəkli insanların qədir-qiyməti bilinmir. Dəyərli insan öldü, ya bir çibin, fərq qoyulmur. Bütün günahlar da yalnız quruluşun özündədi! Ciyərim odsuz-ocaqsız alışıb yanır...

O, barmaqlarını araqla dolu qədəhinə toxundurdu, aramla qaldırdı. Çətin bir işə girişmiş kimi, kirpiklərini çəpərləyib arağı sümürə-sümürə içdi və salat qabından duzlu xiyar götürdü, gəmirə-gəmirə gülümsündü.

– El arasında nahaq demirlər ki, pazı pazla çıxardırlar. Spirt odu ciyərimin o biri alovunu öləzitdi. İndi öz söhbətimizə davam eləyə bilərik... Sənə doğru-düzgün nə cürə müraciət eləyim?.. "Müəllim", "yoldaş" deyim, ya təzə qayda ilə "bəy" deyim?

Əfsun yekəxanalandı:

– Hansı müraciət dilinizə daha çox yatır, onu da deyin.

Artist fikirləşdi.

– Mənim qənaətimcə, ən səmimisi elə "qardaş"dı. İncimirsən?

– Əsla.

– Çox pakizə! – Artist məmnunluqla burnunu çəkdi. – Məsəl var, qardaş, dəvəçi ilə dost olanın darvazası gen gərək. Artist tayfası da dəvəçi kimi bir şeydi. Bizimlə yaxınlıq eləyənlərin səbri, hövsələsi geniş olmalıdı. Söz-söhbətə marağı tükənməməlidi. Gap-gələcidən bezməməlidi. Niyə? Ondan ötrü ki, qardaş, sənətimiz söz sənətidi. Toyuq dəndiyinə dən yığan təkin biz də çinədanımıza söz yığırıq. Odur ki, gəl, məclisimizi soyutmayaq. Bir süfrə arxasında iki nəfər oturdu, ya iyirmi, otuz və hakəzə əyləşdi, fərq eləmir, məclis sayılır. Bu məclisimizin də masabəyiliyini çəkirəm öz öhdəmə. Sağlığına, bayaq ərz elədim, masabəyiliyi pis bacarmıram. İstəyirəm bu badələrimizi, elə bəri başdan içək şəxsən sənin şərəfinə. Nə üçün məhz sənin? Ona görə ki, məni təklik cəfasından qurtardın. Tənhalıq xiffətini axıracan çəkməyə qoymadın. Sənin simanda mədəni, həssas qəlbli, mötəbər bir oğlan

görürəm. Mötəbərliyini nədən bilirəm? Rəftarından! Bir də zavallı, taleyi kəm, amma böyük istedad sahibi rejissor dostumun həyatda yoxluğuna ürəkdən acımağından. Bir daha sənin şərəfinə!

Artist araq qismətini bu dəfə orduna doldurub, bir uduma içdi. Nəfəsini ovcuna hovxurdu, burnunu ovuşdurdu. Ağzına bir tikə çörəklə bir dişdəm xiyar turşusu atdı. Çeynəyə-çeynəyə stəkanına arağı özü tökdü və onu yalnız indi Əfsunun badəsinə toxundurdu.

– Bayaqkı siftə idi, qardaş. Onu ekspromtom içəri addatmaq lazım idi. Bunu isə qanun-qayda ilə verəcəm həzmə. Mənim adətimdi, ürəyimdən gələn sağlığı iki dəfəyə qeyd edirəm.

O, stəkanını eyni üsulla boşaltdı. Yeməyə həvəslə girişdi.

– Bu ceyran südündə, – arağı nişan verdi, – özgə hikmət var, qardaş. Ölünü dirildir, iştahsızı iştaha gətirir. Bir az əvvəl heç nəyə meylim yox idi. İndi ac canavara dönmüşəm. Xörək də əladı. Yaxşı zövqün var, yemək seçimini də bəyəndim, çox dadlıdı. Neçə vaxtdı belə yemək yemirdim.

– Nuş olsun! – Əfsun özündən razı dilləndi. – Kəmərinizin altını möhkəm bərkidin. Atalar demişkən, yaxşı xörək qalınca, yaman qarın cırılsın.

– Hı, hı... – Artist ordu dolu olduğu üçün dinə bilmədi. Yeyin-yeyin başını tərpətdi.

Bir müddət sükut çökdü. Çəngəl-bıçaq cingiltilərinin, şirin marçıltıların arası xeyli kəsilmədi. Fasilə bitəndə, artist dodaqlarını silib dala çəkildi, söhbəti təzələdi:

– Belə-belə işlər, qardaş, belə-belə işlər! İnsan çox mürəkkəb məxluqdu. Onu bir-iki dəfə görməklə, söhbətə çəkməklə, süfrə yoldaşı olmaqla nə yuvanın quşu olduğunu dəqiqləşdirmək çətindi. Gərək uzun yol yoldaşlığı eləyib, pudlarla çörək kəsəsən ki, kimliyini az-çox öyrənəsən. Soruşurlar: qardaşın nə cür adamdı, deyir: yoldaşlıq eləməmişəm.

O, sözünü bu yerdə xırp kəsdi. Əfsunun gözlərinin içinə tamam başqa tərzdə baxdı. İçki öz təsirini göstərmişdi. İçinin mənlik hikkəsi bala-bala baş qaldırırdı. Cilovsuz hisslər dilinin idarə kilidini tezliklə qırdı:

– Çox ola bilsin ki, sən heç də mənim düşündüyüm adam de-

yilsən. Hər hansı bir bəni-insanın cikinə-bikinə bələdlik üçün günlər yox, həftələr, aylar, bəzən də illər gərəkdi. Düzgün rəy söyləməyə isbatlı faktlar, dəlil-sübutlar olmalıdı. İlk təəssüratlar əksər halda aldadıcı mahiyyət daşıyır. Bilinmir sözünün ağasıdı, ya nökəri. Kişidi, ya nakişi. Haşa bizdən, oğraşın, əclafın, qurumsağın yekəsidi...

Artist yenə ara verdi. Qəfil mürgü tutmuş kimi, gözlərini yumub sakit dayandı. Sonra bir gözünü açıb, Əfsuna zillədi. Aramla davam etdi: – Həqiqət belədi, qardaş, incimə məndən. Mən təmiz adamam. Riyakarlığı, üzdə bir söz, dalda da başqa söz deməyi sevmirəm. Ürəyimdəki dilimdədi... hə, qoy burasını da sənə ərz eləyim. Birdən elə bilərsən, ağzımdan çıxan kəlamlar hansısa bir pyesdən, oynadığım roldandır. Xeyr, hamısı öz qənaətimin, həyat təcrübəmin məhsuludu. Bəlkə də sən məni boğaz otaran artistlərdən, istedadsız əyyaşlardan sayırsan? Zəndini yanıltma, mən elə sümsüklərdən deyiləm. Adbatıran elə həmkarlarıma dərin nifrətim var... Yeri gəlmişkən, öz barəmdə əlavə məlumat verim ki, haqqımda doğru təsəvvürün olsun. Mən həqiqi mənada artist babayam. Bu sənətə böyük sevgi, istedadımın gücü ilə qədəm qoymuşam. Bir kəsdən kömək umub, bir kəsə sığınmamışam. Əldə neyləmişəmsə, nəyə nail olmuşamsa öz gücümə, bacarığıma minnətdaram. Ucuz şöhrət, rütbə, vəzifə həvəsinə düşməmişəm. Bunlar üçün kimlərinsə saqqalı altından keçməyi, yaltaqlıq, məddahlıq eləməyi ar bilmişəm. Mənim ülvi amalım yalnız sənətimlə bağlıdı. Konkret bir misal: çox istərdim Şekspirin "Hamlet" əsərində Hamlet rolunu oynayım. Şillerin "Qaçaqlar" dramında qoca Moorun obrazını yaradım. Hüseyn Cavidin "Şeyx Sənan"ında Şeyxin yeni səhnə təcəssümünü verim. Səməd Vurğunun "Vaqif"ində Ağa Məhəmməd şah Qacar surətini tamam başqa ifada tamaşaçılara çatdırım... Axı, artist böyük rollarda gücünü sınamasa, cilddən-cildə girməsə istedadı paslanır. Səhnədə bir obrazı nə qədər oynayasan? Onun sözlərini nə qədər çeynəyəsən? Saqqız da çox çeynənəndə çürüyür... Ehh, qardaş, murazları gözlərində qalmışlar, murazımı gözümdə qoydular. Qırx altı yaşımda, sənətdə püxtələşən məqamında amansız bədxahlarım, istedadı kəm paxıllar, əclaflar

dəstəsi bütün ümidlərimi alt-üst elədilər...

Əfsun susurdu. Daha heç bir müdaxilə etmədən artistə qulaq asırdı. Çənə sarıdan özündən güclüsünə rast gəlmişdi.

Artist həyəcandan köpüklənmiş ağzının yanlarını barmaqlarının ucları ilə təmizləyib, yeni qızğınlıqla davam etdi:

– Burası da var ki, heç bir şey əsassız olmur. Nə idi əsasım? Mənim ağa ağ, qaraya qara deməyim; həqiqətə göz yummağı bacarmamağım; nöqsanı üzə çırpmağım... Akademik dram teatrının başıboş, karyerist, vücudu bir qara qəpiyə dəyməyən direktoru ilə rəqabətimiz! Onun repertuar seçimini bəyənmirdim, yeniləşmə, zamanla ayaqlaşma tələb edirdim. Zəif əsərlərin nəyinsə xatirinə tamaşaya qoyulmasının əleyhinə çıxırdım. Artistlərin tərəfgirliklə bölünməsinə əks gedirdim. Haqqı tapdananların müdafiəsinə qalxırdım. Əlaqədar təşkilat rəhbərləri məni düzgün anlamırdılar. Direktorun yerinə keçməyə çalışdığımı güman eləyirdilər. Maymaq direktorun tərəfini saxlayırdılar. Axırda birləşib mitilimi teatrdan atdılar bayıra. Müqəddəs məbədgah saydığım o yerdən ayağımı tamam kəsdilər. İntriqabazlığı boynuma yoğurub-yapdılar. Hara şikayətə getdimsə, bir nəticə vermədi. Bürokrat məmurlar məni donuq üzlə qarşıladılar. Aylarla süründürdülər. Boş get-gəllərdən, boz üzlər görməkdən bezikib, hər şeyə tüpürdüm. İdealımdan əl çəkdim. İndi toylara, ad günlərinə ayaq döyüb, boğaz yırtıb, çörəkpulu qazanıram. Neyləyəsən? Kimə arxalanasan? Sidqini nəyə bağlayasan? Mövcud elitamız da məqbul elita deyil. Ziyalı qədrini ilk növbədə ziyalı bilməlidi. Haqsızlıqlardan bir-birini qorumalıdı. Lazım gələndə, iqtidar nümayəndələri ilə döş-döşə durmalıdı. Onlarla kəlləşməkdən çəkinməməlidi. Belə olardısa, haqq-ədalət mizan-tərəzisi pozulmazdı. Cəmiyyət normal inkişaf eləyərdi. Mənəvi aşınmalar bu dərəcəyə çatmazdı. Min-min təəssüflər ki, hər kəs yalnız öz başının çibinini qoruyur. Bir çoxumuz da yaltaqlığa, məddahlığa qurşanmışıq. Haşa burdan, yala hürürük. Bu, dəhşətdi! Elitar adını daşıyanlar mənən yüksəkdə durmalıdırlar. Xırdalanmamalıdırlar. Hakimiyyətdəkilərin çaldığı hər havaya qol götürüb şıdırğı oynamamalıdırlar... Bir az bundan qabaq bir siyasi yığıncaqda iştirak eləyirdim.

Utandım, ətim töküldü, başım yerə girdi. Elə adamlar xitabət kürsüsünə qalxıb, şərəfsiz nitq söyləyirdilər, ayağım döşəməyə yapışırdı. Tanıyıram onları, lap yaxşı tanıyıram. Dabbağda gönlərinə bələdəm. Bir zamanlar Sovet quruluşunu – sosializmi bol-bol tərifləyib mükafatlar, ordenlər, fəxri adlar almaq üçün dəridən-qabıqdan çıxırdılar. İndi də onun əleyhinə danışırlar, canfəşanlıq göstərirlər. Hanı vicdan?! Hanı abır-həya?! Hanı utanan üz?! O irsizləri, ar-namus satqınlarını nə üçün ora buraxırlar? Soruşuram nə üçün? Axı, belələri xalqın haqq işini ləkələyirlər, yüksək amalı xələldar eləyirlər. İdeal mübarizəni murdarlayırlar!

Əfsun başını aşağı saldı. Sifəti tez-tez tutulub-açıldı. Artistdən yaxa qurtarmağı düşündü. Lakin buna ehtiyac qalmadı. Artist bu arada kiminləsə salamlaşdı. Əllərini başı üzərində birləşdirib, ehtiram nişanəsi olaraq möhkəm silkələdi. Ayağa qalxıb üzr istədi:

– Məxləs, qardaş, dərdimiz böyükdü, danışmaqnan tükənən deyil. Üzrlü hesab elə məni, tanışlarım çağırırlar. Gedim bir az da onlarla əngə verim. Amma bir ricam var: bəzi sözlərimdən incimə. Artist babayam. Ola bilsin, acı dilim hardasa səni də sancdı. Cavansan məndən, keç günahımdan... Dünya işidi, mənə dair bir buyruğun olsa, qulluğunda hazıram. Di, sağ ol, gələn görüşlərə qədər!

## 21.

Axşama çox vardı. Restoranı dilxor tərk etmiş Əfsun evə belə tezliklə qayıtmaq istəmədi. Gedib Tamaşanı ya evdə tapmayacaqdı, ya da nənəsinin otağında qapını arxadan bağlayıb, dərsə hazırlaşan görəcəkdi. İş yerinə ayaq basması da məsləhət deyildi. İçkili vəziyyətdə əməkdaşlar arasında hərlənsə, xətir-hörmətinə xələl gələrdi. Bəs neyləsin?

Xeyli düşünüb, başqa restoran qapısı açmağa, vaxtını bir az da orda keçirməyə qərar verdi. Soğan çərtilmiş kefini durultmağı, Tamaşa ilə daha xoş əhvalla görüşməyi məqbul saydı. Lakin bu fikrin üstündə də möhkəm durmadı. Qazdan ayıq Qumaş arvadın gözünə sərxoş görünmək işin ziyanına olardı, nənəni duyuq salardı.

Baş sındırdı, beyninə güc verdi, ağıllı bir şey düşünə bilmədi.

Birdən dənizi lap yaxınında gördü. Sevinən kimi oldu. Çoxdan-

dı bu yerlərə ayağı dəymirdi. Təzəliklərdən xəbərsizdi. Tələbəlikdə gəzdiyi, gördüyü yerləri ziyarət edərdi. İlk gənclik xatirələrini yaddaşında çözələyər, əhvalını duruldardı.

Heyhat, bu həvəsi də tezliklə sönüklədi. Ürəyində bayaqdan anlaşılmaz tıqqıltı vardı. Özündə qeyri-müəyyən narahatlıq duyurdu. Yarı yoldan geri döndü. Ayaqları onu çəkib evə gətirdi. Qapını açınca, gözləri alacalandı: çamadanını və başaltı yerində gizlətdiyi pul torbasını astanada gördü. Məsələni dərhal sezdi: Tamaşanın işi idi. Səhərki hadisədən nənəsini hali eləmişdi...

Üstünü vurmamağa çalışdı. Özünü adi qaydada apardı. Hay-küylə salam verdi. Salamı alınmadı. İrəli yerimək istədi. Qumaş arvad ağır qaşqabaqla qabağını kəsdi:

– Sən xörək yediyi qabın içinə tüpürən adamlardansan! Daha burda yer yoxdu sənə. Götür barxanını çıx get!

Əfsun karıxdı. Dili topuq çaldı:

– Nee-cə? Nəə üçün?

Qumaş arvad hökmünü bir az da sərt söylədi:

– Yaxşılıx başa düşən adam döyülsən. Cızıxdan çıxıbsan!

Əfsun boynunu fağır-fağır bükdü.

– Qurban olum, nənə. Bir başa sal görüm neyləmişəm, nə taqsırın sahibiyəm?

– Neylədiyini özün yaxşı bilirsən. Dedim ki, çıx get!

Əfsun Qumaş arvadın yumşalmayacağını yəqinləsə də dil tökməyindən qalmadı:

– Vallah, günahımı başa düşəmmirəm, nənə. Günün axşam vədəsində qovulmağıma ciddi səbəb olacaq qəbahətimi yadıma gətirəmmirəm. Sən, axı, çox rəhmli, nur-ipək nənəsən... Sənə tükənməz hörmətim var.

Qumaş arvad lağlandı:

– Gördük hörmətini, başına dəysin!

Əfsun qız kimi əzilib-büzüldü.

– Andıra qalsın bu hirsi! Onun törəmə səbəbini qanammıram.

– Qanmazsan də! Onnan ötrün ki, qanacağın yoxdu. Mərifətdən kasıbsan!

Əfsun bic-bic ufuldandı:

– Off, nənə, bağrım çatdadı. Qələtimi açıq desənə!

Qumaş arvad zoddu-zoddu soruşdu:

– O nə zayıl hərəkətdi eləyibsən qıznan?

– Hansı qıznan, nənə?

– Mənim nəvəmnən. Tamaşaynan!

– Neyləmişəm ki?

– Sataşıbsan ona!

– Hi-hi-hii!.. – Əfsun əlini əlinə vurub güldü. – Sataşmaq nədi, nənə, eləcənə zarafat eləmişəm.

Tamaşa içəridən hiddətlə qışqırdı:

– Yalan deyir, nənə, inanma!

Qumaş arvad kükrədi:

– Qıznan nə zarafat?! Oyun yoldaşındı o sənin?! Döşünə əl atıbsan, deyir, heç utanırsan?!

Əfsun kirpiklərini xıppıldatdı.

– Vallah-billah, öz canım üçün ondan xəbərim olmayıb. Yəqin eləcənə əlim toxunub.

– Hımm... eləcənə əlim toxunub!.. – Qumaş arvad onu yamsıladı. – Bə nədən ötrün adam olmuyan yerdə yolunu kəsibsən?

– Yolunu kəsmirdim... Məktəbə qədər ötürmək istəyirdim.

Tamaşa içəridən təkrar qışqırdı:

– Düz demir. Yolumu qəsdən kəsmişdi.

Qumaş arvad başını yırğaladı.

– Qız mənə heç vaxt yalan söz danışmır. Kələkləmə məni!

Əfsun əlavə bəhanəyə bundan belə ehtiyac duymadı. Onsuz da inamı itirmişdi. Açıq danışmalı oldu:

– Bağışla, nənə, utanırdım deməyə... Mən sevirəm sənin nəvəni. Vurulmuşam ona.

Tamaşanın qışqırtısı bu dəfə dəhlizdən eşidildi:

– Mənim isə səndən zəhləm gedir! Sənə nifrət eləyirəm!

Əfsun qışqırtıya məhəl qoymadı. Sakit-sakit davam etdi:

– Fikrim bu idi ki, təklikdə qızın razılığını alım, sonra səninlə danışım.

Tamaşa çılğınlıqla:

– Mən buna heç zaman razı olmaram! – dedi. – Get, tayını tap!

Əfsun sırtıqlıqla irişdi:

– Əvəzində, budur, dəli nəvən üzümü cırmaqladı. Bizim işçilər yanında biabır oldum. Hamı mənə güldü.

Tamaşa acıq çıxdı:

– Çox yaxşı olub gülüblər. Səni kimisinə o da azdı!

Əfsun qıza çəp-çəp baxıb Qumaş arvaddan fağır-fağır üzr istədi:

– Olan olub, keçən keçib, nənə. Qələtimi mənə bağışla. Cavanlıq təcrübəsizliyidi.

– Yox, bağışdamıram! – Qumaş arvad kəskin və sözkəsənliklə əlini yellətdi. – Çox nahax yerə neçə gündü səni evimdə saxlamışam. Elə əvvəlcədən həlləm-qəlləm oğlana oxşatmışdım səni. Əyrinin kölgəsi də əyri görünür! Yazığım gəldi, çöldə qalmağına qıymadım. Daha bəsdi. Xətanı xali elə bizdən. Get, özünə ayrı yerdə nişannı axtar.

Əfsun qılıqdan əlini üzüb, aciz minnətə başladı:

– Qurban olum, Qumaş nənə, sən ölənləriyin goru, əzizləriyin urfu, səbirlə qulaq as mənə. Hər nəyə deyirsən and içim, ağı yalayım ki, nəvənə pis niyyətlə yaxınlaşmamışam. Onu həqiqi məhəbbətlə sevirəm. Onunla evlənmək, ailə qurmaq arzusundayam. Özgə xəyala düşsəm, evində kəsdiyim çörək gözümü tutar, zəlil olaram. Gəl rəhmini mənə bir də göstər. Bu dəli nəvənə öyüd ver. Onu mənim qədər ürəkdən sevən ikinci bir oğlana rast gəlməyəcək.

Tamaşa nənəsinə inciklıklə deyindi:

– Nənə, nəyi gözləyirsən? Niyə qovmursan bunu?! Bəsdi zəhləmizi tökdü!

Qumaş arvad son sözünü bir az da sərt və qəti söylədi:

– Sən etibarını itiribsən, bala. Quzunu qurda tapşırammaram daha. Üzüsulu çıx get burdan!

Əfsunun çiyinləri sallandı.

– Vay mənim günümə! Durduğun yerdə şərə düş, buna deyiblər. İndi mən kimə pənah aparım? Bu qış günündə küçədəmi gecələyim? – Boynunu həqiqətən büküb, Qumaş arvada miskin-miskin baxdı. – İnsafı arada gör, nənə. İcazə ver, bu gecəni qalım burda. Sabahdan, baş üstə, başıma bir çarə qılaram.

Tamaşa ayaqlarını yerə çırpıb, cinli-cinli çığırdı:

– Yoox, olmaz! Heç bir saat da qala bilməzsən. Bu dəqiqə rədd ol!

Əlbəttə ki, çöldə qalmayacaqdı. Pula pul demirdi. Hansı mehmanxanaya üz tutsa, gülərüzlə qarşılanacaqdı. Amma nigarançılığı vardı: o boyda pulu hara daşısın? Mehmanxana şəraitində onu necə gizlətsin?! Zıqqıdı:

– Yaxşı, gedirəm... Küçələrdə başıma fəna bir iş gəlsə, Allah yanında siz günahkar olacaqsınız.

Qumaş arvad yumşalaraq təskinlik verdi:

– Qorxma, – dedi, – küçədə qalmıyacaxsan. Onun tədbirini görmüşəm. Yaxın rəfiqəm var, bir az əvvəl mənə baş çəkməyə gəlmişdi. Onnan danışıb razılığını almışam. Çox mehriban yəhudi qadınıdı. Uzun illər bir yerdə işdəmişik. Üçotaxlı evi boşdu. Təkcənə yaşayır. Uşaxları urusyetdədilər. Amba bu şərtnən ki, gərək abırlı davranasan. Gic-gici hərəkətdəri orda da eləmiyəsən. Adı Mara Abramovnadı. Al, bu da evinin ünvanıdı, özü yazıb verib.

Əfsun ünvanı götürüb, haçansa qayıtmağa ayaq yeri qoydu:

– Çamadanı özümlə aparıram. Torba hələlik qalsın burda, içindəkilər çox vacib sənədlərdi. Qorxuram təzə mənzildə itib-batar. O kağızlardan bircəsi əskik olsa, dərimi sıyırıb boğazımdan çıxardarlar. Sizə özümə inanan qədər, inanıram. Qalacaq yerim tam müəyyənləşəndə gəlib götürərəm.

Tamaşa dinmədi.

Qumaş arvad razılaşdı:

– Eytirazım yoxdu. Amba öz əlinlə apar hara lazımdı orda gizdət. Bizim əlimiz ona toxunmayacax.

## 22.

Mara Abramovanın yaşadığı ev dəmiryolu vağzalının alt yanında yerləşirdi. Bakının köhnə binalarından sayılırdı. Bir əsrə bərabər, bəlkə də daha çox yaşı vardı. On doqquzuncu yüz illiyin axırlarında neft sahibkarlarının hansısa fəhlələr üçün tikdirmişdi. Elə bir arxitekturası, nəzərəçarpacaq yaraşığı yox idi. Dar həyətli, üç mərtəbəli bu binada indi də neft sənayesində çalışan aşağı rütbəli əməkdaşlar qalırdılar. Əhalinin başqa təbəqələrindən burada məskunlaşanlar çox azdı. Demək olar ki, tək-tükdü.

Mara Abramovnanın mərhum əri də neft sənayesinin qabaqcıl

işçilərindən olmuşdu. Buruq ustası idi. Mara Abramovna ilə bir mədəndə işləmişdilər. Mara Abramovna həmən mədəndə baş mühasib köməkçisi vəzifəsində çalışırdı. Orta təhsilli gənc qız idi. Bakıda doğulmuşdu. Azərbaycan dilini lazımınca öyrənmişdi. Bu dildə fikrini sərbəst ifadə etməyi bacarırdı. Düzdü, ləhcəsi özünü ara-sıra büruzə verirdi. Bəzi sözlərin tələffüzündə dili dolaşırdı. Lakin adi danışıqda bu o qədər də duyulmurdu.

Uşaqları rus məktəbində oxumuşdular. Ərinin sağlığında Moskva şəhərinə ali təhsilə göndərilmişdilər. Uşaqlar təhsillərini tamamlayıb elə orda da işə düzəlmiş, bir daha Bakıya qayıtmamışdılar. Mara Abramovna oğlanlarının təkidinə baxmayaraq, Bakını tərk etməmişdi. Gənclik əhd-peymanına sadiq olmuşdu. Uzun illərdən bəri (əri altmışıncı illərin axırlarında dünyasını dəyişmişdi) hər bazar günü ərinin qəbrini gül-çiçəklə ziyarət etmişdi. Məzar torpağını səliqə-sahmana salmış, qəbrin dövrəsinə gül-çiçək düzmüş, özü ilə gətirdiyi balaca kətildə əyləşib, mərhumla birlikdə keçirdiyi əziz günləri xatırlamışdı.

Əfsunu xoş sifətlə qarşıladı. Çay süfrəsi açdı. Ordan-burdan söhbət salıb, kirayənişinin tərcümeyi-halı ilə maraqlandı. Sonda qəribə xəbərdarlıq etdi:

– Bizim bu binada yaramaz adamlar da yaşayır, – dedi. – Oğrusu da var, əyrisi, xuliqanı, əyyaşı, cibgiri də. Bunları sənə qabaqcadan deyirəm ki, dələduzlara aldanmıyasan. Həftədə, on gündən bir milis nəfərləri burdadılar. Gah oğru izinə düşüb gəlirlər, gah xuliqan axtarırlar, gah da narkoman. Şəhərin harasında cinayət törənsə, bir ucu bu binada tapılır.

Əfsun əməllicə qorxuya düşdü:

– Əsl cinayət yuvasıdı ki, bura!

Mara Abramovna təəssüflə təsdiqlədi:

– Hə, elədi. Ehtiyatlı dolanmaq lazımdı. Başını sal aşağı, öz işinlə məşğul ol. Heç kəsə qoşulma.

Əfsun, adəti üzrə, lovğalandı:

– Məndən narahat olmayın, Mara Abramovna, özüm cavan olsam da başım daşdan-daşa dəyib. Nə mən bir kəsə gözün üstə qaşın var deyəcəm, nə də bir kəsin mənim həndəvərimə hərlənə

biləcəyinə imkan yaradacam.

Mara Abramovna bir ciddi xəbərdarlıq da elədi:

– Bizimlə üzbəüzdə, həyətin o biri tərəfində əxlaqsız bir qadın da yaşayır, yanına hər cürə adamlar gəlir. Əvvəllərdə bir neçə dəfə həbs olunub. Yenə də pis əməllərindən qalmır. Ondan gözlə özünü. Cavanları tora salmağı çox asan bacarır.

Sonuncu xəbərdarlıq, elə bil, dəli yadına daş saldı. Əfsun həsrətli nəzərlərlə dönüb həyətə boylandı.

– Neçənci mərtəbədə yaşayır o qadın? Göstərin ki, indidən tanıyım. Çalışıb toruna düşməyim.

Mara Abramovna ehtiyatla arxanı nişan verdi:

– İkinci mərtəbədə. Odur, pəncərə qabağında bayaqdan oturub. Sən bura gələndə gözü səndəydi. İndi də bura baxır, fikir vermə.

Əfsunu şeytan qıdıqladı. Özündən asılı olmadan, xüsusi tələskənliklə hədəfə boylandı. Qadını dərhal gördü. Düz qənşərindəki pəncərə önündə yanpörtü əyləşib tellərinə sığal çəkirdi.

– Dolğun sifət, göyçək qadını deyirsiniz?

– Hə, onu. – Mara Abramovna ikrahlıqla üz-gözünü turşutdu, – üstü bəzək, altı təzəkdi. Gözəgəlimliyi, əti-əndamıdı kişilərin ağlını çaşdıran.

– Adı nədi?

– Nəyinə lazımdı adı?

– Elə-belə soruşuram.

– Ayzenat çağırırlar. Ləzgi adına oxşayır. Amma təmiz ləzgi deyil, qan qarışığı çoxdu... Bir də xəbərdarlıq eləyirəm, kənar gəz ondan, cavan oğlansan, xəstəlik-zad taparsan.

Əfsun kişiləndi:

– Arxayın olun, Mara Abramovna. Mən hərif-zad deyiləm. Elə ehtiyatsız hərəkətlərə yol vermərəm. O cürə düşük qadınlar məni yoldan çıxara bilməz! – desə də bir gözü Mara Abramovnadan oğurlanıb, qarşı pəncərəyə iştahla zilləndi.

* * *

Ayzenat Mahamovanın milliyyəti həqiqətən dəqiq bilinmirdi. Hansı xalqa mənsub olduğunu dürüstləşdirmək xeyli çətin idi. Ata

babası əslən osetindi, tatar qızı ilə ailə qurmuşdu. Ana babası isə kumuk idi, ləzgi qızına könül vermişdi. Müxtəsər ki, bu Bakı məskunları bolşeviklərin “xalqlar dostluğu” təbliğatına ilk uyanlardandılar. Atası da həmən “ənənəni” pozmamışdı, abxazlarla qohumlaşmışdı. Odur ki, Ayzenat Mahamovanın milli mənsubiyyətini müəyyənləşdirmək olduqca mürəkkəb məsələ idi.

Ayzenatın qızlıq xəmiri həddi-buluğ çağlarından sıyılmışdı. Yar-yaraşığı göz oxşayan, qəddi-qaməti diqqət çəkən qızcığaz şəhvət tamını çox erkən dadmışdı. O, qəşənglikdən savayı da xasiyyətcə şən, şıtıq idi. Oğlanlarla qarpışmağı, sürtüşməyi xoşlayırdı. Elə bu xasiyyət də onu idman müəllimi ilə yaxınlaşdırmışdı. Üzünü ona açdırmışdı. İntim hadisə aşkarlananda idman müəllimi işdən qovuldu. Ayzenat da bağışlanmadı, məktəbdə oxumağına qadağa qoyuldu. Kasıb atası uzun qalmaqaldan sonra qızını işə düzəltməyi fikirləşdi. Evdə qalıb, qohum-qonşuların sözgap tapdağı olmaqdansa, işləyib özünü pal-paltarla təmin etməsi məsləhət idi.

Qonşuluqda yüksək vəzifəli bir şəxs yaşayırdı. İmkanlı, sözükeçən adam idi. Ayzenatın atası ilə ayaqüstü salam-kəlamı vardı. Kasıb ata bir səhər qızını yanına alıb bu vəzifəli şəxsin hüzuruna yollandı. Şorgöz, surətpərəst məmur qızın qəşəngliyinə, yar-yaraşığına hayıl-mayıl qalıb, işə götürməyə çək-çevirsiz razılaşdı. Aradan heç bir gün ötməmiş köhnə katibəsini ayrı vəzifəyə keçirib, onun yerinə Ayzenatı təyin elətdirdi.

Hal əhli məmur təzə katibə ilə intim münasibəti də yubatmadı. “Quc-quc”da Ayzenatın özünün də təşəbbüsü az olmadı. Məmur yaraşıqlı kişi idi. İlk həmlədəncə ağuşuna atıldı. Aşiq-məşuqluq kefini elə kabinetdə görməyə başladılar. Uzağa getməyə, xəlvətə çəkilməyə ehtiyac yaranmadı.

Məmur məşuqə şirnikdirməkdə də təcrübəli idi. Lətif, şirin keflər üçün müftə pullarını əsirgəmirdi. Ayzenatı heç nədən korluq çəkməyə qoymadı. Bahalı daş-qaşlar, zər-zibalar, dəbdə olan geyimlərlə bəzədi. Ayzenat daha da qəşəngləşdi. Qönçə idi, açılıb ləçəkləndi. Neçə növ paltarın birini soyunub, başqasını geyindi. Hər səhər bambaşqa libasda gözə göründü. Nə evdə, nə qonum-

qonşuda soruşan olmadı ki, bu şux geyimlər, bəzək-düzəklər hansı gəlirin hesabınadı?

Valideynlər hər şeyi gözəl anlayırdılar. Qızın "qazancı" onların da güzəranını babatlaşdırmışdı. Oyunbaz qız valideyn ağzını yummağın çəmini çoxdan tapmışdı: "qazancı"nın mühüm hissəsini anasına ötürürdü.

Vaxt gəldi, Ayzenat Mahamovanın sərgüzəştlərinin miqyası böyüdü. Ona həsrət-həsrət baxan gözlərin, aludə baxışların sayı bilinmədi. Müştəriləri qapı-pəncərədən boylanışdılar. Pula pul deməyən canısulu, ürəyi odlu kişilər bir az da ətə-qana dolmuş, göz dağı olmuş Mahamova üçün sino getdilər. Onunla "görüşə" yollar, üsullar, vasitəçilər aradılar. Bayramlarda bahalı sovqatlar, hədiyyələr, təzə-tər gül-çiçəklərlə təbrikə tələsdilər. Sıyıq xəmirli Ayzenat ayrıları ilə də intim əlaqəyə girdi. Gecələr evə çox gec, bəzən səhərə yaxın qayıtdı. Bəhanə gətirmək lazım olanda: ad gününə çağrıldığını, toya dəvət aldığını, yaxud rəsmi tədbirdə iştirak etdiyini söylədi. Kasıbçılıq amanlarını qırmış valideynlər də bu sözlərə, istər-istəməz inandılar. Özgə çarələri nə idi?

Beləcə aylar, illər ötdü. Ayzenat əldən-ələ düşdü. "Günkeçirmələr" vərdişə çevrildi. Gecə görüşlərində, eyş-işrət məclislərində, gizli şəhvət məkanlarında rastlaşdığı özü kimi ayağı sürüşkən qızlar, gəlinlər, talesiz xanımlarla dostlaşdı. Hər biri ilə ümumi dil tapıb başına pozğun dəstə yığdı. Yüksək çinli kimsələrlə ittifaqa girib "fəaliyyətini" genişləndirdi, "qadın alveri" biznesi yaratdı. Özü yaşa dolub müştəriləri seyrəkləşəndə, dəstəsindəki gözəlçələri irəli verib əvəzində bol-bol bəxşeyişlər aldı. Bu qazanc ona daha sərfəli oldu. Əlavə "hörmət" gətirdi. Kef-əyləncə, şən həyat xiridarları "sütül canan"la gecələmək həvəsinə düşəndə Ayzenat Mahamovaya gizlin minnətçilər göndərdilər. Onu da, özlərini də xoşhal elədilər.

Bu, hələ başlanğıc idi. İki il sonra sovet hakimiyyəti devrilib, ölkədə "keçid dövrü"nə qədəm qoyulanda, iqtisadi böhran dərinləşəndə, qadın alveri yeni vüsət götürəcək, təşkilatlanacaqdı. Sərhədlər açılanda isə cavan, göyçək qız-gəlinlərin sorağı Türkiyədən, İrandan, Dubaydan, neçə-neçə qey-

ri-məmləkətlərdən gələcəkdi.

İndilikdə isə bütün çirkin əməllər yalnız daxildə hökmfərma idi. Mahamovanın "qız-gəlin kolleksiyası"nda hər millətdən nümayəndələr vardı. Kimin könlü hansı xalqın "gözəlini" istəyir, lütfən buyursun Mahamovanın hüzuruna, arzusuna mütləq çatacaqdı...

* * *

...Bir azdan Mara Abramovna harasa getdi. Evdə tək qalmış Əfsun darıxdı. Eyvan pəncərəsini taybatay açıb, başını çölə çıxartdı. Oğrun-oğrun qarşı pəncərəyə boylandı. Tezliklə qarşı pəncərə də açıldı. Ayzenat Mahamova allı-güllü örpəyini çiynindən sıyırıb, özünü nümayiş etdirirmiş kimi, bəmbəyaz sinəsini qabağa verdi, ətli çiyinlərini rəqqasə sayaq oynadaraq, hey qımışdı.

Əfsun bir qırpımdaca ovsunlandı. Nəzərlərini işvəli qadından çəkmədən, o da gah irişdi, gah qımışdı. Arada him-cim də etdi. İki-üç dəqiqə sürən bu alovlu baxışmadan sonra Əfsun qadına qiyabi öpüş göndərdi. Ayzenat iki barmağının işarəsi ilə ona "gəl, gəl!" – dedi.

Əfsun dala-qabağa baxmadan, özünü quş qanadında ona yetirdi. Ayzenat xalatının yaxası açıq vəziyyətdə qənşərə yeridi. Ağızucu salamlaşıb, naz-qəmzə ilə əl tutuşdu. Bu, müştərini qıcıqlandırmaq, şəhvət hissini coşdurmaq üçün sınanmış üsul idi. Hətta oğlana sataşdı da.

– Öz aramızdı, yamanca üzlü oğlansan. Bircə işarətə yüyürə-yüyürə gəldin!

Əfsun ədəb qaydalarını gözləmədi. Açıq-saçıq danışdı:

– Boynuma alıram, mən gözəl qadın təşnəsiyəm. Səni görən dəqiqədən ağlım uçdu başımdan. Sənə yetişmək üçün yüyürmək nədi, at kimi dördnala da çaparam!

Ayzenat yağlı gözlərini süzdürüb, matahını baha satdı.

– Tamahına tət de, qadası. Mən sənin düşündüyün sıyıq qadınlardan deyiləm. Görüşümə hər yüyürəni qəbul eləmirəm. Məni görüb, ağlını başından uçuranlar bir yox, beş yox, yüzlərlə olub. Hələ yenə də olacaq.

Əfsun bu anlarda hər şeyə razı idi. Təki kama tez çatsın.

Qılığını bol elədi:

– Sən gözəllərin ən gözəlisən! Dərdindən ölənlərin çoxluğuna şübhəm yoxdur. Naz-qəmzəli baxışların ürəyə od salır, təpədən tüstü çıxardır. Min cavan qıza dəyərsən!

Ayzenat amanıqırıq müştərisini şirnikdirmək üçün xalatını kürəyinə sürüşdürdü. Əndamını qəsdlə sağa-sola əydi, yır-yır yırğaladı. Hayıl-mayıl oğlanın ağzı lap sulandı.

– Cavan qızlar qələtlərini eləsinlər! – deyib, qürurla cilvələndi. – Qadınlar orta yaşlarında daha qızğın olurlar. Bulud altından çıxmış yaz günəşinə bənzəyirlər. Hərarətləri soyuq çay daşını da əridə bilir!

Əfsun ehtirasın gücündən dodaqlarını yaladı. Heysiz pıçıltı ilə:

– Təki elə olsun!.. Yandır-yax məni! – dedi və Ayzenata sarmaşıq kimi sarıldı.

Təcrübəli Ayzenat soyuqqanlı davrandı, kişmişi gülüşlə özünü oğlandan araladı.

– Hi...hi...hiii... farağat dur, qıdığım gəlir! – deyib ciddi əlavə etdi: – Hövsələn olsun. Qoy söhbətimizi başacan eləyək.

– Söhbət qalsın sonraya. Ona heyim yoxdur.

– Olmaz! – Ayzenat bərk təpindi. – Əla qadın qoynunda yatmağın əla da xərci var. Məzənnədən halısan?

Əfsun qəribə yanğı ilə mızıldandı:

– Məzənnə məni maraqlandırmır. Xərcini lazımından artıq ödəyəcəm! – O, bir əlini Ayzenatın dolu əndamında gəzdirməkdən qalmayıb, digər əlini cibinə saldı. Bir çəngə pul çıxardıb, qürur-qürrə ilə yelləndirdi. – Bunun hamısı sənindi!

– Həəə?! – Ayzenatın üzü güldü. Şit qəhqəhə çəkdi. Uğunmuş gözlərinin ağ giləsi işım-işım işıldadı. – Bax, bu alayı məsələ! Səninlə gün keçirməyə dəyər... Ha-ha-haaa!.. Amma əvvəlcə hamama keçib yaxşı-yaxşı çimməli, təmizlənməlisən. Mən tələsik işi xoşlamıram!

O, Əfsunu nazlı-nazlı dümsükləyib “vanna otağına” apardı...

## 23.

Əfsun Zamanlı qadın tamarzılığının daşını biryolluq atdı. Daha

yaxın yolunu uzaqlardan salmadı. Küçələrə, park və meydanlara "canan ovu"na çıxmadı. İki-üç gündən bir Mara Abramovanın gözlərindən oğurlanıb, özünü Ayzenatın ağuşuna yetirdi. İstədiyi kefi çəkdi. Düzdü, Durna xanımla olmuş keflərin, ləzzətli anların yanında bunlar əsla müqayisəyə gəlməzdi. Üzü üzlər görmüş, kişiləri tum təki çırtlamış fahişə hara, çaşıb lotu toruna düşmüş, təmiz qadın hara?!

O, əyin-başına da fikir verdi. Geyimini təpədən-dırnağa təzələdi. Tamam başqa sur-sinçiyə mindi. Qadın, qız-gəlin diqqətini özünə bir az da çox çəkdi. Ulu dədələr doğruca deyiblər ki, gözəllik ondu, doqquzu dondu. Bəli, cəmi iki-üç həftə ərzində Əfsun Zamanlı tanınmaz dərəcədə dəyişdi. Yeni sur-sinçidə rəhbərliyin də xoşuna daha çox gəldi. Ancaq heç maraqlanmadılar ki, bu şıq, bahalı geyimlərə pul onda hardandı?

İş yoldaşlarından ona paxıllıq eləyən, həsəd aparanlar, əlbəttə, vardı. Şübhələnənlər də yox deyildi. Daldada, küncdə-bucaqda qarasınca danışır, kölgəsini qılınclayırdılar. Üzərdə isə susur, heç nə demirdilər. Hətta məsələdən az-çox hali Fərid Cəbizadə də nə üçünsə kiriyirdi.

Ayzenat Mahamova Əfsundan kamını alandan sonra onu ətrafındakı hallıca-dulluca xanımlar, şux gəlinlərlə də calaşdırdı. Qısqanclıq eləmədi. Bu hiss onda çoxdan ölmüşdü. Pul hər şeydən önə keçmişdi.

Əfsun qadın bolluğunda pulun ecazkar gücünə bir daha inandı, heyran oldu. Bu heyranlıq onu əlavə fəaliyyətə həvəsləndirdi. İrimiqyaslı gəlirə, müftə var-dövlətə tamahlandırdı. Gözünün qabağında mühit dəyişirdi. Xalq malının: yeraltı, yerüstü sərvətlərin fəndgir işbazlar, məmurlar tərəfindən gizlin-gizlin mənimsənildiyini, xımır-xımır özəlləşdirildiyini görürdü. Hakimiyyətdəkilər öz başlarının hayındaydı. Dövlət əmlakına nəzarət itirilmişdi. Çaşqınlıq, təlaş və təşviş içindəydilər. Xaricdən, beynəlxalq demokratik təşkilatlardan dəstək alan müxalifət isə gündən-günə güclənirdi; qarşısıalınmaz böyük qüvvəyə çevrilirdi. Qarşıdurmanın yetişdiyi yəqin idi. Çarə yolları axtarılırdı.

Əfsun Zamanlının siyasi səbatı, dünyagörüşü az olsa da hadi-

sələrin gedişatından nəticə çıxartmağı bacarırdı. Anlayırdı ki, hakimiyyətdə müəyyən dəyişiklik, yeniləşmə mütləq olacaq. Ancaq nə sayaq? Bunu dəqiq bilmirdi (sovet quruluşunun tam çökəcəyinə inanan çox az idi). Fürsətdən istifadəyə can atdı. Ayrı vasitə, yetərli üsul düşünməyə əqlinin gücü çatmadı; komitənin sədri Məsim Müslümoviç Qulamovla şəxsi yaxınlıq yaratmağı, onun sayəsində məqsədə çatmağı düşündü. Hazırkı şəraitdə bu ona daha məqbul göründü. Xətrini az-çox istətmişdi. Qəbuluna gedib, şirin dillə, bəlağətli sözlərlə münasibəti lazımi müstəvidə düzüb-qoşa bilərdi. Vasitəçiyə nə lüzum?!

Sədrin kabineti ətrafında düz bir həftə fırlandı. Qəbul işi müşkülə döndü. Məsim Müslümoviç gah rəsmi yığıncaqlarda, mühüm tədbirlərdə oldu, gah harasa çox vacib səfərə getdi, gah da başı cari məsələlərə qarışdı. Axır ki, şeytanın qılçı bir gün sındı, iş ovanda düşdü...

Dəhlizdə qarşılaşdılar.

Məsim Müslümoviç onu aralıdan, xoş təbəssümlə salamladı:

– Ooo... Zamanlı, xoş gördük! Necəsən? Nə var, nə yox?

Əfsun cəld irəli atıldı. Sədrin azacıq qabağa uzanmış əlini ifrat yaltaqlıqla sıxdı.

– Çox sağ olun, Məsim Müslümoviç. Sizin sayənizdə lap yaxşıyam. Canınıza dua oxuyuram. Hər işim qaydasındadı.

Məsim Müslümoviç ağır başını təqdirlə endirib-qaldırdı.

– Belə də olmalıdı! Sənin kimi qoçaq, ağıllı və məsuliyyətli oğlanın işlərini mən ayrı cür təsəvvür eləmirəm. Böyük gələcəyinə inanıram. Bu qabiliyyətlə çox qabağa gedəcəksən.

Əfsun qol-qanad açdı. Dili ağzına sığışmadı:

– Yüz yaşayın, Məsim Müslümoviç! Mən hədsiz şadam ki, sizin kimi alicənab, həssas və incə ürəkli bir rəhbər yanında çalışıram. Hər adi təşəbbüsü, çəkilən zəhməti lazımınca qiymətləndirən komitə sədrinin himayəsində olmağımla fəxr eləyirəm. Sizin diqqətinizdən heç nə yayınmır. Əməkdaşlarınızı namusla, vicdanla işləməyə həvəsləndirirsiniz. Adam əməyinin bəhrəsindən həzz alır, daha ciddi təşəbbüskarlığa can atır. Biz sizinlə bəxtəvərik!

Məsim Müslümoviç səsinin ahəngindəki mehribançılığı artırdı:

– Düz deyirsən, Zamanlı. Sözlərində çiylik sezmirəm. Həqiqi rəhbər əməkdaşlarının nə ilə nəfəs aldığını, kimin nəyə qadir olduğunu mütləq bilməlidir. Yaxşı işçini pislərdən fərqləndirməyi bacarmalıdır. Yoxsa meyar itər, xaos yaranar. İnsan elə məxluqdur ki, qədir-qiymətinin bilinməsini sevir. Zəhmətinin dəyərləndirilməsini hər şeydən, hətta, maddi gəlirdən də üstün tutur. Necə deyərlər, "ho-ho!" var dağa qaldırır, "ho-ho" var dağdan endirir. Ümumiyyətlə, tərif insan üçün ikinci əsas qidadır. İnsan günlərlə, sutkalarla ac qala bilər, ancaq tərifsiz, şan-şöhrətsiz dözə bilməz, qəlbi qubarlanar. Xəstələnib yatağa düşər. Rəhbər olan şəxs bu psixologiyanı dərindən mənimsəməli və dəqiq icraata başlamalıdır.

Əfsun coşdu:

– Siz fenomen adamsız, Məsim Müslümoviç. Üzünüzə demək olmasın, psixologiyanın da, ruhi aləmin də bütün incəliklərini kamil bilirsiniz. Ürəkləri gözəl oxuyursunuz. Bu ali keyfiyyət yüksək vəzifə sahiblərinin çox az qismində olur. Allah himayənizi bizə çox görməsin!

Məsim Müslümoviç böyük məmnunluqla qımışdı.

– Minnətdaram, Zamanlı! Qoçaqlığın, zirəkliyinlə bərabər, qanacaqlısan. Mənə sözün, xahişin?

Əfsun özünü utancaq göstərdi. Əllərini ovuşdura-ovuşdura əzilib-büzüldü.

– Sizdən bir acizanə ricam var, Məsim Müslümoviç. Daha doğrusu, idarəmiz xeyrinə təklifim var.

– Buyur, eşidirəm.

– Vallah, heç bilmirəm fikrimi sizə necə çatdırım... Qorxuram...

– Qorxan gözə çöp düşür, Zamanlı. Fikrini açıq söylə. Ümidvaram təklifin işimizə gərəkli olar.

Əfsun duruxdu. Qəsdən dilini sürüdü.

– Zənnimcə, pis təklif deyil, Məsim Müslümoviç. Xoşunuza gəlsə, komitəmizə çox xeyri dəyər. Maddi imkanlarımız bir neçə dəfə artar. Büdcəmiz böyüyər. Qaçqın və köçkünlərimizin tələbatı, maddi vəziyyətləri daha müvafiq qaydada təmin olunar.

Məsim Müslümoviç Əfsunun qoluna girdi, kabinetinə doğru çəkdi.

– Diyəsən, vacib məsələdi. Gedək içəridə arxayın söhbət eləyək.

Dal-qabaq kabinetə keçdilər. Məsim Müslümoviç katibəsinə tapşırdı:

– Bizə çay gətir. Yanımıza da heç kimi buraxma!

Meydan kimi geniş, dəbdəbəli kabinet Əfsunun gözlərini qamaşdırdı, zəhmi onu basdı. İlk dəfə – Şakir Şadmanlı ilə bu kabinetə gələndə Əfsun həmin zəhmi duymamışdı. Çox şeyə diqqət yetirməmişdi. Buna vaxtı, imkanı olmamışdı. İndi özünü bir qədər itirdi.

Məsim Müslümoviç Əfsunu yaxınlığında əyləşdirib, təmkinlə öz yerinə keçdi. Yumşaq, fırlanan kreslosuna ağır, astaraq çökdü:

– Hə, Zamanlı, söylə təklifini. Səni dinləyirəm.

Əfsun ayağa durdu, baş əydi. Danışmağa tələsmədi. Məsim Müslümoviç həlim təbəssümlə:

– Ayağa durmaq lazım deyil. Otur, sərbəst danış, – dedi.

Əfsun oturdu. Sözə ədəb-ərkanla başladı:

– Təklifim bir az yekəxana səslənsə, xahiş eləyirəm üzürlü sayın. Dövlət işlərinə qarışmaqda məni qınamayın. Sizi çox istədiyimdən ərk eləyirəm...

Məsim Müslümoviç bu təvazönü xüsusi ilə bəyəndi. Səsi lap həlimləndi:

– Həyəcanlanma, Zamanlı, açıq de fikrini. Bilirsən ki, xətrin mənim üçün əzizdi. Heç nədən çəkinmə.

Bu arada katibə allı-güllü sinidə çay gətirdi. Armudu stəkanlardakı  çayları paylayıb getdi.

Əfsun daha ədəb-ərkan gözləmədi. Çayını sərbəstcə içə-içə mətləb üstünə gəldi:

– Məsim Müslümoviç, mənim bildiyimə görə, siz komsomolun yetişdirməsisiniz. Cavanlarla çox təmasda olubsunuz, uzun illər mərkəzi aparatda məsul vəzifələrdə çalışıbsınız. Düşünürəm ki, məhz bu səbəbdən də gənclərə etimadınız böyükdür.

– Elədir, Zamanlı! – Məsim Müslümoviç yaşına uyğun olmayan tərzdə öyündü. – Mən komsomolun, yəni Kommunist Gənclər İttifaqının yetirməsiyəm. Proletariatın dahi rəhbəri, sosializmin banisi Vladimir İliç Lenin ideyalarının sadiq daşıyıcılarından biriyəm. Damarlarımdan, sözün həqiqi mənasında, bolşevik qanı axır. Mənim rəhmətlik ata babam Qulam Qulamov Azərbaycanda Kommunist Partiyasının ilk üzvlərindən olub. Respublikamızın sovetləşməsində

fəal iştirak edib. Onun adı Böyük Sovet Ensiklopediyasına da düşüb. Vladimir İliçlə ayrıca şəkli var. Kollektivləşmə illərində sinfi düşmənlər tərəfindən vəhşicəsinə qətlə yetirilib. Atam isə babamın yolunu davam etdirib. Onun arzularını həyata keçirmək uğrunda yorulmadan, fasiləsiz çarpışıb. Ən məsul vəzifələrdə çalışıb. Mən də o yolla getmişəm. Otuz beş yaşınadək gənclərə rəhbərlik mənim boynuma düşüb. Oradan da partiya işlərinə cəlb edilmişəm. Quruculuğun ən qaynar yerlərinə göndərilmişəm.

Əfsun ərklə müdaxilə etdi:

– Qarabağa Yardım Komitəsi də dövrün, indiki zamanın mühüm sahəsidir. Çox yəqin ki, bu işi də məhz bu səbəblərə görə sizə etibar ediblər.

– Bəli, etibar ediblər! – Məsim Müslümoviç məğrur-məğrur təsdiqlədi. – Mən də öz növbəmdə siz gənclərə etimad göstərirəm, ümid bağlayıram. Sağlam gənclik bizim gələcəyimizdir. Bunu həmişə, hər yerdə təkrar-təkrar deyirəm. Ümdə vəzifəmiz gəncliklə əlbir işləməkdir. Onları sabahkı daha ciddi, daha məsul işlərə hazırlamaq biz – yaşlı nəslin müqəddəs borcudur. Sən də gələcəyini parlaq gördüyüm ümidverici gənclərimizdənsən. Babalarımızın qan bahasına qurduqları, yer üzündə hər cəhətdən analoqu olmayan sosializm cəmiyyəti siz gənclərin polad çiyinlərində vüsət götürüb bütün dünyaya yayılmalıdır. Mənfur, canavar xislətli kapitalizm qəbrə gömülməlidir. Budur bizim amalımız, idealımız! Nə isə, mənim barəmdə məlumatlar kifayətdir. Keçək sənin təklifinə. Buyur, eşidirəm.

Əfsun məramını növbəti bicliklə yenə birbaşa demədi, dolaylarda dolandı:

– Məsim Müslümoviç, mənə belə gəlir ki, bizim komitənin rayon bankları ilə iş birliyi xeyli zəifdi. Ayrı-ayrı bölgələrdə, kənd və qəsəbələrdə məskunlaşmış məcburi qaçqın-köçkünlərimiz yardım almaqda çətinlik çəkirlər. Olmazmı ki, işləri qaydasına qoymaq, yardımlarımızı ünvanlara vaxtında çatdırmaq üçün bu işi öz müvəkkillərimiz, banklarda nümayəndələrimiz görsünlər?

Məsim Müslümoviç dalbadal kirpik çaldı. Xeyli düşündü.

– Mümkün olar, – dedi, – ağlabatan təklifdi... – O, bir də kirpik çaldı. Əfsuna məmnunluqla baxa-baxa əlavə etdi: – Komitə yara-

dılanda hər şey nəzərdə tutulmuşdu. Necə olub ki, bu yaddan çıxıb?.. – Daxili telefona əl atdı. – Alo, Talıbov, zəhmət çək, komitəmizin ştat cədvəlinə diqqət yetir. Gör orda yerli banklarla işləyəcək müvəkkil vəzifəsi nəzərə alınıbmı... yoxdur?.. Çox qəribədi! Axı, yaxşı yadımdadı ki, biz layihədə onu da yazmışdıq... Necə?.. Hə, ola bilər. Çox yəqin ki, Maliyyə Nazirliyində xəsislik edib ixtisara salıblar... Aydındı. Sən işində ol, özüm maraqlanaram.

Əfsun təklifinin nəqdiləndiyini yəqinləyib ötkəmlədi:

– Mən təbiətən narahat adamam, Məsim Müslümoviç. Avaraçılığı, vaxtı boş-boşuna itirməyi xoşlamıram. Kabinetə çaxılıb, gün keçirmək mənim üçün çox darıxdırıcıdır. Həmişə fəaliyyətdə olmaq, komitəmiz xeyrinə gecəni gündüzə qatıb çalışmaq, nəsə əlavə bir xeyir-bərəkət gətirmək istəyirəm. Məsləhət bilsəniz, o işi üzağlığı ilə mən görərdim.

Məsim Müslümoviç zaminlik verdi:

– Sənin üz ağartdığın mənə məlumdu, Zamanlı. Qoy maliyyə naziri ilə danışım, ştatı bərpa elətdirim, gerisi asandır, sən nəzərimdəsən.

Əfsun ayağını bərkitdi.

– Bağışlayın, Məsim Müslümoviç, sözsüz ki, özünüzə də məlumdur. Maliyyə işçiləri zıqqı olurlar. Hər şeydə qənaət güdürlər. Zamanın tələbi onları az maraqlandırır. Fakt qarşısında qoyulmasalar sıyılmırlar.

Məsim Müslümoviç bekaraca qımışdı. Heç nə demədi. "Dövlət telefonları dəftərçəsi"ni götürüb vərəqlədi. Lazımi nömrəni tapdıqdan sonra şirmayı rəngli hökumət telefonunu özünə sarı çəkdi. Nömrələri aramla yığdı. Arxasını kreslonun hündür söykənəcəyinə söykəyib, cavab gözlədi. Səs-səmir eşidilmədi.

– Yerində yoxdur. Görünür, hansısa tədbirdədir... – Dəstəyi yerinə qoyub, aparatı geri itələdi. – Bu, telefon söhbəti deyil. Gərək bugündə-sabahda özüm gedib ştatı araşdırtdırım.

– Elə yaxşıdı, Məsim Müslümoviç. Sizə əlavə zəhmət də olsa, özünüz gedin. Üz üzdən utanır. İşi gecikdirə bilərlər.

– Gecikdirə bilməzlər! Ona haqları yoxdur. Qaçqın və məcburi köçkünlərimiz bizim ən ağrılı yerimizdir. Belə şeyə laqeydlik göstərmək, barmaqarası baxmaq anormal hərəkətdir. Düşmən dəyirmanına su tökməkdir. Bizi istəməyən daxili bədxahlarımız –

özlərini müxalifətçi qələmə verən demaqoqlar, narkoman zir-zibillər qazdan ayıqdılar, ən kiçik, ən xırda nöqsanı da şişirdib, xalq arasında böyük narazılıq, söz-söhbət yaratmağa cəhd eləyirlər. Milçəkdən fil düzəldirlər.

Əfsun xətir xoşluğu üçün siyasi həmrəyliyə qoşuldu:

– Çox haqlısınız, Məsim Müslümoviç. Adicə bir qüsuru zurna çalıb aləmə yayırlar. Ağılsız kütləni çaşdırırlar. Elə o çaşanların biri də mənim özüm. Maddi vəziyyətimin ağır, dözülməz vaxtlarında, işsizlik axırıma çıxhaçıx zamanında məni də pul-para ilə şirnikdirib öz tərəflərinə çəkmək istəyirdilər. Onların heç bir köməyinə, yardımına sıyılmadım. Boş vədlərinə aldanmadım. Sovet hökuməti kimi möhtəşəm bir hökuməti yıxmaq, elə bilirlər, halva yemək qədər asandı. Ay özünüz öləsiniz!

– Afərin, Zamanlı! Mərhəba!! – Məsim Müslümoviç heyranlığını gizlətmədi. – O parazitlərin, yaramaz həşəratların müqabilində ermənilər toya getməlidilər. Bir ovuc sarsaq daşnakların təbliğatına uyub, bizimlə torpaq iddiasına başlayıblar. Bəzi güzəştlərə getməklə bu məsələdə sülhə gəlmək mümkündü. Özgə çarəmiz yoxdur. Neçə-neçə illərdi yaxın qonşularımızdılar. Nə onlar başqa yerə köçəndilər, nə biz doğma yurd-yuvamızı tərk edə bilərik. Ümumi bir dil tapıb, yollaşmalıyıq. Bir də, axı, ermənilər bizim köhnə axberlərimizdir. Uşaqlarımızın kirvələridi. Qohumlaşmışıq, qızları gəlinlərimizdi. Onlardan doğulmuş nəvə-nəticələrimizin sayı beş deyil, on deyil, yüzlərlə, minlərlədir. Onları çölə atmaqmı olar? Bir sözlə, Zamanlı, iki xalqın düşmənçiliyi uzun sürməməlidi. Gec-tez arada sülh yaranmalıdı. Biz yenə axberlərimizlə canhacan olacağıq. Mən bunu dəfələrlə demişəm, yenə deyirəm: həqiqi düşmənimiz, qatı yağımız ocaq başımızdakı, öz içimizdəki müsavatçı, axecepeçi yaramazlardı. Ən ciddi mübarizəmizi, savaşımızı o bədxahlarımıza yönəltməliyik. Onların dirçəlməsinə aman verməməliyik. Elə bələkdəcə boğmalıyıq və boğacağıq da!.. O ki qaldı sənin irəli sürdüyün təklifə, qəbulu mümkündür. Yaxın zamanda çalışıb, lazımi səviyyədə düzüb-qoşacam. Bu sarıdan bir zərrə nigarançılığın olmasın. Xahişin də nəzərə alınacaq.

– Həmişə var olun, Məsim Müslümoviç. Kölgəniz üstümüzdən

heç vaxt əskilməsin!
Əfsun kabineti əlləri döşündə, daldalı tərk etdi.

## ÜÇÜNCÜ HİSSƏ

### 1.

Aradan daha bir il ötdü.

Ölkədə siyasi-ictimai gərginlik ölçüyə sığmadı. Hadisələr məcrasından büsbütün çıxdı. Sovetlər əleyhinə çıxışlar, inqilabi çağırışlar, bəyanatlar ciddidən ciddi şəkil aldı. Ehtiraslar ziyadə coşdu. Qəzəblənmiş əhali nifrət şüarları ilə meydanlara axışmağa əzmlə, dəyanətlə davam etdi. Hakimiyyət dayaqları lap laxladı.

Bu o vaxt idi ki, Baltikyanı respublikalar SSRİ tərkibindən ayrılmağa yekdil qərar vermişdilər. Moskvaya itaət göstərmirdilər. Ukraynada, Moldovada, Qazaxıstanda, Gürcüstanda üsyanlar baş qaldırmışdı. Şimali Qafqazda, xüsusi ilə Çeçenistanda siyasi narazılıqlar silahlı qarşıdurmalara çevrilmişdi. Müstəqillik uğrunda qanlı döyüşlər gedirdi. Azərbaycanda isə Dağlıq Qarabağ problemi gündəmdə idi. Ermənilərlə başlanmış müharibə get-gedə şiddətlənir; Azərbaycan sərhədboyu atəşə tutulurdu. Sovet ordusunun himayəsi ilə erməni birləşmələri Qarabağın ətraf kənd və qəsəbələrini, rayon mərkəzlərini toplarla, iriçaplı pulemyotlarla, raketlərlə gecə-gündüz hədələyir; tanklarla hücuma keçib, əliyalın, köməksiz azərbaycanlıları sıxışdırır, ev-eşiklərindən didərgin salırdılar. Qarı-qocaları, yorğan-döşəkdə yatan xəstələri, kiçikyaşlı uşaqları, qız-gəlinləri öldürür, əsir götürür, torpaqları işğal edirdilər. Yerli rəhbərlər – Moskvaya satılmışlar isə törədilən rəzalətlərə göz yumur, xalqı aldadır, radio və televiziya vasitəsilə yalan məlumatlar yayaraq, törədilən faciələri ört-basdıra çalışırdılar. Hələ

bir qədər əvvəldən əhalidə olan ov tüfənglərini, soyuq silahları (qılıncları, xəncərləri, polad tiyələri) qəsdən yığmışdılar. Camaatı yaba, balta, bel ümidinə qoymuşdular. Düşmənin müqavimətsiz basqınına xaincəsinə şərait yaratmışdılar.

Lakin xalq bu fitnəli xəyanətdən çaşmadı, özünü itirmədi. Son gücünü, ağıl-fərasətini səfərbər etməyi bacardı. Tezliklə müdafiə dəstələri yaradıldı. Ölümün gözünə dik baxan mərd, cəsur oğullar, hərbi xidmətdə olub döyüş üsulunu az-çox öyrənmiş atalar, hətta qocalar, qadınlar da bu dəstələrə könüllü qoşuldular. Çox çəkmədi, silah-sursat mənbəyi aşkarlandı, əks həmlələr qüvvətləndi. Evdə gizlənib, gözləmə mövqeyi tutanlar da canfəşanlığa başladılar. Çünki mövcud hakimiyyətin öz içindən çürüdüyü, bu gün-sabah çökəcəyi artıq hamıya gün kimi aydın idi.

Əfsun Zamanlı da tədbirini vaxtında görmüşdü. İki cəbhəyə qulluq edirdi. Bir ayağı dövlət üzəngisində, o biri ayağı müxalifətçilər tərəfində idi. Komitənin bank əməliyyatlarını apara-apara, əlaltından "cəbhəçilər"lə də əlaqə saxlayırdı. İşğal olunmuş rayonların banklarından fürsət tapıb mənimsədiyi pullardan arabir müxalifətə də ötürür, onların sıralarında yerini möhkəmləndirirdi. Həbsdə olduğunu, siyasi əqidə üstündə tutulduğunu da yeri gələndən-gələnə ustalıqla gözə soxur, etimad qazanırdı. Mitinqlərdən, nümayişlərdən qalmır; meydanlarda ön sıralarda dayanır, danışanlara sürəkli çəpik çalır, hay-küylə alqışlayırdı.

Bir dəfə onun könlündən yenə də xitabət kürsüsünə yönəlmək, bəlağətli nitq söyləmək keçdi. Kimdən əskik idi? Kəkələyə-kəkələyə, deməyə uyğamlı söz tapmayıb udquna-udquna çıxış edənlərin yüzünü yorub yolda qoyardı. Di gəl ki, mikrofona bu dəfə də yaxın buraxmadılar. Əvvəldə olduğu kimi, döşündən dala itələdilər.

Əfsun şit-şit hırıldayıb özünü təkrar irəli verəndə ağ saçlı, nimdaş geyimli, gözü eynəkli bir kişi sərt-sərt qabağını kəsdi. Boz üzlə soruşdu:

– Zamanlı, sən burda neyləyirsən, hara təpilirsən?!

Əfsun onu gec tanıdı. Professor Cəmil İmanlı idi. Əvvəlcə karıxdı. Həbsxanadakı üzləşmələrini xatırlayıb möhkəm qızardı. Çox tez də özünü ələ aldı. Qəddini dikəldib arsızlıqla gülümsündü.

– Salam, professor. Heç nə eləmirəm, sizinlə həmrəyliyimi bil-

dirmək istəyirəm, – dedi.

Professor onu çəpəki süzüb, lağ elədi:

– Sən bizimlə həmrəysən?! Hansı üzlə? Hansı abır-həya, hansı sifətlə?!

Əfsun nifrətli suallardan qamaşmadı. Diri-diri dilləndi:

– Əziz və hörmətli professorumuz, mən çoxdan siz gedən yolun yolçusuyam.

– Nəəə?! – Hirs professoru silkələdi. – Utan, Zamanlı! Müqəddəs amalı murdarlama!

Əfsun irişdi. Özünü bir az da arsızlığa vurdu:

– Hi-hi-hi, professor, yaxşı tələbə müəlliminin həmişə amal və əqidə davamçısı olub.

Cəmil İmanlı hirsini cilovlamağı bacarmadı, şəhadət barmağını irəli tuşlayıb Əfsunun sağ gözü bərabərində fırladı. Az qaldı onun bic-bic işıldayan bəbəyini deşsin.

– Sən heç zaman mənim yaxşı tələbəm olmayıbsan. Əclaflığı özünə peşə seçən, əyri əməllərə qurşanan, çirkin mənəviyyatlı gənc mənim əqidə davamçım ola bilməz. Rədd ol burdan!

Əfsun dala çəkilmədi. Önündə hərəm-hərəm hərlənən, tir-tir titrəyən barmağı vecinə almadı. Heç kirpiklərini də qırpmadı. Yenə hihildədi:

– Hi, hi, hii, professor, mənə acığınız var, ona görə əsəbiləşirsiniz. Günahı məndə axtarmayın. Taqsır sizi gözü götürməyənlərdə, şəxsi düşmənlərinizdədi.

Cəmil İmanlı hövsələdən tamam çıxdı. Boğunuq səslə bağırdı:

– Zəvzəmə! İtil bu müqəddəs kürsü həndəvərindən! Satqınların, böhtançıların, mənəvi çirkinlərin əmmişlərin yeri deyil bura!

Əfsun tərpənmədi. Ayaqlarını döşəməyə möhkəm dirədi. Acı sözləri rahatca həzmə verib, sakitliklə üzr istədi:

– Haqqınız var, professor! Söyməyə, təhqir eləməyə, döyməyə yüz faiz ixtiyarınız çatır. – Üzünü ona yaxın tutdu. – Vurun, şillələyin, tüpürün üzümə. Bu camaat içində salın təpiyinizin altına, sındırın qabırğalarımı. Qabağınızdan qaçan, güldən ağır bir söz deyən deyiləm. Amma inanın ki, o şərə, böhtana məni məcbur elədilər. Günlərlə it əzabı verdilər. Ac-susuz qoydular, istədikləri iltizamı almamış rahat buraxmadılar... Önünüzdə diz çökürəm,

iradəmdən asılı olmayan qəbahətimi bağışlayın.

Professor onu eşitmək belə istəmədi.

– Üzrün günahından betərdi sənin! Sürük gözümün qabağından. Çəkdiyin nəfəs, udduğun hava da saxtadı.

Əfsun qımıldanmadı. Cəmil İmanlı yana çönüb yaxınlığındakı cavanlara əsəbi əmr etdi:

– Götürün bu sırtığı atın aşağı! Onun bizim cərgəmizdə görünməyi nöqsandı. Adımızı batırır!

Cavanlar əmri icraya başlayan anda kim isə Əfsunun tərəfini saxladı:

– Sakit olun, professor. Bu oğlan bizə lazımlı adamdı. Xeyriyyəçidi. Müdafiə fondumuza bir neçə dəfə iri məbləğdə pul köçürüb.

Cəmil İmanlı sakitləşmək əvəzinə bir az da kükrədi:

– Lazımlı adam yox, arzu olunmaz adamdı bu! İqtidar agentidi. Belələrini müxtəlif yollar, vasitələrlə içərimizə ötürüb bizi parçalamaq, daxildən zərbə endirmək niyyətindədirlər. Ehtiyatı əldən verməməliyik!

– Orası doğrudu, professor, ayıq-sayıq olmalıyıq. Amma ayıq-sayıqlığın da əndazəsi var. Kiçik qüsurlarına görə adamları özümüzdən uzaqlaşdırsaq, ümumi işimizə xələl gələr. Bu saat əsas vəzifə bütün əhalini ətrafımıza toplayıb, yumruq kimi birləşdirməkdir. Saf-çürük sonranın tədbiridi.

Cəmil İmanlı başını bulayıb, sərt təkzib verdi:

– Sonra çətin olacaq! Bu üzüyumşaqlıq bizə baha oturacaq. Dələduzları, oğru-əyriləri, lotu-potuları sıralarımızdan təmizləmək ciddi problemə çevriləcək. Tarix bizə ibrət dərsidir. Bütün inqilablar daxildən zəiflədilib.

Əfsuna başqa qəhmərçi də tapıldı:

– Professor, yaxşı olardı yaxın keçmişimizə də xəyalən nəzər salaq. Proletar inqilabının təcrübələri hələ xatirəmizdədi. Məktəb dərsliklərindən, bədii əsərlərdən oxuduqlarımızdan əlavə, babalarımızın söylədiklərini də unutmamışıq. Bolşeviklər o problemi asanlıqla həll elədilər.

Cəmil İmanlı kinayəsiz ötüşmədi:

– Tuthatutları, günahsız edamları, məhkəməsiz qətlləri,

repressiyaları deyirsiz?!

Daha bir qəhmərçi inadlı cavab verdi:

– Qələbə qurbanlarsız olmur, professor!

Professor məyus-məyus susdu.

**2.**

Əfsun Zamanlı tərslik etmədi, səhnədən öz xoşu ilə düşdü. Bir az aralanmışdı ki, Durna xanımı mitinqçilərin ön sırasında gördü. Özünü ona yetirməyə can atdı. Nə üçün? Köhnə münasibəti təzələməkmi istəyirdi? Yaxud özündəki yeniliyi, maddi imkanlarının aşıb-daşdığını, vəziyyətinin yaxşılığını nümayiş etdirib, acıqmı verəcəkdi? Heç nə aydın deyildi.

Durna xanımın yanında əmisi qızı Süsənbər və balaca Fərəh də vardı. Əfsun məqam gözlədi. İmkan yaranan kimi, irəli keçib Durna xanımla qabaq-qənşər dayandı. Salamlaşıb:

– Pəh-pəh! Maşallah olsun, – dedi, – siyasi məsələlərdə qadınlarımız kişilərdən geri qalmırlar. Min-min təşəkkürlər!

Durna xanım onu görüb səksəkələndi:

– Bismillah! Bu zəhləm getmiş yenə hardan peyda oldu? – pıçıldayıb, təşvişlə Süsənin böyrünə sığındı. Əmisi qızına yalvardı: – Sənə qurban olum, Süsən, qov onu burdan!

Süsənbər heç nə anlamadı. Əfsunu tanımırdı.

– Kimi qovum, əmiqızı? Sənə nə oldu? Bət-bənizin niyə qaçdı?

Əfsun bir addım da irəli gəldi. Durna xanımı qılıqladı:

– Qovdurmağa tələsmə, Durna xanım. Eşit nə deyirəm...

– Heç nə eşitmək istəmirəm! – Durna xanım nifrətin son həddi ilə çımxırdı. – Nə deyəcəyinlə maraqlanmıram. Rahat qoy məni!

Əfsun şitəngi-şitəngi irişdi.

– Mən əsəbiləşdirici söz demirəm, Durna xanım, yalnız qibtə hissimi söyləyirəm. Səni bu fəalların önündə görməyimə şad oldum, fəxarət duydum.

Süsənbər Əfsunu adi sataşqana, qabaqkəsən şorgözə bənzətdi. Boz-boz dedi:

– Bəli, biz qadınlar beləyik! Yeri gələndə, böyük qəhrəmanlıqlar da göstərənlərimiz çoxdur. Tomrisləri, Nüşabələri, Nigarları, Həcərləri və başqalarını yadınıza salın!

Əfsunun alt dodağı qaçdı. Bicərtək təbəssüm ağzının bir ucunu yüngülcə yaladı.

– Tariximizi mən də pis bilmirəm, bacı, – dedi. – Müasir qadınlarımız keçmişlərdəki igid, hünərvər qadınlarımızdan heç də geri qalmırlar, onlardan qabağa gediblər. Mən bunu mübaliğəsiz deyirəm. Dastan və rəvayətlərimizdəki cəsur ana-bacılarımızın ənənəsini davam etdirirlər.

Süsənbər əlavə nəsə deməyə hazırlaşdı. Durna xanım mane oldu:

– Baş qoşma, qoy itilsin!

Əfsun əl çəkmədi.

– Nahaq yerə cinnənirsən, Durna xanım. Mən xətirə dəyəsi söz demədim. İctimai işlərdəki iştirakınızı təqdir elədim.

Durna xanım üzünü kənara çevirdi. Onu yad adam saydığını, tanımaq istəmədiyini bildirmək üçün "siz" ifadəsinə keçib, bir az da sərt danışdı:

– Kişiliyiniz çatsın! Adama söz bir dəfə deyilir. Mən son qərarımı sizə çoxdan bildirmişəm. Bu dərəcədə sırtıqlıq, irsizlik, həyasızlıq olmaz!

Əfsun həqarətləri də qıcıqsız qarşıladı:

– Mənim səndən heç bir təmənnam, umacağım yoxdur, Durna xanım! O sarıdan tam arxayın ol, ürəyinə başqa şey gətirmə. Sadəcə, görüşüb əhvallaşmaq, həm də borcumu qaytarmaq istədim.

– Nə borc?!

Əfsun cavabdan qabaq, pencəyinin qoltuq cibindən pul çıxartdı, yekəxana əda ilə Durna xanıma uzatdı.

– Vəziyyətimin hədsiz ağır, heç kəsdən köməyim olmadığı vaxt mənə rəhmin gəlmişdi, pul vermişdin. O zaman bu böyük pul idi. Məni acından ölməyə qoymadı... Onu qaytarmağa gəlmişəm.

– Onu mən borc kimi yox, qızımın başının sadağası vermişdim.

– Olsun sadağa, lap dilənçi payı! Götür xahiş eləyirəm, o pul mənə xeyir-bərəkət gətirdi. Əlin yüngül imiş. Kasıbçılığın daşını, sağlığına, birkərəmlik atmışam. İndi bu ölkədə beş pullu kişi varsa, biri mənəm!

Durna xanım ona nifrətlə arxa çevirdi. Süsənbər məğrur-

məğrur dedi:

– Əmiqızım verdiyini geri götürmür. Allaha şükür, maddi imkanı çoxlarından yaxşıdı. Bir də ki, ulu adətimiz var: nəzir-niyaz üçün verilən pul borc sayılmır!

Əfsun Durna xanıma təkrar üz tutdu:

– Çox təvəqqe eləyirəm, götür. Məni xəcalətli qoyma. Özünə gərək olmasa da kasıb-kusubun birinə verərsən. Əlindəki yüngüllük bəlkə ona da bərəkət gətirdi. O da ömrü boyu duaçın olar.

Durna xanım əsəbi halda Süsənbərin qoluna girdi. Balaca Fərəhi qabağına qatıb izdihamın başqa səmtinə çəkildi.

Əfsun yerindən tərpənmədi. Bir neçə an sakit və məğrur dayandı. Sonra ovcundakı pulu hirslə büküb-bürmələdi; Durna xanımın dalınca tolazladı.

– Al, gəldi! Belə pullar məndə xəzəl kimidi, qoy bu da mənim başımın sadağası olsun!

Yumurlanmış pul adamlardan aralıda yerə düşüb top təkin diyirləndi. Haradansa, kir-pas içində bir uşaq peyda oldu, pulun ardınca çaparaq yüyürdü. Cəld götürüb ildırım sürəti ilə gözdən itdi. Kiçikyaşlı bu uşağın qeyri-adi çevikliyi ətrafdakı insanlarda gülüş doğurdu. Əfsunun özü də ləzzətlə uğundu.

**3.**

Durna xanımgil mitinqin sonuna qalmadılar. Meydanı tez tərk etdilər.

Birinci dəfə idi Durna xanım belə tələsmişdi, bütün çıxışları dinləməyə hövsələsi çatmamışdı. O, adətən, ən axıra qalırdı. Natiqlərin hamısına səbirlə qulaq asırdı. Ən zəif, ən maraqsız söz yığınlarına da diqqət kəsilirdi. Ertəsi gün kitabxanada iş yoldaşları ilə fikrini bölüşür, çıxışlara münasibətini bildirir; bəzilərini təqdir edirdi, bəzilərini isə tənqid.

Durna xanım istiqlal hərəkatına lap əvvəldən qoşulmuşdu. Ötən əsrin səksəninci illərinin axırlarından milli oyanış, özünə qayıdış hissləri güclənəndə, xalqın keçmişinə, adət-ənənələrinə, müstəqillik uğrundakı çarpışmalarda göstərilmiş qəhrəmanlıqlara maraq hamıda artdı. Gənclər də, orta yaşlılar da, qocalar da tarixi kitabları, məxfi sənədləri əldə edib oxumağı, hər şeydən hali olmağı özlərinə

ciddi məqsəd seçdilər. Ajiotaj başlandı, yeni-yeni bilgilərə, məlumatlara aclıq duyuldu. Vətən sevgisi hər sevgini üstələdi. Kitabxana işçilərinin həm zəhməti, həm də hörməti birə-beş böyüdü. Sifarişlərin, tələblərin sayı yüz minləri, milyonları ötdü.

Durna xanımın da kitabxanada işi başından aşdı; lazımlı kitabların, arxiv sənədlərinin tapılmasında, sifarişçilərin razı salınmasında o, xüsusilə fərqləndi. Müxalifətçilərin ehtiramını qazandı. Eyni zamanda da əldə etdiyi dəyərli kitablarla, qiymətli sənədlərlə özü də tanış olub, daxilən dəyişdi. Mövcud quruluşun barışmaz əleyhdarlarından birinə çevrildi. Siyasi-ictimai yığıncaqlara, kütləvi toplantılara, mitinqlərə müntəzəm getdi.

Burası çox qəribə idi ki, əri Bəhlul Ağazadə dövlət idarəsində məsul vəzifə daşıyırdı. Siyasi xətt icraçılarından sayılırdı. Amma arvadının ictimai işlərindən xəbərdar ola-ola, maneçilik törətmir, narazılıq bildirmirdi.

Bu gün isə qanı möhkəm qaralmışdı. Əfsunla nagahan rastlaşması Durna xanımın xoş ovqatını ovsanatdan çıxartmışdı. Səbrini, hövsələsini tamam tükətmişdi. Köhnə günahlarının ruhi sarsıntıları təzələnmiş, canına qor doldurmuşdu. Yanındakı əmisi qızını da, ciyərparası balaca Fərəhi də unutmuşdu. Xəyalən özü-özü ilə danışırdı. Gah Əfsunu – əzablarının səbəbkarını söyür, lənətləyir; gah da Allaha asılanırdı ki, o şeytansifəti ona nə üçün urcah eləyib, biabırçı babala batırdı...

Süsənbər əmisi qızının könül ağrılarını sezmişdi. Onun əsəbi yerişindən, qaçqın bənizindən, qaşlarının sıx çatılmasından duyuq düşmüşdü. İzdihamdan aralanan, səs-küy seyrələn kimi gərgin sükutu pozdu:

– Əmiqızı, görürəm, çox dilxorsan. Kim idi kefimizə soğan çərtən, o sırtıq oğlan?

Durna xanım xəyaldan ayıldı.

– Bəs tanımadın?

– Yox , tanımadım. Ancaq şübhələndim.

– Nədən şübhələndin?

– Gümanım, Bəhlul qardaşla sənin arana girən, məhəbbət oyunu oynayana getdi.

– Yanılmırsan. – Durna xanım sinəsinə sallanmış başını azacıq dikəltdi. Yanğılı köks ötürdü. – O köpək oğluydu!

Araya təzə sükut çökdü. Süsənbər bekaraca yırğalandı. Fikirli-fikirli dilləndi:

– Diqqətim səndəydi. Söhbət zamanı heç bir dəfə də başını qaldırıb onun murdar üzünə baxmadın.

Durna xanım içinin qeyzini üzə çıxartdı:

– Mürdəşir yusun onun üzünü! Baxılası üzümü var, baxasan?!

Süsənbər məzəmmətlə:

– Eh, əmiqızı, – dedi, – hələ də başa düşəmmirəm, sən onun nəyinə uymuşdun. Yar-yaraşıqda, görkəmdə, boy-buxunda Bəhlul qardaşın əlinə su tökməyə də yaramır. Hələ Bəhlul qardaşdakı böyük ürəyi, yüksək mədəniyyəti, nəcib keyfiyyətləri demirəm.

Durna xanım uzun nəfəs dərdi:

– O məsələ mənim özüm üçün də qaranlıqdı, Süsən. Sonralar bu barədə çox düşünmüşəm. Özüm-özümü çox qınamışam. Bax, elə indi də onu fikirləşirdim...

Süsənbər təəssüfləndi:

– Məhəbbətin gözü kor olur, deyiblər.

Durna xanım kəskin etiraz etdi:

– O məhəbbət deyildi, Süsən! O nə isə bir ayrı tanrı bəlasıydı. Məni hamının yanında xar elədi... Ehh, sovxa bəxtimə o rüsvayçı günlər də yazılıbmış!

Sükut təkrarlandı. Durna xanımın pıçıltıya bənzər qəmgin səsi ala-çula eşidildi:

– İnan mənə, Süsən, o, insan yox, iblis törəməsidi. Üzündə şeytan tükü var, ovsunlayır adamı. Dili də ki şipşirin. Məni təki axmaq, sadəlövh qadınların qəlbinə çox asanlıqla girir. Duyuram ki, onun qurbanlıq qoyunu təkcə mən deyiləm.

Süsənbər heyfsindi:

– O məsələ səni çox alçaltdı, əmiqızı, həddindən çox! Öyüncəklik düşməsin, sənin tərəfini təkcə mən saxladım.

– Bunu yaxşı bilirəm... – Durna xanım minnətdarlıq üçün Süsənbərin çiynini sığalladı. – Xəstə yatan vaxtımda da qohumlardan heç kəs məni itirib-axtarmadı. Yalnız sən yetdin hayıma-hoyuma. Göydə Allah, yerdə sən oldun köməyim. Əmim qızı olsan da doğma bacıdan yüz dəfə artıq qaldın qayğıma. Adın həmişə dilimin

ucunda, əzbərimdədi. Hər gün alqış eləyirəm sənə. Bəhlulumla yenidən qovuşmağıma, ruhi əzablarıma son qoyulmasına da səbəbkar səni sayıram. Bu xeyirxahlığın savabı sənin özünə də, ərinə də, balalarına da bəsdi. Ulu tanrı xoş günləri başından yağdırsın!

Süsənbər təvazö ilə silkələndi.

– Ayrı nə cürə ola bilərdi, əmiqızı?! Axı, mən uşaqlıqdan çox istəmişəm səni. Doğma bacılarımla sənə fərq qoymamışam... Orası da düzdü ki, hamının gözündən düşmüşdün. Bütün qohum-əqrəba sənə nifrət eləyirdi. Elə indinin özündə də köhnə, üzdəniraq o hərəkətini sənə bağışlamayanlar çoxdu.

Durna xanım dərin, inilti ilə ah çəkdi.

– Ahh, Süsən, əlbəttə, bağışlamazlar. Fahişəliyə bərabər murdarlığı kim bəyənər?! Mən heç kəsdən incimirəm. Heç kəsə umu-küsü bəsləmirəm. Buna heç haqqım da çatmır. Öz cəzamdı, çəkməliyəm. Ancaq sən o biabırçılığın törəmə səbəbindən halisən. Sonsuzluq mərəzi idi ağlımı çaşdıran. Hamının yanında üzüqaraydım. Doğub-törəməzlik baş qaxıncımıydı. Baldızlarım durub-oturub bunu şapalaq kimi üzümə çırpırdılar, ürəyimə iynə-sancaq suncurdular, çarəm kəsildi... Heç kəs məni başa düşmədi, bircə səndən savayı.

– Hə, mən hər şeydən halıydım, – Süsənbər astaca təsdiqlədi. – Ona görə də hamı səni şortu adlandıranda mən razılaşmırdım. Bir çoxları ilə üz-göz olurdum. Səni təmizə çıxartmağa çalışırdım... Eh, nə isə, gəl palan içi eşələməyək. Onları yada salıb, təzədən ürək bulandırmağa dəyməz. Nəhs günlər çoxdan arxada qalıb. İndi daha xoşbəxtsən. Sevimli ərin yanında, arzuladığın övlad böyründə. Daha nə dərdin var?! Fərəh qızımız, maşallah, böyüyüb, bu gün-sabah məktəbə ayaq açacaq.

Balaca Fərəh böyüklərin xısın-xısın söhbətindən nəsə hiss etmişdi. Gah çönüb anasına, gah da xalası Süsənbərə hərdən-hərdən, altdan-yuxarı boylanırdı. Süsənbər şirinliklə onun saçlarını tumarladı. Səsinə şaqraq ahəng qatdı:

– Süsən xalası ona qəşəng, bəzəkli məktəb çantası alacaq, gül-çiçəklə məktəbə yola salacaq. Fərəh bala da əlaçı şagird olub, bizi fərəhləndirəcək. Elədi?

Qız kövrəkcə qımışıb, başını tərpətdi. Süsənbər aşağı əyilib qızı

marçıltı ilə öpdü. Söhbəti yarı təəssüf, yarı şadyanalıqla tamamladı:

– İllər yaman sürətlə ötür, əmiqızı. Bu şirin balanı filan yerdən (adını qəsdən dilə gətirmədi) götürəndə necəydi, indi bax, necədi. Həftənin, ayın, fəslin nə sayaq keçdiyindən xəbər tutmuruq. Səhərin açılmasıynan axşam qaranlığının arası uzun sürmür. İşə-gücə, ev-eşik qayğılarına başımız elə qarışır ki, bir də baxıb görürük yatı vədəsidi. Ömrümüz də beləcə, hiss eləmədən ötür. Onda ayılacağıq ki, balaların toy məclislərinə – gəlin gətirməyə, qız köçürməyə hazırlaşırıq.

Durna xanımın nazik qaşlarının ucları diklənmişdi. Xəyalı uzaqlara uçmuşdu. Xeyli qüssəli dilləndi:

– Mənə o günlər çətin ki, nəsib olar, Süsən. Mən sən deyən bəxtəvərlərdən deyiləm!

Həlim təbiətli Süsənbər cinnəndi. Əmisi qızını sərt-sərt danladı:

– Nəs-nəs danışma bircə! Ağzını xeyirliyə aç. Sən o şən günləri mütləq görəcəksən. Həyata təzədən qayıdıbsan. Bəlkə də o lənətli, nifrətli davranışın olmasaydı, uşaq sarıdan xoşbaxtlığa tamarzı qalardın. İlahinin eləyəcəyi işi heç bir bəndə bilmir!

Durna xanım başını buladı. Qaşları iki-üç dəfə düyülüb-açıldı. Küskün-küskün:

– Yox, Süsən, – dedi, – ürəyimə damıb, mən o biabırçı davranışımın, xəcalətli hərəkətimin cəzasını mütləq çəkəcəyəm!

– Çəkibsən də! Ölümlə əlləşibsən.

– O azdı! Məni irəlidə ən ağır cəza gözləyir. Tanrının mənə qəzəbi soyumayıb. Duyuram bunu.

– Bəsdi, sən Allah!.. Yox yerdən özünə dərd axtarma! – Süsənbər hirsini birdən-birə acı qəhqəhə ilə əvəzlədi: – Ha, ha, ha, əmiqızı, öz aramızdı, sən əməlli-başlı xərifləyibsən, ağlın kütləşib. Başqaları neçə-neçə kişinin altından çıxır, heç nəyi vecinə almır. Sən isə bir neçə il bundan qabaq fırıldaqçının, yaramaz bir lotunun toruna düşübsən, xam xəyala aldanıbsan, hələ də onun peşmançılığını çəkirsən. Unut o qarauğur hadisəni birdəfəlik!

Durna xanım dərin köks ötürdü.

– Unut deməklə heç nə unudulmur, Süsən. Özüm də istəyirəm bir daş altına, bir daş üstünə qoyum, bacarmıram. Vicdan qarşısında təmizlənmək çox çətinmiş! Bəhlul kimi tanrı-peyğəmbər övladına

xəyanətim güvə qurdu kimi ürəyimi gizlin-gizlin hey gəmirir.

Süsənbər inadla:

– Əfəl olma! – dedi, – ağlını başına yığ. Sən səhvini başa düşüb, düz yola qayıdıbsan. Düz yola qayıdanları Allah bağışlayır. Onları sonradan daha xoşbəxt eləyir. Yüz faiz inanıram ki, bu Fərəh balanın toyunu sağlam canla görəcəksən. Bəhlul qardaşla qoşa qarıyıb nəvə laylası çalacaqsan.

Durna xanımın köksü bərk körükləndi. Çöhrəsindən qara bulud kölgəsi keçdi.

– Qorxuram, Süsən, qorxuram o arzum gözümdə qalsın, – deyib, bir anlıq fasilə verdi. – Axır vaxtlar Bəhlulun sağlamlığında ciddi problemlər yaranıb. Ürəyi də, mədəsi də onu çox incidir. Tez-tez həkimə müraciət etməli olur. Bunun günahkarı mənəm. Başımdan böyük o qələtimlə əzab-əziyyətə saldım onu. Ürəyi qəm-qüssə, dərd-azar yuvasına döndü. Uzun müddət tək-tənha yaşadı. Qulluğunda duran, xörək-çörəyini hazırlayan olmadı. Çox vaxt ac-susuz qaldı. Mədəsinə korluq verdi. Bu səbəbdən də xəstəlik tapdı. Mənə görə qohumları da, tanış-bilişləri də ondan uzaqlaşdılar, yalqız qaldı. Yenidən məni qəbul etməyi, bir yasdığa təzədən baş qoymağı da vəziyyətini lap ağırlaşdırdı. Bacıları üsyana başladılar. İsmarıcla söyünc-qaxınc göndərdilər. Əlaqələrini tamam kəsdilər. Anası öləndə də bildirmədilər, onsuz basdırdılar. Bu saymazlıq, heç kim yerinə qoyulmazlıq Bəhlula həddsiz pis təsir elədi. Durub-oturub hey onun fikrini çəkdi. O qiymətsizlik günü bu gün də onu fikirləndirir. Məndən gizlətməyə çalışsa da ürəyini oxuyuram. El qınağı, tanış-biliş tən-töhməti hər dərddən yamandı. Adamı içindən çürüdür... Hər şeyini mənə qurban verdi. Onun başına bir iş gəlsə, heç bilmirəm neyləyəcəm. Çox yəqin ki, özümü o, ölməmişdən öldürəcəm.

Süsənbər narazılıqla burnunu qırışdırdı:

– Tutalım ki, yenə səfehləyib, ağlını çaşıb özünü öldürdün, bəs bu qız? – Fərəhi göstərdi. – Onun taleyi necə olacaq?

– O da mənə əlavə dərd yüküdü, Süsən. – Durna xanım, nəfəsi çatışmırmış kimi fısıldadı. – Böyük məsuliyyət altına girib, onu qəyyumluğa götürdük. Sonrası məni çox narahat eləyir.

– İndi nədi səni dərdləndirən? Narahat eləyən?

– Öhdəliyimizi axıracan yerinə yetirməyi bacara bilməməyimiz!.. – Durna xanım yenidən pıçıltıya keçdi. Qızın eşitməməsi üçün ağzını Süsənbərin qulağına yaxınlaşdırdı. – Bəhlulun kefsizliyindən gözüm su içmir, Süsən, ciddi xəstəliyə oxşayır. Özü də çox qayğılı hərlənir, nəyisə gizlədir məndən. Allah eləməmiş, gümanım düz çıxsa, mənim halım-günüm göy əskiyə düyülər. Bu körpənin qarşısında xəcalətli qalaram.

Süsənbər dilini nırçıldatdı. Əmisi qızını möhkəm yamanladı:

– Vallah, səni anlaya bilmirəm, əmiqızı, heç cürə başa düşəmmirəm. Bir zamanlar sonsuzluq mərəzi səni incidirdi, ününü ərşə dirəndirirdi, ölüb-dirilirdin. Allaha çox şükür, o məsələn düzəldi. Evinə şənlik, şadlıq gəldi. Qızını öz canından artıq istəyirsən. Yaxşı da eləyirsən, istəniləsi baladı. Bu yandan da boş-boş şəklərə, pis-pis gümanlara düşürsən. Bəsdi, qurtar də vasvasılıqlarını!

– Vasvasılıq deyil bunlar, Süsən. Sənnən dərdimi bölüşürəm. Məni gümanlara salan, gecəmi gündüzümə qatan kimsəsiz bir insan aqibətidi. Axı, biz o körpəni xoşbəxt etmək, ağ günlərə çıxartmaq üçün öhdəlik götürmüşük, cavabdehlik daşıyırıq. Ümidini bizə bağlamış tifilin əlini çörəyə çatdırmamış həyat qayğıları ilə tək, üz-üzə qoymaq...

– Sus! – Süsənbər əli ilə əmisi qızının ağzını yumdu. – Səni kimisinə deyiblər: kəsək oturub daşın gününü ağlayır. Nə olub Bəhlul qardaşa? Maşallah, lap yaxşıdı. Arada xəstələnmək hamıda olur. Hər şeydən şəkkə düşmək sənin köhnə peşəndi. Özün boyda dərd dağarcığısan!

Durna xanım pıçıltısını lap alçaq dabana endirdi:

– Qınama məni, Süsən, bu çox düşünməli məsələdi. Öz doğma övladım olsaydı, öz qarnımdan çıxsaydı, dərd yarıydı. Bir o qədər vecimə almazdım. Vədə xilaflıq sənə asan görünməsin. Əmanəti Allah ümidinə qoymaq ağırdan-ağır şeydir.

Süsənbər fikri yayındırmaq qəsdi ilə araya şuxluq qatdı:

– Ağlına gələnlər dağlara, daşlara gəlsin, əmiqızı! Nə Bəhlul qardaş pis azar tapacaq, nə sən özünü öldürəcəksən, nə də qəşəng balan Allah ümidinə qalacaq. Sarsaq-sarsaq fikirləri qov başından.

Yaxşı-yaxşı işlər barədə düşün. Xoş hisslər, duyğularla yaşa. Eşitmirdinmi mitinqdə necə gözəl gələcəkdən danışırdılar; xalqımıza qat-qat şən günlər, firavan həyat vəd eləyirdilər? Müstəqil dövlət, ayrıca respublika olacağıq. Azadlıq qazanıb cənnətdə yaşayacağıq. Torpaqlarımızın altı da, üstü də olduqca zəngindi. Ən dəyərli zinətlər, ən bahalı nemətlərlə doludu. Heç nədən korluğumuz olmayacaq. Təkcə neftimizin gəliri ilə küçələrimizə asfalt yerinə qızıl döşəyəcəyik. Özümüzü o xoş günlərə hazırlamalıyıq... sən isə yox yerdən qan qaraldırsan.

Durna xanım siyasətdən yan ötdü. Gözlərini ətrafda yorğun-yorğun dolandırıb, mövzunu dəyişdi:

– Qılçalarım yaman sızıldayır. Oturmağa bir yer olsaydı, beş-on dəqiqə dincimizi alardıq.

– Heç məni demirsən, – Süsənbər əməllicə zarıdı. – Topuqlarım zoq-zoq zoqquldayır. Zarafat deyil, gör neçə saatdı ayaq üstəyik. Yazıq ayaqlar sızıldayar, hələ o yana da keçər!

Durna xanım qəmgin-qəmgin qımışıb Fərəhi göstərdi:

– Biz birtəhər dözərik, binəva qız lap əldən düşüb. Gərək özümlə gətirməyəydim.

– Onu nahaq gətiribsən. Mitinq uşaq yeri deyil. – Süsənbər qıza doğru bir də əyildi. Üzündən təkrar öpüb, şirin-şirin soruşdu:
– Necəsən, mənim maralım?.. Çoxmu yorulubsan?

Fərəh ağlamaq həddində mızıldandı:

– Hə, yeriyə bilmirəm.

Bu vaxt uzaqda avtobus göründü. Süsənbər qızı qucağına hop götürüb, Durna xanımı tələsdirdi:

– Cəld ol, bəxtimizdən avtobus özünü yetirir. Biz tərəfə gedəndi. Geciksək, ən azı yarım saat gözləməli olacağıq.

Dabanbasaraq dayanacağa yüyürdülər.

## 4.

Əfsun Zamanlı izdiham içində dilxor-dilxor vurnuxdu. Ovqatı çox təlx idi. Dalbadal təhqirlə, sayılmazlıqla qarşılaşmışdı. Əvvəlcə professor Cəmil İmanlının həqarətli sözlərini sinirmişdi,

sonra da Durna xanımın nifrətli etinasızlığının acısını dadmışdı. Dilxorçuluğunu nə ilə isə unutmaq hayındaydı. Xapa-xapdan Fərid Cəbizadə əlinə keçdi. Salam-kəlamsız sorğu-suala tutdu:

– Ə, əziz dost, sən də burdasan?

Kobud cavab aldı:

– Yaxşı görürsən ki, burdayam!

Əfsun qılığa keçdi:

– Ə, xətrinə dəyməsin, demək istəyirəm ki, sən hara, bura hara? Nə əcəb mitinqə gəlibsən?

– Sən gələ bilərsən, mən gələmmərəm?

– Çox dambat cavab verirsən, ə. Vəzifən böyüyüb-nədi?

– Dambatlıq, yekəxanalıq gözü ayağının altını seçməyənlərdə olur. Onu özündə axtar.

– Ə, sən öl, nəsə var səndə. Höcət danışırsan. Əvvəllər heç belə deyildin. Adamla adam dilində kəlmə kəsirdin.

– Nə əkərsən, onu da biçərsən! – Fərid kinayəsinin mənasını açdı: – özündən xəbərin yoxdu sənin. Axır zamanlar çox ədabazlaşıbsan. Əlləri cibində forslu-forslu gəzirsən. Adamı saymaq nədi, salam vermək də istəmirsən. Elə indi də salamı çox gördün mənə.

Əfsun könülsüz gülümsündü.

– Başa düşdüm səhvimi... gərək bağışlayasan. Qanım bir az qaradı.

Fərid də istehzalı qımışdı.

– Məlumatım var qanının qaralığından. Gördüm qadınlar səni necə saymadılar. Heç adam yerinə də qoymadılar... Biri mənə tanış gəldi. Köhnə cananına oxşatdım – yataqxanamıza gətirdiyinə.

– Afərin zəndinə! Yaddaşın yaxşıdı. Aradan gör neçə il keçib, yanılmırsan.

– Az dəyişib. Yenə də göz-könül oxşayandı... Bəs niyə saymadı səni? Danışmaq belə istəmirdi. Üzünü yana tuturdu.

– Hardan bilirsən, ə, bunu?

– Necə hardan? Gözlərimlə görüb, qulaqlarımla eşidirdim.

– Bizi güdürdün, hə?

– Nəyimə lazımdı güdüm sizi... Təsadüfən o qadınların arxasında dayanmışdım... məni görməməzliyə vurdun.

– Yox, ə! Görməmişəm, sən öl. Sadəcə başım qarışıq olub, incimə.

– Sənin nəyindən inciyəcəm? Onsuz da bilirəm ipi qırıq adamsan. Heç şübhə eləmirəm ki, o qadınla da ipi qırıbsan.

– İpini özü qırdı. Elə bildi ona həmişəlik ər olacam. Başa düşmədi ki, bu mümkünsüz məsələdi.

– Heyfim gəldi o qadına. Min təəssüf ki, aldanıb sənə.

– Ağlı olaydı, aldanmayaydı. Günah özündədi.

– Dəhşətli adamsan! – Fərid ona kəskin hiddətlə baxdı. – Sənə rast gələn iki dəfə sevinər. İlk tanışlıqda və səndən yaxasını qurtaranda!

Əfsun cırnamadı. Sülhlə ötüşməyə çalışdı:

– Ə, səfehləmə! Qurd qazanının ağzını açma yenə. Bundansa, gəl, gedək xudmani bir yerdə oturub o xoşbəxt tələbəlik illərini yadımıza salaq. Çoxdandı səninlə üz-üzə oturub söhbətləşmirik.

– Nədən söhbət eləyəcəyik? Bizim söhbətlərimiz qurtarıb artıq.

Əfsun fəndgirliklə Fəridin qoluna girdi.

– Ə, yerə salma sözümü. Sənə qonaqlıq borcum var, gedək ürəyin istəyən əla bir restoranda oturaq kefə baxaq. Bu dünyanın dərd-səri bizə qalmayıb.

Fərid qolunu sərtliklə ondan çəkdi.

– Yox, sağ ol. Heç yana getməyəcəm!

Əfsun şappıltı ilə əlini-əlinə vurub, cırnaqcıl-cırnaqcıl güldü.

– Gorun çatdasın, baba! Bu da mənə naz satır! – O sakitləşib Fəridin qoluna yenidən girdi. – Ə, qurtar bu höcəti. Boş yerə söz güləşdirmək dananı qurda yedirtməkdi. Nahar vaxtıdı, hamı fasiləyə çıxır. Gedək, yoldaşlı bir qismət çörək kəsək. Tək darıxıram.

Fərid ciddi imtina etdi:

– Üz vurma, dedim ki, getməyəcəm. İşim çoxdu.

– Ə, nə iş?! Boş qoy onun bir yanını, sovetə can yandırmaq, dəridən-qabıqdan çıxmaq daha havayı şeydi. Axmaqlıqdı.

– Axmaqlıq nə üçün?

– Onun üçün ki... – Başını o tərəf-bu tərəfə qanırıb, camaata işarə vurdu. – Ə, görmürsənmi bu çaxnaşmanı, ictimai təlatümü?!.. Sənin hökumətiyin hay-hayı gedib, vay-vayı qalıb.

Fərid onu pis-pis süzdü.

– Buna görəmi komitədə daha az-az görünürsən? Həftələr, aylarla gəlib-getmirsən.

– Komitəlik heç bir iş yoxdu daha. O da bu gün-sabahlıqdı. Fatihəsi oxunub.

– Onu bədxahlar belə düşünür!

– Bədxahlar niyə? Kor-kor, gör-gördü!

Fərid gerçək cinnəndi. Az qaldı Əfsunun üzünə lomba ilə tüpürsün.

– Üzüdönüklük zatıqırıqların, ipi çürüklərin peşəsidi! Külək həyana əssə o yana çönürlər... Gözünü tutsun komitədən yediyin çörək. Onun hesabına adam oldun. Sur-sinçiyə mindin, cibin pul tanıdı. İndi ona fatihə oxuyursan. Bir utan, yerə gir! – dedi. Və ondan nifrətlə uzaqlaşa-uzaqlaşa, hamının eşidəcəyi tərzdə əlavə etdi: – Sovet hökuməti dayaqları qranitdən olan möhtəşəm qaladı. Gədə-güdələrin hay-küyü, qaraqışqırığı onun bir tükünü də tərpədə bilməz. İt hürər, karvan keçər!

Əfsun qollarını sinəsində çarpazlayıb, şeşmər dayandı. Lovğa-lovğa qıy çəkdi:

– Bəsirət gözün bağlanıb, ay yazıq! Karvan keçən yolun önündə dərin uçurum durur. Oyan qəflətdən. Dövrənə ayıq-sayıq bax. Bu dərəcədə ifrat fanatiklik, mühafizəkarlıq olmaz. Zamanayla ayaqlaşmaq lazımdı!

Fərid aralıdan əlini yellətdi. Qəzəbdən əyilmiş dodaqları hey qımıldandı. Ancaq səsi eşidilmədi, yəqin ki, Əfsunu yağlıca söyürdü.

## 5.

Meydan mikrofonları hələ də gur-gur guruldayırdı. Çıxışlar bitib-tükənmirdi.

Əfsun Zamanlı dəniz kənarına üz tutdu. Sahil ilə tələsmədən addımladı. İlin çox günləri çırpınan, çalxanan Xəzər bu gün quzu kimi sakit idi. Bulvar da boş idi. Gəzintidə heç kəs gözə dəymirdi. Ayrı vaxtlar xəlvət künc-bucaqlarda, diqqətdən kənar oturacaqlarda bir-birinə sığınıb, üzlərini gizlədərək sevişən sütül qız və oğlanlar da görünmürdülər. Hamı mitinqdə idi.

Sahilin daimi sakinləri qağayılar isə, elə bil, çoxalmışdı. Zildən çığırışa-çığırışa uçuşur; gah hündürlərdə, gah alçaqlarda geniş dövrə vurur, hərdən-hərdən də şığıyıb su altına cumurdular. Üzə

çıxanda dimdikləri əksər halda boş olurdu.

Qağayılardan bir qədər gendə, gəzinti həndəvərlərində qarğalar, dolaşalar, göyərçinlər, qumrular ora-bura vurnuxur; nəsə tapıb dənləyir, hərdən yem üstündə dimdikləşirdilər də.

Boz, çəlimsiz sərçələr onlardan aralıda əl-ayağa dolaşır; iri quşların gözlərindən yayınmış xırım-xırda tör-töküntüyə neçəsi birdən cormalaşırdı.

Əfsun əlləri şalvar ciblərində yırğana-yırğana, ac quşların yemaxtarma səhnəsinə tamaşa edə-edə bulvarın nəhayətinə gəldi. Burada ayaq saxladı, fikirləşdi: Neyləsin, hara getsin? Zədələnmiş mənini nə ilə ovundursun? Şən əyləncə tapmasa rahatlana bilməyəcəkdi. Dərhal Ayzenat Mahamovanı xatırladı. Xeyli vaxt idi onunla görüşmürdü. Başı pul toplamaq, bacardıqca çox varlanmaq iştahına bərk qarışdığından şəhvət məsələlərinə həvəsi azalmışdı. Pula hərislik şəhvət hissini üstələmişdi. İndi məqam idi. Canı yanmış, od parçası Ayzenat ilə mükəmməl kefə baxar, aldığı məzəmmətləri unudardı...

“Köpək qızı ayrı candı, yüz cavan qıza, hallı-dulluca gəlinə dəyər. İntim hisslər üçün Allah tək yaradıb onu. Yataqda oynadığı oyunlar adama ləzzət verir. Gedim, bir gecəlik qonağı olum. Hirs acısı ürəyimdən çıxsın”.

O, qərarının təqdiri ilə çiyinlərini tərpətdi. Yol kənarına çıxdı. Müştəri gözləyən taksilərdən könül oxşayanına əyləşib, niyyət ünvanına sürdürdü.

Məlum binanın get-gəlli həyətinə girən dəqiqədə səbrini basdı, birbaşa Ayzenat yaşayan mənzilə yönəlmədi. Təcrübədən bilirdi ki, hövsələsizlik Ayzenatın ayağını yuxarı nərdivana qoyur, məzənnə artırır, gərəksiz işvə-nazı can üzür.

Öncə Mara Abramovaya baş çəkməyi lazım saydı. Yaxşı qarı idi. Evində kirəkeş qaldığı müddətdə ondan Qumaş arvad qədər xoş üz, şirin münasibət görmüşdü. Mehribançılıqla ayrılmışdılar (Hazırda özünün şəxsi evi vardı. Aranı qarışdırıb qaçmağa məcbur olmuş bir ermənidən ucuz qiymətə almışdı. Ürəyi istəyən təmir elətdirmişdi. Ancaq hələlik içinə köçməmişdi. Ev bomboş idi. Gərəkli avadanlıqla bəzədilməmişdi. Bir ayağı rayonlarda olduğundan, qızğın bank

əməliyyatları apardığından bu işi sonraya – arxayın vaxta saxlamışdı. Şəhərə gələndən-gələnə ən yaxşı mehmanxanalarda – lyuks otaqlarda gecələyirdi. Bir də axı, subay-salıx oğlan öz mənzilində neyləyəcəkdi? Heç özünə babat qulluğu da bacarmırdı.)

"Əvvəlcə gedim Mara Abramovadan hal-əhval tutum. Yalqız arvaddı, könlünü açım. Beş-altı ay himayəsində yaşadım, güldən ağır bir sözünü eşitmədim. Bəlkə pul-paraya ehtiyacı var. Bir az xərclik versəm, alqış qazanaram, uğurum xeyir gətirər" – düşündü.

Mara Abramovanı evdə tapmadı. Qapısı bağlı idi. Yüngülvari deyindi: "Bəxtindən küssün! Sidq-ürəklə əl tutmaq, köməklik göstərmək istədim, alınmadı. Deməli, qismətində deyilmiş... Allah məsləhət bilmir!"

Qapıdan aralananda arxadan cingiltili səs eşitdi. Kim isə onu nazlı-nazlı çağırdı. Qanrılıb baxdı. Ayzenat idi. Yenə açıq pəncərə dalında oğrumca dayanmışdı. Şeytan-şeytan qımışırdı.

– Üzünü görək, itkin oğlan! Haralarda ilişib-batmışdın? Niyə gəlib, mübarək üzünü bizə göstərmirdin?!

Əfsun şirin-şəkər sözlərini ondan əsirgəmədi:

– Şəhərdə deyildim, mələyim, – dedi. – Uzaqlardaydım. Sənin üçün hər gün burnumun ucu göynəyirdi.

Ayzenat işvələndi.

– Hımm... Heç oxşamır!

Əfsun boğazını uzadıb çəkə-çəkə and içdi:

– Əziz canın haqqı! Özümün ölmüşümə yaman darıxmışam sənin üçün...

Ayzenat ağız sulandırmaq qəsdi ilə əndamını yır-yır yırğaladı.

– Elə isə, gəl məni gör, dərdimdən öl!.. Ha-ha-haaa!!

Əfsunun tamahı gücləndi. Zalım qızı axır vaxtlar, elə bil, bir az da qəşəngləşmişdi. Adamı özünə təzə maqnit kimi çəkirdi. Əfsun pəncərə önünə bir qırpımda çatdı. Hər iki qolunu içəri uzatdı. Bu hallıca-dulluca qadını elə buradaca qucaqlamağa iştahlandı.

Ayzenat onu umsundurdu. Kişmişi gülüşlə dala çəkildi. Qaşı bir yana getdi, gözü o biri yana.

– Yolu yanılma. Qapı irəlidədi!

Əfsun bir az pərt oldu. Sifətinə xırda qızartı ləkələri çiləndi.

– Bağışla, canım yaman odludu, ağlımı başımdan yenə çıxardıbsan!
Ayzenat şit-şit hihildədi.
– Ağlını başında möhkəm saxla, – dedi. – Sənə sürprizim var. Onu görəndə lap dəli-divanə olacaqsan.
Əfsun sinəsini pəncərəyə dirədi. Yanğılı-yanğılı pıçıldadı:
– Mənim üçün ən yaxşı sürpriz elə sənin özünsən!
– Ha-ha-haaa! – Ayzenat Mahamova anaş kəklik təki qaqq-qaqq qaqqıldadı. – Ona hələ baxarıq... Həsri basma, dolan gəl!
– Qapı açıqdı?
– Yaxşı qonağa o həmişə açıqdı.
– Mən pisəm, bəyəm?
– Gözüm üstə sənin yerin ayrıcadı!
– Mənim də sənə şövqüm tükənməzdi!
– Hi-hi-hii! Vaxt itirmə, cəld ol bir az!
Əfsun qanadlandı. Heç bir dəqiqə keçmədi, astanada nazlanan Mahamova ilə qabaq-qənşər dayandı. Özünü saxlaya bilmədi, dəli hövlü ilə üstünə atıldı, belinə sarmaşdı. Lakin Ayzenat balıq sürüşkənliyi ilə sürüşüb qucaqdan çıxdı. Geriyə işarətlə pıçıldadı:
– Hövsələ elə. Altı aylıq deyilsən! Dedim, axı, sənə sürprizim var.
Əfsun qanadı sınmış quşa döndü, qolları incikliklə yanına sallandı.
– Başa düşmürəm səni... Nə sürpriz?
– Darıxma, indi görəcəksən! – Ayzenat onu dəhlizin yuxarı başına doğru apardı. – Hələ de görüm, cibin doludu, ya boş? O ay parçasının qoynuna girmək haqqını ödəyə biləcəksənmi?
Əfsun xüsusi əda ilə yan ciblərini sığalladı.
– Mənim cibim hər vaxt dolu olur. İllah da sənin yanına gələndə! Təki təriflədiyin gözəl könlümə yatsın.
– Yatacaq könlünə! Xoruz səsi eşitməyən, kişi nəfəsi dadmayannandı. Sütülcə ceyrandı.
– Əvvəlcə görüm, sonra sövdələşək.
– Etirazım yoxdur, gedək bax! Gözlərin qamaşacaq.
– Gözqamaşdıran qıza pulum da, canım da qurbandı!
Ayzenat Mahamova birdən ciddiləşdi. Sövdələşməsini tam rəsmiləşdirdi:
– Bax, ha, təkrar deyirəm, bu qız sən düşünənlərdən deyil, çox

bahalıdı. Böyük bir adam üçün yerin dibindən tapdırıb gətirtmişdim. O adamın vacib işi düşdü araya. Hökumət tapşırığıyla bir neçə günlüyə harasa göndərildi. Sən qabağa keçdin. Belə can dərmanını heç yuxunda da görəmməzsən. Bəri başdan üç yüz dolları sayacaqsan ovcuma. Əgər öz müştərisi ezamiyyətə getməsəydi, məzənnə daha böyük olacaqdı. Səninlə ucuz behləşirəm.

– Razıyam. – Əfsun dözümsüzlədi. – Heç olmasa, aralıdan göstər onu mənə. Amanımı qırma.

– Gəl dalımca!

Mahamova qabağa düşdü. İntim görüş üçün hazırladılmış otağa yaxınlaşdı. Otağın ala-bəzək qapısının tən ortasındakı iri, şüşə deşiyə işarə etdi:

– Buyur bax, gözlərinə su ver!

Əfsun bir gözünü qapı deşiyinə söykəyib, xeyli baxdı. Ayzenat qürrəli-qürrəli xəbər aldı:

– Hə, necədi? Mən deyəndi, ya yox?

– Əladı!

– Bəs nə bilmişdin? – Ayzenat bir az da qürrələndi: – Zərgər dükanının tozu da zər olur!

Əfsun susdu. Bir gözünü çəkib, o biri gözünü deşikdən içəri zillədi. Handan-hana onu sanki işıq cərəyanı vurdu. Bərk silkələnib, geri çəkildi. Sifəti bir neçə rəng aldı. İçəridəki qızı Tamaşaya oxşatmışdı. Əfsun hər iki gözünü yaylıqla silib, deşiyə yeni maraqla yaxınlaşdı. Daha diqqətlə baxdı. Yox, gözləri onu aldatmamışdı. İçəridəki qız, doğrudan da Tamaşa idi. Bir öpüşdən ötrü həşir-qiyamət qoparmış, üzünü cırmaqlayıb yaman günə salmış, onu evdən qovdurmuş o qız idi!

Heyrəti dəhşətlə əvəzləndi. İçini çəkdi. Bu, nə məsələ idi? Nə baş verirdi. O cürə dəlisov, ipə-sapa yatmayan qız belə yerə necə gəlib düşmüşdü? Onu nə aldatmışdı? Kim aldatmışdı?!.. Çətin qavranışlı suallar beynində uc-uca düzülüb, aramsız şimşəklər şiddəti ilə çaxdı. Sol çiyni üstündən qanrılıb Mahamovanı çaşqın-çaşqın süzdü. Qəribə də olsa, şəhvət hissi qəfilcən kütləşmişdi, əhvalı tamam dəyişmişdi. Elə bil, intim görüş üçün alışıb-yanan bayaqkı oğlan deyildi. Nə idi buna səbəb? Qıza yazığımı gəlmişdi? Qumaş

arvaddan gördüyü yaxşılıqlarımı qabağını kəsmişdi? Bilinmədi.

Ayzenat lağlağı ilə pıqqıldadı:

– Nə oldu sənə? Bət-bənizin niyə ağardı? Yoxsa o söz... cavanca qıza girişməyə qorxursan, təpərin çatmır, hə?

Əfsun həyəcanını, nəhayət ki, boğdu. Sualları sərt deyimdə birləşdirdi:

– Mələk kimi bu qızı necə ələ keçiribsiniz? Onu kim gətirib sizin hücrəyə?

Ayzenat Mahamova ikiqat hikkə ilə dilləndi:

– Onun sənə heç bir dəxli yoxdur! Qarışma belə işə. Pulun, təpərin var, gir bu meydana. Yoxdu, xoş getdin. Gəldiyin qapıdan sürüş bayıra!

Əfsun təpgiyə höcətlə cavab verdi:

– Bunun dəxli var mənə! O qızı yaxşı tanıyıram. Xəmiri sıyıq, yüngülxasiyyət qızlardan deyil. Bir də soruşuram: kim və necə gətirib onu bura? Dəqiq bilməliyəm!

Ayzenatı güclü hirs təpədən-dırnağa dingildətdi. Cod-cod dedi:

– Başımı boş yerə ağrıtma! Biz heç kimə, heç nə barədə hesabat vermirik. Dediyimi elə: ya kip-kirimiş muzdu ödə, keç içəri. Ya da dəyib-toxunulmamış, əkil burdan!

Hökmlü təpginin davamı kimi, yan otaqdan kişi öskürəyi eşidildi. Bu nəyə isə xəbərdarlıq idi. Əfsun həsdədi. Həlim, xeyirxah hisslər ürəyində soyudu. Sorğusuna dürüst cavab almayacağını duyub, bir neçə anlıq tərəddüddən sonra nə düşündü, nəyi götür-qoya başladısa, sərənəsi yatdı. Səsini lap alçaq dabana endirib, xahişyana xəbər aldı:

– Qıza başqa əl toxunmayıb ki?

– Bunu əvvəlcədən, sənə sözarası anlatdım ki, bakirədi. İlki sən olacaqsan. – Ayzenat da xeyli yumşaldı. Ancaq amiranəliyində davam etdi: – Vaxtımı alma, mənim ayrı işlərim də var. Səndən savayı da gələn-gedənlərim olacaq, ya elə, ya belə, çıx aradan!

Əfsun qarışıq hisslər burulğanından tez ayrıldı. Qıza canıyananlığı, mənbəyi heç özünə də bəlli olmayan humanist duyğuları ötüb-keçdi. Onların yerini əvvəlki çılğın ehtiras tutdu. Tamaşa ilə bağlı uğursuzluqları, ona qarşı etinasızlıqlar yadına düşdü. Xə-

yalən özünü acı-acı məzəmmətlədi: “Əşi, mənə nə var kim gətirib, necə gətirib onu bura. Hazırca məqamdı, gedim ürəyim istəyən kamımı alım ondan. Bir vaxtlar məni saymadı, dirsək göstərdi, umsuq qoydu. İndi onların acığını yaxşıca çıxaram. Sübut eləyərəm ki, sən mənim qismətimdəsən. Çox atlanıb-düşdün, naz-qəmzən yerə-göyə sığmadı. Gördün ki, axırda yenə mənim ağuşumda özünə yer tapdın... Hə, doğrudan-doğruya alın yazısıdı bu. Onunla kefə baxmağı ilahi mənim alnıma yazıb. Sonrası necə olacaq, hansı əllərə düşəcək, həyatı hansı sonluqla bitəcək, bunlar mənlik deyil. Özü bilər, Allahı bilər! Bəxtimdən razı qalmalıyam ki, arzuma çatıram, məqsədimə qovuşuram. Onun üçün verəcəyim muzd qurban olsun alacağım həzzə, çəkəcəyim ləzzətə. Lap min dollar da istəsəydilər, çək-çevirsiz verərdim. İnsan bir dəfə gəlir dünyaya. Heç bir kefdən, əyləncədən, zövq-səfadan imtina etməməlidi. Şən və şad yaşamalıdı. Əslində, pul elə belə-belə məqsədlər üçün qazanılır. Hansısa saxlanclarda, banklarda yığılıb kimlərəsə qalmaq üçün yox! Humanistlik, kiminsə taleyinə acımaq da havayı şeydi. Bəlkə də ən böyük ağılsızlıqdı. Əlimə imkan keçib, kefimi ürəyimcə sürməliyəm!”

– Bağışla, Ayzenat xanım, şadlığına şıllaq atır, məni kimisinə deyiblər. Fikrim dolaşmışdı. Üzr istəyirəm.

Mahamovanın sallaq qaşları tərəzi gözləri kimi qalxıb-endi.

– Üzrün günahından pis! Cəld ol, pulları say ovcuma!

Əfsun əlini qoltuq cibinə yetirdi. Bir çəngə şax pul çıxardıb, Ayzenatın ona doğru uzanmış açıq ovcuna şırtaşırt saydı. İkisini də əlavə verdi.

– Halalındı bu pullar! Bəxşeyşdi sənə.

– Bu alayı məsələ! – Ayzenat Mahamovanın qaşqabağı açıldı. – Mən də sütülcə qızı sənin halalın eləyirəm. Get, doyunca səfasını sür!

**6.**

Bürüşüb ikiqat olmuş, başını dizləri üstünə qoyub, heysizlikdən mürgüləmiş Tamaşa qapının küt cırıltısına diksindi. Titrətmə içində dikəldi. Zodlu, cəsarətli addımlarla üstünə yeriyən Əfsunu görüncə dəhşətləndi. Uçunması bir az da artdı. Qanrılıb, qorxulu-qorxulu

ora-bura boylandı. Batqın, ağlamsınmış səslə öz-özündən soruşdu:

– Oy, bura haradı?! Kimin evidi?!

Əfsun lap yaxına gəldi. Qızın önündə ona sahib təkəbbürü ilə dayandı.

– Bəs, bilmirsən hardasan?

– Yooxx... – Tamaşanın qorxusu gücləndi. Ağzında dili də titrədi. – Bil...mi...rəəəm.

Əfsun həqarətli vurğu ilə:

– Bura ev deyil, fahişəxanadı! – dedi.

– Nəəə?! – Tamaşanın gözləri dəhşətdən bərəldi. Qəhərli səsi rezin kimi dartılıb uzandı. – O... ola bil...məz!

– Olub! – Əfsun acıq üstünə acıq artırdı. – Gözünü sil, yaxşı bax! Odur, ipək yorğan-döşək bizi gözləyir.

Tamaşa key-key, hürkək-hürkək çöndü. Mat-mat baxdı. Oturduğu taxtın geri yanında qəşəng gərdək qurulmuşdu. Gərdəyin içindəki təptəzə çarpayı, allı-güllü yatacaq “gəl-gəl!” deyirdi.

Əsməcəsi güclənən Tamaşanın gözləri son həddə qədər böyüdü. Az qaldı hədəqəsindən çıxsın. Bəbəkləri bomboz olub yaş içində itib-batdı. Solğun bənizi isə dümağ ağardı.

Əfsun buna məhəl qoymadı. Köhnə acığının əvəzini Tamaşadan daha açıq-saçıq çıxdı:

– İndi qandın hardasan?!.. Bura sənin kimi sütül qızların, “dəli ceyranların” pullu kişilərlə mazaqlaşdığı, qucaqlaşıb oynaşdığı yerdi! Di, incitmə məni, keç çarpayıya!

Tamaşa çaşqınlıqdan ayıldı. Güclü hönkürtü ilə qışqırdı, yumruqlarını düyüb başına çırpa-çırpa özünü qarğışladı:

– Oy, oy, başım yerə girsin, üstümü qara torpaq örtsün, lənətə gəlim! Gör, necə aldanmışam?! Kül təpəmə! Nənəm məni öldürəcək... Hü-hü-hüüü.

Əfsun məqsədinə tələsmədi. Zor işlətmədi. Acı sözlərlə hayıf aldı:

– Bir vaxtlar bu işi xoşluqla, sevgi-məhəbbətlə görmək istəyirdim. Razı olmadın. Dəlilik eləyib üz-gözümü cırmaqladın. Nənənə xəbər verib məni evinizdən qovdurdun. İndi öz ayağınla gəlib düşübsən əlimə. Deməli, qismətimsən, tanrı payımsan. Yubanma, tez ol, işimizi görək!

Tamaşa onu eşitmədi. Özünü döyməkdən yorulub, saçlarına əl atdı. Çəngələyib, ot yolan kimi yoldu.

– Bəxtim qara geysin, qılçalarım sınsın! Gör hara gəlmişəm?! Vay mənim halıma! Bundan sonra adamların üzünə necə baxacam? Nənəmə nə cavab verəcəm? Oy, ay Allah! Oy, oy, oyy! Hü-hü-hüüü!!! Off, gic ağlım!!!

Əfsun sakit davrandı. Hansı bir hiss isə onu zor göstərməkdən saxladı. Bəlkə də bu hiss özünə inamdan, kama yetməyin qaçılmazlığından idi. Bunun üçün bir ətək pul vermişdi, əlindən hara qaça biləcəkdi?! Qızın böyründə ağır-arxayın oturdu. Sataşqanlıqla soruşdu:

– Özün soyunursan, ya mən soyundurum səni?

Birdən çox təəccüblü hal yarandı. Tamaşa saç yolmalarını qəfil dayandırdı. Bütün bədəni ilə Əfsuna doğru çevrildi. Ona yazıq-yazıq, mənalı-mənalı nəzər saldı. Ağlayan gözlərində qeyri-adi ifadə yarandı. Qəzəbli, nifrətli baxışlar aramla həlimləşdi. Sonra gözlənilməz hövl ilə qollarını açıb Əfsunu istiqanlıqla qucaqladı. Məzlum-məzlum yalvardı:

– Ömrüm-günüm, sənə qurban olum, toxunma mənə... Nənəm xəstəxanadadı. Ona dərman aparmalıyam. Qurtar məni burdan.

Əfsun qızın bu mehrindən, ona sidq ilə sığınmasından sanki sehrləndi. Kama yetmək yanğısı, şəhvət ehtirası bir neçə andaca qeybə çəkildi. Qəlbinə haradansa yol tapmış insani duyğular onu özgə təbə saldı:

Ən naqis, ən qəddar insanın da qəlbinin hansı bir küncündəsə ali duyğu, mərhəmət hissi mövcuddur. İntəhası, o zərif duyğunu, kövrək hissi oyada biləcək məqam, yaxud da ciddi səbəb lazım olur. İndi həmən məqam öz-özünə yetişmişdi. Həm də, axı, Əfsunun bu qıza dumanlı sevgisi də vardı. Riqqətlənmiş ürəkdə həqiqi sevgi birdən-birə büruzə vermişdi. Eyni zamanda da Qumaş arvadın xəstələnməsi vicdanını oyatmışdı. Həyəcanla xəbər aldı:

– Harda yatır nənən?

– “Semaşko” xəstəxanasında.

– Çoxdan azarlayıb?

– Hə, üç aydı... İki ay evdə yatdı. Bir aydı da ordadı.

– Nədi xəstəliyi?

Tamaşa yenidən hıçqırdı. İki damla şəffaf yaş yanaqlarında muncuqlandı.

– Əsas ürəyidi... Böyrəkləri, qara ciyəri də çox incidir onu.

– Heyif! – Əfsun xeyli susub həlim səsini sərtləşdirdi: – Bəs sən bura necə gəlib düşübsən? Gizlətmə, mənə düzünü de!

Tamaşa alnını Əfsunun çiyninə söykəyib səsi boğula-boğula:

– He-eçç özüm də bil...mi...rəm, – dedi.

– Necə yəni bilmirsən?! Bəyəm gözübağlı gətiriblər səni bura?!

Qız dinmədi. Hıçqırtıları gücləndi.

Əfsun təkidlə:

– Ağlamaqdan fayda yoxdur, – dedi, – olduğunu söylə. Bunu bilmək mənə çox vacibdi.

Tamaşa qəhərini çətinliklə boğdu. Nisbətən toxtaqlı cavab verdi:

– Bir... qadın gətirdi.

– Kim idi o qadın, səni hardan tanıyırdı?

– Məktəbimizə gəlib-gedirdi. Bir müəllimənizin rəfiqəsiydi.

– Səninlə harda, necə tanış olmuşdu?

– O müəlliməmizlə sinfimizə gəlmişdi...

– Bəs tanışlıqdan sonra nə oldu?

Tamaşa başını Əfsunun çiynindən araladı. Dərin köks ötürdü.

– Onda... nənəm bərk xəstəydi. Evdə yatırdı. Dərman almağa pulumuz yoxuydu. Heç çörək almağa da...

– Sənə pul təklif elədi, hə?

– Hə, – qız nəfəsi tıncıxa-tıncıxa cavab verdi: – Əl çantasından pul çıxartdı. Mən yaxın durmadım. Müəlliməmiz üstümə qışqırdı ki, götür, nənənə dərman puludu...

– Ax, yaramaz!... – Əfsun hövsələsiz fısıldadı. – Qadının özü nə dedi?

– O dedi ki, xeyriyyəçilik puludu. Xəstələrə, imkansızlara yardım fondundandı. Eşitmişik sənin nənən ağır xəstədi. Bu pulu xeyriyyə cəmiyyətimiz onun üçün ayırıb, mütləq götürməlisən.

– Sonra? Sonra neylədi?

– Həftədə bir dəfə məktəbə gəldi. Məni həyətə çağırdı. Nənəmin vəziyyətiylə maraqlandı. Gedəndə yenə pul verdi.

– Nə qədər?

– Yüz dollar.

– Ah, köpək uşağı! – Əfsun yenidən fısıldadı. – Bura hansı hiylə ilə gətirdi səni?

– Dedi ki, gedək mənimlə, cəmiyyətimizin sədri səni görmək istəyir. Yaxşı işə düzəldəcək.

– Soruşmadın nə işə?

– Heç nə soruşmadım... Nə iş versələr, razılaşmağa məcburuydum...

Əfsun bərk darıldı. Acı sözlər dişləri arasından sürtülə-sürtülə çıxdı:

– Budur, fahişəlikdi onların sənə verdikləri iş! Razılaşırsan?!

Tamaşa ayağa sıçradı. Dəhşət içində dalı-dalı gedib arxasını divara dirədi. Canı azarlı adam kimi zarıdı:

– Yooxx! Ondansa ölsəm yaxşıdı. Öz əlinlə öldür məni!

Bir dəqiqədən artıq sükut çökdü. Əfsun tərəddüd keçirdi. Qəti bir qərara gələ bilməyib deyindi:

– Ayrı kömək eləyən qohum-əqrəbanız qəhət idi? Qırılıb-batmışdılar?!

Tamaşa yazıq-yazıq köks ötürdü. Həzin səsində küskün tale xiffəti sezildi:

– Şəhərdə heç kimimiz yoxdu. Təkcənə Durna xaladı – nənəmin əvvəl dəfə xəstəxanada dostlaşdığı qadın. Onun da başı özünə qarışıb. Əri ağır xəstədi...

Sükut dərinləşdi. Əfsun qıza gözaltı nüfuz etdi. Tamaşa çox sınıxmışdı. Dolubədənli, girdəsifətli, lalə yanaqlı qızın yarı canı qalmışdı. Əfsun bunun fərqinə yalnız indi vardı. Şübhə qurdu ürəyini dərhal gəmirdi: "Qız, sorulmuşa oxşayır... Mənə yalan satırlar. Mütləq yad əl dəyib ona. Özü də bir dəfə yox, Allah bilir, neçə dəfə..." – düşündü. Durulmuş hissləri təkrar bulandı. İkrahlıqla sual elədi:

– Bura gəlişin birinci dəfədi?

Tamaşa sualın gizlinini anladı. Qürurla, həmişəki vüqarla Əfsunun üzünə dik və cəsarətlə baxdı.

– Hə! Birinci dəfədi.

Əfsun qızın qətiyyətli, həm də höcət cavabından təskinləndi. İti baxışların dərinliyində həqiqi saflıq sezib sualından xəcalət çəkdi. Tamaşa qırpımsız nəzərlərini ondan ayırmadan, incik səslə əlavə etdi:

– Yoxsa inanmırsan?

Əfsunun incəlmiş ürəyi dilindən öncə dilləndi:

– İnanıram! Daha hər şey mənə aydındı.

– Yalvarıram... Ümidim sənədi... Qoyma toxunsunlar mənə.

Bu lətif sözlər Əfsunun iç dünyasının altını üstünə çevirdi. Şükranlıqla pıçıldadı:

– Nə yaxşı ki, yanına ilk gəliş mənim oldu. Başqası gəlsəydi...

Tamaşa onu saxladı. Sözü özü tamamladı:

– Allaha qurban olum, mənə rəhm elədi. Başqasını göndərmədi... Meyitim bayaqdan ayaq altında qalardı.

Son etiraf Əfsunu daha da təsirləndirdi. Tamaşanı tamam ayrı gözlə görməyə başladı. Əllərini dizlərinə çırpıb, ayağa sıçradı. Dodaqlarını çeynəyə-çeynəyə baisləri ucadan söydü:

– Əclaflar! Qadın ismətini qazanc mənbəyinə döndərən it uşaqları! Kökünüz kəsilsin!

Tamaşa Əfsunun ona tərəfgirliyindən ürəkləndi. Yüyürüb onu sevincək bir də qucaqladı. Ərklə aman dilədi:

– Səni belə bilməmişdim... Çox sağ ol! Məni murdar əsgiyə döndərtmə, tez apar burdan. Yoxsa... yoxsa... ölümümdə sən də günahkar olacaqsan.

Əfsun mərdanə kişiləndi:

– Arxayın ol! Ürəyini buz təkin saxla. Səni burda qoymayacam. Bir azca döz, qoy bu əclaflara sözümü deyim sonra gedək.

O, yerindən tərpənməmiş Ayzenat Mahamova zodlu-zodlu içəri girdi. Ucadan qışqırdı:

– Nə ağlaşma-şivəndi burda? Bu zibilçə niyə təslim olmur?

Əfsun çox ciddi və höcətlə:

– O zibilçə deyil, çox namuslu qızdı! – dedi. – Sizin əlaqə adamınız aldadıb onu. Guya işə düzəldəcəksiniz...

Ayzenat şit pıqqıltı ilə güldü.

– Bundan yaxşı nə iş istəyir? Həm öz canı rahatlanacaq, həm də başqa yerdəki işlərdən qat-qat artıq pul qazanacaq, hədiyyələr alacaq.

Əfsun özündən çıxdı:

– Siz gənc qızları əxlaqsızlığa sürükləyirsiniz, çirkin yola təhrik eləyirsiniz! Xalqa, millətə mənəvi zərbədi bu! İkiqat düşmənçilikdi!

Ayzenat əllərini belinə qoyub gərşəldi. Dilini nırçıldatdı:

– Xeyr, qadası! Xalqa düşmənçilik yox, kömək durmaqdı bizim işimiz. Pis güzərana, çətin dolanışığa yardımdı. Bu işsizlik, çörəkpulu tapılmayan zamanda imkansızlara xidmətdi!

Əfsun lap kükrədi. Son sözünü əvvəldə dedi:

– Xidmət deyil bu, ən iyrənc qazanc üsuludu!

Gizlindəki adamın öskürəyi təkrarlandı, yaxınlaşan ağır addım səsləri və hökmlü təpgi eşidildi:

– Ağzını təmiz saxla, küçük! Başından yekə qələt eləmə. Yoxsa, xurd-xəşil olacaqsan!

Əfsun kobud səsə doğru çöndü. Qapı çərçivəsinə zorla sığışan ətli-canlı, çox yekəpər bir pəzəvəng astanada dayanmışdı. Üz-gözündən ağı-zəhrimar yağırdı. Əfsun həsdədi. Bu pəzəvəng, doğrudan da onu xurd-xəşil edə bilərdi. Təhqirə cavab üçün hazırladığı kəskin sözlər xirtdəyində ilişdi. Fağırlamış halda Ayzenata üz tutdu, təvəqqeyə keçdi:

– Çox xahiş eləyirəm, Ayzenat xanım, bu qızı bağışla mənə. Sevirəm onu. Nə çoxdu sizin üçün gözəl-göyçək qızlar.

Ayzenat amansızlıqla başını buladı:

– Boş yerə minnət eləmə. Bura gələn geri qayıtmır!

Tamaşa dəli qışqırtı ilə irəli atıldı. Üsyankarlıqla dartıb koftasının yaxasını cırdı.

– Mən qal...mı...raam burada!.. Buraxın gedim evimizə!

Ayzenat əlinin arxası ilə ona tərs şillə çəkdi. Üstünə çəmkirdi:

– Sus, zibilçə! Sənə söz düşmür!

Tamaşa şillənin zərbindən yerə yıxıldı. Ayaqlarını qarnına yığıb çapalaya-çapalaya, qulaqbatıran hönkürtülərlə çır-çır çığırdı:

– Ölə...cəəm, amma siz de...de... yənə razı ol...ol...mayacam!

Əfsun, döşəmədə başı kəsilmiş beçə tək çapalayan Tamaşaya böyük qəlb ağrısı ilə baxdı. Qızın burnu qanamışdı. Hələ də şoralanan qan onun ağzına, sifətinə yayılmışdı. Əfsun təlaş içində qızı döşəmədən qaldırdı. Öz yaylığı ilə qanı sildi. Qucağına götürüb taxtda oturtdu. Ürək-dirəklə sakitləşdirib Ayzenatı mərhəmətə səslədi:

– Nə qədər pul lazımdı, ödəməyə hazıram. İcazə verin qızı

aparım... – O, əlini ciblərinə saldı. Üstündəki bütün pulları çıxardıb, tələsə-tələsə saydı. – Min dollardı burda, hamısı sizindi.

– Hımm... – Ayzenat lağ elədi. – Əcəb səxavətlisən! O nə puldu?!

– Azdı, bəyəm?.. – Əfsun heyrətlə qaşlarını qaldırdı. – Bəs eləmir?!

– Az yox, çox azdı! – Ayzenat mısmırıq salladı. – Biz onu əhliləşdirib, xanım-xatın eləyib, yüz qat bundan artıq gəlir götürəcəyik. O zibilçənin özü də az qazanmayacaq. Ağzının dadını bilmir hələ.

Tamaşa bərk inildəndi. Anlaşılmaz mızıltı ilə nəsə dedi. Əfsunun ürəyi ona bir az da artıq yandı. Ayrı çıxış vasitəsi düşünməyə, Tamaşanı xilasa tam ciddiyyətlə can atdı. Kütləşmiş beyninə isbatlı fikir gəlmədi. Nədən ötrüsə qapıya sarı göz yetirdi. Pəzəvəng oradan getməmişdi. Qapı ağzını bütünlüklə kəsmişdi. Yassar, adama oxşamaz sir-sifəti daş kimi donuq idi. Qalın, tüklü qaşları altından soyuq-soyuq işıldayan xırdaca gözləri acışmış ilan gözlərinə bənzəyirdi. Beləsindən xəta əskik deyildi.

Əfsun həlim-həlim yaltaqlandı:

– Mən bu işin çətinliyini yaxşı başa düşürəm, Ayzenat xanım. Bizə edəcəyin savabkarlığın heç də asan olmayacağını anlayıram. Sən özün də kimlərdənsə asılısan, cavabdehlik daşıyırsan. Amma hər şeydən irəlidə insanlıq durur. Dara düşənə, imdad umana çalışıb kömək etmək Allahı arada görməkdi. Ulu tanrıya tapınmaqdı. Sənin həssas ürəyinə bələdəm. Rəhmin gəlsin o qıza. Taleyinin puç olmasına, həyatının pozulmasına qıyma. Elə bil, onun simasında öz gözəl gəncliyini geri qaytarırsan, ona təzə ömür verirsən. Yəqindən-yəqin bilirəm ki, sən onu çox yaxşı bacararsan. Mən də sənin bu xeyirxahlığının xərcini-borcunu ödəməyə hazıram. O qızı ağlar, yetim quzu kimi mələr görmək mənim üçün çox-çox ağırdı.

Ayzenat yerə baxıb xeyli dinmədi. Kirpiklərinə nəm qondu. Köksündən sirli ah qopdu.

– Dilin yamanca yağlıdı. Məni kövrəltdin, – dedi və tezcə də səsi codlaşdı. – Bu, təkcə mənlik iş deyil. Dəvədən böyük fil var!

– Lap olsun fildən də böyüyü. Sən çalışsan, düzələr.

– Baxaq da... – Ayzenat könülləndi. – Gedim, məsləhətləşim. Bəlkəm bir köməyim dəydi...

Bir-iki addım atıb, çiyni üstündən Tamaşanı qıyqacı süzdü.

Həmən anda Tamaşa da yalvarışla ona baxdı. Ayzenatın ürəyinə əlavə rəhm qığılcımı düşdüyü hiss edildi. Addımları yeyinlədi.

O qapını arxasınca möhkəm örtüb gözdən itəndə, Əfsun şən təbəssümlə Tamaşanın qulağına pıçıldadı:

– Daha qorxma, hər şey yaxşı olacaq. Bu xarabadan birlikdə çıxacayıq!

Tamaşa rahatlıqla nəfəs aldı. Kövrəkcə qımışıb, Əfsuna ən əziz adamı kimi sığındı. Əfsun bundan sonsuz fərəh duydu.

**7.**

Ayzenat Mahamova özünü darta-darta qayıtdı. İlk kəlmədən də matahını baha satdı:

– Qızı aparmağa yalvar-yaxarla icazə ala bildim. Amma ciddi şərt kəsdilər. Pulu gərək elə indi, bütünlüklə ödəyəsən.

Əfsun sevincək qabağa yeridi.

– Baş üstə, Ayzenat xanım! Əlbəttə, elə indi ödəyəcəm... Məbləğ nə qədər olacaq?

– Beş min! Manatla yox, dollarla.

– Necəəə?! – Əfsunun gözləri kəlləsinə çıxdı. – Beş min dollar?!

– Çoxdu, bəyəm? – Ayzenat üzünü bozartdı. – Allahınıza şükür eləyin ki, buna razılaşdılar. İkiqat artıq tələb eləyirdilər. Mənim xatirimə aşağı endilər.

– Axı...

Ayzenat sözü onun ağzında qoydu:

– Axı-maxısı yoxdu, xərci budu! Gücün çatır ödə, çatmır, bas bayıra!

Əfsun başını köksünə salladı. Ayzenat təkidlə davam etdi:

– Biz sənə güzəştə getmişik. Bu qızdan çox böyük qazanc götürəcəyimizi hesablamışdıq. Başqa qızlar kimi onu da Türkiyəyə, Dubaya, Avropaya yola salıb bol-bol gəlir əldə eləyəcəkdik. Sənnən köhnə tanışlığıma görə, həm də cavanlığımı yadıma saldığın üçün ürəyim yumşaldı. Şefimizi razılığa gətirdim. Budur mənim yaxşılığımın əvəzi!?

Tamaşa dil göynədən and-amanla imdad dilədi:

– Oyy, qurbanınız olum, mənə yazığınız gəlsin!..

Əfsun da çarəsiz minnətə qoşuldu:

– O qədər pul üstümdə yoxdu, Ayzenat xanım, amma tapıb düzəldə bilərəm. Heç olmasa bir günlük möhlət ver.

– Xeyr! Möhlət verilməyəcək! – Ayzenat qəti bildirdi. – Mümkün deyil!

Əfsun üz vurdu:

– İnan, etibar elə mənə. Sabah tezdən ovcunda olacaq.

Pəzəvəng qapı arasından təpindi:

– Bazar açma! Hə, ya yox?!

Əfsun boynunu büküb fağırladı. Sonra birdən yadına Qumaş arvadgildə gizlətdiyi pul bağlancı düşdü. Qanrılıb Tamaşadan ehtiyatla soruşdu:

– Sizdə qoyduğum əmanət yerindədimi?

Tamaşa ona çaşqın baxdı. Sorğunu anlamadı.

Əfsun arxayınlıqla nəfəs dərdi.

– Evin açarını mənə ver! – Əlini Tamaşaya uzadıb, Ayzenata qətiyyətlə dedi: – İndi gedib gətirirəm. Bir saata, ən geci saat yarıma qayıdıram.

Ayzenat razılaşdı:

– Etirazımız yoxdur. Bu şərtlə ki, gecikməyəsən!

Əfsun evin açarını götürüb getməyə hazırlaşanda, Tamaşa da titrəyə-titrəyə ayağa qalxdı. Ayzenat ona gözünü ağartdı:

– Uğur olmasın, sən hara?!

Tamaşanın səsi sızıldadı:

– Məə...ndə ge.....gedim.

– Otur yerində, sarsaq qız! – Ayzenat onu dala itələdi. – Sən burda girov qalmalısan. Pul bizə çatmamış heç yana gedə bilməzsən!

Tamaşa büzüşüb körpə uşaq kimi heykirdi:

– Mə...ən qorxu...ram. Tək qalammaram...

Pəzəvəng təpiyini qapıya çırpdı. Balta dişlərini qıcadı:

– Zəhlə tökmə! Çox çığır-bağır salsan, heç vaxt getməzsən burdan!

Tamaşanın bağrı yarıldı. Vahimədən uçuna-uçuna, qan-yaş tökə-tökə oturdu.

Əfsun geri döndü. Tamaşanın sinəsinə əyilmiş başını qaldırıb, köksünə sıxdı. Saçlarını nəvazişlə tumarlaya-tumarlaya sakitləşdirdi:

– Qorxma. Tez qayıdacam. Lap tez!

Ayzenat da yarı sərt, yarı həlimliklə təskinlik verdi:

– Oğlana mane olma. Qoy işində olsun. Heç kim toxunmayacaq sənə.

Tamaşa kiridi. Əfsun ildırım sürəti ilə bayıra şığıdı. Qapıdan çıxa-çıxa qıza bir də tapşırdı:

– Heç narahat olma, ürəyini sıxma, yubanmayacam. Quş qanadında yanına dönəcəm.

* * *

İş avandına düşdü. Taksi axtarmağa vaxt itirmədi. Küçəyə çıxan kimi, boş maşınla rastlaşdı. Əyləşib, sürücünü tələsdirdi. Yolda tıxaclara, məcburi əylənmələrə də tuş gəlinmədi. Mənzili sürətlə başa vurdular.

Saxlanc yerində idi, toxunulmamışdı. Torbanın bağını açıb, iki-üç xışma pul götürdü. Qoyun-qoltuq ciblərinə basdı. Saymağa macal yox idi. Taksi onu gözləyirdi. Bu pullar ödəniş xərcinə bəs edəcəyinə, hələ artıq da qalacağına şübhə etmədi. Çünki əsginasların əksəriyyəti iri rəqəmli idi. Torbaya seçib yığmışdı.

O, torbanı bağlayıb həmənki yerinə qoydu. Və dabanı üstə dönüb evin qapısını kilidlədi, qol saatına baxdı. Vəd etdiyi vaxtdan cəmi yarım saat ötmüşdü. Sözünə yalançı çıxmayacaqdı...

Təkərlər hamar yolda daha bərk qıjıldadı. Sürət küləyi yarımaçıq pəncərədən içəri üfürülərək Əfsunun saçlarının arasına doldu, alnına səpələnmiş telləri ilə oynadı; üzünü yelpikləyib ona əlavə rahatlıq gətirdi.

Bununla belə, təlaş keçirirdi. Qızdan intizar idi. Qorxurdu ki, onu incidərlər. İstənilən məbləğin düzələcəyinə inanmayıb, başqa yerə apararlar. Ayzenat Mahamova kimilərdən hər yaramazlığı gözləmək mümkündü. Həm də açıqca duyulurdu ki, arxaları çox möhkəmdir. Yüksək vəzifəlilərdən kiminsə dəstəyini alırlar.

Əfsun özündən də baş açmırdı. Tamaşa üçün bir belə canfəşanlığın səbəbini doğru-düzgün anlamırdı. Sadəcə, mərdlik etməkmi istəyirdi? Yaxud Qumaş arvadın yaxşılıqlarının əvəzinimi verirdi? Söz yox ki, bunlar da vardı. Öyüncək davranış onun təbiə-

tinə xas idi. Seçilməyi, görklü hərəkəti sevirdi. Xüsusən də qadın xeylaqları yanında. Ancaq hal-hazırkı cidd-cəhdlərinin kökündə bu xırdalıqlar durmurdu. Onun qəlbinə munis duyğular hakim idi. Tamaşanın dəyanətini, düşdüyü acınacaqlı vəziyyətlə barışmazlığını, qızlıq isмətini qorumağa çalışmasını bəyənmişdi. Bu tərs qızın ona sidq ilə sığınmasına, pənah gətirməsinə qürrələnmişdi. Ona sevgisi dərinləşmişdi.

Aradan ötən hər an, hər dəqiqə Əfsunu darıxdırdı. Nigarançılıq canını sıxırdı. Maşının iti sürəti də ona bəs etmirdi. Az qalırdı, özü qanad açıb uçsun.

Əyləcin cır səsi intizara son qoydu. Tələsik bir də saatına baxdı. Gecikməmişdi. Sürücünün haqqını lazımından artıq ödəyib, səkiyə atıldı. Tamaşanın köməyinə yüyürdü.

Tamaşa daha da büzüşüb, yumağa dönmüşdü. Çoxluca ağlamışdı. Gözlərinin altı da, üstü də şişib, qıpqırmızı qan çanağına bənzəyirdi. Əfsunun tayüşüyünə səksəkə ilə dikəldi. Onu yanında görüb, sevincdən umaxşıdı.

– Oy, nə gec gəldin? Bağrım lap partlayırdı...

Əfsun qolunu onun boynuna doladı. Şirin canıyananlıq göstərdi:

– Gec deyil, mənim əzizim. Dediyim vaxtdan bir az da tez gəlmişəm. Hər şey qaydasındadı.

Tamaşa iç yanğısını çölə üfürdü, tam rahatlandı.

– Çox sıxılırdım. Geciksəydin, gəlib taxt üstündə meyitimi tapardın.

– Allah eləməsin! – Əfsun ürəyi ağzında dilləndi. – Qoy bizi istəməyənlər, qəsdimizə duranlar ölsünlər. Biz uzun bir ömür yaşamalıyıq!

Sonra Tamaşanın böyründə bardaş qurub, cibindəki pulları ortaya tökdü.

– Gəl birlikdə sayaq. Orda buna macalım olmadı. Sənin üçün tələsirdim. Ortaya əngəl çıxacağından qorxurdum. Nə yaxşı ki, nəhs bir iş baş vermədi.

Birlikdə pul hesabına başladılar. Tamaşa əsginasları ipçinlədi, hamarladı, dəstə-dəstə eləyib Əfsuna verdi. Əfsun onları saydı, dəstə-dəstə eləyib Tamaşanın ətəyinə yığdı. İş sona yetəndə, ödəniş məbləğini

götürüb əvvəlcə Tamaşanın başına, sonra da öz başına doladı.

– Qoy başımızın sadağası olsun! Bizi xətalardan sovuşdursun! – deyib, artıq pulları ciblərinə basdı. Məğrur-məğrur gərnəşib, ayağa durdu. Ayzenatla hesablaşmağa getdi.

Hesabat nağdılaşanda Mahamova ciddiyyətlə tapşırdı:

– Bunlar öz aramızda qalmalıdı!.. Soruşsalar: dəvə görübsənmi? Deyərsən heç qığını da görməmişəm!

Pəzəvəng təpgi ilə əlavə etdi:

– Özünü salamat istəyirsənsə, dilini farağat saxla. Əks halda, hər tikən qulağın boyda olacaq!

Əfsun ikimənalı zəmanət verdi:

– Tövbəliyəm, arı yuvasına çöp salıb qurdalamaram!

**8.**

Həyətə çox həyəcanlı və qaçaraq düşdülər. Burada əl-ələ tutdular. Darvazaya qədər yeyin gəldilər. Sanki nəsə olacağından, yeni maneə törəyəcəyindən ehtiyatlanırdılar.

Alaqapı səmtində addımları yavaşıdı. Üzlər, gözlər güldü. Tamaşa yüngülcə tövşüyərək, kəsik-kəsik pıçıldadı:

– Çox-çox minnətdaram sənə. Məni pis adamların əlindən aldın. Bu yaxşılığını heç vaxt unutmayacam. Gecə-gündüz duaçın olacam!

Ürəyin içindən qopub gələn bu səmimi təşəkkür Əfsunu məst elədi. Umacaqlı baxışlarını Tamaşadan ayırmadı. Tamaşa onu sevgi-təbii duydu. Əfsunu utana-utana öpdü. Ürək gizlinlərini ahəstəcə açıqladı:

– Mən səni əvvəllər xoşlamırdım, acığım gəlirdi. Sırtıq, abırsız oğlan hesab eləyirdim. Sən gözümə görünəndə hirs beynimə vururdu... Oy, bağışla məni, necə yanılmışam! Sənə qarşı kobud hərəkətlərimin əvəzində kömək durdun. Kimsəsiz bir qızı o cürə dardan qurtardın...

Əfsun sakitcə dayanıb, zarafatla soruşdu:

– Məktəb çantasını başıma daha çırpmayacaqsan ki?!

Tamaşa bekaraca qızardı:

– Yox, yox! Nə danışırsan?! – deyib, tam səmimiyyətlə pıçıldadı: – Heç bilirsən, indi xətrini necə istəyirəm?!

Əfsun məzə ilə kirpiklərini xıppıldatdı.
– Münəccimlik əlimdən gəlmir, desən, bilərəm.
Tamaşa həyadan udqundu. Utancaq-utancaq:
– Elə şeylər var ki, onu dillə söyləmək çətindi, – dedi.
Əfsun eyni məzə ilə şıltaqlandı:
– Dil ilə demirsən, əyani göstər.
Tamaşa sıxıla-sıxıla yerə baxdı.
– Bayaq göstərdim...
– Haçan?! – Əfsun şitəndi. – Nəyi göstərdin?
Tamaşa həlim-həlim:
– Öpdüm səni, – dedi. Dodaqlarına şirin təbəssüm bələndi.
– Eh, bircə dəfə... O da ağızucu... – Əfsun zarafatını gerçəklətdi. – Elə öpüşdən nə olsun?!
Tamaşa çiyinləri üstündən yan-yörəyə göz gəzdirdi. Yaxınlıqdan gəlib-keçən görməyib, Əfsunu bərk qucaqladı. Hər iki üzündən öpdü. Əfsun da onu bağrına basıb, böyük hərarətlə öpdü. Bu öpüşlər ehtiras təzahürü yox, məhəbbət izharı idi.
– Mən səni sevirəm. Bütün qəlbimlə, varlığımla sevirəm!
Tamaşa sirli töyüşüklə:
– Mən də!.. – dedi.
Əfsun bir az əvvəlki zarafatını təzələdi:
– Bir də dəliliyin tutub, üzümü cırmaqlamayacaqsan?
Tamaşa başını onun köksünə qoydu, şirin-şirin:
– Görürsən ki, cırmaqlamıram! – söylədi.
Əfsun ona təmiz eşqini ucadan elan etdi:
– Sən mənim canımda ikinci canımsan! Ömrümə yaraşıqsan!
Tamaşa susub, Əfsunun qoynuna daha inamla sığındı. Bir neçə dəqiqə sus-pus qaldılar. Sonra qeyri-adi mehr ilə qol-boyun olub küçəyə çıxdılar. Əfsun məmnunluqla soruşdu:
– İndi neyləyək? Səni evinizə aparım, ya Qumaş nənənin yanına?
Tamaşa ərklə təklif etdi:
– Xəstəxanaya gedək. Nənəmə birlikdə baş çəkək. Mən ona sənin yaxşılıqlarını danışmalıyam. Bu günə qədər ondan heç nəyi gizlətməmişəm.
– Əla! – Əfsun qəlbən razılaşdı. – Gedək, mütləq gedək! O, gözəl nənədi. Mənim ona böyük ehtiramım var. Həm baş çəkək, həm də

halallığını alaq. Bizə öz xeyir-duasını versin. Etiraz eləmirsən?

Tamaşa itaətlə:

– Eləmirəm! – dedi. – Bundan belə sənin hər sözün mənim üçün qanundu.

Əfsun böyük fərəh içində:

– Çox minnətdaram, könlümün şahı, başımın tacı! – deyib, Tamaşanın alnından öpdü.

Yollarına davam etdilər. Alaqapıdan azca aralanmışdılar, Mara Abramova ilə qarşılaşdılar. Yəhudi qadını onları birlikdə görüb heyrətləndi. Hər ikisini dərin təəccüblə süzdü.

– Bizə gəlmişdiniz?

Əfsun sualdan yayınıb hörmətlə salamlaşdı:

– Xoş gördük, möhtərəm Mara Abramovna. Necəsiniz? Canınız-başınız?

Mara Abramovna bir gözü Tamaşada dilucu dilləndi:

– Sağ ol, pis deyiləm. Canım hələ tutarlıdı.

Əfsun qoca arvadın baxışlarında narazılıq sezib, araya söz qatdı:

– Sizə bir neçə dəfə gəlmişəm, Mara Abramovna, hal-əhval tutmağa. Amma evdə olmayıbsınız. Elə bu gün də gəlmişdim, qapınız qıfıllı idi.

Mara Abramovna nəfəsini fısıltı ilə dərdi:

– Hə, deyildim evdə. Qumaş bacını görməyə getmişdim.

Tamaşa ağlamsındı:

– Nənəm necədi, Mara xala? Dünən halı heç yaxşı deyildi. Bu gün nə cürdü?

Mara Abramovna incik cavab verdi:

– Gördüyün kimidi... Tez-tez huşunu itirir. Ayılanda da səni soruşur... Üz-gözün niyə bu haldadı?

Tamaşa xəcalətlə yönünü yana çevirdi. Əfsun əhvalatı danışdı. Mara Abramovna "baisləri" lənətlədi:

– Gözləri çıxsın onların! Əxlaqsızlıq yuvaları dağılsın! Cavan-cavan qız-gəlinləri pulla həvəsləndirib, insan alverinə başlayıblar. Heç kəs də bir tədbir görmür. Belə də qanunsuzlux olar?!

Əfsun lağlağı ilə güldü:

– Qanun daha işləmir, Mara Abramovna! Dərə xəlvət, tülkü

bəylik zamanəsidi. Heç nədən, heç kəsdən çəkinmirlər.

Mara Abramovna Əfsuna məzəmmətlə baxdı.

– Bax, buna görə sənə deyirdim ki, uzaq ol o tərbiyəsiz qadından. Düşmə onun toruna. Məni eşitmədin...

Əfsun məsələnin üstünü ört-basdıra tələsdi:

– Bu ilahinin işidi, Mara Abramovna. Mənə o köpək qızının evini Allah boş-boşuna tanıtmayıb. Əgər belə olmasaydı, indi gedib, sadəlövhlük ucbatından tələyə düşmüş ismətli bir qızı xilas eləyəmməzdim... Doğrusu, o xarabaya ayaq basmağa heç həvəsim yox idi. Elə bil, qayibən yadıma saldılar... Sevinirəm ki, nə yaxşı ürəyim duyuq düşdü. Yoxsa, həyatım qədər əziz sandığım bu gözəl-göyçəyimdən əlim həmişəlik üzülərdi. Bu, mənim üçün ən əzablı itki olardı.

Mara Abramovna ürəkdən dil-ağız elədi:

– Dünyada tək Allahımız köməyin olsun! Qumaş bacı səndən çox razı qalacaq. O cür nurlu qadının alqışını almaq da bir xoşbaxtlıqdı!

Tamaşa gözləri yaşara-yaşara Əfsunu yola doğru çəkdi:

– Sənə qurban olum, tez çatdır məni nənəmə. Haçandı intizardı. Bir az da geciksəm, Allah eləməmiş, başına bir iş gələr.

Mara Abramovna qəti etiraz etdi:

– Olmaz! – dedi. – Bu sir-sifətlə gedib nənənin gözünə görünsən, yazıq arvadı qorxudarsan. Xəstə ürəyi elə o dəqiqə partlayar.

Tamaşa nəsihətə qulaq asmadı. Əfsunun qolunu dartışdırdı:

– Apar məni, yalvarıram, tez apar!

Mara Abramovna sərtliklə qabağa durdu, etirazını ciddiləşdirdi:

– Sözə bax, qızım. Sənin özündən xəbərin yoxdur, yaman gündəsən. Bu vəziyyətdə adam içinə çıxammazsan... Bıy, o nədi?! – Qızın qoftasının cırığını indi gördü. – Yaxanı kim cırıb?

Tamaşa dinmədi. Əfsun cavab verdi:

– Özü, hirsindən cırıb.

Mara Abramovna üzünü tam bozartdı:

– Belə halda sənin xəstəxanaya getməyini mən heç cürə məsləhət görmürəm. Nənənnən başqa da orda camahat var. Gümanları yüz yerə gedər. Cavanca, gözəl-göyçək qızsan, haqqında nə üçün pis fikir yaransın?

– Eybi yoxdu... – Tamaşa təkid elədi. – Hər nə gümana dü-

şürlər, qoy düşsünlər! Mən nənəmi elə indi görməliyəm!

Mara Abramovna yenidən nəsihətə başladı:

– Elə deyil, qızım. Eybi çoxdu. Mən sənin doğman əvəziyəm, eşit məni. Yaxşısı budu, gedək bizə. Əl-üzünü mükəmməlcə yu, üst-başını səliqəyə sal, qoftanı dəyişək, irz-irəngin düzəlsin, sonra get.

Əfsun da Tamaşanı dilə tutdu:

– Mara Abramovna düz deyir, əzizim. Üz-gözün çox pis haldadı. Güzgüyə baxsan, özünü tanımazsan. Gedək əvvəlcə Mara Abramovnagilə. Bir az dincəl, özünə gəl. Sonra gedək hara istəyirsən, ora.

– Axı, axşam olur, geciksək içəri buraxmazlar.

– Ondan narahat olma. Buraxdırmaq mənim boynuma. Həm də ki, xəstə yanına əliboş getmək yaxşı deyil, mənim üçün ayıbdı. Sən hələlik Mara Abramovna ilə qal, mən qaçım bazara. Urvatdı mer-meyvə, təzə gül-çiçək alım. Gözəl nənəmizin könlünü şad eləyək. Qıraxdan baxanlar da görsünlər ki, nənənin qayğısına qalanlar çoxdur... Necə sözdü, Mara Abramovna? Siz dünya görmüş arvadsız, belə yaxşıdı, ya yox?

– Hə, elə məsləhətdi! – Mara Abramovna Tamaşanın qoluna girib, yarı xoş, yarı zorla evi tərəfə çəkdi. – Gəl, bala, gəl. Axşama hələ çox var. Xəstəxanaya buraxılış saat yeddidə qurtarır. Ən əfzəli budu ki, sən xəstə görüşünə abırlı yollanasan, Qumaş bacını təzə dərdə salmayasan.

Tamaşa bu dəfə nəsihəti eşitdi.

## 9.

Əfsun bazardan qayıdanda halsızlamış Tamaşa yatmışdı. Mara Abramovna Əfsunu him-cimlə yan otağa çağırdı:

– Yazıq qız ayaq üstə güclə dayanırdı. Əl-üzünü isti su ilə yudurtdum. Bir stəkan çay içirtdim. Çarpayıda yer düzəltdim ki, sən gəlincə dincəlsin.

– Çoxdan yatır?

– Yarım saat olar.

Əfsun biləyini çirməyib, saatına baxdı.

– Onda bir az da yatsın. Çox əziyyət çəkib, heydən tamam düşüb.

– Hə, qoy yatsın, yuxusunu alsın. Vaxta hələ çox qalır... Bir şeyi səndən öyrənmək istəyirəm.

– Nəyi, Mara Abramovna?

– Bu qıza münasibətini.

– Münasibətim əladı!

– Fikrin nədi?

– Fikrim... – Əfsun qımışdı. – Hansı mənada soruşursunuz, Mara Abramovna?

– Məqsədini bilmək istəyirəm.

Əfsun səsinə ciddi ahəng qatdı:

– Anladım sizi, məqsədim onunla evlənməkdi.

Mara Abramovnanın üzü güldü.

– Allah mübarək eləsin! Xoşbəxt olmağa layiq qızdı. Gözümün qabağında böyüyüb. Otuz beş ildi Qumaş bacını tanıyıram. "Körpələr evi"ndə mən tərbiyəçi işləmişəm, o da başbilənimiz olub. Elə o vaxtdan da heç bir sirrimiz gizlin qalmayıb. Bir-birimizi doğma bacıdan artıq istəmişik. Qızıl təkin insandı. Heyif ki, taledən yarımadı. Cavannıqdan dul qaldı. Əri Sovet-Alman müharibəsinə gedib, qayıtmadı. Ondan bircə qızı vardı. Başqa ərə getmədi. O qıza həm atalıq, həm də analıq elədi. Heç nədən korlux çəkməyə qoymadı. Geyimdə, dolanışıxda atalı qızlardan seçdirmədi. Oxutdu, ali təhsil verdi, ərə köçürdü. Amma... – Mara Abramovna kövrəldi, yaşarmış kirpiklərini donunun cibindən çıxartdığı ipək yaylıqla qurulayıb, səsini lap alçaltdı, xısın-xısın davam etdi: – Bəxtsiz qadın qızından da yarımadı. Hamiləlikdən azad olandan sonra o bədbəxti pis xəstəlik tapdı. Dava-dərman köməyinə yetmədi. Tamaşa yarım yaşa çatmamış, canını tapşırdı. Qumaş bacı bu bircə nəvəsini də özü təkbaşına böyütdü. Körpəyə nənəlikdən çox analıq elədi. Çəkdiyi cəfaların, əziyyətlərin ucbatından da ürəyi üzüldü... Tamaşa bilməsin, arvadın vəziyyəti çox ağırdı. Həkimlər əllərini üzüblər ondan.

Əfsun məyuslandı:

– Çox təəssüf ki, bizim toyumuzu görməyəcək!..

Mara Abramovna köks ötürdü:

– Yazığın qismətində o da yoxmuş!.. Amma qızın toyunu görməyi çox arzulayırdı. Tamaşanın xoşbəxtliyinə arxayın olub, axirətə köçmək istəyirdi...

Əfsun sözgəlişi təvəqqe elədi:

– Möhtərəm Mara Abramovna, acizanə bir xahişim var: gəlin, xəstəxanaya birlikdə gedək. Sizə əlavə zəhmət də olsa, sözümü yerə salmayın. Mənim orda deyə bilməyəcəklərimi Qumaş nənəyə siz çatdırın. Mümkündü ki, o mənə inanmasın, istəyimə şübhə ilə yanaşsın. Sizi mütləq eşidər. Uzun illərdi istəkli rəfiqəsiniz.

Mara Abramovna ona mat-mat baxdı:

– Mən Qumaş bacıya nə deməliyəm? Nəyin minnətini eləməliyəm?

– Bizə xeyir-dua verməsinə köməkçi olun...

Bu arada Tamaşa oyandı. Söhbət yarımçıq qaldı.

– Mara xala, hardasan? Əfsun gəldimi?

Əfsun Mara Abramovanı qabaqlayıb cavabı özü verdi:

– Gəlmişəm, əzizim, burdayam! – deyib onun yanına adladı. – Sənin oyanmağını gözləyirdik. Nə şirin yatdın?

– Heç özümdən xəbərim olmadı... yuxu birdən tutdu məni.

– Yatmağın yaxşıdı. İrz-irəngin əməllicə düzəlib. Qumaş nənəni görməyə indi arxayın gedə bilərik.

Mara Abramovna aralıdan şirin-şirin dilləndi:

– Qoftanı da dəyiş, qızım. Odur, çarpayının başına qoymuşam. Geyilməyib, təptəzədi. Sən yatanda axtarıb gənclik saxlancımdan tapmışam. Sənə yaraşandı.

Tamaşa qoftanı götürməyə utandı. Əfsun onu cəsarətləndirdi:

– Geyin, əzizim, geyin! Mara Abramovna xeyirxah xaladı. Nə deyir, bizim yaxşılığımız üçün deyir. Vaxt gələr, xəcalətindən çıxarıq.

Mara Abramovna qınadı onu:

– Xəcalətdən çıxılacaq bir şey yoxdu burda. Üzünü çevir, qız əynini rahat dəyişsin.

Əfsun üzünü çevirdi. Yönü divara doğru Tamaşanı dilə tutdu:

– Mənim ruhum, Mara xalandan sən də xahiş elə bizimlə gedib, nənədən bizə xeyir-dua istəsin. Mən nənəyə bu barədə söz

deməkdən ehtiyatlanıram.

Tamaşa Mara Abramovna ilə ərkli şərt kəsdi:

– Mara xala, getməyə razılıq versəniz, qoftanı geyinəcəm, yoxsa, elə bu cürə gedəcəm!

Mara Abramovna gülümsündü.

– Razıyam, bala, gedirəm. Cavanların xoşbəxtliyi qocaların əziz diləyidi!

**10.**

Qumaş arvad xəstəxana otaqcasında tək deyildi. Durna xanımla Süsənbər qulluğunda durmuşdular. Alnının, üzünün tərini silir; göyərib qaysaq bağlamış dodaqları arasını çayla yaşlayırdılar. Arvadın gözləri yumulu idi. Çəpərlənmiş kirpikləri xəfifcə titrəyirdi.

Durna xanım Əfsunu görən kimi, bərk əsəbiləşdi. Rəngi qaralıb, qaşqabağı yer süpürdü. Dodaqaltı:

– Bu haramzada hardan peyda oldu yenə?! Nə azarı qalıb onun burda?!..

Süsənbər isə Mara Abramovanın təkrar gəlişinə heyrətləndi:

– Burdan təzəcə getməmişdinizmi, Mara xala, zəhmət çəkib niyə qayıtdınız?

Mara Abramovna kövrək səslə:

– Nə zəhməti var? – dedi, – ayaqla yeriyib gəlməmişəm ki, əziyyəti olsun. Rahat maşına əyləşib gəlmişəm. Cavanlara yoldaşlıx eləmişəm... Qumaş bacının halı nə cürədi? Az-çox dəyişiklik, dirçəliş bilinirmi?

Süsənbər dinməzcə başını buladı. Doluxsunmuş Tamaşa yüyürüb özünü nənəsinin üstünə atmaq istəyəndə, Durna xanım qabağını kəsdi. Hirslə soruşdu:

– De görüm, harda tapışıbsan bu yaramaz adamla?! Nəyə gəlib o bura?!

Tamaşa bir neçə anlığa çaşbaş dayandı. Nə deyəcəyini bilmədi. Əfsuna baxdı ki, sən cavab ver. Özü Durna xanımın böyründən sivişib, nənəsini qucaqladı:

– Can, nənə, necəsən? Çoxmu ağrıyırsan?

Cavab gəlmədi. Qumaş arvadın donuq sifətində heç bircə əzələ də tərpənmədi. Tamaşa çılğın hönkürtü ilə öz-özünü silllədi.

– Bi...bili...rəm inci...yibsən məndən. Ya...yanına ge...cc gəlmişəm. Məndə gü...günah yoxdu...

Süsənbər Tamaşanı xəstənin üstündən geri çəkdi.

– Bəsdi, özünü ələ al! Arvadı dinc qoy. Səni eşidəcək halda deyil.

Tamaşa üç-dörd dəfə yanıqlı-yanıqlı hıçqırıb kiridi. Bir neçə anlıq gərgin sükutdan sonra Durna xanım onunla bir də əsəbi sorğu-suala başladı:

– De görüm, bu kələkbaza harda, nə cür ilişibsən?! Necə salıb o belə-filan səni tələsinə?!

Tamaşa sarsıntı keçirdi. Durna xanımın əsəbiliyinin səbəbini anlamırdı. Sevdiyi oğlan barədə təhqirli ifadələrə təəccüb edirdi. Onu hardan tanıyırdı? Əfsuna bir daha israrla baxdı. Cavabı ondan gözlədi. Əfsun dilindən qıfıl asdı, Mara Abramova araya girdi:

– Ona yolu mən tanıtmışam. Sorğu-sualını mənimlə elə.

Durna xanım duruxdu.

– Bura nə üçün gəlib?

– Qumaş bacının səhhəti ilə maraqlanır.

– Nə əcəb?

– Əcəbi budur ki, bunu özünə borc bilir. Qumaş bacıdan mehribanlıq görüb. Onun çörəyini yeyib. Evində kirayənişin olub.

– Hımm... – Durna xanımın içi göynədi. – Bu əclaf it kimi iy bilir, harda yağlı kökə var, gedib oranı tapır!

– Orasını mən bilmirəm. Qumaş bacıgili nə cürə tapdığından məlumatım yoxdur. Cavanlardan öyrəndiyim ayrı şeydi... Bu yana gəl, deyim sənə, Qumaş bacının şeytanlarının qulağı kar olsun!

Mara Abramovna Durna xanımın qolundan tutub, pəncərə önünə çəkdi. Əfsun özünü həyalı aparıb çölə çıxdı. Mara Abramovna əhvalatı yarıpıçıltı ilə danışıb, şadyana əlavə etdi:

– İşlər bax, bu cürədi! Mən təklikdə qızı dilə tutub rəyini bilmişəm. Oğlandan çox razıdı. Buna o dağılmışda rast gəlməsəymiş, sorağı Allah bilir, haralardan eşidilərdi. Biçarə Qumaş bacı nəvəsinin xiffətini gora aparardı.

Durna xanım ciddi təşviş keçirdi. Tamaşanı yanına çağırıb bir qədər sakit halda xəbər aldı:

– Mara xala mənə dəhşətli hadisə söylədi. O yaramaz oğlan guya səni böyük biabırçılıqdan qurtarıb, düzdümü?

Tamaşa boynunu yana əyib xəcalətdən kirpik çala-çala təsdiqlədi:

– Hə, düzdü.

– Sənə dəyib-toxunmadan elədi bu yaxşılığı?

– Hə, toxunmadı.

Durna xanım xəyallandı. Özünün Əfsunla sevgi macəraları gəlib gözləri önündən keçdi. Etirafa az inandı. Ancaq bunu açıb-ağartmadı.

– Bəs mən ölmüşdüm?! Tanımadığın adamlara niyə inanıb pul götürürdün? Nə üçün vəziyyətinizi gəlib mənə demirdin? Heç olmasa, telefonla bildirəydin?

– Sənin öz qayğıların başından aşır, Durna xala. Bəhlul əmi o cürə...

– Eh, ağılsız qız! – Durna xanım Tamaşanın sözünü ağzında qoydu, – Bəhlul əmiyin xəstəliyinin buna aidiyyəti nədi? Hər halda, sizə azdan-çoxdan köməyim dəyərdi. Ehtiyac ucbatından biabırçı addıma səbəb qalmazdı. Heç bilirsən, necə qəbahət eləyibsən?!

Tamaşa qollarını qoynunda günahkar-günahkar çarpazlayıb, başını aşağı saldı, Durna xanım ah çəkib, onu təşvişə salan məsələyə keçdi:

– Mənə açığını de, o oğlanı həqiqətən sevirsən?

Tamaşa təsdiq mənasında başını astaca tərpətdi.

– Hansı xoşa gələn keyfiyyətlərinə görə?

Tamaşa qollarını qoynundan açıb, qəddini dikəltdi. Durna xanıma şax və qətiyyətlə baxdı.

– Sözünə bütövlüyünə, mənim üçün hər şeydən keçdiyinə görə.

– Əsil sevgi, doğru məhəbbət üçün bunlar çox azdı! – Durna xanım dərin, təngimiş nəfəs dərdi. Ötkəm səsi həzinlədi. – Həyat təcrübəsi göstərir ki, bu gün bizə olduqca saf, munis görünən hisslər, duyğular sabah əksinə dönür. Ürəkdə soyuyur, buz bağlayır. Hətta böyük nifrətlə əvəzlənir. Ülvi eşq ürəyə zərrə-zərrə, qətrə-qətrə hopur. Bir neçə saatın, ya bir günün ərzində yaranmış xoş təəssürata arxalanıb, kimə isə könül vermək ağılsızlıqdı. Bu addımı yaxşı-yaxşı ölçüb-biçib, atmaq lazımdı.

Tamaşa heyrətli israr bildirdi:

– Məni qınama, Durna xala, – dedi. – Bəlkə də bağışlanmaz səhv eləyirəm, uşaqcasına yenə aldanıram. Amma mən könlümü Əfsuna həmişəlik vermişəm. Geriyə yolum yoxdur. Sonra başıma nə gələcəksə, peşmançılığını çəkməyəcəm. Onun mənə yaxşılığı

qarşısında canımı girov qoyuram. Çox xahiş eləyirəm bunun üçün heç kəs məni danlamasın.

Gənc qızın inadı Durna xanımı heyrətdə qoydu. Əli üzündə qaldı.

– Deməli, fikrin qətidi, inanırsan onun etibarına?

– Hə, inanıram!

– Nolar, Allah xoşbəxt eləsin!

Durna xanım yana çəkildi. Ürəyində qıza acığı tutsa da, büruzə vermədi. Nə deyə bilərdi? Doğması deyildi ki, höcətə dursun, etirazını hökmlə bildirsin. Lakin qızın taleyinə tam laqeyd olmağı da bacarmadı. Bir xeyli düşünüb Əfsunun dalınca dəhlizə yönəldi. Hər necə olsa da cavabdehlik daşıyırdı. Qoca, xəstə rəfiqəsi sonra umu-küsü eləyərdi ki, "himayəni sadəlövh qızdan niyə əsirgəyibsən? Məsələyə nə üçün ciddi qarışmayıbsan?" Qumaş arvadın xatirinə öz mənini yendi. Danışdırmaq nədi, heç bircə qırpım da üzünə baxmaq istəmədiyi Əfsunla üz-üzə söhbətə məcbur oldu.

Əfsun dəhlizin get-gəlsiz bir küncündə kürəyini divara söykəyib siqaret çəkirdi. Bu pis vərdişə son aylar öyrənmişdi. Nə tələbəlik illərində, nə də həbsxanada ona meyil göstərməmişdi. İndi də hərdən-hərdən, ya damağı çağ, ya da dilxor olanda yadına düşürdü. Tüstünü heç vaxt içəri ötürmürdü. Dodaqları arasından qəribə şəkildə havaya püfləyirdi.

Durna xanımın ona doğru gəldiyini görüb, siqareti tezcə söndürdü, kibrit qabının içinə basıb, cibində gizlətdi. Centlmen qaydası özünü səliqəyə saldı. Bu gəlişin məqsədini təxmini anlayırdı. Dialoqa ədəblə hazırlaşdı.

Durna xanım çarəsiz söhbətə gözlərini yerdən qaldırmadan, sərt ahənglə başladı:

– Mən sizinlə çox ciddi bir məsələ barəsində danışmalıyam.

Əfsun sakit dilləndi:

– Buyurun, sizi eşidirəm.

Durna xanım gendə dayanıb:

– Məni Tamaşanın gələcək taleyi düşündürür, – dedi. – Nənəsi o cür ağır xəstədi, sağalmağa ümid azdı. Qızın məndən savayı simsarı yoxdu. Bilmək istəyirəm, qıza o viranxana yerdə hansı niyyətlə arxa durmusuz?

Əfsun eyni sakitliklə cavab verdi:

– Kimsəsiz qıza arxa durmaq, hər şeydən əvvəl, mənim insanlıq borcum idi. Ayrı cür davranmaq ağlıma sığışmadı.

Durna xanım acı təbəssümlə xəbər aldı:

– Bəs, hər şeydən sonra nə?

Əfsun təmkinini pozmadı:

– Hər şeydən sonra da Qumaş nənənin xətir-hörməti, onun mənə yaxşılıqları boynumdakı haqqı-sayı!

Durna xanımın sifəti qırcaşdı.

– O xətir-hörmətin, yaxşılıq haqqı-sayının siz tərəfdən məzənnəsi bizə məlumdu. Daha nə?

– Daha... – Əfsun dözmədi. İçinin qürrə qurdu tərpəndi, yekəxanalandı: – Məramım Tamaşanı xoşbəxt eləməkdi! – dedi.

– Hımm... xoşbəxt eləmək!.. – Durna xanımın kinayəsi səsini titrətdi. – Sizin kimi dil pəhləvanı oğlanların "xoşbəxtlik vədi" adi sabun köpüyüdü! Çirkin niyyətinizə çatana qədərdi. Heç nəyin məsuliyyətini daşımırsınız!

Əfsun cırnamaq əvəzinə qımışdı.

– İnsafınız olsun, Durna xanım. İttihamınız çox ağırdı.

– Nə?!.. İnsaf?! – Durna xanımın hirsi son həddə çatdı. Boynunun damarları şişə-şişə nifrətini ona bütünlüklə bəyan etdi: – İnsafdan danışmağa haqqınız çatmır sizin! Mənim başıma gətirdiklərinizi unudubsuz, yoxsa?!

Əfsun yenidən sakitliklə:

– O məsələlər köhnədə qalıb, Durna xanım, – dedi. – Aradan gör neçə illər ötüb. Mənim də başım daşdan-daşa dəydi. Siz çəkən iztirabları mən də az çəkməmişəm. Bəlkə də sizdən artıq ruhi sarsıntılar keçirmişəm… Nə isə, keçənə güzəşt, deyiblər. İndi mənim otuz yaşım yaxınlaşır. Buraxdığım səhvlərə son qoymağa çalışıram. Daha mən başqa adamam. Romantika ilə yaşamıram. Cavanlıq, çılğınlıq əllamələrimin üstündən xətt çəkmişəm, onlar təkrar olunmayacaq. Unudun o gənclik və giclik qələtlərimi. Allaha şükür, sizin də ailə həyatınız sahmana düşüb. Qəşəngcə bir qızınız da var. Toyunu çaldırıb, nəvə-nəticə görün!

Durna xanım gizlin təəssüf keçirdi. Özü-özündən küsəndi: "Bəxtəvər başıma, içim özümü yandırır, çölüm özgəsini!" –

düşündü. Ancaq qadın qürurunu sındırmadı. Ürəyindən keçənləri dilinə gətirməyib, başqa tərzdə soruşdu:

– Yaxşı, keçənlər keçmişdə qalıb... Amma mənə gərək sırf həqiqəti deyəsiz. O qızla da əylənmək, günü xoş keçirmək istəyirsiz?

– Əsla! – Əfsun qəti cavab verdi. – Mən onu sevirəm. Qəlbən, sidqən sevirəm. Bunu çox rəsmi deyirəm! Tamaşa mənim ürəyimin içindədi. Onunla ailə qurmaq son qərarımdı. Bunu Mara Abramovnaya da bildirmişəm. Xəstəxanaya da onun üçün gəlmişəm ki, Qumaş nənənin xeyir-duasını alım.

Durna xanım sınaq üçün Əfsunun gözlərinin içinə iti zəndlə baxdı. Orada söylənilən bu sözlərin aydın ifadəsini gördü. Çöhrəsindən hiddət cizgiləri silindi. Gərgin sorğu-sual tamamlandı.

İçəri birlikdə keçdilər. İntizar dolu nəzərlər üç tərəfdən onlara zilləndi. Köksü atlanan Tamaşa daha artıq həyəcanla cavab gözlədi.

Durna xanım sakit baxışları ilə otaqdakılara xoş əhval aşılayıb, Süsənbərə üz tutdu:

– Qumaş xalanı gör ayılda bilirsənmi. Onu sən xəbərdar elə.

Süsənbər böyük sevinclə Qumaş arvadı səslədi:

– Can, Qumaş xala, bir hovvurğa gözünü aç. Sənə vacib xəbərim var!..

Hərəkətsiz Qumaş arvadda cüzi tərpəniş belə hiss edilmədi. Kirpiklərinin sıx çəpəri bekaraca da olsa, qımıldanmadı. Üstündəki yalınqat yorğan zorla seziləcək dərəcədə qalxıb-enməsəydi, deyərdin, çoxdanın ölüsüdü.

Süsənbər bir az da irəli durdu. Arvadın çiyninə toxunub, ehmalca silkələdi.

– Əzizimiz Qumaş xala, eşidirsənmi məni? Nəvənə – qəşəngin Tamaşaya xeyir-dua vermək lazımdı. Sən, axı, o günün həsrətindəydin. Gəlib çatıb o gün. Dillən, cavanlara sözünü de!

Qumaş arvad daşa döndü. Cınqırı çıxmadı. Əfsun da irəli durdu. Qumaş arvadın üzündən öpdü, xüsusi istiqanlıqla dil tökdü:

– Mənim mehribanlar-mehribanı, hamıdan mərhəmətli nənəm! Bir acizanə minnət üçün gəlmişəm hüzuruna. Mən də bu gündən sənin qanım-qanından, canım-canından nəvən olmaq istəyirəm. Tamaşa ilə əhdi-peyman bağlamışıq. Bu ömür-gün sevdamıza xeyir-duanı eşitmək arzusundayıq.

Qumaş arvadın süst halı dəyişmədi. Tamaşa hədsiz təlaş içində

özünü bir də nənəsinin üstünə yıxdı. Onu ikitərəfli qucaqlayıb hönkürə-hönkürə yalvardı:

– Qurbanın olum, nənə, niyə dinmirsən? Niyə bizi qorxudursan?! Məni tək qoymaq istəyirsən, nədi?! Hü-hü-hüüü...

Qumaş arvadın göyərib, bir-birinə yapışmış dodaqlarında handan-hana çox zəif çimilti sezildi. Həmən zəif çimilti kirpiklərində də bilindi. Tək bircə anlığa aralandı. Lakin həniri eşidilmədi.

Durna xanım da, o birilər də bunu xoş marama yozdular. Təsəlli tapdılar.

...O gecə səhərə yaxın Qumaş arvad həyatla vidalaşdı.

Matəm xərcini bütünlüklə Əfsun çəkdi. Durna xanımın və mərhumun köhnə iş yerinin köməyindən imtina etdi. Geniş yas çadırı qurdurdu. El adəti üzrə ehsan süfrəsi açdırdı. Ölünün üçünü və yeddisini verdi. Qırxıncı günə qədər isə qəbrin üstünü layiqincə götürtmək, mərmərdən başdaşı hazırlatmaq üçün sifariş verdi.

O, bu müddət ərzində Tamaşanın da qeydinə rəsmi nişanlısı kimi qaldı. Onu evdə tək qoymadı. Mara Abramovnanı qıza həyan olmağı rica etdi:

– Möhtərəm Mara Abramovna, mən sizi Qumaş nənənin əvəzi hesab eləyib, Tamaşadan göz-qulaq olmağı tapşırıram. Onu himayəsiz qoymaqdan ehtiyatlanıram. Qarışıq zəmanədi. Ölkədə it yiyəsini tanımır. Qorxuram yenə pis bir hadisə törəyər. Həm də Tamaşa təkliyə öyrəşməyib. Gecələrin tənhalığında başına hava gələr. Mənim işlərim xirtdəkdəndi. Günüm rayonlarda keçir. Şəhərə yolum az-az düşür. İşləri sahmana salıb, Bakıya tam yığışınca siz onun yanında qalın. Hər xərcinizi də mən çəkəcəm.

Mara Abramovna çox fikirləşmədən yola gəldi:

– Yaxşı, razıyam. Qapımı bağlayıb, köçərəm sən gələnə qədər Tamaşanın yanına. Qumaş bacının ruhu bunnan şad olar.

## 11.

Bəhlul Ağazadə vəzifəsindən kənarlaşdırılmışdı. Xəstəliyi bəhanə edilmişdi. Bir aydan çox idi dövlət işlərində şirin canından keçmiş, şəxsi həyatını ona qurban vermiş bu üzüyola fədakar insan evdə dörd divar arasına qapılıb qalmışdı.

İlk günlər asudəliyinə xeyli şad idi. Tənhalandığını təzə dərd eləyib ürəyinə salmamışdı. Bütün vaxtını doğmadan-doğma balası gözündə gördüyü toppuş qızcığazla – şıtıq, şıltaq Fərəhlə keçirməkdən, onun yanında olmaqdan qəribə həzz duymuşdu. Axşam çağına – Durna xanım kitabxanadan qayıdıncayadək qızcığazla əylənirdi. Ona gah nağıllar, uşaq könlü açan məzəli əhvalatlar, gülməcələr danışar; əksərini özündən uydurduğu qaravəllilərin birini qurtarıb, şirin-şəkər balanın tələbi ilə yenisini başlardı. Daha heç nə uydurmağı bacarmayanda, çənəsi yorulanda isə qıza qoşulub, onunla bərabər oyuncaqlarla oynayardı. Ancaq get-gedə bu məşğuliyyətlərdən usandı; həvəsi, hövsələsi tükəndi. Eyni şeyləri nə qədər təkrarlamaq olardı?! Bir də, axı, Fərəh xeyli böyümüşdü. Körpəlikdəki şirinliyi müəyyən dərəcədə azalmışdı. İki-üç il qabaqkı kimi, qızcığazı çiyninə mindirib, otaq-otaq gəzdirmək, atıb-tutmaq, qıdıqlayıb qəşş etdirmək, evi şən qəhqəhələrlə doldurmaq və bundan böyük ləzzət almaq mümkün deyildi. Fərəhin çəkisi artmışdı, ağırlaşmışdı. Həm də bunlara özünün də taqəti yox idi. Candan çox düşmüşdü. Ağrıları amanını daha artıq qırırdı. Bir sözlə, özünü aldatmalar, yalançı ovunmalar tez bitdi.

Belə də olmalı idi. Günlərini həmişə qızğın fəaliyyətdə sərf etmiş, insanlarla ünsiyyət bağlamış, diqqətdə olmağa can atmış bir adamın təklənməsi, evə qapılıb qalması, yaddan çıxarılması, əlbəttə, ağır dərd idi. İstər-istəməz, onu qüssələndirdi. Ötən haylı-küylü çağların, haqqındakı təriflərin xiffətini çəkdi. Qəmlər, qüssələr, acı xiffətlər xəstəliyini şiddətləndirdi, axırda yatağa saldı.

Əvvəllərdə, cəmiyyət arasında olanda, vəzifəsini icra edəndə can ağrıları bir o qədər də vecinə gəlmirdi. Hər vəchlə yada salmamağa, unutmağa cəhdlər edirdi. Əksər hallarda buna müvəffəq də olurdu. Ətrafındakı işçilər heç nə duymurdular. Həmən cəhdlərin əziyyətləri özünü yalnız gecələr büruzə verirdi. İradəsi zoruna bunu çox vaxt gecələr də hiss etdirməməyi, Durna xanımdan gizlətməyi bacarırdı. Ağzını yastığa möhkəm dirəyib ah-uflarını batırırdı. Səhərləri ciddi ağrılar içində dirigözlə açırdı. İndi isə heç kimə, heç nəyə lazımsızlığı, qəlbinə qara daş bağlamışdı. Ölümünü sürətlə yaxınlaşdırırdı.

Vəziyyətinin gərginliyini bir axşam Durna xanıma başıörtülü

söyləməli oldu:

– Nə ilə məşğulsan, Durna?.. İşdən gəlib dincini ala bilibsənmi?

Durna xanım ona mətbəxdən, xüsusi mehr ilə hay verdi. Bəhlul işdən çıxarılıb, evə qapılandan bəri ona qayğısını, canıyananlığını daha da artırmışdı. Bəhlulun könlünü hər vəchlə şad eləməyə, qəm-qüssədən qorumağa çalışırdı. Müraciətinin başlanğıcında da, sonunda da "can" kəlməsi işlədirdi. Məsələdən hali idi. Ərinin ümid çırağının öləzidiyini aydın görürdü. Həkimlər də bəzi gizlinləri açıqlamışdılar. Sirr saxlamağı mənasız saymışdılar. Həqiqət acı olsa da bildirilməliydi. Odur ki, gödələn ömrü hər vasitə ilə uzatmaq istəyirdi. Yanına yüyürüb gəldi:

– Nədi, can Bəhlulum? Nə lazımdı? Nə gətirim sənə, ömrüm-günüm?

Bəhlul bu ziyadə mehrdən riqqətləndi. Səsi çox həzin, çox kövrək çıxdı:

– Yorğunluğunu alıbsansa, ciddi bir işin yoxdusa, gəl, otur böyrümdə. Bir az ordan-burdan söhbət eləyək. Darıxıram.

Durna xanım nəvazişini artırdı:

– Eləyək, canım-ciyərim, eləyək. Söhbət uzun gecəyə körpüdü. Amma əvvəlcə çörək yeməlisən. Sənin üçün dadlı xörək hazırlamışam. Onu çox xoşlayırsan. Neçə vaxtdı düz-əməlli yemək yemirsən. Belə olmaz.

Bəhlul kəsik-kəsik nəfəs aldı.

– Özün bilirsən ki, Allah iştahımı kəsib. Heç nəyə meylim, həvəsim yoxdur. Ağzımın tamı tamam itib. Xörək adı eşidəndə qusmağım tutur, içalatım çalxalanır. Ürəyim bulanır.

– Axı, heç nə yeməmək, tam ac qalmaq da ziyandı sənə. Azacıq da olsa, boğazından nəsə keçməlidi. Candan lap düşübsən.

Bəhlul təəssüf yanğısı ilə əlini bekaraca yellədi. Dodaqları çox heysiz tərpəndi:

– Daha hər şey gecdi. Qarınınkı qurandan keçib, – pıçıldadı. Başını ehmallıqla qanırıb, yan-yörəyə boylandı. – Mənim şirin-şəkər qızım hardadı?.. Nəynən məşğuldu?

– Böyük otaqda oyuncaqları ilə oynayır. Çağırımmı?

– Yox, çağırma. Başı oyuncaqlarına qarışmağı yaxşıdı. Söhbətimizi qoy eşitməsin. Maşallah, böyüyüb, hər şeyi anlayır. Ürək

sözlərimi sənə təklikdə deməliyəm.

Durna xanım təşvişləndi. Bəhluldan öz səhhəti ilə bağlı nəsə pis xəbər eşidəcəyindən qorxuya düşdü. Ovcunu tələsərək Bəhlulun alnına qoydu.

– Hərarətin, deyəsən, yüksəkdi... Bəlkə həkimlə danışım...

– Həkimə ehtiyac yoxdu… – Bəhlulun sinəsi xeyli qabarıb, aramla çökəldi. – Qorxma. Hələ o qədər də pis deyiləm. Ağlına başqa şeylər gətirmə. Söhbətlə özümü yüngülləşdirmək istəyirəm.

Durna xanım nisbətən sakitləşdi. Ancaq ürəyinin sirli tıqqıltısı ötüb-keçmədi.

– Onda qoy gedim çay gətirim. Təzə dəmləmişəm. İçinə şəfalı otlar da tökmüşəm. Onların xeyri var sənə. Söhbətimizi birlikdə çay içə-içə eləsək yaxşıdı.

Bəhlul alakönül razılaşdı:

– Olsun elə. İki-üç qurtum hortdadaram... Qayıdanda iç qapını örtməyi unutma. Səs-səmir o yanlara keçməsin, arxayın söhbətləşək.

– Baş üstə, örtərəm.

Durna xanım narahat ürək tıqqıltıları ilə o biri otaqdan kiçik masanı bura daşıdı. Çarpayının baş ucuna söykədi. Üstünə təzə süfrə saldı. Bəhlulun çox xoşladığı moruq və heyva mürəbbələrini də gətirib yan-yana qoydu. Sonra da çay dalınca mətbəxə getdi. İki armudu stəkanda çayla qayıdıb, qapını arxasınca örtdü. Bəhlulun böyründə oturub, mehribanca soruşdu:

– Çayına hansı mürəbbədən töküm? Ya qaşıqla götürüb içəcəksən?

– Elə-belə, mürəbbəsiz içəcəm.

– Di onda soyutma, isti-isti iç.

Bəhlul çaydan iki kiçik qurtum hortdadıb stəkanı yerinə qoydu. Rahat uzanıb, Durna xanımın əlini ovcu içinə aldı. (Ovcu nəm idi.) Asta-asta, aram-aram sözə başladı:

– Əzizim üç telli, əvvəlcə məni inandır ki, özünü toxtaqlı aparacaqsan, ağla-sıtqa başlayıb, məni peşman eləməyəcəksən, axıra qədər hövsələ ilə dinləyəcəksən... Hə, söz verirsənmi?

Durna xanım köks ötürüb gileyləndi:

– Bağrımı yarma, can Bəhlulum. Bu nə cürə söhbətdi ki, məni bərkə-boşa çəkirsən?

Bəhlul bir neçə anlıq fasilə verdi. Gözqapaqlarını yarıyacan qapayıb, ciddiyyətlə davam etdi:

– Bərkə-boşa çəkmirəm, üç telli. Sadəcə səni təmkinə, səbrə səsləyirəm. Söhbətimiz bir az xoş ovqatsız olacaq. Könül bulandıracaq. Xəbərdarlığa məcburam. Dinləməyə hazırsanmı?

Durna xanımın səsi batqınladı:

– Hazıram.

Bəhlul yenə bir neçə anlıq fasilə verdi.

– Ağlım-huşum başımda ikən, dilim söz tuturkən, ürəyimi sənə boşaltmaq istəyirəm. Vəsiyyətimi eləmək qərarına gəlmişəm...

Durna xanım tir-tir titrədi. Uçum-uçum uçundu:

– Oyy, qurban olum, bu nə deməkdi?!.. Vəsiyyət nə üçündü?!.. Yalvarıram, vahiməyə salma məni… Elə şeyi gətirmə dilinə!

Bəhlul incimiş halda onu danladı:

– Uşaq deyilsən, Durna. Toxtaqlı ol. Xahiş eləyirəm axıracan səbirlə qulaq as mənə. Heç kim və heç nə əbədi qalmır bu dünyada. Bir gün yaranan, bir gün də köçünü sürməlidi. Bu, həyatın pozulmaz, mütləq qanunudu.

– Yox, yox! – Durna xanım çılğınlıqla etiraz elədi. – Belə sözləri mən eşitmək istəmirəm. Dəyiş mövzunu... Sənin nə yaşın var ki, ölümü dilə gətirirsən?!.. Hələ heç qırx iki yaşın da tamam olmayıb. Sən çox yaşamalısan!

Bəhlul yenidən həlim danışığa keçdi:

– Ömür məsələsi bizim arzumuzdan, istəyimizdən asılı deyil, mənim üç tellim. O, Allahın insanlara sovqatıdı. Bəndələrinə yaşam payıdı. Ondan bəzilərinə çox, bəzilərinə az düşür. Odur ki, hay-küy əbəsdi, həyəcanlanmağa, təlaş-təşvişə dəyməz.

Durna xanım sakitləşmədi.

– Əslinə qalsa, mən səndən tez ölməliyəm. Sənin də qarşında, Ulu tanrımızın da qarşısında günahlarım çoxdur.

Bəhlulun sifəti qırcaşdı. Köhnələr yadına düşməkdən əlavə, can ağrısı da ona qarışdı. Handan-hana özünə gəlib, nəsihətlə dedi:

– Allah işinə qarışmaq, ona asi olmaq deməkdi. Bu asilik bəndələrə qəti yasaqdı. Hərənin öz alın yazısı var.

Durna xanım göz yaşları içində, üsyankarlıqla bir də etiraz etdi:

– Mən belə alın yazısına inanmıram! Ona qane deyiləm! Sənsiz həyat mənə heç nədi, dözülməz cəzadı... Görsəm ki, əlim

üzülür səndən, zəhər içib, birinci mən köçümü sürəcəm.

Bəhlul çaydan bir qurtum da içdi. Azacıq yaşlanmış boğazını əli ilə də ovxalayıb, xırıltılı səsini ciddiləşdirdi:

– O böyük axmaqlıq olar, Durna. Ən səfeh hərəkət olar! Unutma ki, bizim müqəddəs öhdəliyimiz var. Fərəh qızımızı ləyaqətlə böyüdüb ərsəyə yetişdirməyə, xoşbəxt insanlar cərgəsinə qatmağa söz vermişik, əhd eləmişik. Vicdanımızla ona boyun olmuşuq. Bunun üçün Allahdan kömək diləmişik.

Durna xanım yanğı ilə başını yırğaladı.

– Bilirəm, hər şey yadımdadı… Bəs bu müqəddəs öhdəliyi yerinə yetirməyə qurban olduğum Allah niyə mane olur? Diləyimizi nə üçün eşitməyib?! Biz, axı, yaxşı niyyətdə olmuşuq. Onun kimsəsiz bir körpə bəndəsini himayəyə götürmüşük. Öz canımızdan artıq əzizləyirik, doğmamız sayırıq. Ulu tanrı bizə kömək durmaq əvəzinə, başa düşmürəm, işimizi niyə əngəlləyir... Budumu onun insafı, ədaləti?!

– O dərinliklərə getmə. Tanrı sirri açılmaz bir boxçadı. İnsan idrakının əl çatmazı, ün yetməzidi. Bəşəri anlayış xaricindəki hikmətdi. Öz düşüncəmiz miqyasında davranmaq məsləhətdi. Reallıqla barışmalıyıq.

– Heç vaxt, heç vaxt barışa bilmərəm, Bəhlulum!.. Qoymaram öləsən!.. Evimi, malımı-mülkümü, cəvahiratlarımı, əyin paltarlarımı satıb həkimlərə verəcəm, səni lənətli azar-bezarlardan xilas eləyəcəm. Sənsiz bir çürük çöp də mənə gərək deyil!!

Durna xanım bunları tövşüyə-tövşüyə deyib, axırda qəhərini boğa bilmədi, bərkdən hönkürdü.

Bəhlul ona sərtliklə acıqlanmalı oldu:

– Bu nə şivəndi salıbsan?!.. Ayıbdı! Ağlamağını uşaq eşidər, qorxuya düşər... Nə olub, axı? Niyə vahimələnirsən? Bu saat ayaqlarımı uzadıb ölmürəm ha. Vəsiyyət yüngüllükdü. Ürək sakitləşdirmək üçündü... Mən səni bu dərəcədə zəif iradəli təsəvvür eləmirdim. Sən savadlı, həyatı başa düşən qadınsan. Bu dünya, təkrar eləyirəm, gəlimli-gedimli, ölümlü-itimli, sonu boz-bulanlıq dünyadı. Göz yaşı tökməklə heç nəyin qabağı alınmır.

Durna xanım dili dolaşa-dolaşa:

– Ürə…yimə dam… mışdı, – dedi. – Sən nasazlayandan bəri səksəkədəydim. Nahaq deməyiblər: ağıla gələn başa gələr... Əmiqızım Süsənə bunu söyləmişdim. Bəxtiqaralıq məni çoxdan basıb...

Bəhlul təəssüfünü bu dəfə gizlətmədi:

– Olacağa çarə yoxdu, üç telli. Tale yazan belə yazıb. Mən də uzun yaşamaq arzusundaydım. Fərəh qızımın toyunu görmək, nəvə əlindən tutub bağlarda, bağçalarda gəzib-dolanmaq, başqa babalar kimi bundan ləzzət duymaq xəyalındaydım. Arzular, təəssüf ki, kövrək qanadlı olur, çox da uzaqlara uça bilmir. Amma bir inancım var: mənim görməyəcəklərimi sən mütləq görəcəksən. Nəvə ləzzətini mənim də əvəzimdən çəkəcəksən! Bunun üçün gərək dözümlü olasan. Ağla sıtqaları bir qırağa qoyasan. Onsuz da onlardan fayda yoxdur; əbəs yerə can üzmək, ömür çürütməkdi.

Durna xanımın asta hıçqırtıları azalmadı, bir az da artdı. Bəhlulun özü də təsirlənmişdi, gözləri doluxsunmuşdu. Qəhərlə davam etdi:

– Durna, əzizim, eşit nə deyirəm. Diqqətin məndə olsun. Bu həyatı mən alayarımçıq yaşadım, onun dadını-duzunu az dada bildim. Çox-çox heyiflər ki, insan özünü kənardan müşahidə etməyə acizdir. Nədə səhv buraxdığını, harda büdrəyəcəyini görmür. O vaxt ayılır ki, artıq gecdir, o səhvləri düzəltmək mümkünsüzdü... Ancaq mənim təsəllim, ürək rahatlığım da yox deyil. Paxıllıq, bədxahlıq, kin-küdurət, saxtakarlıq qəlbimə heç zaman yol tapmayıb. Həmişə xeyirxahlığa çalışmışam. Dara düşənə bacardığım qədər kömək əli uzatmışam. İnsanı yazıq, məzlum görmək qəlbimi daim ağrıdıb. Heyhat ki, başa düşülmədim. Məni anlamadılar. Dostlar, tanış-bilişlər məndən üz döndərdilər, salam-kəlamı kəsdilər. Qohum-əqrəbalarım bütün əlaqələri qırdılar. Olmazın zəhmətlə, əziyyətlə dardan qurtardıqlarım, xoş yaşam tərzinə qaytardıqlarım da arxamdan qaçdılar, meydanda məni tək qoydular. Təklənmək çox ağır dərddi...

O, ağrılardan bərk qovşuruldu. Çətin-çətin arxası üstə çevrildi. Hər an dəyişən, haldan-hala düşən, qırcaşan sifətindən apaydın sezilirdi ki, danışmağa əzab çəkir. Amma başladığı söhbəti, zorla da olsa, tamamlamağa çalışdı:

– Ehh, nə isə… Olan oldu, keçən keşdi, mənim üç telli Dur-

nam. Özümü tərifləmək, təmizə çıxartmaq fikrim yoxdu. Azdan-çoxdan bələdsən mənə. Bəzi mətləbləri, sadəcə, yada saldım. Ona görə xatırlatdım ki, sən dəyanətli, daha artıq toxtaqlı olasan. Qarşında böyük məsuliyyət durur. Öz səhhətinə, sağlamlığına ciddi diqqət ver. Balaca Fərəhimizdən müğayət ol. Onun gələcək xoşbəxtliyi sənin ixtiyarındadı. Onu sənə, səni də Allaha tapşırıram… Bir vəsiyyətim də var: çalış məni urvatlı dəfn elətdir. Bura qəbiristanlıqlarında yox, kəndə apartdır. Məzarımı anamın ayaqları altında qazdır. Anam məndən küsülü getdi. Heç olmasa, onunla axirətdə barışa bilim… Di, sağ ol! Mən yüngülləşdim. Sən də sakitləş. Get, arxayınca ayrı işlərini gör.

Durna xanım heç cürə sakitləşə bilmədi. Acı hönkürtülərlə mətbəxə gəldi. Burada pəncərə çərçivəsinə dirsəklənib, alnını şüşəyə söykədi, hönkürtüləri get-gedə gücləndi.

Bir azdan qoluna kim isə toxunduğunu duydu. Balaca Fərəhin cingiltili səsi qulaqlarını oxşadı:

– Ağlama, anacan! Su gətirmişəm sənə. Al, iç, ürəyin sakit olsun.

Uşağın böyüklər sayağı bu qayğısı Durna xanımı mat qoydu. Hönkürtüsü tezcə kəsildi, toxtadı. Qızı sevinclə, heyranlıqla qucaqlayıb, bağrına basdı. Dönə-dönə öpüb, şükürənlıqla pıçıldadı:

– Qurban olum sənə, mənim qulluqdar balam! Çox sağ ol, uzun yaşa!.. Nə yaxşı ki, sən varsan. Həyatım tamam puç deyil!

## 12.

Azadlıq uğrunda xalq hərəkatı bahara doğru daha da şiddətləndi. Meydan mitinqləri, küçə yürüşləri kəskinləşdi. Qarşısı heç nə ilə alınmaz möhtəşəm qüvvəyə çevrildi. Ətrafına əhalinin böyük əksəriyyətini toplamağa müvəffəq olmuş "xalq cəbhəsi" təşkilatı ölkədə miqyassız nüfuza mindi. Həqiqi mənada kütlə təmsilçisi, milli ruh daşıyıcısı bir qurum kimi tanındı. Az müddətdə bütün dünyanın demokratiya tərəfdarları, mühüm təşkilatları diqqətlərini Azərbaycana yönəltdilər. Hərəkata gizli və açıq şəkildə maddi-mənəvi dəstək verdilər. Yerli hakimiyyət son dərəcə qamaşdı. Əhali mövcud quruluşa itaətsizlik göstərməyə başladı. Hökumət daxilində parçalanma getdi. Onların müəyyən qismi xalq

tərəfinə keçdi. Nümayişlərə qoşuldu. Hüquq-mühafizə orqanları, daxili qoşun hissələrinin zabit və sıraviləri də iki tirəyə bölündülər. Çoxluq kükrəmiş camaat ilə qarşı-qarşıya durmaqdan çəkindi. İqtidarın təzyiq və təkidinə baxmayaraq, hadisələrə adi müşahidəçi mövqeyi seçdilər. Yaxın-uzaq məmləkətlərdə mənfi rəy doğurmuş ötənilki iyirmi yanvar faciəsi, görünür ki, gözlərini qorxutmuşdu.

Laxlamış quruluşa – sovet cəmiyyətinə sonsuz nifrət, sönməz qəzəb dalğası axırda o həddə gəlib çatdı ki, həmişə dənizkənarı meydana toplaşaraq, etirazlarını, bəyanatlarını dünyaya oradan yayan; mübarizələrini son nəfəsədək aparacaqlarını bildirən mitinqçilər lənət şüarları ilə daha kifayətlənmədilər. Hakimiyyət iqamətgahına hücuma keçdilər. "Mərkəzi Komitə binası"nı əhatəyə aldılar. Binanın qənşərindəki hündür pillələr üstündə rəmzi "dar ağacı" qurdular, yaxın yolları, küçə və səkiləri əl-ələ tutuşub, qol-qola girib bağladılar. Giriş-çıxış yerlərinə sədd çəkdilər. Yüksək çinli məmurların, respublika rəhbərlərinin istefasını bir ağızdan tələb etdilər.

Günortadan sonra adamlar birə-beş gurlaşdı. "Azneft" binasının yanından başlamış filarmoniyanın önü, keçmiş "Bakı Soveti" metrosunun ətrafı narazılarla doldu. Cəld, çevik oğlanların bir çoxu filarmoniyanın damına, küçədəki hündür ağacların başına dırmaşmışdılar. Oradan hadisənin gedişatını izlədilər. Aralarında Dövlət Təhlükəsizlik İdarəsinin mülki geyimli əməkdaşları da, şübhəsiz ki, vardı.

Bu gün mikrofon açıq idi. Könlü istəyən ona sərbəst yaxınlaşıb öz ürək sözlərini söyləyirdi. Tanınmış ziyalılar – alimlər, şairlər, yazıçılar, jurnalistlər, mədəniyyət işçiləri, müəllimlər, mühəndislər, həkimlər, hətta adi vətəndaşlar da odlu-alovlu çıxışlarını "sovetlərə ölüm!", "Kommunistlərə nifrət!" nidaları ilə tamamlayırdılar. Vaxtilə üstündə əsim-əsim əsdikləri, göz bəbəyi kimi qoruduqları "Sovet İttifaqı Kommunist Partiyasının üzvlük kitabçası"nı elə oradaca kibrit çəkib yandıran kim, cırıb vərəqlərini havaya atan kim! Halbuki, o kitabçanı almaq, kommunist partiyasının üzvü olmaq üçün bir çoxları dəridən-qabıqdan çıxmışdılar. Hələ karrıca "şirinlik" də vermişdilər. Çünki cəmiyyətdə mövqe qazanmaq ayrı cürə mümkün deyildi. Partiyaya üzv ol-

mayanlar irəli çəkilmir, vəzifəyə layiq görülmür, dövlət mükafatlarına, yüksək təltiflərə ömürlük tamarzı qalırdılar.

Yaranmış imkanı Əfsun Zamanlı da ötürmədi. Bu, əla fürsət idi. Çənədanı boşaltmaq, mitinqçilərin, onların liderlərinin diqqətini özünə cəlb etmək üçün yaxşıca məqamdı. Belə şərait hələm-hələm ələ düşmürdü.

Adamları yarıb önə gəldi. Mikrofonu iki əllə qamarlayıb, ilk cümlədən bar-bar bağırdı:

– Əziz qardaş və bacılar! Möhtərəm mitinq iştirakçıları! Burada, məndən əvvəl gözəl, məna-məntiqli çıxışlar oldu. Dəyərli fikirlər söyləndi. Onlara əlavə olaraq, demək istəyirəm ki, biz haradasa bəxti gətirməmiş millətik, öz bolluca, çoxluca var-dövlətimizdən umsuq qoyulmuş xalqıq! Torpaqlarımız barlı-bərəkətli, sərvətlərimiz başımızdan aşdığı halda, özümüz yarıac, yarıçılpaq yaşayırıq. El içində bir hikmətli deyim var: “Hamını bəzər, özü lüt gəzər”. Bax, o bizik! Neftimizlə, qazımız-benzinimizlə başqa məmləkətləri çilçıraq eləyirik. Amma özümüz çox vaxt qaranlıqda qalırıq. Qazımız, benzinimiz kənd-kəsəklərimizə gedib çatmır. Çatanlar da keyfiyyətsiz və yararsız olur. Bunlardan başqa da ağ qızıl adlanan pambıq bizdə, qızılın özü, dəmir-filiz yataqları uca-uca dağlarımızda, taxılımız yetərindən artıq, buğda, arpa, düyü, qarğıdalı, darı, çovdar bu qışdan o qışa ötürülür. Hər cürə mer-meyvəmiz, bostan və tərəvəz bitkilərimiz növ-növ! Allah-təala heç nəyini əsirgəməyib bizdən. Bəs onda nəyimiz çatışmır? Boynumuza alaq ki, fərasətimiz! Bütün nemətlərimizin şəriksiz sahibi olmaq bacarığı! Bu sahibliyi əgər bacarsaq, dünyanın ən varlı, ən zəngin ölkələrindən birinə çevrilərik. Lakin nə yazıq ki, bal tutan barmağımızı yalamaqla kifayətlənirik...

O, fasilə verdi. Çığırmaqdan səsi tutulmuşdu, xırıldamağa başlamışdı. Öskürəklə boğazını yaşlayıb, izdihama göz gəzdirdi. İzdiham onu maraqla dinləyirdi. Həvəsləndi, daha çığır-bağır salmadı. Özünə güvənclə, aramla davam etdi:

– Hə, əziz qardaş və bacılar! Çox hörmətli ağsaqqallar və ağbirçəklər! Allaha min-min şükürlər ki, neçə yüz illərlə, qərinələrlə arzusunda olduğumuz, gecə-gündüz həsrətini çəkdiyimiz, nisgili

ilə könlümüzü qubarlatdığımız o şanlı, o müqəddəs gün bizə yaxınlaşmaqdadı. Ucalardan-uca amalımıza qovuşmağa lap az qalıb. Daha da sıxlaşsaq, yumruq kimi bir ovucda möhkəm düyülsək, qəddar düşmənimizin – mənfur “bolşevizm”in nəfəsini birdəfəlik kəsib müstəqillik qazanarıq. Rədd olsun, qəbrə gömülsün Sovet hökuməti! Lənətə gəlsin onun “kommunizm” adlı yalançı cənnəti! Bəsdi boş vədlərə aldandıq. “Müvəqqəti çətinlik” – deyib başımızı yozdular. Bir qarın çörəyə möhtac qoydular. İllərlə ətə, yağa, qəndə, qeyri vacib məhsullara əliuzalı qaldıq. Hər adi şey üçün saatlarla növbəyə durmaqdan qılçalarımıza qara su endi. Ən qeyrətli, yüksək ağıl, istedad, müdrik zəka sahibi adamlarımızı şərləyib tutdular. Qanunsuz-məhkəməsiz güllələdilər. İlik donduran uzaq Sibir çöllərində, soyuq və qaranlıq məhbəslərdə, it ulayan sürgünlərdə ömürlərini çürütdülər. Tarixdə görünməmiş müsibətlər törətdilər. O insan cəlladlarına – qırmızı iblislərə ölüm, yenə də ölüm!

İzdiham uğuldadı. Sürəkli əl çaldılar. Əfsun Zamanlı bundan ruhlandı. Əlini rəmzi “dar ağacına” tuşlayıb, boğazını yırta-yırta təzədən bağırdı:

– O vəhşiləri, qaniçənləri bu dar ağacından asmaq, xirtdəklərini üzmək də azdır. Onlar daha dəhşətli cəzaya layiqdirlər. İrəli, qardaşlar, irəli! Haqq-ədalət bizimlədir!!

Çəpiklər gücləndi. Arası kəsilmədi. Əfsun Zamanlı qəhrəman iddiası ilə mikrofondan ayrıldı. Bir qədər qıraqda, dəstə halında müxalifət liderləri dayanmışdılar. Professor Cəmil İmanlı da onlarla idi. Əfsun professora doğru getdi. Çıxışı barədə ondan xoş söz eşitmək xəyalına düşdü. Professor onu rişxəndlə qarşıladı:

– Yaxşı qırıldatdın, afərin!

Müxalifətçilərdən biri Əfsuna yan basdı:

– Yaxşı qırıldatmadı, professor, çox mənalı, məzmunlu danışdı. Halal olsun!

Digəri professora yarındı:

– Bizim görkəmli, hamımızın sevimlisi alimimizin yetirməsidi bu oğlan. Ayrı cür də ola bilməz!

Daha bir nəfər isə bir gülləyə iki ov vurdu:

– Qaydadır, yaxşı tələbə sevdiyi müəlliminin yerişini yeriyər!

Cəmil İmanlı etirazını kəskin bildirdi:

– Məni yamsılayanlara ehtiyacım yoxdur. Bunu öz kölgəm daha urvatlı bacarır! – dedi.

Müxalifət dəstəsinin ortasında təmkinlə dayanmış ağsaçlı, ortaboylu kişi Əfsuna minnətdarlıqla üz tutdu:

– Bəyəndik sizi. Bizimlə əlaqə saxlayın.

Professor gərgin nəfəs dərdi. Çiyinlərini silkələyib, yönünü sərt tərzdə yana döndərdi. Əfsun ehtiyatlandı. Professorun xasiyyətinə bələd idi. Belə qəribə hərəkətdən sonra o, mütləq ciddi irad söyləyirdi. İndi də nəsə ağır söz deyəcəyini yəqinləyib, dəstədən tez aralanmağa çalışdı.

O, gözdən itəndən sonra Cəmil İmanlı məslək dostlarını ciddiyyətlə məzəmmətlədi:

– Ürəyiyumşaqlıq eləyirsiniz, qardaşlar. Hər ağzıgöyçəyə rəğbət bəsləmək, bağışlayın məni, kobud səhvdir.

Ağsaçlı kişi xəfif təbəssümlə soruşdu:

– Möhtərəm professoru narahat edən nədir?

Cəmil İmanlı sualı sualla qabaqladı:

– İndi burdan gedəni – çıxışı xoşunuza gəlmiş o cavanı tanıyırsınızmı?

– Xeyr. – Ağsaçlı kişinin xoş təbəssümü dodaqlarından silinmədi. – Bizim onu tanımağımız bir o qədər də vacib deyil. Möhtərəm müəllimimiz Cəmil İmanlının tələbəsi olmağını bilməyimiz bəsimizdir. Tələbənin hörmətli professoruna isti münasibəti çox şeydən xəbər verir.

Cəmil İmanlı, adət üzrə, çiyinlərini atıb gərnəşdi.

– Burasını da unutmayın ki, hər yoğrulan xəmirdən yağlı kökə alınmır!

Ağsaçlı kişi həlim səslə:

– Əlbəttə, – dedi, – hər oxuyan Molla Pənah olmur. Bu aksiomadı. Lakin biz mövcud vəziyyəti, cəmiyyətin çağdaş durumunu nəzərdən qaçırmamalıyıq. Çürümüş, laxlamış, iprənmiş bir ideologiya mühitində, manqurtlaşmış ictimaiyyət içində az-çox müstəqil düşüncəyə, fərdi təfəkkürə, erudisiyaya və nəhayət, milli dərkə malik gənclərimiz varsa, buna sevinməliyik, ondan qürur duymalıyıq.

Çünki sovet təbliğat maşını insanların beynini kütləşdirib. Sərbəst düşünmək, fərdi fikir söyləmək, hadisələrə açıq gözlə münasibət bildirmək, faktiki olaraq, heçə endirilib. Belə şəraitdə bir çox müsbət keyfiyyətləri özündə cəmləşdirmiş gəncləri öz cərgələrimizə qatmalıyıq. Bəzi qüsurlara, mənfi cəhətlərə yol veriblərsə, ona göz yummaq lazımdır. Bizim ümumi həmrəyliyə ehtiyacımız böyükdür.

Cəmil İmanlı sözünü göyərtdi:

– Mən təkrar deyirəm: hər boşboğaza, dildən pərgara inanmaq, ona bel bağlamaq, ən azı, sadəlövhlükdür.

Digər müxalifət lideri maraqlandı:

– Konkret danışaq, professor. İndicə burdan gedən oğlandan rəncidəliyiniz nədəndir? O, axı, bizim fikirlərimizi bölüşdürdü. Parlaq çıxışı hamını heyran qoydu. Belə görünür, savadlı, dərin təfəkkürlü cavandı.

Cəmil İmanlı acı kinayə ilə:

– Elədi, görünür, – dedi. – Ancaq görünmək çox vaxt əslin tərsi olur. Adi ilğım mahiyyəti daşıyır.

Dəstədən daha bir nəfər söhbətə qoşuldu:

– Nədir o ilğım, professor? Sizə zəhmət deyilsə, xahiş edirik, açıqlayın.

Cəmil İmanlı bir qədər düşündü. Alın qırışları və çənə əzələləri qabardı. Cod danışdı:

– Sizin xoşunuza gəlmiş o oğlan dələduzdu, fırıldaqçıdı. Dili ilə ürəyinin ittifaqı olmayan söz pəhlivanıdı. Yalançı, böhtançı, min sifətlidi!

Liderlər gülüşdülər. Ağsaçlı kişi əvvəlki həlimliklə professora irad tutdu:

– Ciddi narahat olmağa dəyməz, professor. Hələlik beləsləri də bizə lazımdı. Hardasa, nədəsə ümumi işimizə xeyirləri dəyə bilər.

– Mən razılaşmıram! – Cəmil İmanlı höcət etdi: – O oğlan həm də iqtidar adamıdı. Həbsxanada onu mənim üzümə qoymuşdular...

Ağsaçlı kişi dodaqucu qımışdı:

– O oğlanın iqtidar adamı olması da bizə xeyirlidi, professor? Kütlə arasında bizim lehimizə danışırsa, mövcud quruluşu pisləyirsə, öz rəhbərlərinin əleyhinə gedirsə, bu əladır ki! Düşmənin

yumruğunu qaldırıb özünün başına çırpmağa bərabərdi.

Cəmil İmanlı etirazını kəskinləşdirdi:

– Mən bunun tam əksini fikirləşirəm. Düşünürəm ki, onlar gələcək işlərimizə pərsəng olacaqlar. Gizlin əngəllər törədəcəklər. Əhali arasında narazılıqlar yaradacaqlar. Elələri sıralarımızda az deyil, əksəriyyəti də Dövlət Təhlükəsizlik xəfiyyələridi. Hər sirrimizi yuxarılara çatdırırlar. Ona görə də bir para planlarımız, tədbirlərimiz istədiyimiz şəkildə alınmır. Hələ sonralar daha bic badalaqlar quracaqlar.

Digər müxalifət lideri təskinlik verdi:

– Bəzilərinin hərəkəti bizə də bəllidi, professor. Onlardan məlumatımız var. Qoy müqəddəs amalımıza çataq, onlarla asan xudahafizləşərik.

Dəstədən kim isə zarafata saldı:

– Ata yetincə eşşək minmək ayıb deyil!

Bir başqası zarafatı şitləşdirdi:

– Dar ayaqda öküzü də minmək mümkündü!

Cəmil İmanlı hər iki zarafatcıla bir tulamazdı atdı:

– Ümumxalq işini eşşək, yaxud öküz minənlərə etibar etmək böyük axmaqlıqdır!

Ağsaçlı kişi əlini nəzakətlə Cəmil İmanlının çiyninə qoydu.

– Belə xırda-para şeylərin nigarançılığını keçirmək çox tezdi, professor. Hər işin öz görülmə məqamı var. Gəlin, arxı hoppanmamış “hop” deməyək.

Cəmil İmanlı höcətindən qalmadı:

– Mikrob qana işləyəndən sonra müalicəsi uzun və ağır olur!

Ağsaçlı kişi sülhə çalışdı:

– Gəlin, bir-birimizi başa düşək. Hərə öz qənaətini söyləyir. Məsələn, mən bu fikirdəyəm ki, milli hərəkatımızda xalqın bütün zümrələrinin iştirakı vacibdir. Saf-çürük etmək bu günün problemi deyil.

Cəmil İmanlı inciklikłə ayaqlarının ucuna baxdı. Dodaqaltı gileyləndi:

– Bu neçənci dəfədir sözüm yerə düşür. Məsləhətim eşidilmir. Belə olan halda, mənim sizin sıralarınızda yerim yoxdur. Vaxtımı

burada nahaq itirirəm.

Digər müxalifət lideri professoru dostyana qınadı:

– İncimək sizə yaraşmır, professor. Siz böyük ürəkli, dərin kamallı insansınız. Bir alim kimi də, şəxsiyyət kimi də fəxrimizsiniz. İstiqlaliyyət uğrunda apardığımız mübarizənin önündə gedənlərimizdənsiniz. Sizin məsləhətlərinizi eşitmək bizim şərəfli borcumuzdu. İntəhası, siyasət naminə bəzi güzəştlərə getməyə məcburuq. Bunu zaman və vəziyyət tələb edir.

Cəmil İmanlı könülə gəlmədi. Ayağının birini getməyə hazırladı.

– Boynuma alıram, mən siyasət adamı deyiləm. Ondan qandığım qrafa çox azdır. Gedib öz elmi araşdırmalarımla məşğul olsam, dərsimi deyib gələcəyə qabiliyyətli gənclər yetişdirsəm, xalqa, cəmiyyətə daha artıq xeyir verə bilərəm. Bu gündən mən siyasi fəaliyyətimi dondururam.

Ağsaçlı kişi təlaşlandı.

– Səbir edin, professor. Hövsələsiz olmayın. Heç nədən ixtilafa səbəb yoxdur.

Cəmil İmanlı o biri ayağını da qaçaraq qoydu.

– Məni düzgün başa düşün. Şıltaqlıq, ərköyünlük eləmirəm. Sadəcə, ürəyimdəkiləri dilimə gətirirəm. Mən sizin cərgələrinizdə artıq olduğumu çoxdan hiss etmişəm. Mənim həyata baxışlarım, hadisələrə münasibətim sizinkilərlə uzlaşmır, üst-üstə düşmür. Bugünkü mübahisəmiz bizim fikir ayrılığımızı bir daha sübuta yetirdi. Odur ki, mənim adımı siyahınızdan silin. İndən belə heç bir tədbirinizə qatılmayacam. Siz sağ, mən salamat!

Digər müxalifət lideri rəsmi danışdı:

– Biz onu bacarmayacağıq, professor. Siyahıdan ad silmək bizim səlahiyyətimiz xaricindədi. Təşkilatımızın bizdən böyükləri var. Bir də, axı, siz "divan" üzvüsünüz, iradlarınızı buyurun, gəlin ali orqanımız olan "divan" yığıncağında söyləyin.

Cəmil İmanlı əlini yellətdi. Üzünü çevirib, gedə-gedə:

– Mən qərarımı istisnasız bildirdim, – dedi. – Onu böyüklərinizə olduğu kimi çatdırmağınızı rəncidəsiz təvəqqe edirəm. Lazım gələrsə, siyasətdən uzaqlaşmağımın səbəblərini yazılı şəkildə çatdıraram. Xudahafiz!

Arxadan onu iki-üç dəfə səslədilər, əylənmədi. İnadkar addımlar yeyinlədi.

**13.**

Həmən dəqiqələrdə Əfsun Zamanlı əllərini arxasında çatıqlayaraq, hünərli-hünərli izdihamın içərilərinə irəliləyirdi. Çıxışını bəyənmiş adamlardan yeni təşəkkür eşitmək həvəsindəydi. Lakin bunun əksi alındı.

Məsim Müslümoviç də başının dəstəsi ilə bugünkü mitinqdə idi. Artıq ciddi təşvişə düşmüş yerli hakimiyyət rəhbərlərinin tapşırığı ilə gəlmişdi. Real vəziyyəti öyrənib, lazımi instansiyalara səhih məlumat çatdıracaqdı.

Həmkarları Əfsun Zamanlını ağır qaşqabaqla əhatələdilər. Əfsun məsələni duydu. Yanlarından saymazyana ötmək istədi. Arxadan kim isə çiynindən möhkəm yapışdı. Bütün gücü ilə özünə sarı çəkdi. Əfsun səndirlədi. Müvazinətini tarazlayıb, əsəbi halda geri çönəndə Məsim Müslümoviçi önündə gördü. İri gövdəli, dolu bədənli bu nəhəng kişi hirsindən tir-tir əsirdi. Gözləri hədəqədən çıxmış, ağzı xeyli yana əyilmişdi. Nəfəsi tıxaclana-tıxaclana qışqırdı:

– Dayan, çörək tapdayan haramzada! Yaxanı əlimdən qurtara bilməyəcəksən!

Əfsun nər kimi qızmış, kükrəmiş Məsim Müslümoviçlə çənələşməyə vaxt itirmək istəmədi. Başını dik tutub, etinasızlıq göstərdi. Məsim Müslümoviç Əfsunun çiynini buraxıb, yaxasından yapışdı. Kobud söyüşə keçdi:

– Ə, zatıqırıq köpək oğlu, o nə hədyanlar, həyasız çərənləmələr idi danışırdın?! Bizə verdiyin vədlər, sovet quruluşu haqqında söylədiyin ağızdolusu təriflər, mədhiyyələr hara, bu iftiralar, böhtanlar hara?!.. Nə irsiz, nə vicdansız adamsan?! Bir damcı həya suyu yoxdu sənin üzündə!

Şakir Şadmanlı sədrinin sözlərinə sakit-sakit qüvvət verdi:

– Nüfuzlu bir dövlət təşkilatına sığınıb, onun sayəsində dirçəlib, adamlıq sifətinə düşüb, sonradan bütün yaxşılıqlara tüpürmək, arxa çevirmək, ən azından, mənəvi çirkinlikdi! Yumşaq

desək, əxlaqsızlıqdır!

Fərid Cəbizadə isə köhnə tələbə yoldaşını köntöy yamanladı:

– Qoç olmamış buynuz çıxardanlardandı bu!

Məsim Müslümoviç nərildədi:

– Beləsində əxlaq, ar-namus nə gəzir? Anasının süd əmdiyi əmcəyini kəsən nankordur! Gedib tapıb taylarını. Qoşulub o "cəbhəçi" gədələr cərgəsinə. Gözündən gəlsin ona yaxşılıqlarımız!!

Karıxmış Əfsun boğazı üzülürmüş kimi xırıldadı. Həmişə yüyürək dili damağına yapışdı. Dillənə bilmədi. Yaxınlıqdakı adamlardan biri ona qəhmər çıxdı:

– Nə istəyirsiniz bu cavandan? Nə düşübsünüz hər tərəfdən onun üstünə?! Tribunadan nə dedisə, çox düz dedi. Ürəyimizdən dedi. Əl çəkin yaxasından!

Məsim Müslümoviç Əfsunun yaxasını buraxıb qəhmərçiyə doğru qanrıldı.

– Siz kimsiniz?! Sizə nə düşüb, qarışırsınız bu məsələyə?! Ələkçinin qıl vərəni çatışmırdı, elə!

Qəhmərçi sərt adam idi. Cavabı da yetərincə sərt səsləndi:

– Haqqın ağzına daş basmaq, düz söz danışanı amansızlıqla susdurmaq sizin kimilərinin köhnə peşəsidi. Daha heç nədən qorxan yoxdur. Hədə-hərbə çanağı öz başınızda çatdayacaq!

Məsim Müslümoviç şeşmərləndi:

– Bura bax, eyy! Dilini farağat saxla. Sənə dəxli olmayan işə başını soxma. Öz işçimi tənbeh etməyi mənə heç kəs qadağa qoya bilməz!

Qəhmərçi də döşünü qabağa verdi:

– Öz işçinizi öz iş yerinizdə tənbeh eləyə bilərsiniz. Camaat içində təhqirə, alçaldıcı ifadəyə ixtiyarınız yoxdur. İnsan hüquqlarını, heç olmasa, burda pozmayın.

Məsim Müslümoviç bir addım irəli gəldi. Yenidən şeşmərləndi:

– Sən mənə ədəb dərsi öyrətmə! Mən yaxşı bilirəm kiminlə harda, necə danışmaq lazımdı. Yol azmışa düz yol göstərmək hər məqamda vacibdir!

Burada bir başqası da mübahisəyə qoşuldu:

– Hörmətli yoldaş, mən bilmirəm siz kimsiniz, nə səlahiyyətin sahibisiniz. Ancaq mənə bir şey aydındır ki, iqtidar nümayəndə-

lərindənsiniz. Başa düşün, birkərəmlik anlayın ki, daha bu həna, o hənadan deyil. Camaatın canı cəzanə gəlib. Sizin başımıza bəla hakimiyyətinizin arxivə göndərilmək vaxtı artıq çatıbdır!

Məsim Müslümoviç yarası basılmış adam hövlü ilə çır-çır çığırdı:

– Xeyr, onu görməyəcəksiniz! Sovet hökumətini heç zaman, heç bir qüvvə arxivə göndərməyi bacarmayacaq! Bu, əbləhlərin xülyasıdır. Dünyaya meydan oxuyan, kapitalizmin canına üşütmə salan sosializmi, sorağı bütün qitələrdə eşidilən SSRİ adlı qüdrətli bir dövləti sarsıdacaq, heçə döndərəcək fövqəlqüvvə mövcud deyil və olmayacaq da!

Kənardan bir nəfər də höcətləşmə yerinə yan aldı. Həqarətlə gülərək, Məsim Müslümoviçə işarə etdi:

– Bu haylı-küylü yoldaşda toyuq korluğu var, – dedi. – Odur, hakimiyyət iqamətgahının qənşərində, on-on beş addımlıqda qurulmuş dar ağacını görə bilmir. Onun nə demək olduğunu qanmır. Qəribə adamdı!

Ətrafdan ona hay verdilər:

– Qəribə yox, beyni püfdü!

– Qəflət yuxusundadı, ayılmayıb!

– Bircə sözlə, korafəhimdi!

Məsim Müslümoviç acığından qovşuruldu. Gücü heç nəyə çatmadı, hirsini deyinməklə soyutdu:

– Nankorlar!.. Qədirbilməzlər! Axı, bu binəva Sovet hökuməti sizə yaxşılıqdan savayı neyləyib?! Keçmişinizi niyə insafsızcasına unudursunuz? Babalarınız, bir çoxlarınızın ata-analarınız gənclik yaşlarına qədər yeraltı qara, hisli damlarda yaşayıblar. Mal-qoyunla bir tövlədə, miz iy-qoxulu daxmada ömür çürüdüblər. Ağalar, bəylər, koxalar, kəndxudalar qapılarında nökər-naib olublar. Arvad-uşaqları yarıac, yarıçılpaq həyat sürüblər. Bit-sirkədən, dava-dərmansız xəstəliklərdən kütləvi qırılıblar. Çox vaxt kəfənsiz-filansız qəbirə gömülüblər. Sovet quruluşu dünyaya sosial ədalət gətirdi. Hamıya azadlıq bəxş etdi. Havasız, işıqsız daxmalardan qəşəng binalara, imarətlərə köçürdü. Savadsızlığı aradan götürdü. Yazmaq-oxumaq nə olduğunu bilməyənlərə bilik öyrətdi. Onların övladlarına, yəni sizlərə pulsuz ali təhsil verdi. Hər eldə, hər oba-

da, ən ucqar kəndlərdə hisli-paslı neft çıraqlarını gur elektrik lampaları ilə əvəzlədi. Evlərə qaz kəmərləri çəkdi, mənzillərinizi mavi yanacaqla qızdırdı. Ayaqlarınızı adi göndən tikilmiş çarıq, kotğu, patavalardan qurtardı. Sudan, soyuqdan qoruyan isti ayaqqabılar geyindirdi. Əyin-başınızı nimdaş, yırtıq-sökük çul-çuxalar əvəzinə yaraşıqlı paltarlarla, pencək-şalvarlarla təzələdi, abıra mindirdi. İndi onu bəyənmirsiniz. Ata-anası bəlli olmayan, xarici düşmənlərimizə xaincəsinə satılmış qor-qoduqların, ekstremistlərin boş hay-küylərinə uyub, hakimiyyətin istefası tələbini irəli sürürsünüz. Ağlınızı başınıza yığın! Papağınızı qabağınıza qoyun, bir dərin-dərin fikirləşin. Başınız daşdan-daşa dəyəndə peşman olacaqsınız. İnanın mənə!

Məsim Müslümoviç susan kimi, gər və gur bir səs qulaqları cingildətdi:

– Qaxınclarını az elə, a qardaş! Özün deyib, özün də eşidirsən. Zəhmət çək, bizi də dinlə!

Ortada sus-pus dayanmış Əfsuna bu səs tanış gəldi. Restoranda həmsöhbət olduğu artistin səsinə oxşatdı. Çönüb baxdı, yanılmamışdı.

Artist Məsim Müslümoviçə lap yaxın yeridi, nəfəs-nəfəsə dayandı. Səsini bir qədər alçaldıb, qollarını qoynunda çarpazladı. Gözlərini arabir ətrafdakı adamlarda gəzdirə-gəzdirə sözünə davam etdi:

– Siz, bayaq ərz elədiniz ki, Sovet hökuməti bizi ağ günlərə çıxardıb. Qara daxmalardan işıqlı, yaraşıqlı binalara, imarətlərə köçürüb. Savad verib, əyin-başımızı təzələyib, insan təkin yaşadıb, düzdü?

Məsim Müslümoviç bir-iki addım geri çəkildi. Artistin ağzından turşumuş iy gəlirdi. Yəqin ki, yenə hardasa içmişdi. Dilucu dilləndi:

– Bəs yalandı?!

– Bəli, yalandı! – Artist dabanlarını höcətlə qaldırdı. – Onlar yalnız və yalnız sovetlərin xidməti deyil, dövrün-zamanın həyata diktəsinin nəticəsidi. Biz on səkkizinci, on doqquzuncu əsrdə yox, iyirminci yüz illiyin sonlarında yaşayırıq. Sadaladıqlarınızı Sovet hökuməti olmasa da bu xalq görəcəkdi!

Şakir Şadmanlının "yazıçı" hissiyyatı önə çıxdı. Artisti siyasi korluqda dolayısı ilə qınadı:

– Zamanın belə bir mütləq diktəsi, həyat və yaşam tərzinə mü-

daxiləsi əgər mövcuddursa, niyə digər məmləkətlərin sosial irəliləyişində özünü göstərmir? Məişətlərində dönüş yaratmır?! Məsələn, heç uzağa getməyək, özümüzün cənubdakı qardaş-bacılarımızın – İrandakı azərbaycanlıların vəziyyətlərini bir anlığa yada salaq. Otuz milyondan artıq o əhalinin öz milli dilində heç ibtidai məktəbi də yoxdur. Muxtariyyət nədi, bilmirlər. Orta əsrlərdəki həyat tərzi ilə gün keçirirlər. Buna nədi sözünüz?!

Artist dərin yanğı ilə köks ötürdü:

– O başqa bir ciddi söhbətin mövzusudu. Onu qatmayın bura. Biz, hələlik, özümüzdən danışırıq. Siz bayaqdan fövqəladə hünərlərinizdən dəm vururdunuz. Tərifli hökumətinizin biabırçı nöqsanlarını ört-basdıra çalışırdınız.

– Heç bir ört-basdıra hacət yoxdur burda... – Şakir Şadmanlı höcətsiz danışdı: – Qərəzi bir qırağa qoyaq, keçib gəldiyimiz həyat yollarına insaf tərəzisində nəzər salaq. Yetmiş iki illik qısa zaman kəsiyində Sovet hakimiyyəti sayəsində bir neçə yüz illik inkişaf mərhələsini ötmüşük. Elm, ədəbiyyat, mədəniyyət sahəsində danılmaz nailiyyətlər əldə etmişik. Görkəmli alimlərimiz, məşhur musiqiçilərimiz, hər yanda tanınmış şair və yazıçılarımız, rəssamlarımız, heykəltəraşlarımız var. Hələ mahir dövlət təşkilatçılarımız, siyasətçilərimiz, diplomatlarımız da öz yerində!

– Tamamilə doğrudu! Büsbütün həqiqət göstəriciləridi bunlar!.. – Məsim Müslümoviç fəxarətlə təsdiqlədi. – Məhz Sovet cəmiyyətinin, böyük sosial ədalətinin bəhrəsidir! Kommunist partiyasının xüsusi diqqət və qayğısı nəticəsində araya-ərsiyə gəliblər bizim hər sahədəki sənət korifeylərimiz. Elə siz artist zümrəsi də, o cümlədən. Əvvəllər kimlər idiniz? Adi komediantlar! Küçə-küçə gəzib gülməli oyunlar çıxardıb, qəpik-quruş qazananlar! Səfil həyatı sürənlər! Hörmətə mindirdik sizi. Mütəşəkkil teatrlar yaratdıq. Ad-san verdik. Cəmiyyətin fəxarətli üzvləri, elitar nümayəndələri elədik. Budumu sizin minnətdarlığınız?!

Artist bərk qıcıqlandı. Qollarını qoynundan açıb, əllərini havada haqq bayrağı kimi o tərəf-bu tərəfə yelləndirdi:

– Amma unudursuz ki, sizin o gülməşəkər Kommunist Partiyanız heç bir dövrdə, orta əsrlərin müdhiş inkivizisiya zamanında

da görünməmiş, baş verməmiş dəhşətli cinayətlər, faciələr, kütləvi amansızlıqlar, repressiyalar törədib! Bu xalqın ən say-seçmə, ən dəyərli oğul və qızlarını, öncül ziyalılarını: alimlərini, şair və yazıçılarını, teatr xadimlərini, digər sənət sahiblərini qanunsuz, məhkəməsiz güllələtdirib. Uzaq Sibirin buzxana həbs düşərgələrində qətlə yetirib. Onların ailələrinə sürgünlərdə min bir əzablar çəkdirib. Əgər o önəmli insanlarımız sağ qalsaydılar, mədəni inkişafımız, irəliləyişimiz ayrı təməl, özgə bünövrə üzərində qurulardı. Bugünkü çürüklərimizin yaranmasına münbit şərait olmazdı!

Şakir Şadmanlı qısa təkzib verdi:

– Repressiya İosif Stalinin günahıdı. Onun yanlış siyasi xəttinin, şəxsiyyətə pərəstişin acı nəticəsidi. Kommunist ideologiyasından irəli gəlməyib.

Məsim Müslümoviç tələskənliklə müavininin fikrini davam etdirdi:

– Məlumatınız olsun ki, o məsələni Kommunist Partiyasının özü iyirminci qurultayında bütün ciddiliyi ilə pislədi. Heç nədən çəkinmədən səhvləri etiraf etdi. Bir diktatorun şəxsiyyətə pərəstişinin fəsadlarını lazımınca töhmətləndirdi. Repressiya qurbanlarına bəraət verdi, onların sağ qalmış ailə üzvlərindən mərdi-mərdanə üzr istədi, şən həyata qaytardı. Yaşam şəraitlərini yaxşılaşdırdı. Bu, yüksək insanpərvərliklə bərabər, həm də ibrətamiz cəsarətin, haqq-ədalətin bariz timsalıdır!

Artist acı istehza ilə güldü.

– Əcəb ədalətdi!.. Başımızı yarıb, ətəyimizə çürük qoz tökübsüz!

Məsim Müslümoviç çımxırdı:

– Başı biz yarmamışıq. Gorbagor Stalin yarıb. Onun kobud səhvlərini bizim aydan arı, sudan duru partiyamızın ayağına yazmağa cəhd etməyin, babal yumayın!

Kim isə qəfil qəhqəhə çəkdi:

– Tutalım, o dəhşətlər təkcə Stalinin günahıdı, bəs doxsanıncı ilin iyirmi yanvar qırğınını kimin ayağına yazaq? Şanlı "Qızıl ordu"nuzun, ya yerli hakimiyyət rəhbərlərinin?

– Heç birinin! – Məsim Müslümoviç nifrətlə xitabət kürsüsünü, oradakı müxalifətçiləri göstərdi. – Taqsırkarlar, bax, onlardı! Camaatı qızışdırıb güllə qabağına verdilər. Özləri isə qaçıb orda-

burda gizləndilər. Heç burunları da qanamadı.

Yaxınlıqdakı adamlar Məsim Müslümoviçə növbə ilə sataşdılar:

– Adımı sənə qoyum, səni yana-yana qoyum, beləsinə deyiblər!

– Adətləridi, öz günahlarını özgələrin üstünə yıxmaqda qoçaqdılar!

– Əvvəllər kəsdikləri başlara sonralar saxta ağlaşma qurdular!

– Xalqdan aldıqlarını lüm-lüm udub, xalqa verdiklərini borca yazdılar!

Məsim Müslümoviç yenidən çır-çır çığırdı:

– Bəsdi, susun, qədirbilməzlər! Siz əmək itirənlərsiniz. Haqqı dananlarsınız! Kapitalistlərə satılmış axmaq ekstremistlərə uyanlarsınız! Hayıf Sovet hökumətinin sizə çəkdiyi zəhmətdən!

Ağbirçək, sifəti qırış-qırış bir qadın hirs-hikkə ilə qənşərə gəldi. Məsim Müslümoviçi lağa qoydu:

– Sən də sus, yekə qarın qurumsax! Çığır-bağırla baş-beynimizi aparma. De görək hansı əməyinizi itirmişik? Hansı haqqınızı danmışıq?! Mən ağır zəhmət adamıyam. On dörd yaşımdan altmış yaşınacan kənddə pambıq becərmişəm. Səhər ala-torandan evdən çıxıb, axşamın zil qaranlığında qayıtmışam. Dinclik, rahatlıq bilməmişəm. Əllərim qabar-qabardı, budu bax, o qabarların düyünləri ovuclarımda hələ də durur... Xalqı həmişə aldadıbsınız. “Müvəqqəti çətinlik” deyə-deyə başımızın altına yasdıq qoyub, yarıac dolandırıbsız. Aldığımız maaş ayın başına çatmayıb. Siz isə kağız üzərində yalan planlar doldurub “keçici bayraqlar”, orden-medallar, mükafatlarla yüksək vəzifələrə çatıbsınız... Budur sizin başqaxıncı elədiyiniz yaxşılıqlar!!

Həmən anda səhnədəki mikrofon daha ucadan guruldadı. Kim isə qoca qadının ittihamlarını xüsusi kəskinliklə dilə gətirdi. Və onun ardınca da nifrinli şüarlar səsləndirdi:

– Rədd olsun kommunistlər! Qəbrə gömülsün qəddar sovetlər! Moskvanın muzdlu nökərlərinə nifrət və lənət!!!

İzdiham sonuncu kəlməni təkrarladı:

– Lənət, yenə də lənət!

– Əcdadlarına lənət!

– Yeddi arxadan dolananlarına lənət!

– İstefa!!!

– İs-te- faaa!!!

Məsim Müslümoviç daha nəsə demək istədi, bacarmadı. Gözlərinin işığı birdən-birə sönüklədi. Sifəti qırcaşıb gömgöy göyərdi. Havada çaşqın əl-qol atdı, dalı-dalı getdi və gözlənilmədən yerə sərildi.

Onu tutmağa, yıxılmaqdan saxlamağa əməkdaşlarından heç biri macal tapmadı. Ağır gövdəli kişinin nəfəsi dərhal dayandı.

Fatihəsini həm qəzəb, həm də rişxəndlə artist oxudu:

– Başınız sağ olsun, əziz qardaşlar və bacılar! Yerlə kifayətlənməyib, göylə əlləşən bu acgöz bəndə də ömrünü bizə beləcə bağışladı. Canından şirin bildiyi, təbliğindən heç vaxt yorulub-usanmadığı gözəl kommunizmi bu dünyada görmək nəsibi olmadı. Kaş onu o dünyada görə bilsin. Amin!

Ətraf kiridi.

Əfsun Zamanlı meyitin üstündən şəstlə adlayıb, yoluna davam etdi...

## EPİLOQ

Bakının qızmar yayının ən bürkülü axşamlarından biri idi. Havasızlıqdan can sıxılırdı. Astaqanad mehi az-az hallarda əskik olan Bakının sisli səmasında bir zərrə tərpəniş, misqalca hərəkət nəzərə çarpmırdı. Küçələrdə əyri-üyrü, qozbel ağacların, səkilər kənarlarında cərgələnmiş donqar yasəmən kollarının sıx yarpaqları sanki yapışqanla bir-birinə yapışdırılmışdı. Çəkilən nəfəs boğaz yandırır; tər bədəndən su yerinə axırdı.

Əfsun Zamanlının isə heç nə vecinə deyildi. Beş-altı ay əvvəl aldığı təptəzə "Mersedes" markalı, yüksək komfortlu maşının sükanı arxasında qütəbbər əyləşib, Tamaşanı da arxada oturdaraq, özü üçün yellənirdi. Maşındakı kondisioner içərini əməllicə sərinlətmişdi. Bayırdakı bürkü əsla hiss edilmirdi. Təzə bəylə gəlin şəhəri seyrə çıxmışdılar.

Bir keçiddə "Mersedes" möhkəm silkələnib, xırp dayandı. Tamaşa təşviş keçirdi:

– Maşına nə oldu?

Əfsun şirin nəvazişlə:

– Heç nə olmayıb, can-ciyər, həyəcanlanma, – dedi. – Yoldan keçən bir tanışımı gördüm. Onunla görüşmək üçün əylədim maşını. Sən çölə çıxma. Bürkü vurar, Allah eləməmiş, xəstələnərsən. Mən bircə dəqiqəyə gəlirəm.

O, maşını qırağa çəkib, yolkeçən adamı səslədi:

– Ə, qağa, bir ayaq saxla görək!

Yolkeçən səsə çaşqınlıqla boylandı.

– Mənimləsiz?

Əfsun maşından düşüb, ona sarı gedə-gedə:

– Bəli, sən cənablayam! – deyərək zarafata başladı. – Yolu keçəndə, nə olar, dala-qabağa baxasan. Özün şil-küt olacağın cəhənnəm, az qalmışdı, təptəzə maşınım əzilsin. Bir aləm xərcə düşəcəkdim.

Yolu keçən fağır-fağır üzr istədi:

– Fikirliyəm, bağışlayın.

Əfsun əlini-əlinə vurub, ucadan qəhqəhə çəkdi:

– Ha- haa! Ə, mənəm ey, Əfsunam! Tanımadın? Bıy, məzən olsun!

Yolu keçən əyləndi. Gözlərini döyəcləyib diqqətlə baxdı. Bu, Fərid Cəbizadə idi. Sönük-sönük qımışdı.

– Həəə... sənsən?! Doğrudan tanımadım.

Əfsun qürur-qürrə ilə əl tutuşdu.

– Yəni çox dəyişmişəm?

– Hə, çox dəyişibsən... – Fəridin həzin, həvəssiz səsində qibtə də, tale umu-küsüsü də sezildi. – Əməllicə kökəlibsən... Altında da qəşəng maşının.

– Elə mən də səni zorla tanıdım. Yaman sınıxıbsan. Xəstə-zad deyilsən?

Fərid, həqiqətən, çox sınıxmışdı. Tanınmaz dərəcədə arıqlamışdı. Çənə sümükləri aydın görünürdü. Şalvarı əynində zorla dururdu. O, altı-üstü qaralıb dərinə düşmüş gözlərini yana hərləyib, lap yazıq dilləndi:

– Vəziyyətim son dərəcə ağırdı, xəstəliyə bərabərdi.

– Nolub?

– İşsizəm.

– Haçandan?

– "Təzə bəylər" hakimiyyətə gələli.

– Hımm... – Əfsun dodaqlarını büzüb, bir xeyli susdu, yalandoğru təəssüfləndi. Sonra şən halda ürək-dirək verdi: – Kefini pozma, iş barədə bir şey fikirləşərik. Söhbətimizi gəl, gedək maşında oturub eləyək. Kondisionerini qoşmuşam, içi yaxşı sərindi.

– Yox, sağ ol! – Fərid aralanmağa çalışdı. – Tələsiyirəm.

– Bəri gəl, əşi! – Əfsun onun biləyindən yapışıb buraxmadı. – Hara lazımdı, maşınla apararam.

– Minnətdaram. – Fərid dartındı. – Gedəcəyim yer yaxındı.

Əfsun əl çəkmədi. Fəridin qoluna girdi.

– Di yaxşı, tərslik eləmə. Gəl, həm maşının komfortuna bax, həm də orda sənə göstərəcək daha əfzəl bir sürprizim var.

Fərid tərpənmədi.

– Üz vurma. Xarici maşınların komfortu, bilirəm, çox gözəldi. Öz maşınım olmasa da özgələrində görmüşəm.

Əfsun təkidindən dönmədi:

– Məqsədim maşınımı sənə bəyəndirmək deyil, tamam ayrı şeydir. Höcət eləmə, sözə bax!

Fərid istər-istəməz yumşaldı. Maşına yaxınlaşdılar. Əfsun maşının qabaq qapısını açıb, əvvəlcə Fəridi oturtdu. Sonra keçib sükan arxasında öz yerini rahatladı. Və təkəbbürlü təbəssümlə arxada sakit əyləşib, səsini çıxartmayan Tamaşanı ona təqdim etdi:

– Tanış ol, zövcəmdi. Yəni ki, ömür-gün yoldaşımdı.

Fərid arxaya qanrıldı. Tamaşa ilə salamlaşıb, Əfsunu səmimi təbrik etdi:

– Ürəkdən şadam. Durnanı gözündən vurubsan!

Əfsun bunu ayrı cür yozdu: "Bu qız Durna xanımı kölgədə qoyur" mənasını anladı. Qurcalanıb öyündü:

– Başqa sayaq ola da bilməzdi. Durnanı gözündən vurmaq ovçuluqda birinci şərtdi. Ona xüsusi məharət lazımdı!

Fərid eyhamını ehmal açıqladı:

– Məharətinə bələdəm. Güllən heç vaxt boşa çıxmır, – deyib, Tamaşadan üzr istədi: – Bacı, sözüm birdən xətrinizə dəyər. "Durnanı gözündən vurmaq" el arasında yaxşı mənada işlənir. Xoşbəxt olun!

Tamaşa nəzakətlə gülümsündü. Əfsun onun əvəzindən:

– Mənim zövcəm hər şeyi incəliyi ilə duyur. Narahat olma, başa düşür ki, dost zarafatı eləyirsən, – deyib Tamaşaya gizlin göz vurdu. Fəridi təqdim etdi: – Bu oğlan, yox ey, nə oğlan, yekə kişidi, uşaqları var... hə, tələbə yoldaşımdı, yataqxanada bir otaqda qalmışıq. Canlara dəyən dostdu. Amma bir qüsuru var: dili acıdı.

Məni hərdən-hərdən sancıb. Elə indi də sözarası sancdı... Neylək, canı sağ olsun, bal arısının sancmağı xeyirdi, deyirlər.

Fərid də sönük-sönük qımışdı.

– Hərənin bir şakəri olur, – dedi. – Mənimki də sözü üzə söyləməkdi. Tərgidə bilmirəm. Südlə girən xasiyyət sümüklə çıxır.

Əfsun sükan arxasında yerini rahatlayıb, mühərriki işə saldı.

– De görüm, səni hara aparım? Yolun şəhərin hansı səmtinədi?

– Minnətdaram. – Fərid maşından düşməyə tələsdi. – Aparmışcan varsan. Yolunuzdan qalmayın.

– Bizim gedəsi elə bir yerimiz yoxdur. Tamaşa xanımın evdə ürəyi bir balaca sıxıldı. Açıq havada gəzməyi qərara aldıq. Şair demişkən, heç yana, heç yerə tələsmirik. Qulluğunda hazırıq. Gedəcəyin ünvanı de, quş qanadında çatdıraq. Maşınımın sürəti əladır!

– Yox, lazım deyil. – Fərid maşından düşə-düşə minnətdarlığını bir daha bildirdi: – Gedəcəyim yerə çatmışam. On-on beş addım qalıb. Sizə yaxşı yol!

– Ə, bir səbir elə, qaçmağa can atma. – Əfsun döş cibindən “vizit kartı”nı çıxardıb ona uzatdı. – Al bunu, haçan istəsən zəng vur. İş məsələni gəl, nağdısından həll eləyək. Xəbərin yəqin ki, var. Böyük ofis açmışam. Özəl bank sahibiyəm. Düzdü, hələlik şəriklidi, iki nəfərə aiddi. Amma əsas şəxs özüməm. Bütün səlahiyyət məndədi. Ofisin adı da “Əfsunbank”dı... Bir sözlə, ünvanım, telefon nömrəm kartda yazılıb. Asan tapacaqsan. Şəhərin mərkəzində, nəzərə çarpan yerdədi. Yubanma, nə qədər tez gəlsən, xeyrinədi.

Fərid “kartı” aldı.

– Sağ ol!

– Bax, ləngimə ha, gözləyəcəm.

– Baş üstə, tez gələrəm.

* * *

Ertəsi gün görüşdülər.

Fərid məcbur idi. Dolanışıq şəraiti son dərəcə ağırlaşmışdı, dözülməz hala çatmışdı. On aydan artıq işsizlik onu xirtdəyə qədər borca salmışdı. Bu azmış kimi, arvadı da ciddi xəstəlik tapmışdı. Ay yarım

idi yorğan-döşəyə düşmüşdü, ayağa dura bilmirdi. Ona dərmanları tanış bir aptekçidən nisyə alırdı. Ümidi hər yerdən üzülmüşdü. Xoşlamadığı adamın hüzuruna ayağı getdi, ürəyi getmədi.

Təzə təmirli, gözəgəlim ofis diqqətini aralıdan çəkdi. Bir qədər hündürdə, kiçik təpənin üstündə tikilmiş üçmərtəbəli binanın birinci mərtəbəsini bütünlüklə tutmuş bu ofisin mavi rəngli sal dəmir qapısının hər iki tərəfinə (az qala qapının özü boyda) lövhə vurulmuşdu. Lövhənin biri Azərbaycan, digəri rus dilində idi. İri, basma hərflərlə "Əfsunbank" yazılmışdı. Qapının önündə çiyni silahlı, sütülcə bir keşikçi beş addım o yana, beş addım da bu yana var-gəl edirdi.

Fərid binaya yaxınlaşanda sütül keşikçi qabağı kəsdi:

– Əmanətlərin qəbulu arxa tərəfdəndi! – dedi.

Fərid, əmanət qoymayacağını, dəvət olunduğunu söyləmək istədiyi anda Əfsunun özü qapı ağzında göründü. Geyincəkli idi. Harasa gedirdi. Fəridi məzəmmətlə qarşıladı:

– Ə, niyə belə?! Gəldiyini irəlicədən zəng eləyib nə üçün bildirməmisən? Bir az ləngisəydin, məni yerimdə tapmayacaqdın.

Fərid peşman dilləndi:

– Nə bilim, Vallah... Ağlıma gəlmədi.

Əfsun yekəxanalandı:

– Sənsən də, əlimdə yağım da daşsa, qəbul eləməliyəm. Buyur, keç içəri.

Fərid ayağını sürüdü.

– Mənə görə vacib işindən qalma. Gəldiyim kimi də qayıda bilərəm.

– Di yaxşı, tezcə burnunu sallama. Sən çoxdanın dəymədüşərisən, o saat inciyirsən.

– Yox, doğru deyirəm. Mənə görə işini pozma.

– Dəymədüşərlikdən əl çək. Zarafatdan adam cırnamaz. Sən mənə hey sataşıbsan, incidiyimi heç görübsənmi?

– Hamı bir təbdə olmur.

– Xülasə, şeytana lənət! Gedək, kabinetimdə danışaq.

Kabinet xudmani, ancaq yar-yaraşıqlı idi. Müasir, seçimli avadanlıqla bəzədilmişdi. Divarları boyunca dərin divan, yumşaraq kreslolar, stullar cərgələnmişdi. Yuxarı başda böyük, üstü

mavi, məxməri parça örtülü masa və onun arxasında yellənən oturacaq qoyulmuşdu.

Əfsun Fəridi pəncərə önündəki kresloda əyləşməyi təklif edib, özü masa arxasına keçdi. Yelləncəkli stula ağır-arxayın çöküb, qılçını qılçının üstünə aşırdı. Söykənəcəyə dirsəklənib sağ əlini üzünə qoydu. Şadyana, bir az da təkəbbürlə soruşdu:

– Hə, necədi? Xoşuna gəlirmi ofisim?

Fərid fikirli:

– Mübarəkdi. Sağlığına qismət olsun! – dedi və təəccübünü də gizlətmədi: – Dünəndən bəri durub-oturub hey fikirləşirəm. Bir belə gəlir səndə hardandı, nəyin hesabınadı? Təptəzə maşın alıbsan. Gözəl ofisin var. Özəl bank açıbsan...

– Allah yetirib!

– Allah necə yetirib?

– Səxavət göstərib!

– O səxavəti mənə niyə göstərmir? Nə günah işləmişəm?

– Günahın odur ki, sən suyu da üfürə-üfürə içirsən. Hər şeydən ehtiyat eləyirsən. Qorxan gözə isə çöp düşür... Bu barədə hələ sonra. İndi özündən danış, de görüm, bu bahalıqda, qıtlıq və yoxsulluqda ailəni necə dolandırırsan? Dünən başıörtülü soruşdum, dərinə getmədim. Zövcəmin yanında səni utandırmaq istəmədim. Halın-günün nə cürədi?

Fərid qızarıb başını aşağı saldı.

– Çox pis.

– Gündəlik çörək pulunuhardan qazanırsan?

– Qul bazarından.

– Qul bazarı?! O nə yerdi?

– Hambalçılıq... Belində yük daşımaq yeri.

– Ay yazıq! – Əfsun yarı ürək yanğısı, yarı da rişxəndlə ona acıdı. – Deməli, qəpik-quruşla yük daşıtdırırlar sənə... Vaxtında mənə qulaq asmadın. Deyəndə ki, düz adam düzdə qalır, sözümü qəribçiliyə saldın, lağ elədin. Bax, budur o düzlüyün, tamahsızlığın bəhrəsi, əziyyətini çəkirsən. Yoxsa indi sən də yağ yeyib, yaxada gəzənlərdən biriydin.

Fərid başını qürurla dikəltdi.

– Maddi əziyyət çəksəm də, mənəvi cəhətdən üzüqara deyiləm! – dedi.

Əfsun kinayəyə keçdi:

– Nə verirlər o üzüqarasızlığa? Məlyəti nədi?

– Məlyəti... – Fərid ötkəmlədi. – Ürək sakitliyi! Əqidə bütövlüyü!

– Ehh, gəlişi gözəl sözlər... – Əfsun kreslosunu yellətdi. Tam dövrə vurub, Fəridə yuxarıdan-aşağı baxdı. – Bunlar mücərrəd təfəkkür ifadələridi. Sənin beynini kommunist ideologiyası xarab eləyib. Hələ də o boş təxəyyüllərin təsiri altındasan. Gorbagor Məsim Müslümoviçlərin sadiq şagirdisən!

Fərid qeyzləndi:

– Amma bir vaxtlar Məsim Müslümoviçin əlini mən yox, sən öpürdün, önündə ikiqat əyilirdin!

Əfsun həqarəti vecinə almadı. Özünü tox tutdu:

– Danmıram, əl öpürdüm, ikiqat əyilirdim, çünki vəziyyət elə tələb eləyirdi.

Fərid içinin acısını boşaldırmış kimi, dərindən fısıldadı:

– Məlum oldu!.. Deməli, əclaflığını, mənəvi düşkünlüyünü, satqınlığını boynuna alırsan?!

– Alıram, bəli! – Əfsun şeşmərlənmiş cavab verdi. – Zamanla ayaqlaşmaq lazımdı. Həyat gedişatına uyğun davranmaq böyük fərasətdi. Əks təqdirdə mən də olardım sənin bir tayın. Qalardım hər şeyə tamarzı. Boynubükük, yazıq hallı.

– Fərid onu açıq nifrətlə süzdü.

– Sifət dəyişmək, cilddən-cildə girmək, üzə tüpürtdürmək ən alçaq davranışdı. Zamanla ayaqlaşmaq yox, iyrənc pozğunluqdu, mənəviyyatsızlığın ən çirkin formasıdı!

Əfsun kreslosunu bir də yelləndirdi. İrsiz-irsiz irişdi:

– Mənəviyyat boş şeydi, yoldaş Fərid! O da sovet ideologiyasının uydurmasıdı. Bu dolaşıq dövrdə, bulaşıq zamanda əsl hünər hadisələrdən baş çıxarmaqdı, gələcəyinə bir gün ağlamaqdı. Nədənsə həya etmək, abır-ismətə qısılıb, dünənki yaşam tərzini eynən təkrarlamaq avamlıqdı, həyatdan dala qalmaqdı. Addımını müasir tələbatla qoşalaşdırmalısan. Yoxsa... nə deyim, öz düşdüyün vəziyyətdən ibrət götür.

Fərid dalğın-dalğın susdu. Əfsun qalib qiyafəsində məğrurluqla əlavə etdi:

– Yadıma müdriklərdən birinin mübarək kəlamı düşdü. O kəlamda deyilir ki, həyat çətin ram olunan xam ata bənzəyir. Çəmini tapıb belinə minə bildinsə, cilovunu əlində möhkəm saxlamağı bacardınsa, səni niyyət mənzilinə dördnala çatdıracaq. Əgər bacarmadınsa, belindən atacaq. Çığnayıb, dalınca sürüyəcək. Dağa-daşa çırpıb qəhr edəcək!

Fərid heysiz-heysiz ayağa durdu.

– Anladım səni... Məni bura məzəmmətləməyə, ağıl öyrətməyə, üzümü danlamağa çağırıbsan. Havayı zəhmət çəkirsən. – Fərid qapıya doğru yeridi. – Xudahafiz!

– Ə, hara belə?!.. Səbrin olsun!.. Əsas söhbət geridədi.

– Əlavə söhbətə ehtiyac yoxdu... Hər şey aydındı.

– Ə, darqursaqlıq eləmə. Hövsələn çatsın. Keçirəm sənin iş məsələnə.

– Mənə sənin işin lazım olmadı.

Əfsun yüyürüb, qapıya çatmış Fəridin ətəyindən geri çəkdi.

– Ə, səfehləmə! Bu gündən səni ofisimin iş icraçısı təyin eləyirəm. Maaşın yüksək olacaq. Kasıbçılığın daşını atacaqsan. – Əlini cibinə yetirib, xeyli pul çıxartdı. – Al, bu da ilk xərclik.

Fərid pula baxmadı.

– Mən sədəqə yığmıram!

– Ə, sədəqə deyil ey, avansdı. Sonra maaşından tutulacaq. Uşaqların yanına əliboş qayıtma.

– Uşaqlarım əliboşluğuma öyrəşiblər. Heç nə olmaz. Umsunmazlar.

Əfsun üz vurdu:

– Xahiş eləyirəm, daşı ətəyindən tök, qulaq as hələ nə deyirəm. Vacib bir sözüm, təklifim də var... Eşitməmiş olmazsan, qarşıdan Ali Məclisə seçkilər gəlir. Ona ciddi hazırlıq gedir. Mən də deputatlığa namizədliyimi irəli sürmək fikrindəyəm. Kimdən əskiyəm? Yüksək qabiliyyət məndə, maddi imkan məndə. Natiqlikdə də ki, çoxlarını suya susuz aparıb, susuz da qaytararam. Daha nə lazımdı? Əgər yeri gələrsə, seçiciləri pulla da şirnikdirib lazımi qədər səsi toplamağa gücüm çatar. Hə, necə fikirdi?

Fərid dillənmədi.

Əfsun bir az da yekəxanalandı:

– Səni də özümə vəkil götürmək qərarına gəlmişəm. Seçki məntəqələrini birlikdə gəzəcəyik. Bülletenləri yaymaqda, ilkin səsləri toplamaqda mənə kömək edəcəksən. Əlbəttə, mənfəətinlə... Arxayınam ki, etiraz bildirməyəcəksən.

Fərid başını buladı. Əfsunun böyründən kirimişcə keçib, çölə çıxdı.

Əfsun arxadan qışqırdı:

– Əh, sarsaq! Bu dünyaya əbləh gəlibsən, əbləh də gedəcəksən!

Fəriddən cınqır çıxmadı.

Əfsun ucadan, acı həqarətlə deyindi:

– Gorun çatdasın, baba! Bu nə təhər insandı?! Xeyrini anlamaz belə bəndəsini ulu tanrı nə üçün yer üzünə göndərib?!

* * *

...Bir neçə gündən sonra iki qəzetdə iki məlumat çap edilmişdi. Çox yayımlı rəsmi qəzetdə Əfsun Zamanlının seçiciləri qarşısında öhdəlikləri (platforması) bir səhifənin yarısı boyda, aydın, oxunaqlı hərflərlə işıq üzü görmüşdü.

Digərində – azsaylı, kiçik formatlı, müstəqil qəzetin son səhifəsinin lap küncündə isə Fərid Cəbizadənin intihar etdiyi (özünü asdığı) bildirilir; ailə üzvlərinə və yaxın qohumlarına başsağlığı verilirdi...

***Nə yaman bulanıbsan, ey gidi dünya!!!***

**SON.**

**Oktyabr, 2006 – Mart, 2010-cu il**



“Şərq-Qərb” Nəşriyyat evində çapa hazırlanmışdır

Buraxılışa məsul: ***Rasim Müzəffərli***

Texniki redaktor: ***Rövşən Ağayev***

Üz qabığının dizaynı və
kompyuter səhifələnməsi: ***Xəqani Fərzalıyev***

Korrektor: ***Pərinaz Səmədova***

Çapa imzalanmışdır 26.07.2011.
Formatı 60×90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 21,75.
Sifariş N166. Tiraj 500.

“Şərq-Qərb” Nəşriyyat evinin mətbəəsində çap olunmuşdur
AZ 1123, Bakı, Aşıq Ələsgər küçəsi, 17
Tel.: (+99412) 370 68 03; 374 83 43
Faks: (+99412) 370 68 03; 370 18 49
www.eastwest.az